

# ATEİZMİN DÖRDÜNCÜ ATLISI

## HITCHENS VƏ *ONUN* *K*İTABI

**Samir Təhməzxan**

ORGANICELM

# İçindəkilər

# MÜQƏDDİMƏ

Rəngini qırmızı etmişdilər, sadə bir dizaynı var idi. Çox ehtimal ki, nümunə olaraq ingilis dilindəki orijinalın çaplarından birini əsas almışdılar. Çox önəmli bir kitab olmalı idi. Əgər bu sayda iddialı gənclər yaşlı bir fəlsəfə doktorunu da yanlarında gətirərək kiçik bir otaqda ictimaiyyət ilə bir kitab barəsində görüş təşkil etmək istəyiblərsə mütləq önəmli bir kitab olmalı idi. "Tanrı Böyük Deyil" adı ilə çap edilmiş bu kitabın üz qapağını örtən bu sözlərdə həqiqi mənada böyük olan iki şey var idi. Birinci böyüklüyü mənzərədəki ironiya adlandıra bilərik, çünki üzündə yer alan yeddi sözün arasında ən böyük olan məhz "tanrı" sözü idi. Masanın üzərində yatan kitabı ilk dəfə kameraların gözü ilə gördüyümdə oxuya bildiyim də yalnız "TANRI" sözü oldu. Bunu tanrının heybətindən etməmişdilər. İngilis mətbəələrinin çap etdiklərinə baxsaq kitabın orijinal "God is Not Great" adındakı "God" (Allah) sözünü böyük hərflərlə yazdıqlarını görərik. Görünür ki, ABŞ-dakı mətbəələr bunun bir "xəta" olduğunu düşünüblər, ona görə də kitabın adındakı "God" sözünü ən kiçik hərflərlə yazıblar, hətta müəllifi Christopher Hitchens'in adı belə daha böyük qeyd edilib. Bunun məqsədli şəkildə edildiyini təxmin etmək çətin olmamalıdır. Necə də olmasa bəzi ateistlər üçün bu, xüsusi bir əhəmiyyət kəsb edir. Tarixin ən hərəkatçı ateistləri sayılan bolşeviklər də 1917-ci ildə hakimiyyətə gəldikdə çox önəmli hesab etdikləri bəzi "islahatların" altına imza atmışdılar. Onlara qədər çar Rusiyasında "*Богъ*" sözünü yazarkən böyük hərflə yazardılar. 1917-ci ildə hakimiyyətə gələn inqilabi hökumətin verdiyi bir göstərişdə dil ilə bağlı düzəlişlər arasında bu "xəta" da düzəldilməli və kiçik hərflərlə yazılmalı idi.[1] Sovet dönəmində kitab çap edən dövlət qurumları bu direktivə əsasən Allah sözünü böyük hərflə yaza bilmirdilər. Nobel mükafatı laureatı rus yazıçı Aleksandr Soljeniçin "Avqust 1914" adlı kitabını Rusiyada yox, Fransada çap etməsini belə izah edirdi: "Sağlam insan düşüncəsinin dərk edə bilməyəcəyi senzura etirazları və onların üstəlik Allah sözünü həmişə böyük hərf olmadan yazmağı tələb etməsi üzündən bu kitab öz doğma ölkəmizdə

---

[1] E. M. Verşaqin, V. Q. Kostomarov, "Yazık i Kultura: Tri Linqvostranovedçeskiye konçepçii", səh: 76; Direct Media, Moskva-Berlin, 2014

*Samizdat'dan başqa heç yerdə* çap edilə bilməz. Bu həqarətə boyun əyə bilmərəm. Allah sözünü kiçik hərflərlə yazmaq direktivi ən ucuz ateistik xırdaçılıqdır."[2] Azərbaycanlı ateist gənclərimizin *bolşeviklə*r qədər pedant və hərfgüdən olmaması həqiqətən də *xoşdur.*

Sözünü etdiyimiz böyüklüyün ikincisi isə iddianın özü idi. Azərbaycanlı bir müsəlman olaraq tariximizin, mənəviyyatımızın, mədəniyyətimizin, hər şeydən əvvəl isə insan olaraq mahiyyətimizin əsasını təşkil edən bir varlığın heç də əsrlər boyunca inandığımız kimi böyük olmadığını iddia edirdilər. Bəşər mədəniyyətinin əvvəlindən bu günə qədər insanlar, həyatı və yaradılışı düşünüblər. Qədim yunan filosoflarından başlayaraq zamanımızın ən məşhur filosofları da daxil olmaqla bu sualın ağırlığını və əhəmiyyətini hamı etiraf edib. "Tanrı Böyük Deyil" iddiası həm də bizim tarixi dəyərlərimizə meydan oxumaqdır. Çox uzağa getmədən, hələ yaxın *keçmişdə* baxdığımız video kadrlarda Qarabağ müharibəsində aparılan əməliyyatlarda əsgərlərimizin dilindən "Allahu *Əkbə*r" sözl*ərini eşitm*ək olur. Allahın böyüklüyünə *şahidlik ed*ən bu sözlər əsrlər boyunca müsəlmanların dilind*ən qopmaz şüar olub.* Hitchens kimi bir fiqur bu qədər böyük bir iddia ilə mövzuya yeni nə gətirə bilərdi?! Üstəlik bizim bu gənclərin kitabın adını yarımçıq qoymaqlarını da anlamaq lazım idi. Tam adı əslində ingilis dilindən tərcümədə belədir: "**Tanrı Böyük Deyil; din necə hər şeyi zəhərləyir**". Kitabın üz qapağında adın əsas mahiyyətinin yer almamasının səbəbini bilmirəm. Amma əslində kitabın əsas mövzusunun, əsas qayəsinin dinlərin neqativ yanlarını ifşa etmək olduğunu nəzərə alsaq adın ixtisara salınmasının bir problem olduğunu anlaya bilərik.

Maraqlı olan bir başqa tərəf isə budur ki, ateist gənclərimiz öz iddialarını bir ingilisin qələmi ilə oxucu kütləsinin qarşısına çıxarmışdılar. Christopher Hitchens'in kitabını seçmələri məni bir qədər təəccübləndirmişdi. Axı Hitchens nə bir filosof, nə də teoritik fizik deyildi. Bəli, "ateizmin dörd atlısı" adı ilə tanınmış kvartetin dördüncüsü idi. Hər nə olmasa da bu kvartetin digər üzvləri olan Daniel Dennett filosof, Richard Dawkins bioloq, Sam Harris[3] isə nevroloqdur. Bizim Hitchens isə sadəcə olaraq yazıçı və jurnalist olub. Bu dörd atlının İncilin "Vəhy" kitabında keçən "Məhşərin Dörd Atlısı" ilə bağlı bir bənzətmə olduğunu nəzərə aldıqda Viktor Vasnetsov'un çəkdiyi şəkil gözümün önündə canlanır. Ən sonda gələn solğun atın üzərindəki Ölüm ilə Hitchens arasında qəribə bir bənzərlik sezmək olur. "**Mən baxdım və budur: meydana solğun rəngli at çıxdı. Onun belində oturanın adı Ölüm idi və Məzar addımbaaddım onun dalınca**

---

[2] Aleksandr Soljeniçin, "*An Author's Appeal*", The New York Times, 16 iyun, 1971

[3] Sam Harris'i filosof kimi təqdim edənlər də vardır, ancaq ciddi filosoflar onu filosof kimi qəbul etmirlər.

**gəlirdi.**"[4] Bu dördlükdən öz iddiasının doğruluğunu yoxlamaq şansını ilk qazanan Hitchens oldu və ömrünün son ilində xərçəng xəstəliyinə tutulduğu üçün dalınca addımbaaddım gələn məzar sonunda onu haqladı. Dörd atlı, xristianların kitabında işğal, müharibə, aclıq və ölümün təmsilidir. Ateistlərin dördlüyünə baxdıqda isə Dawkins təkəbbürlüyün, Hitchens şəhvətin, Harris inadkarlığın, Dennett isə tərəddüdün təcəllisidir. Özünün də etirafı ilə Hitchens'in İncilin çox səhifəli hekayələri arasında ən çox xoşladığı hissə İsa peyğəmbərin suyu şəraba çevirməsidir. Buna heç bir etirazının olmadığını etiraf edir. Dinə qarşı yönəltdiyi etirazların içində ən çox dinin insanların seksual həyatına qoyduğu məhdudiyyətlərə qəzəbləndiyini görmək olur və bunu gizlətmir. Əlbəttə ki, Hitchens təkcə şəhvətyanlılığı ilə digərlərindən seçilmir, amma onu xarakterizə edəcək tək bir xüsusiyyəti qeyd etməyimizi istəsələr gözə ilk çarpan şəhvət olur. Hitchens – bəzilərinin təbirindən istifadə etsək – "bir anti-puritandır; o, kiminsə hardasa öz əlindən tam ölçüdə seksual həzz ala bilməməsi fikrindən çox narahatdır."[5]

Digər tərəfdən bu gənc tərcüməçinin və onun yoldaşlarının bu seçimini də başa düşmək mümkündür. Kitabın qapağının üzərində bir ingilisin adının olması ehtiyacdan qaynaqlanır. Önəmli olan, müəllifin görkəmli filosof, dahi alim olması deyildir, sadəcə olaraq avropalı olması kifayət edir. Qürbətdə yaşasam da azərbaycanlı olmağın nə anlama gəldiyini bilirəm. Günəbaxan bitkisi günəşə tərəf baxdığı kimi bizim azərbaycanlı insanı da öz aləmində ideallaşdırdığı Qərbə tərəf üz döndərir. Axı məşhur hikmətə görə Şərq mühafizəkarlığın, Qərb isə proqressivliyin məkanıdır. Bunu nəzərə alıb bir ingilis adının təsirini düşünün! Christopher Hitchens yoxsa Taryel Abdullayev? Hansı daha inandırıcı səslənir? Bu həqiqətin üzərində düşündüyüm üçün bir ara əks arqument olaraq hazırlamaq istədiyim kitabın əcnəbi müəlliflərdən birinin kitabı olmasını istəyirdim. Azərbaycanda ən parlaq bir zəkanın hazırladığı bir kitabdakı səhifələr nə qədər zəngin və önəmli məlumatlarla, dərin düşüncələr ilə dolu olsa da adının şərqsayağı olması onu, Qərbin ən bayağı adı qarşısında uduzdurur. Ona görə də dostlarıma zarafatla deyirəm ki, yazdığım kitabda təxəllüs olaraq müəllifin adını "Homer Simpson" və ya "Donald Duck" qoysam daha çox oxucu qazanaram.

Fakt budur ki, Hitchens'in kitabı artıq dilimizə tərcümə olunub. Kitab haqqında yüksək bir fikrə sahib olmasam da onun qarşısına bir cavabın qoyulmasına ehtiyac olduğunu görürdüm. Görəsən bütün tərcüməçilər oxucularına kitab seçərkən ən yaxşısını seçməyi öz qarşısına məqsəd qoyurmu yoxsa burada başqa maraqlar da

---

[4] Vəhy kitabı, 6:8
[5] Vox Day, "The Irrational Atheist: Dissecting The Unholy Trinity of Dawkins, Harris and Hitchens", səh: 205; Benbella Books, Texas, 2008

nəzərə alınmalıdır? Öz adımdan deyə bilərəm ki, nəzərdən keçirdiyim kitablar bir və ya iki kitabla məhdud deyildi. Əfsuslar olsun ki, qarşılaşdığım kitablar "qane edicilik" sınağından kəsildilər. Bunun səbəbi kitabların keyfiyyətindəki qüsur deyildi. Sadəcə olaraq o kitabların içindəki bəzi mövzuları azərbaycanlı oxucu üçün münasib görmədim. Bu mövzuda cavab keyfiyyətini daşıyan ədəbiyyatın əksər hissəsi eyni zamanda xristian dininin müdafiəsidir. Digər kitabların içində keçən bir sıra misallar – iddia olunan erməni soyqırımı buna misal ola bilər – azərbaycanlı oxucuda lazımsız reaksiya oyada bilərdi. Seçim etmək asan iş kimi görünmürdü. Ürəyimin istədiyinə tam uyğun bir kitabı tapmaq ümidimi itirdiyim andan əlinizdə tutduğunuz bu kitabın ilk ürək döyüntülərini eşitməyə başladım. Qısa bir müddət sonra öz qələmimi işə salmaq əzmi qəlbimdə möhkəm bir kök atmışdı. Məyus olmaq üçün bir səbəb yoxdur; kitabın səhifələri, adları dillərinizi əzib-büzəcək avropalı müəlliflərin fikirləri ilə zəngindir. Bu adlar təkcə John Lennox, William Lane Craig, Alvin Plantinga, David Berlinski kimi müasir dindar-ateist diskursunda tez-tez hallanan adlarla məhdudlaşmır. Kitabımızda verdiyimiz cavabları şərq kitabxanasından almadıq, Hitchensə aid olduğu yarımkürənin insanları ilə cavab vermək istədik. Michel de Montaigne *demişkən* "mən yalnız özümü daha yaxşı ifadə etməkdən ötrü başqalarından sitat gətirirəm."[6]

[6] "The Works of Michael de Montaigne; Comprising His Essays, Letters and Journey Through Germany and Italy", səh: 86; J.W.Moore, Philadelphia, 1856

## HITCHENS İLƏ TANIŞLIQ

*"Əgər səhv qatara minmisənsə, qatarın içində dəhliz boyunca əks istiqamətdə qaçmaq heç bir fayda verməz."*

Dietrich Bonhoeffer

Christopher Hitchens ilə tanışlığım 13 il əvvələ qayıdır. Bu, virtual bir tanışlıq idi. *Onunla bu* şəkildə ilk qarşılaşmam George Galloway'in debatlarından birini izləyərkən nəsib oldu. 2005-ci ildə New York şəhərində yerləşən Baruch kollecinin səhnəsində gedən debatda George özünə məxsus x*əfif şotland l*əhcəsində həyəcan və *coşqunluq ilə* Hitchens'in siyasi baxışlarındakı d*əyişiklikl*əri belə vəsf edirdi: "O zamandan bəri sizin *şah*idi olduğunuz, təbiət tarixində *baş vermiş nadir bir hadis*ədir; kəpənəkdən sürfəyə geri dönən ilk metamorfoz." *Əvvəllər ABŞ*-ın xarici siyasətinə qarşı xüsusi şövq ilə etiraz edən Hitchens artıq kursunu tamamilə əks istiqamətə doğru d*əyişmişdi. On*a yoldaşlı*q etmiş* Larry Alex Taunton onun haqqında ölümündən sonra yazdığı kitabında bu d*əyişikliyin 9/11 hücumu ilə* bağlı olduğunu deyir. Hamı bununla razılaşmır; b*əzil*ə*ri bunu dönüş nöqt*əsi yox, artıq qapalı şəkildə mövcud olan fikirləri gücləndirən bir "ideoloji viaqra" adlandırırlar. Hitchens haqqında bunu qəti şəkildə deyə bilməsək də onun dostu Richard Dawkins haqqında deyə bilərik. Dawkins özü kitabında yazır: "Mənim "dindən əl ç*əkin"* şəklində səslənən ehtiramımın son qalığı 2001-ci ilin sentyabr ayının tüstüsü və boğucu tozu içində yoxa çıxdı."[7] Digərləri bunu hər zaman etiraf etməsələr də əksər antiteistlər haqqında da eyni müşahidə keçərlidir.

Bir sözlə Hitchens çox ziddiyyətli və ekssentrik *bir* ş*ə*xsiyyət kimi tanınır. Bu ziddiyyət onun sosial, mənəvi və siyasi məsələlərdə mövqeyini qabaqcadan təxmin etməyin çətinliyində özünü göstərir. Onun fikirlərini bir ipə düzmək mümkün deyildir. "Hitch-22" adlı avtobioqrafiyasında öz etirafına əsasən 1960-cı illərin sonunda günün gündüz çağında proletariatın sıralarında *militant solçu, axşam* vaxtları isə burjuaziyanın bahalı ziyafətlərində qonaq ola bilirdi. Bu səbəblə Oxford universitetindəki Balliol kollecində oxuyarkən onu "hypocritchens" ləqəbi ilə

[7] Richard Dawkins, "A Devil's Chaplain", səh: 185, Phoenix, 2004, London

tanıyırdılar.[8] İlk oxunuşdan bu ləqəbin ingilis dilində ikiüzlü mənasını verən "hypocrite" sözü ilə Hitchens soyadının izdivacından əmələ gəldiyini görmək olur. Bir tərəfdən gənc illərində Vyetnam müharibəsinə qarşı nümayişlərdə iştirak edə bilir, Bill Clinton'un prezidentliyi dövründə Sudanın bombalanmasını "müharibə cinayəti" adlandıra bilir, Amerikanın İraqa qarşı başlatdığı ilk müharibəyə də etiraz edə bilir, digər tərəfdən isə onu müsəlman ölkələrini işğal edən amerika imperializminə bəraət qazandırarkən görmək mümkündür. Balkan müharibəsində serblərin və xorvatların müsəlman bosniyalılara qarşı törətdikləri cinayətləri haqlı bir şəkildə qınayırdı, amma daha sonra amerikalıların müsəlmanlara qarşı törətdikləri cinayətlərə zərurət donu geyindirməyə çalışmağa başladı. Müasirləri – onların arasında Noam Chomsky, Norman Finkelstein kimi tanınmış siyasi mütəfəkkirlər də yer alır – hər imkan düşdüyündə bu ikiüzlülüyə işarə ediblər. Bu cür ziddiyyətli seçimlərə yalnız bir izah tapa bilirəm. Hitchens dinlərə, xüsusilə də İslam dininə qarşı müharibə aparmağın zəruri olduğuna inanırdı. 2001-ci ildə nəşr etdirdiyi "The Trial of Henry Kissinger" (Henry Kissinger'in Mühakiməsi) adlı kitabında ABŞ-ın dövlət katibini 1969-cu ildə Kambocanı bombaladığı üçün şiddətli qınayır. Halbuki bundan üç il sonra ABŞ qüvvələri İraqın Fəlluca şəhərini ağ fosfor bombaları ilə vurduqda Hitchens'in buna görə ürəyinin ağrıdığını hiss edə bilmədik. Əksinə ölənlərin sayının azlığına təəssüfləndiyini desək bəlkə də mübaliğə etmiş olmarıq. "Ölənlərin sayı kifayət qədər yüksək deyildir … çox sayda [cihadist] qurtula bilib"[9] sözlərini o, Fəlluca şəhərində öldürülənlər haqqında deyib. Ağ fosfor bombası mülki əhaliyə qarşı istifadə olunmuşdu, çünki – bir amerikalı əsgərin izah etdiyi kimi – o şəhərdə hərəkət edən və ya nəfəs alan hər bir şey düşmən döyüşçü hesab edilirdi. Şəhərə daxil olduqdan sonra evlərdə və küçələrdə tapılan ərimiş cəsədlərin dəhşətli ağrılar içində necə can verdiyini təsəvvür etmək mümkün deyildir. Ağ fosforla birbaşa təmasda olmuş şəxslərdə ətlər sümüyə qədər tədricən əriyib getmişdi. Bu ölüm daşıyan materialla təmasda olmayanlar isə onun tüstüsünü udduqları üçün daxili orqanların yanması nəticəsində ölmüşdülər. Fəlluca ilə Kamboca arasındakı fərq nədə idi? İki fərq görə bilirəm; Fəlluca 9/11 hadisələrindən sonra baş vermişdi və oradakı qurbanlar müsəlmanlar idilər. Müsəlmanlara və İslam dininə qarşı – yumşaq dildə desək – tutduğu qərəzli mövqeyini kasset bombaları ilə bağlı dediyi bu sözlərində də görə bilirik:

> **"Əgər yalnız düşmən qoşunlarının cəmləşdiyi yeri vurduğundan əminsənsə … o zaman bu, çox yaxşıdır, çünki o polad diyircəklər kiminsə bir tərəfindən girib o**

---

[8] Richard Seymour, "Unhitched: The Trial of Christopher Hitchens", səh: x; Verso, London, 2012

[9] Simon Cottee, Thomas Cushman, Christopher Hitchens (2008). "Christopher Hitchens and His Critics: Terror, Iraq, and the Left", p.5313, NYU Press

> **biri tərəfindən çıxacaq və yenə bir daha başqa bir kimsənin bədənindən keçəcək. Əgər onlar ürəklərinin üzərində Quran kitabı daşıyırlarsa onu da həmçinin deşib keçəcək. Ona görə də - "Aha, mən ürəyimin üstündə Quran daşıyırdım, təxmin et nə baş verdi; qəlpə yarısında ilişib qaldı" – sözlərini demək imkanları olmayacaq. Heç cür mümkün deyildir, çünki onu da keçib deşəcək. Başqa sözlə onlar ölmüş olacaqlar."[10]**

Hitchens'in siyasi və sosial mövzulardakı bu cür aşkar ziddiyyətləri onun haqqında öyrəndiyim ilk məlumatlar idi. Ondan bu cür çox sitatlar gətirmək mümkündür, amma bu qədərinin onun haqqında demək istədiyimin haqqını verdiyinə inanıram. İlk tanışlığımızdan mənə "*Pax Americana*" ideologiyasının müdafiəçisi kimi görünüb. Haqqında əldə edilə biləcək digər məlumatlar isə bir daha onun ziddiyyətlərini qabarıq şəkildə ortaya çıxarmaqda effektiv oldu.

"Tanrı Böyük Deyil" kitabını öz sözləri ilə oxuduqdan sonra təsəvvürüm daha da dolğunlaşıb. Onun öz sözlərinə inansaq Christopher hələ uşaqlıqda "intellektual ateist" olub. Ona müəlliməlik etmiş xanım Jean Watts'ın sözlərini belə xatırlayır: "Beləliklə də, ay uşaqlar, Allahın nə qədər qüdrətli və səxavətli olduğunu görürsüz. O, ağacların və otların hamısını yaşıl edib, bizim gözlərimiz üçün ən rahat rəng məhz bu rəngdir. Əvəzində bütün bitkilərin bənövşəyi və ya narıncı rəngdə olduğunu təsəvvür edin! Nə qədər də qorxunc olardı, elə deyilmi?!" Xanım Watts bu sözlərini doqquz yaşlı uşaqlara deyirdi və bizim Christopher də onların arasında idi. Dediyinə görə müəlliməsinin bu sözləri onu d*əhşətə gətirmişdi*. "Amma düzünü desəm onun dediyi məni dəhşətə gətirdi. Mənim topuq bağı ilə bağlanan səndəllərim onun yerinə utanaraq buruldu." Bu sözləri ilə müəlliməsində gördüyü *dar düşüncəyə* görə onun yerinə xəcalət çəkdiyini ifadə edir və bunun izahını verərkən deyir: "Hələ doqquz yaşımda dizayn arqumenti haqqında və ya (bu arqumentin) rəqibi olan Darvin təkamülü haqqında və ya fotosintez ilə xlorofil arasındakı əlaqə haqqında bir təsəvvürüm yox idi… Mən sadəcə olaraq bilirdim – sanki mənə ali qüvvə ilə əlaqədə olmağa imtiyaz verilmişdi – ki, mənim müəlliməm iki cümlədə h*ər şeyi s*əhv anlamağı bacarmışdı. Gözlər təbiətə uyğunlaşmışdı, heç də əksinə deyildi." Xanım Watts'ın yeganə "axmaqlığı" öz ətrafında gördüyü dizaynı bir dizayner ilə izah etməsində idi. Christopher isə hələ *uşaq ik*ən, hələ darvinin təkamül nəzəriyyəsi haqqında bir təsəvvürə sahib olmadan h*ər bir şeyin* əksinə olduğunu "bilirdi". Onun uşaqlığında artıq ikinci Darvin olduğunu, hətta ondan daha "dahi" olduğunu çəkinmədən deyə bilərik, çünki Darvinin uzaq

---

[10] Simon Cottee, Thomas Cushman, Christopher Hitchens (2008). "Christopher Hitchens and His Critics: Terror, Iraq, and the Left", p.5313, NYU Press

səfərlər etdikdən sonra görə bildiyi və anlaya bildiyi nəzəriyyəni bizim Hitchens doqquz yaşında məsum bir uşaq ikən qavramışdı.

Hitchens'i məşhur edən də ateist fəaliyyətidir. Siyasi, sosial fikirlərinə görə, jurnalist fəaliyyətinə görə məhdud dairələrdə tanınırdı, lakin onu həqiqi mənada ingilis dilli dünyada, hətta ötəsində məşhurlaşdıran, dinə qarşı başladılmış hərəkatın sıralarında yer alması oldu. 9/11 hadisələrindən sonra din diqqət mərkəzinə keçdi və dinlə bağlı hər bir müzakirə xüsusi maraqla izlənməyə başladı. Bu diqqətdən ən böyük pay alan ələlxüsus İslam dini oldu və İslama, müsəlmanlara qarşı hücumun ön sıralarında yer alanlardan biri də Hitchens idi. Ömrünün son on ilini dinə qarşı mübarizəyə həsr etsə də din və dindarlar həmişə onun həyatının ayrılmaz hissəsi olub. Dinə qarşı apardığı mübarizədəki radikallığının bəlkə də dinlərlə, dindarlarla bir arada yaşamağı onun üçün dözülməz edəcəyini düşünürsüzsə yanılırsız. Öz sözləri ilə desək ömrünün ilk axarında "**metodist məktəbdə təhsil almış anqlikan**" olub. İlk evliliyində yunan əslli vəkil Eleni Meleagrou ilə ailə həyatı qurmaq üçün üzdə yunan-ortodoks kilsəsinin üzvlüyünü qəbul etməli olur və onların həyat bağlarını Kiprin Lefkoşasındakı Müqəddəs Yohanna kilsəsinin baş keşişi düyünləyir. "**Mən həyat yoldaşımın valideynlərini razı salmaq üçün (kilsəyə) üzv oldum**" sözləri ilə buna izahat gətirən Hitchens öz seçimi ilə həmin keşişlə bir araya gəlmişdi, ancaq onun həyatına dəvət olunmadan girən isə sabiq anqlikan keşişi Timothy Bryan oldu. Kilsə fəaliyyətini tərk etmiş Timothy onun anası Yvonne Hitchens ilə birlikdə 1973-cü ilin soyuq və solğun payızında Afinada bir hotel otağında intihar etmişdilər. Timothy anasının sevgilisi idi. (Bəzi kəslər Sigmund Freud'un təhtəlşüur ilə bağlı nəzəriyyələrini istifadə edib Hitchens'in ateizmini erkən həyatda aldığı travmalara bağlayır. Mənə görə belə bir izah çox ucuz və keyfiyyətsizdir.) Onun ikinci evliliyində isə nikahlarını yəhudi ravvin kəsmişdi. Oğlu Alexander'i də yunan ortodoks kilsəsində xaç suyuna salmalı oldu. Christopher nə qədər istəsə də dindən və dindarlardan qurtula bilmirdi. Sanki bir şeydən nə qədər çox uzaq durmaq istəyirsənsə həmin şey bir o qədər sənə yaxınlaşır. Hətta ölümün nəfəsini boynunda hiss etdiyi müddətdə Hitchens öz həyatını dindar kəslərin rəhmətinə tapşırmışdı. Xərçəngdən qurtulmaq üçün ümid bəslədiyi ən son "genom sıralama" metodunu inkişaf etdirən Francis Collins idi və Francis ciddi bir xristian elm adamıdır. Hitchens ən sonuncu kitabında Collins'i ən gözəl sözlərlə yad edir. Elə bu kitabında bir yerdə adını çəkmədiyi bir xəstəxanada yatmalı olduğunu deyir; xəstəxana "tarixi dini təşkilat tərəfindən idarə edilməsi ilə tanınır." "Xəstəxananın hər bir otağında yataqda hansı istiqamətdə yatmağından asılı olmayaraq" –

Hitchens deyir – “gördüyün amiranə mənzərə *şübhə*siz ki, divardan bərk-bərk asılmış yekə qara metal xaç idi.”[11]

Dindarlar tərəfindən bu qədər sıx əhatə olunmasına baxmayaraq onlara qarşı qərəzli olduğunu deyə bilərik. Ateistləri dindarlarla müqayisə edərkən deyir: “Biz cənnətə və cəhənnəmə inanmırıq, bununla belə *bu şirnikləşdirmə*lər və təhdidlər olmadan bizim dindarlardan daha çox tamah cinayəti və ya zorakılıq törətdiyimizi heç bir statistika göstərə bilməz. (*Əslində* isə lazımi qaydada statistik araşdırma aparmaq nə zamansa mümkün olarsa dəlillərin bunun əksini göstərəcəyindən əminəm.)”[12] Mötərizə içindəki sözlər də daxil olmaqla iddiaların hamısı Hitchens’in öz sözləridir. Hitchens bir trotski sevdalısı kimi böyüyüb və solçu ateistlərin din haqqındakı fikirlərini çox gözəl bilirdi. Karl Marx’a görə din cəmiyyəti basqı altında saxlamaq üçün bir alətdir, bir vasitədir. Ona görə din, insanlara itaətkarlıq, mütilik hisslərini aşılamaqla onları avtoritetə qarşı passivləş*dirir.* Əgər Karl haqlıdırsa o zaman dindar insanlar daha az zorakılığa meyilli olmalıdırlar. Deməli dindarlıq müti bir v*ətəndaş istehsal etmə*k*dən ötrü uydurulmuş bir alə*tdir, o zaman dindarlığın effekti cinayətin, üsyankarlığın azalmasında özünü göstərməlidir. Görəsən Hitchens nə üçün öz intellektualları ilə razılaşmır? Bəlkə də razılaşır, amma yenə də *din əleyhinə hər atdığın palçıq qızıldır* deyib gözünü yumur və yenə palçığını atır. Statistika da onunla razılaşmır. Old Dominion universitetinin “sosiologiya və cinayət ədliyyəsi departamentinin” professorları hazırladıqları elmi məqalənin xülasəsində bunu deyirlər: “Din və cinayət arasındakı əlaqə üzərində aparılmış araşdırma göstərir ki, dinin müəyyən aspektləri cinayət fəaliyyətlərində iştirakı azaldır.”[13] 2018-ci ildə nə*şr edilmiş bu m*əqalənin müəllifləri bu araşdırmalarında statistik məlumatlara əsaslandıqları kimi Karl Marx, Emil Durkheim kimi sosioloqların nəzəriyyələrini də müzakirə ediblər. Deyə bilərsiz ki, məqalə Hitchens’in vəfatından 8 il sonra yayınlanıb, ona görə də onun bu məlumatlardan xəbəri olmayıb. Həqiqət budur ki, bu cür elmi məqalələr və statistik araşdırmalar əvvəllər də olub. Bu məqalələrin əksəriyyəti Hitchens’in iddiasının tamamilə əksini tapıb və dinin cəmiyyətə müsbət təsirini təsdiqləyib.[14] Pennsylvania Dövlət Universitetinin “sosiologiya və cinayət” departamentinin professoru Jeffery T. Ulmer bu barədə öz araşdırmasını 2013-cü ildə dərc edib və gəldiyi nəticəyə əsasən, qara, ağ və latino icmalarında dindarlığın cinayəti zəiflətdiyini göstərən

---

[11] C. Hitchens, “Mortality”, səh: 81; Twelve, New York, 2012

[12] “God is Not Great”, səh: 5;

[13] Kent R. Kerley, ”Religion and Crime: Theory, Research and Practice”, səh: 194; MDPI, Basel, 2018

[14] Misal üçün bax: Harold G. Koenig, Michael E. McCullough, David B. Larson, “Handbook of Religion and Health”, Oxford University Press, New York, 2001; John M. Wallace, Tyrone A. Forman, “Religion’s Role in Promoting Health and Reducing Risk Among American Youth”, Health Education & Behavior 6(25), səh: 721-741

sübutlar çoxdur.[15] Hitchens'in kitabı bu şəkildə elmə və fəlsəfəyə dayanmayan, sadəcə şəxsi zövqünü oxşayan iddialar ilə boldur. Dindarlara qarşı bəslədiyi güvənsizlik, rahatsızlıq hissini kitabı vərəqlədikcə hiss edirsən. Qəribə deyil ki, Hitchens bardan çıxmış içkili futbol xuliqanlarından çox, kilsədən, məsciddən çıxmış dindarlardan qorxur.[16] Qorxmaq üçün qorxduğun insanların qorxulu olması şərt deyildir, öz xəyal dünyanda onları qorxunc təsəvvür etmək kifayət edir.

Hitchens'i tənqid edənlərin bir hissəsi yazdığı kitabı yalnız dinə qarşı ədavəti ilə əlaqələndirmək fikrinə könül bağlamaq istəmirlər. Onun üçün "kontrarian" (contrarian) vəsfini daha doğru hesab edirlər. Kontrarian adını populyar fikirlərə müxalif olmağı sevən kəslər üçün işlədirlər. Hər hansı bir fikir cəmiyyətdə məşhurlaşıbsa və əksəriyyət tərəfindən qəbul edilibsə bəzi kəslər o fikrə məhz buna görə müxalif olmaq ehtiyacı hiss edəcəklər. Christopher Hitchens də belə biridir. Onun dinə müxalifətini də bununla izah edirlər. Tereza Ana, Henry Kissinger və Thomas Jefferson haqqında yazdığı tənqidi kitablar kontrarian, müxalif təbiətinin məhsuludur. Sanki bu kitabları yazdıqdan sonra yayın evi ona – "daha böyük hədəfi vurmalıyıq" – deyir. Siz kitabın adını "Tanrı Böyük Deyildir" qoymağına o qədər də fikir verməyin, Christopher Hitchens'in aləmində onun üçün ən böyük hədəf Tanrının özüdür. Öz kitabını yazmadan bir müddət əvvəl kvartetin lideri Dawkins'in "The God Delusion" adlı kitabından 180 000 nüsxə satması haqqında aldığı xəbər – görünür ki, - onun iştahasını artıran səbəblərdən olub.

Nəbadə Hitchens haqqında bu yazdıqlarımın "ad hominem" arqument olduğunu düşünəsiz! Şəxsiyyətə sui-qəsd etməklə oxucularda onun iddialarına qarşı şübhə və etibarsızlıq hissi oyatmaq – bunun hər bir halda baş verəcəyini etiraf etsəm də - qəsdim deyildir. Hitchens'in, həmçinin Dawkins, Harris kimi digər antiteistlərin fikirlərinin arxasında duran motivləri anlamadan onların arqumentlərini də yaxşı başa düşə bilmərik. Biz insanlar, ətrafımızdakı rəylərdən çox asanlıqla təsirlənirik, intellektual düşüncə və fikirlərimiz batini duyğularımızla sıx bir əlaqədədir və onlardan təsirlənir. Antiteistlər də müstəsna deyillər. Çox dərin etiqadlarımdan biri də budur ki, ateist bir mövqe - əksər hallarda – sırf intellektual bir mövqe deyildir, lakin yaşadığı həyatda qarşılaşdığı mənzərələrdən təsirlənmiş, qəzəbdən, çarəsizlikdən, rahatsızlıqdan doğmuş bir münasibətdir. Isaac Newton'un müşahidə və hesablamaları sonunda cazibə qüvvəsini kəşf etməsi tam bir intellektual mövqedir, Einstein'in nisbilik nəzəriyyəsinin riyazi formulunu ortaya çıxarması da bunun kimi sırf əqli bir mövqe olur. Ateistin ilahi varlığı inkar etməsi bir fizikin təbiət qanunlarından birinin sirrini kəşf etməsi ilə eyni deyildir.

[15] Jeffery T. Ulmer & Casey T. Harris, "Race and The Religious Contexts of Violence: Linking Religion and White, Black and Latino Violent Crime", Sociol Q. say 54(4), səh: 610-646; 2013
[16] GIG, səh: 18

Onun üçün bu, keçici bir prosesdir; o, birdən birə Allahın mövcud olmadığını *kəşf* etmir, bir çox fərqli faktorların köməyi ilə öncə duyğusal ***bir duruş*** alır, daha sonra bu mövqeyi üçün intellektual bəraət axtarır. “Axtaran tapar” deyiblər, onlar da axtardıqları üçün bir şeylər tapırlar.

# ATEİZM TRENDİ

"*Məsələ sadəcə mənim Allaha inanmamağımda və təbii ki, bu inancımda haqlı olduğuma ümid etməyimdə deyildir. Məsələ budur ki, mən əslində Allahın olmamasına ümid edirəm. Mən hansısa bir tanrının olmasını istəmirəm; kainatın o cür olmasını istəmirəm.*"

Thomas Nagel

Altmış il öncə Avropanın universitetlərində marksist idealar m*əşhur idi,* akademiklər hətta Stalini, Mao'nu və solçu fiqurları müdafiə edirdilər. Bir sözlə sosialist küləklər əsirdi və solçu olmaq dəb idi. Günümüzün gəncləri arasında ateizmin də *bu* şəkildə bir dəbə çevrildiyini deyə biləcək qədər güclü qənaətə sahibəm. Bu sadəcə Azərbaycanda yox, Qərb ölkələrində və Qərbə meyl edən üçüncü dünya ölkələrində görülən bir trenddir. Britaniyalı komik aktyor Ricky Gervais'i tanıyanlar tanıyırlar. Keçən ilin fevral ayında[17] amerikalı komediyaçı Stephen Colbert şou-proqramına qonaq dəvət etdiyi Gervais'ə - "sənin ateist olduğunu bilirəm" – dedikdə publika bunu alqışla qarşıladı. Elə bir alqış qalxdı ki, adam ondan həzz aldığını gizlədə bilmədi. Gervaisi alqışlayanlar onu olimpiya oyunlarında qızıl medal qazandığı üçün və ya qəhrəmancasına çayda boğulan pişiyi xilas etdiyi üçün, ya da qoca bir nənəyə yolu keçməyə kömək etdiyi üçün alqışlamırdılar, sadəcə olaraq onu dinsizliyinə, allahsızlığına görə təbrik edirdilər.

Bu trendin nə üçün yayğın olduğunu başa düşmək çətin deyildir. İntellektual görünmək üçün gözünə eynək taxanlar, metroda, ictimai nəqliyyatda kitab oxuyan gənclərimiz var. O kitablar bəlkə də xüsusilə onun üçündür. *Əlbə*ttə ki, bunu hər kəsə aid etmək olmaz. Amma metroda oturub çantasından kitab çıxarıb özünü savadlı göstərməyə çalışan qızları və ya oğlanları *düşün!* Üstəlik müasir tariximizdə bizim ziyalı təbəqəsind*ən başlay*araq gənclərimizə qədər böyük əksəriyyət Qərb mədəniyyətinə könül salıb. "*Əcn*əbi seyrə balonlarla çıxır, biz hələ aftomobil minməyiriz" – deyən mərhum Sabirin dövründən bəri bu qərb sevdasını hiss etməyə başlamışıq. Özlüyündə pis bir şey olduğunu da demirəm. Həyat rifahını yaxşılaşdıracaq inkişafa qarşı necə çıxmaq olar axı?! Amma işin ağrılı tərəfi budur

[17] Bu sətrlər 2019-cu ildə yazılıb.

ki, gənclərimizin bir hissəsi Qərbin elmi-texniki inkişafını, kitab oxumaq həvəsini götürmək əvəzinə sadəcə zahirdə qərblilərə bənzəməyə üstünlük verirlər. Cəmiyyətimizdə məscidə gedən, Quran oxuyan, dini kitabları mütaliə edən bir gəncə adətən – "sənin nə yaşın var axı?!" – sualı ilə etiraz edirlər. *Yetmiş il ateizmi* təbliğ edən totalitar bir rejimin nəzarəti altında dini dəyərlərin sarsılmayacağını gözləmək ağılsızlıq olardı. Bu günün yaşlı nəsli dini dəyərlər üzərində yeni bir nəsil *yetişdirmə*yib. *Əksinə* sovet təcrübəsi çökdükdən sonra iqtisadı problemlərimizi çözmək üçün – yumurtadan təzə çıxmış ac cücələr kimi - hamı ağzını kapitalist Qərbə doğru açıb. Yeni mühitdə azərbaycanlı insanın gününü sosial problemlər məşğul etdiyi üçün həyatin qayəsi ilə bağlı *düşüncəyə* çox az bir yer qalıb. Belə bir şəraitdə ateizmin trendə çevrilməsi üçün iki faktor kifayət edib. Bunlardan birincisi materialist elmi mə*şhurlaş*dıran simalardır. Məlumdur ki, Qərbin film və əyləncə sənayesi mavi ekranlardan evimizin içinə qədər boylanır. Məhz televiziya, internet və elmi-populyar jurnallar və kitablar vasitəsi ilə təbiət elmləri böyük kütlələr arasında populyarlaşdırıla bilib. Bu kütləvilə*şdirmə işini h*əyata keçirən Carl Sagan, Isaac Asimov, Sean Carroll, Richard Dawkins, Brian Greene, Stephen Hawking, Neil deGrasse Tyson, Michio Kaku kimi tanınmış bəzi simalar olub. Mediada elmi kütləvilə*şdir*ən simaların ən məşhurları əksər hallarda aqnostik və ya dinsiz insanlar olublar. Bu, çox önəmli bir faktordur. Bunun nəticəsində insanların qavrayışında elm və ateizmin iki ayrılmaz qardaş olması təəssüratı formalaşır. İkinci əhəmiyyətli faktor isə, ateizmə qarşı dini müdafiə edən kəslərin əksər hallarda din xadimləri və ya fəlsəfə üzrə universitet professorları olması ilə əlaqəlidir. Dinə qarşı "səlib *yürüşlə*rini" başlatmış radikal ateistlərin çoxu fizika, biologiya, kimya üzrə alimlər olduğu halda əks tərəfdə dini müdafiə edənlərin arasında biz - əfsuslar olsun ki, - bu sahələrdə nailiyyətlər qazanmış, məşhurlaşmış dindar fizikləri, kimyaçıları az görürük. Bu, onların mövcud olmamağı anlamına gəlmir, əksinə sayları çoxdur, amma boğucu mühitdə öz dindarlıqlarını göstərib imeclərinə zərər vurmaq istəmirlər. Necə də olmasa onların "tolerant" ateist həmkarları "irticaçı", "xurafatçı" kimi damğaları ustalıqla istifadə edirlər. Təbii ki, debat səhnəsinə çıxaraq dini dəyərləri müdafiə edənlərin fəlsəfə üzrə professorlar, din xadimləri olması normal bir haldır, buna heç bir etirazımız yoxdur. Sadəcə olaraq daha fərqli bir səhnə görmək istərdik. Dindar fiziklər, kimyaçılar, bioloqların əksəriyyəti dini yalnız öz şəxsi həyatlarında yaşamaq istəyirlər və ictimaiyyət qarşısında gedən mübarizənin bir hissəsi olmaqdan imtina edirlər. İctimaiyyət qarşısına çıxmaq bir kənarda qalsın, kampuslarda tələbələrlə ünsiyyətdə belə dini etiqadlarını gizli saxlamağa çalışmaq artıq normaya çevrilib. Sosioloq Elaine Ecklund qeyd edir ki, "belə alimlər tələbələr ilə öz imanları ilə bağlı müzakirələri o qədər nadir hallarda

açırlar ki, tələbələr o alimlər dindar olduqlarını görə bilmirlər."[18] Doğrudur ki, onlardan bir çoxu özlərinin dini inancları ilə bağlı kitablar yazıblar, lakin ictimaiyyət qarşısında dini müdafiə edən obraza çevrilməyiblər. Nəticədə insanların gözü qarşısında xətalı bir mənzərə canlanır; Qərbə meyl edən gəncin nəzərində, dini inkar edənlər təbiət elmlərini yaxşı bilən alimlər, dini müdafiə edənlər isə anlaşılması çətin olan, abstrakt fəlsəfi fikirlərdən danışan universitet müəllimləri olaraq görünür. Ian Hutchinson, William Daniel Phillips, Francis Collins, John Polkinghorne, Done Page, Allan Sandage, Eric Priest, Jennifer Wiseman, Ard Louis kimi alimlər ictimai debatlarda görünən və adları hallanan alimlər deyillər, bu, onların elmi dərəcələrinin kiçikliyindən qaynaqlanmır, aralarında nobel laureatı da var. Lakin mühit boğucudur, məhdudlaşdırıcıdır. Razılaşın ki, heç də ürək açan bir perspektiv deyil.

Üstəlik allahsızlar cəbhəsinin əsgərlərinin müzakirə zamanı sevdikləri bir üslub var; istehza və rişxənd. Təkəbbürlü ton və yumor istedadı ilə istənilən mövzunu gülüş obyektinə çevirmək olar. Antiteistlərin polemikası tamamilə bu cür istehza suyunda yoğrulub. Bu simptomları göstərən ateist əksər hallarda "böyüklük" kompleksindən əziyyət çəkir. "Real Time" proqramının aparıcısı, komediyaçı Bill Maher bunun gözəl bir misalıdır. Öz proqramında din və dindarları lağa qoymağı sevən Bill ağıl və zəka nümayiş etdirən dindarlara qarşı öz qəzəbini gizlədə bilmir. Hətta bəzi ateistləri bunu etiraf edərkən, bunun ümumi ateist obrazına zərər verdiyini söyləyərkən görmək mümkündür. BBC-nin radio proqramını aparan John Humphrys çap etdirdiyi "In God We Doubt" adlı kitabının axırlarında neo-ateistlərin iddiaları arasında ilk yerdə bunu qeyd edir: "İnanclı insanların əksəriyyəti sadəlövh və axmaqdırlar və ya ən azından ateistlər qədər ağıllı deyillər."[19] Yeni nəsil ateistlərdəki təkəbbürlük və istehza hətta özünü aqnostik olaraq təqdim edən Humphrys kimilərini də qıcıqlandırır. Bu dediyimiz bütün ateistlərə aid deyildir. Bu xarakteristika əsasən fəlsəfi mövzulardan tamamilə cahil olan, təbiət elmlərini hər şeyin xilaskarı hesab edən tiplərə aiddir. Nəyə inandıqlarını da gizlətmədən dilə gətirirlər; təbiət elmlərinin ən sonda hər şeyi izah edəcəyinə, hər sualın cavabını verəcəyinə inanırlar. Bu, yeni bir faktor deyildir. Dostayevski'nin personajlarından biri Dmitri Karamazov hələ on doqquzuncu əsrdə rus cəmiyyətində bu inancı belə səsləndirirdi: "Nə? Allaha yazıq oldumu? Kimya, qardaşım, kimya! Ediləcək bir şey yoxdur, ali cənabları, bir qədər kənara çəkilin, kimya gəlir!"[20] Dmitri kimi sadə bir zabit onu dustaqxanada ziyarət etmiş Rakitin'in fikirlərini bu qədər aydınlıqla ifadə

[18] E. H. Ecklund, "Science vs. Religion: What Scientists Really Think", səh: 125; Oxford University Press, New York, 2010

[19] John Lennox, "Gunning For God; Why The New Atheists Are Missing The Target", səh: 23; Lion Hudson, Oxford, 2011

[20] F. M. Dostoyevski, "Bratya Karamazovi", səh: 589; İzdatelstvo AST, Moskva, 2017

edirdi. Mixail Rakitin kimi insanlar zahiri elmlərin bütün sirləri çözəcəyinə inanırdılar, ən azından buna ümid edirdilər. Zamanımızda bu inanc özünə tərəfdar toplamaqda dinlə yarışdadır; bəzi yerlərdə qazanır, digər yerlərdə isə uduzur. Dindarların "imanını" şiddətlə qınayan ateistlə*rin bu ş*əkildə təbiət elmlərinə iman etdiklərini görmək mümkündür. Allaha inanan insan hər bir şeyin izahının Allahın qatında olduğuna inanır, neo-ateistlər isə hər bir izahın təbiət elmlərinin əlində olduğundan əmindir. İngilis filosof Julian Baggini norveçlilərin "Fri Tanke" qəzetində yazır: "Fikirləşmək və dəlili dəyərləndirmək ehtiyacından yayınmaq üçün iman ən böyük bəhanədir, qaçış vasitəsidir" deyir Dawkins və bununla bir daha ağılın və dəlilin dindarlara yad olduğuna eyham edir. Bu, təkəbbürlükdür və olmayan bir qüvvəni ağıla nisbət etməkdir."[21] Ağıl üzərində monopoliya qurmağa çalışan yeni nəsil ateistlərə görə əsl tanrı ağıldır. Təkəbbürlük də buradan əmələ gəlir. Təbiətə daxil olmayan, təbiət qanunları ilə izah oluna bilməyən hə*r bir şey* onların nəzərində istehza obyekti olmalıdır. Bütün bu faktorların sayəsində bəzi ateist gənclərin dünyasında "ağıllı, zəkalı ateist" obrazı yaşayır. Michael Ruse – özü də ateist olmağına baxmayaraq - yeni nəsil ateistlər haqqında bunları yazır: *"Onlar sataşqan və* təkəbbürlüdürlə*r; onlar başqal*arına qarşı ədalətsizdirlər və başqalarını alçaldırlar; onlar öz fənlərində*n başqa mövzularda o d*ərəcədə cahildirlər ki, müasir akademiklər arasında belə bir hal çox təəccüblüdür."[22] Nədənsə Michael Ruse'un vəsf etdiyi bu təkəbbürlük, "intellektə ibadət edən" və allahsızlığı və ya dinsizliyi və ya materialistliyi ilə tanınmış tarixi şəxslərin nəzərə çarpan bir xüsusiyyət olub. Voltaire, Ludwig Feuerbach, Nitzsche, Sigmund Freud, Bertrand Russell "özlərini vurğun intellektuallar" kimi tanınıblar. Misal üçün Voltaire haqqında onun avtobioqrafiyasını yazan müəllif qeyd edir ki, o, "öz intellektual üstünlüyünü gizlətməyə o qədər də çalışmazdı."[23] Bəziləri buna "epistemoloji təkəbbürlük" adını verir və bunu üç komponentə - üstünlük hissinə, imtiyaz təsəvvürünə və müstəsnalıq təsəvvürünə - *işarə e*dərək izah edir.[24] Bu komponentlərdən ilki neoateistlərin özlərini digərlərindən intellektual olaraq daha üstün olduqlarına inanmaqlarıdır; özlərini "aydınlar" və ya *"azad düşünürlə*r" adlandırmaqları bunun əlamətlərindən biridir."İmtiyaz təsəvvürü" ateistlərin bəzi mövzularda danışmaq haqqını yalnız özlərinə aid etməklərində özünü göstərir. "Müstəsnalıq imtiyazı" isə tarix, fəlsəfə, teologiya kimi ixtisaslarından uzaq olan *mövzularda "ixtisas ş*ərtinin" onlara aid olmadığını d*üşünə*n ateistlərdə görülə

---

[21] Julian Baggini, "*The New Atheist Movement is Destructive*", Fri Tanke, 19 mart, 2009
[22] M. Ruse, "Atheism: What Everyone Needs To Know", səh: 52; Oxford University Press, New York, 2015
[23] Alfred Owen Aldridge, "Voltaire and The Century of Light", səh: 8; Princeton University Press, New Jersey, 1975
[24] C. R. Cotter, P. A. Quadrio, J. Tuckett, "New Atheism: Critical Perspectives and Contemporary Debates", səh: 58-61; Springer Publishing, Cham, 2017

bilər. Hitchens bu baxımdan yaxşı bir misaldır və kitabda onun öz ixtisasından kənar mövzularda etdiyi iddiaların keyfiyyəti ilə tanış olacağıq.

Bir zamanlar Einstein'in surəti tipik bir fizika aliminin zahirən necə göründüyünü müəyyən edirdi. Rejissor Robert Zemeckis'in çəkdiyi "Back to The Future" (Gələcəyə Doğru Geri) filmində zaman içində səyahət edən maşını icad *etmiş Emmett Brown* əslində Einsteindən ilhamlanmış bir personajdır.[25] Fizika alimi dedikdə çoxları beynində ağ irqə mənsub, dağınıq tərzdə ağarmış saçlarla, əynində ağ laboratoriya xalatı daşıyan bir yaşlı adamı təsəvvür edirlər. Bu obrazı insanların beyninə köçürən qüvvə *eyni* şəkildə ateistliyi də bu alimlərin arxasına tikməyə davam edir. *Şübh*əsiz ki, Qərb intellektinə həsəd aparan gənclərimiz bu cür obrazlardan təsirlənirlər. Təəssüf ki, bu obrazdakı mə*şhur sima dinlər*ə ağız büzən, fövqəltəbii dünyaya gülən ateistin simasıdır. Ekran arxasında canlanan hər *şeyin h*əqiqət olmadığını bildiyimiz halda bizə göstəril*ən o* şəkillərin, o epizodların şüuraltı təsirind*ən tam* şəkildə qurtula bilmədiyimiz aydındır. Televizor erasından əvvəl də bu imeci məşhurlaşdırmaq cəhdləri var idi. Ateizmin məşhurlaşması iyirmi birinci əsrə xas deyildir. Hələ on doqquzuncu əsrd*ən başlayaraq* ateizm, daha əvvəl görülm*əmiş çapda* müxtəlif dairələrdə nəzərə çarpacaq bir ideologiyaya çevrildi. Hətta iyirminci əsrlərdə ədəbiyyat sahəsində ateistlər özlərini gələcəyin elçiləri kimi hiss edirdilər və Allah inancı ilə *yaşayan h*ər kəsə keçmişin qalıqları kimi baxırdılar. Thomas Eliot'un dinə, imana sarıldığından xəbər tutan yazıçı Virginia Woolf buna qarşı duyduğu d*əhş*ət və ikrah hissini bacısına 1928-ci ildə yazdığı məktubunda ifadə edirdi. "Yazıq Tom Eliot ilə ən rüsvayçı və üzücü söhbətim oldu; bu gündən sonra o, hamımız üçün ölü sayıla bilər" - deyir xanım Woolf və səbəbini belə izah edir: "O, anqlo-katolikliyi qəbul edib, Allaha və əbədi həyata inanır və kilsəyə gedir. Mən həqiqətən də d*əhş*ətə gəldim. Ölü cəsəd mənim üçün ondan daha ağılkəsən səslənir. Demək istəyirəm ki, sobanın kənarında oturub Allaha inanan diri bir insanda biabırçı bir tərəf vardır."[26] Bu sözlərdə *aşkar* şəkildə hiss olunan nifrət və təhqir o dövrdə getdikcə vüsət tapan bir dəbin əksi idi. Həqiqətdə "rüsvayçı və üzücü" olanın Tom Eliot'un Allaha olan imanı, yoxsa xanım Woolf'un məktubunda bu imanla bağlı ifadə etdiyi fikirləridir?! Bu sualın cavabını oxucuya buraxıram. Thomas Eliot ingilis dilli ədəbiyyatda bəlkə də Woolf'dan daha böyük və daha məşhur bir yazıçıdır. 1948-ci ildə nobel mükafatına layiq görülüb. Hitchens də onu öz kitabında katolik intellektual kimi göstərib ucuz həmlələr ilə gözdən salmağa çalışır.[27] Peter Hitchens, Christopher Hitchensin kiçik qardaşı, ateizmin onu dinə və imana necə gətirdiyini kitabında izah edərkən ingilis

[25] Billy Wong, "Science Education, Career Aspirations and Minority Ethnic Students", səh: 83-84; Palgrave Macmillan, London, 2016

[26] "A Change of Perspective: Letters of Virginia Woolf", 3/457-458;

[27] "GIG", səh: 237;

cəmiyyətində hakim olan bu atmosferi gözəl vəsf edir. Virginia Woolf 19-cu əsrdə mə*şhurlaşan ateizmin t*əbii nəticəsi idi. Müasir dövrümüzə qədər vəziyyət eyni istiqamətdə davam edir.

2003-cü ildə *Florida* şəhərində keçirilmiş ateist konfransında Paul Geisert və Mynga Futrell adlı iki təlimçi dünya ateistləri üçün yeni bir ad istifadə etməyi təklif etdilər. “Aydınlar” mənasını verən ingilis dilindəki “brights” sözü dərhal *konfransda iştirak ed*ən neo-ateistlər tərəfindən – Richard Dawkins onlardan biri idi – həvəslə qəbul edildi.[28] Bu insanların özlərini “aydınlar” olaraq görməkləri özləri haqqında həddindən artıq yüksək fikirdə olmaqlarından xəbər verir. İgidi öldür, amma haqqını yemə deyiblər; Hitchens bu ada qarşı etiraz edən ateistlərdən biridir. Amma Dawkins və Daniel Dennett bu adı kitablarında, çıxışlarında heç bir güzə*şt etm*ədən bu adın arxasında durduqlarını göstərdilər. Dawkins özündən razı *bir* şəkildə “gələcək aydın görünür” vədini verir.[29] İngilis dilindəki “bright” sözünün antonimi “dim” sözüdür, yəni tutqun, solğun mənalarını verir və məcazi mənada gic, axmaq insanlara da “dim” deyilir. Bu adı seçməklə zahirdən görünən bu oldu ki, ateistlər sanki özlərini başqalarından daha ağıllı hesab edirlər. PR münasibətlərinə zərbə dəyməsindən narahat olan ateistlər “aydınlar” adını o mə*nada işl*ətdiklərini deməsələr də insanların əksəriyyəti ad seçiminin arxasında bu motivin durduğunu güman edirlər. Bəşəriyyətin qalan hissəsinə nisbətdə özlərini aydınlanmış olaraq görən bu ateistlərin içində yaşadıqları əfsanəni William Dembski “prometey əfsanəsi” adlandırır.[30] Yunan mifologiyasında Prometey insanları tanrılardan qoruduğu, tanrıların iradəsinə müxalif olaraq insanlara müdriklik və alov bəx*ş etdiyi kimi neoateistl*ər də bəşəriyyətə yeni bir aydınlıq gətirəcəklərini *düşünürl*ər. Bu mifologiya yalnız mif olaraq gözəl səslənir, lakin praktikada insana nəsə bəx*ş etm*ək əvəzinə onu bütün insanlığından məhrum etməkdən ibarətdir. Hə*r şeyd*ən əvvəl insanı qeyri-material cövhərindən, yəni ruhundan məhrum edirlər. Daha sonra azad iradəsini əlindən alaraq insanı bioloji robota çevirirlər. Sonra həyatın obyektiv bir mənasının olmadığını təlqin edərək onların həyatlarını mənasından qopardırlar. İnsanın kosmik partlayış, təsadüfi reaksiyalar nəticəsində ortaya çıxdığını iddia edərək onun yaradılışdakı xüsusi məqamını inkar edirlər. Gələcəyin sadəcə ölümlə bitdiyini təbliğ etdikləri üçün insanın gələcəyə olan ümidini əlindən alırlar. Belə bir baxış bizə göstərir ki, ateizm insanlığa aydınlıq bəx*ş etmir,* əksinə onu ən əziz dəyərlərdən məhrum edir. “Bütün bunların sadəcə olaraq xeyli ədavətli kainatın kiçik bir parçası olduğunu dərk

[28] William A. Dembski, “Uncommon Dissent: Intellectuals Who Find Darwinism Unconvincing”, səh: xxv; Intercollegiate Studies Institute, Wilmington, 2015

[29] R. Dawkins, “*The Future Looks Bright*”, The Guardian, 21 iyun, 2003

[30] William A. Dembski, “Uncommon Dissent: Intellectuals Who Find Darwinism Unconvincing”, səh: xxiii-xxv; Intercollegiate Studies Institute, Wilmington, 2015

etmək çətindir" – Steven Weinberg deyir: "Bu hazırkı kainatın ifadəolunmaz dərəcədə naməlum erkən şərtlərdən əmələ gələrək təkamül etdiyini və gələcəkdə sonsuz soyuqluq və ya dözülməz istilik ilə nəticələnəcək ölümlə üzləşdiyini dərk etmək daha da çətindir. Kainat nə qədər çox anlaşılırmış kimi görünürsə bir o qədər mənasız görünməyə başlayır."[31]

Dəb məsələsində Qərbin keçdiyi bu yolları bizim azərbaycanlı ateistlərimiz təzəlikcə keçməyə başlayıblar. Sosial şəbəkədə bir ateist ilə yazışmam əsnasında ateizmin dəb olduğunu ona qəbul etdirə bilmədim. Əksini iddia edirdi, sanki Azərbaycanda ateist olmaq qorxuludur, tam tərsinə dindar olmağın trend olduğunu söylədi. Azərbaycanda dindar həyatı yaşamış biri olaraq bunun nə qədər yalan olduğunu çox gözəl bilirdim. Qohumların, qonşuların dillərindən eşitməkdən yorulduğum - "namaz qıl, amma dərinə getmə" – ifadəsi də camaat üçün bir növ "atalar sözünə" çevrilmişdi. Ölkəmizdə dindarlar üçün saqqal, hicab kimi zahiri atributlara görə həmişə problem olub. Sovet dövrünün propaqanda aparatı din xadimlərini hər zaman aşağı keyfiyyətli insanlar, dürüst olmayan fırıldaqçılar kimi göstərib. Bütün bunları və daha da çoxunu bilən bir kimsə Azərbaycanda dindar olmağın dəb olmadığını çox asanlıqla dərk edə biləcək. Ateizmə gəldikdə isə biz onsuz da bir millət olaraq yetmiş il müddətində ateist dövlətin təbəəsi olmuşuq. Bir çoxunun atası, anası Allahın yoxluğunu sübut etmək üçün elmi işlər yazıblar. Orta məktəbdə coğrafiya fənnində müəlliməmin anlatdığına görə materializm fənnindən imtahan verədən öncə bəziləri məscidə gedib sədəqə verərmiş və imtahandan keçə bilmək üçün Allaha dua edərmişlər. Bəs görəsən Azərbaycanda bu gün ateizmin dəb olması nə üçün təəccüblə qarşılanmalıdır ki?! The Atlantic dərgisinin yazarlarından Emma Green 2014-cü ildə nəşr etdiyi məqaləsini "ateizm intellektual olaraq dəbdədir" sözləri ilə başlayır. Əgər ateizm bu gün bütün dünyada dəbdirsə Azərbaycan nə üçün istisna olmalıdır ki?! Sovetin allahsızlıq siyasəti artıq öz işini görüb. Beynəlxalq araşdırma və sorğu firmaları mənim ölkəmi xəritədə dünyanın ən dinsiz ölkələri arasına qoyur. WIN/GIA-nın 2012-ci ildə apardığı araşdırmaya əsasən əhalinin 51 faizi, 2014-cü ildəki araşdırmaya görə 54 faizi və 2017-ci ildə isə artıq 64 faizi dinin onların gündəlik həyatında heç bir əhəmiyyətinin olmadığını deyir. Bu göstəricidə azərbaycanlılar Avstriya, Belçika, Danimarka, Finlandiya, Fransa kimi sekulyar dövlətlərlə yarışırlar. Belə bir cəmiyyətdə ateizmin trendə çevrilməsi niyə qəribə hesab olunur?! Dəb barədə danışmışkən onu da əlavə edim ki, bu dəb çox qeyri-adi bir haldır. Bir zamanlar üzündə saqqal gördükləri namaz əhlinə "qırx onu getsin, üzünü təmiz saxla... saqqal natəmizlikdir" deməkdən çəkinməyən vətəndaşlar artıq saqqalı müasir

[31] S. Weinberg, "The First Thre Minutes: A Modern View of The Origin of The Universe", səh: 144; Bantam Books, New York, 1979

həyatın bir hissəsi kimi qəbul etməyə başlayıblar. Metroda, fəvvarələr meydanında, şəhərimizin başqa "müasirləşdirilmiş" guşələrində uzun saqqallı cavanları görmək adi bir mənzərəyə çevrilib. Saqqal artıq dəbin təzahürüdür. Əvvəllər natəmizlik əlaməti kimi görülən saqqal bu gün müasirliklə ayaq saxlamağın əlamətinə çevrilib. Qəribə deyilmi?! Bu saqqal dəbini yaxından izləyən birinə də "lamberseksual" deyirlər. Əynində qırmızı rəngdə "flannelet" parçadan hazırlanmış dama-dama köynəklə Amerikanın meşələrində odun yaran kişilərin dəbi imiş. Əslində o kişilər üçün bir trend deyil, daha çox həyat tərzidir. Amma şəhərdə yaşayan, özlərini zahirən onlara bənzətmək istəyənlər üçün isə dəbdir. Bizim Azərbaycana da bu küləklər Qərbdən gəlib. Bu meşə kişilərini şəhərlərdə trendə çevirən qüvvə eyni şəkildə ateizmi gənclərin arasında kütləviləşdirməyi də bacarıb.

## TARİX VƏ ATEİZM

"*Başa düşə bilmirəm ki, mənim insanlara müəyyən tanrıların mövcud olduğunu və bu tanrıların Şəhərin qəbul etdiyi tanrılardan fərqli olduğunu öyrətdiyimi – ki, bu halda mən tanrıların mövcud olduğunu qəbul edirəm, heç bir şəkildə ateist olmuram və bu baxımdan müqəssir deyiləm – deyirsən, yəni sənin mənə qarşı ittihamın mənim fərqli tanrıları qəbul etməyimlə bağlıdır? Yoxsa mənim ümumiyyətlə heç bir tanrını qəbul etmədiyimi və başqalarına da bunu öyrətdiyimi iddia edirsən?*"

Socrat

Richard Dawkins'in və Britaniya Humanist Cəmiyyətinin dəstəyi ilə 2008 və 2009-cu illərdə London sakinləri üçün avtobusların üzərində bir reklam kampaniyası başladıldı. "Möhtəmələn Allah yoxdur. Ona görə də narahat olma və həyatından həzz al!" Reklam posterlərində çatdırılan mesaj bu iki cümlədən ibarət idi. Hardasa "güman ki", "ehtimal ki" sözləri ilə *başlayan bir* reklam posterini təsəvvür edə bilirsizmi?! *Bir avia şirk*ətin "bizim təyyarələrimiz güman ki, sizi mənzil başına çatdıracaq" və ya bir əczaçılıq şirkətinin "bizim dərmanımızın çox güman ki, heç bir ölümcül əks t*əsiri yoxdur"* şəklindəki reklam posterlərini maliyə*ləşdirdikl*ərini beynimizdə canlandıra bilirikmi?! Ateist aktivistlər üçün belə bir reklamı maliyə*ləşdirm*ək heç bir problem tə*şkil etmir*. Tədbir daha çox şou xarakter daşıyırdı və əsas məqsəd – güman ki, - qəzet başlıqlarına düşmək idi. Alman ateistlər bələdiyyə idarələrindən reklam üçün icazə ala bilmədiklərində öz reklamlarını bütün ölkəyə daşıması üçün bir avtobus kiraladılar. Bu zaman reklamın sözləri daha konkret idi: "Allah yoxdur. Dolğun həyat üçün imana ehtiyac yoxdur." Ateistlərin bu avtobusu Almaniyanın şəhərlərini səyahət etmək üçün keçdiyi yollarda arxasından bənzər bir avtobus tərəfindən izlənirdi; dindarlar tərəfindən kiralanmış bu ikinci avtobusun izərində isə sanki tamamlayıcı bir sual verilirdi: "Əgər Allah varsa bəs onda necə?" Bu sadə sual ateizmin vüsət tapdığı müasir bir dünyada mümkün ola bilərdi. Keçmişin insanları yatsaydılar yuxularına bu cür bir fikir gələ bilməzdi.

*Keçmişin i*nsanlarından danışmışkən qeyd etməyimiz lazımdır ki, bu gün gördüyümüz ateizm müasir dövrün məhsuludur. Bəzi yazıçılar ateizmin çox qədim olduğunu isbat etməyə çalışsalar da heç də *düşündükl*əri kimi uğurlu bir nəticə əldə

edə bilməyiblər. "Ateist" sözü öz mənşəyini klassik yunan dilindəki "ateos" sözündən götürür. Amma yunanlar o sözü bizim bildiyimiz m*ənada işlə*tmirdilər, dədələrimizin dilindəki "allahsız" sözü ilə eyni məna daşıyırdı. Bir insanın "atheos" olması onun Allahı inkar etdiyini göstərməzdi, sadəcə olaraq onun Allah tərəfindən tərk olunduğunu ifadə edirdi. "Misal üçün afinalı dramaturq Aeschylus'un yazdığı Eumenides əsərinin qəhrəmanlarından Orestes "atheos" adlandırılır, çünki dinin qadağalarını çeynəyərək anası Clytemnestra'nı qətl *etmişdi, halbuki onun Apollo ilə* söhbətləri "ilahların" mövcudluğuna inanmasını *zəruri edir. Eyni* şəkildə Sophocles'in yazdığı Oedipus Tyrannus əsərində xor qrupu Oedipusa sadiqliyini belə protest edir ki, əgər ona qarşı hansısa bir pislik arzulayarlarsa qoy dostları tərəfindən t*ərk edilmiş (af*ilos) və ya ilahlar tərəfindən t*ərk edilmiş (ate*os) olsunlar."[32] Sokrat məhkəmədə ittiham edilib miladdan əvvəl 399-cu ildə edam edildikdə ona qarşı sürülmüş ittihamlardan biri də onun ateist olması idi. Çünki Sokrat dövlət ilahlarını inkar edirdi və gəncləri yolundan çıxarırdı.[33] Halbuki onun ilahi qüvvəyə inandığını da bilirik. Epikür də qədim Yunanıstanda ateist kimi tanınan bir başqa filosof idi, amma məlumdur ki, "Epikür özü ateist olmayıb, lakin sonrakı dövrlərin filosofları – çox ehtimal ki, stoisistlər – onun fiziki sistemini tənqid etdilər, ilahların onun sistemində bir rolunun olmaması nəticəsini çıxardılar və şadyanalıqla onu ateist adlandırdılar."[34] Bununla belə Epikür deyildikdə ağla ateizm gəlir və yəhudilər də dinsiz insanlara, mürtədlərə "apikoros" adını verərkən məhz yunan filosof Epikür'ü nəzərdə tuturlar.[35] Epikür bir deist olub, Allahın və ya ilahların varlığını qəbul edirdi, sadəcə olaraq onların insanın taleyinə müdaxilə etmədiklərinə inanırdı. Ümumiyyətlə qədim Yunan filosofları arasında ateist kimi tanınan filosofların həqiqətən də ateist olduqlarından əmin olmağımız imkansız görünür, çünki əlimizdəki qaynaqlar bizə onlar haqqında dolğun məlumat vermək üçün kifayət etmir. Onların bir çoxu yunanların inandıqları antropomorfik ilahların varlığını inkar ediblər, lakin bununla belə, yaradıcı qüvvənin olduğunu qəbul ediblər. Eyni şeyi İslam dünyasında "mülhid" olaraq tanınmış şəxslər üçün də demək olar; İbnur-Ravəndi, Muhəmməd bin Zəkəriyya *ər-Razi heç bir* şəkildə Allahın varlığını şəkk altına almırdılar,[36] lakin peyğəmbərlik inancını tənqid edirdilər və bu baxımdan deist olduqlarını demək olar. Bununla heç də ateistlərin ümumiyyətlə mövcud olduğu qəsd olunmur, lakin onları təmsil edən hər hansısa bariz şəxsiyyətlərin zühur etmədiyi nəzərdə tutulur.

---

[32] Nigel Wilson, "Encyclopedia of Ancient Greece", səh: 109; Routledge, New York, 2010
[33] C. D. C. Reeve, "Socrates in The Apology: An Essay on Plato's Apology of Socrates", səh: 93-95; Hackett Publishing Company, Indianapolis, 1989
[34] Michael Martin, "The Cambridge Companion to Atheism", səh: 19; Cambridge University Press, New York, 2007
[35] David Biale, "Not in The Heavens: The Tradition of Jewish Secular Thought", səh: 5; Princeton University Press, New Jersey, 2011
[36] "əl-Məvsuatul-Fəlsəfiyyətul-Arabiyyə", 2/170; Məhəd əl-İnmə əl-Arabi, 1988

Misal üçün İngiltərənin ilk ateistlərindən hesab edilən və Hitchens'in xüsusi ehtiram ilə təqdir etdiyi Thomas Hobbes həqiqətdə Allaha inanan və özünə xas *teologiyaya sahib bir* şəxsiyyət olub. Onu ateizmdə ittiham edənlər əslində onun *materialist düşüncə*lərindən bu nəticəni çıxarırdılar, beləki Hobbes'a görə bədəni, *cismi olmayan heç bir şey mövcud deyildir. Belə*liklə də Hobbes yaradıcı qüvvəni də cisim kimi təsəvvür edirdi.[37] Hobbes birdən çox yazısında özünü ateist ittihamlarına qarşı müdafiə edir, bununla belə din, dövlət və kilsə haqqındakı fəlsəfəsini də qarşıya qoyur. Hobbes haqqında deyilənlər ateizmdə ittiham olunmuş bir çox başqa filosoflar haqqında da deyilə bilər. Hətta Oxford universitetinin professorlarından olan Michael Ruse etiraf edir ki, "o dövrdə ateistlərin olmasına baxmayaraq Voltaire özü ateist deyildi, nə də David Hume ateist idi, həmçinin Erasmus Darwin də ateist deyildi. O zaman bir çox başqaları kimi onlar da deizmin bir formasına meyl edirdilər…"[38] Bəli, hətta Hume belə ateist olmayıb, kimisi onu "xəfif deist", kimisi "fəlsəfi teist", kimisi də "dindar naturalist" adlandırıb.[39] *Hume daha geniş mə*nada bir skeptik idi və öz zamanında təslimiyyət ilə qəbul edilən bəzi inancları sual altına almağı və onları sınaqdan keçirməyi sevərdi. Əgər biz müasir dövrün ilk həqiqi ateistini tanımaq istəyiriksə bunu alman dilli danımarkalı Matthias Knutzen*'in* şəxsində tapa bilərik.[40] Knutzen haqqında əlimizdə qane edəcək qədər *geniş mə*lumat yoxdur, amma onun 1670-ci illərdə ateistik bir manifest yazdığını və o yazılar vasitəsi ilə ideoloji təbliğat apardığını bilirik. Fransız neo-ateist Micheal Onfray ilk ateist kandidatı müəyyən etməyə çalışarkən bizim Knutzen'dən yan keçir və öz yerlisi Jean Meslier'ni "ateist mübarizəsinin qutsal adamı, qəhrəmanı və şəhidi" elan edir.[41] Meslier, insanı təəssüratsız tərk etməyən *bir* şəxsiyyətdir; bütün ömrü boyu katolik bir rahib vəzifəsində çalışmağına baxmayaraq batinən ateist olub və öldükdən sonra ateizmi və materializmi təbliğ edən bir kitabının olduğu üzə çıxıb.[42] Ondan təxminən bir

---

[37] Wayne Hudson, Diego Lucci & Jeffrey R. Wigelsworth, "Atheism and Deism Revalued: Heterodox Religious Identities in Britain, 1650-1800", səh: 32-33; Routledge, New York, 2016

[38] Michael Ruse, "Darwinism As Religion: What Literature Tells Us About Evolution", səh: 14; Oxford University Press, New York, 2017

[39] John Gaskin onu "xəfif" və ya "zəif deist" adlandırır. (Bax: Gaskin, "Hume's Philosophy of Religion", səh: 168; Macmillan, 1978) Beryl Logan da qeyd edir ki, Hume'un nəzərində minial deizm təbii inancdır. (Bax: Logan, "A Religion Without Talking: Religious Belief and Natural Belief in Hume's Philosophy of Religion", səh: 127-128; P.Lang, 1993) Donald Livingston onu fəlsəfi teist adlandırarkən, vəhy əsasında duran teizm ilə fəlsəfə əsasında duran teizm arasında fərq qoyur. (Bax: Livingston, "Philosophical Melancholy and Delirium: Hume's Pathology of Philosophy", səh: 151; The University of Chicago Press, 1998)

[40] Gianni Paganinin, Margaret C. Jacob & John Christian Laursen, "Clandestine Philosophy: New Studies on Subversive Manuscripts in Early Modern Europe, 1620-1823", səh: 24; University of Toronto Press, 2020

[41] M. Onfray, "In Defense of Atheism: The Case Against Christianity, Judaism and Islam", səh: 29; Arcade Publishing, London, 2007

[42] Michael Palmer qeyd edir ki, Jean Meslier'nin materializmi hətta Voltaire kimi din əleyhdarı filosoflar üçün belə qəbuledilməz idi; çünki Voltaire səbəb və dizayn arqumentlərini qəbul edirdi. Ona görə də Meslier'nin Vəsiyyətnaməsinin 1762-ci ildə nəşr *edilə*n versiyası Voltaire'in daha

əsr sonra Denis Diderot, Baron D'Holbach və Jacques-André Naigeon kimi ateist filosoflar tanınmağa başladı. Əslində alman olan Baron D'Holbach on səkkizinci əsrin ikinci yarısında, 35 il müddətində Parisdə bir salon idarə edib və orada hər həftə iki dəfə, dövrünün məş*hur ateist, deist*, liberallar və skeptiklərini toplayan məclislər tə*şkil edirdi. Bu* salon Baron von Grimm, Guillaume Thomas Raynal, Andre Morellet, Jean-François Marmontel, Augustin Roux, Guillaume-François Rouelle kimi jurnalistləri, həkimləri, yazıçıları və filosofları öz divarları arasında bir araya gətirirdi, hətta David Hume, *Adam Smith kimi şotland filosoflar da bu* salonun ziyarətçiləri arasında olublar.[43] Denis Diderot bizə Hume'un ilk ziyarətini belə xatırladır: "Cənab Hume ilk dəfə Baron (d'Holbach)ın məclisində *iştirak* etdikdən masada onun yanın yer verdilər. Səbəbini bilmirəm, amma ingilis filosof ateistlərə inanmadığını, heç zaman bir ateist ilə qarşılaşmadığını Barona söyləmək ağlına gəldi. Baron ona dedi: "Say gör biz burda neçə nəfərik." Biz on səkkiz nəfərik. Baron əlavə etdi: "Sizə bir dəfəyə *on beşini göstərə* bilmək heç də pis bir göstə*riş deyil;* geridə qalan üçü isə hələ qərar verməyiblər."[44] Maraqlıdır ki, Fransada ayaq tutub gəzməyə başlayan ateizm İngiltərədə bu dövrdə heç doğulmadı; bəziləri bunu İngiltərədəki xristian müəlliflərin deizmə qarşı başlatdıqları intellektual müqavimət ilə izah edirlər.[45] Fransız ensiklopedistlərin arasındakı ateizm, fəlsəfi müzakirədən kənara çıxmırdı. Diderot' və ondan sonrakı fransız materialistlərin əsas fəlsəfi arqumenti "İlkin Səbəbi" inkar etmək üzərində dururdu. "Biz əgər - "kosmosun mütləq bir başlanğıcı olmalıdır" – şəklində səslənən isbat olunmamış prinsipi tərk etsək, o zaman bütün hərəkətlər(in izahı) üçün, kainatdan ötədə yerləşən effektiv bir səbəbə ehtiyac qalmayacaq." Louis Dupré bunu qeyd etdikdən sonra deyir: "Diderot və ondan sonrakı fransız materialistlərin gəldiyi nəticə bu idi."[46] Bu səpkidə cərəyan edən arqumentlər dövrün əksər intellektualları üçün marginal, önəmsiz və aşırı mövqeni təmsil edirdi. Bu üç fransızın içində isə ateizmi məntiqi nəticəsinə gətirib çıxaran D'Holbach özü idi; determinist və materialist olaraq insanların "azad iradəyə" (free will) sahib olmadıqlarına, iradənin sadəcə bir illüziya olduğuna inanırdı.[47] Onun dövrü üçün bu, istisna bir mövqe idi. Diderot isə deizm ilə ateizm arasında gedib gələn bir

---

"mülayim" münasibətinə (yəni deistliyə) uyğunlaşdırılmışdı. Bax: M. Palmer, "The Atheist's Primer", səh: 42; The Lutterworth Press, Cambridge, 2012

[43] Graham Oppy, "A Companion to Atheism and Philosophy", səh: 29; John Wiley & Sons Ltd., Oxford, 2019

[44] David Berman, "A History of Atheism in Britain: From Hobbes to Russell", səh: 101; Routledge, London, 1990

[45] Alister McGrath, "The Twilight of Atheism: The Rise and Fall of Disbelief in The Modern World", səh: 15-16; Doubleday, New York, 2004

[46] Louis Dupré, "Religion and The Rise of Modern Culture", səh: 50; University of Notre Dame Press, Indiana, 2008

[47] Peter van Inwagen, "Thinking About Free Will", səh: 63; Cambridge University Press, Cambridge, 2017

filosof idi; lakin ona görə deist filosofların tanrısına inanmaqla ateist olmaq arasında bir fərq yox idi; filosofların tanrısına, yəni heç bir zaman dünya işlərinə müdaxilə etməyən bir tanrıya inanmağın mənası yoxdur.[48]

Əgər on səkkizinci əsrin ateistləri ümumiyyətlə ateizmin fəlsəfi arqumentləri ilə məşğul idilərsə, on doqquzuncu əsrdə bu, daha çox "təbii fəlsəfə" formasına keçdi. Yeni ateizmin çempionu Charles Darwin və onun təkamül nəzəriyyəsi oldu. Bu, ateistlər üçün xüsusi bir əhəmiyyət kəsb edir, çünki bundan sonra "təbiət fəlsəfəsi" ateizmin əsas alətinə çevrildi. Bu, materialistik cəbhəyə daha çox könüllülər cəzb etməkdə böyük bir rol oynadı. Hətta Dawkins belə etiraf edir ki, "1859-cu ildən əvvəlki çağların heç birində ateist ola" biləcəyini təsəvvür edə bilmir.[49] Yəni əgər Darwin'dən əvvəl yaşasaydı Allaha inanacağını ifadə edir və Darwin'dən əvvəl yaşamış heç bir fikir adamının bu baxımdan ateizmə, möhtac olduğu "legitimliyi" qazandırmadığını vurğulayır. Qərb dünyasında ateizmə kütlələr qazandırmaqda heç bir fikir darvinizm nəzəriyyəsi ilə müqayisə edilə bilməz.[50] Bu əsrdə ateizmin dünyanı necə dəyişdirəcəyi və bunun gətirəcəyi yeni dünya düzəninin necə olacağı müzakirə olunurdu. Fərqli tərəfləri təmsil edən fikir sahibləri dinin cəmiyyətdə marginallaşmasının və ateizmin təsiri ilə cəmiyyətlərin sekulyarlaşmasının aqibətini müzakirə edirdilər. Bu müzakirənin kulminasiyası alman filosof Friedrich Nietzsche ilə tamamlandı. O, öz zamanının insanlarının ateizmin həqiqi mənada mahiyyətini dərk etmədiyinə toxunurdu. Allahın – *haşa!* – ölümü xəbərinin cəmiyyətləri nə qədər radikal şəkildə transformasiya edəcəyi hələ də dərk edilmirdi. Ona görə də "hər bir cəhətdən postmodern düşüncənin mərkəzi peyğəmbəri" Nietsche hesab edilir.[51]

> "Aydın bir səhər çağı fənərini yandıran və bazarda ətrafda qaçaraq durmadan - "Mən Allahı axtarıram! Mən Allahı axtarıram!" – deyən dəlinin xəbərini eşitməmisizmi? Allaha inanmayanlardan bir çoxu məhz o vaxt orada bir yerdə yığılışıb durduğu üçün o, gur bir gülüşə səbəb oldu. "Allahı kimsə itiribmi?" – orda duranlardan biri soruşdu. "Uşaq kimi yolunu azıbmı?" – bir başqası soruşdu. "Ola bilərmi ki, gizlənir? Bizdənmi qorxur? Dənizə gedibmi? Hicrət edibmi?" – Bu şəkildə biri o birinin sözünü kəsərək qışqırıb gülürdülər. Dəli adam onların içinə dalaraq baxışları ilə onları yeməyə başladı. "Allah hara gedib?" – o qışqırdı, "Qoyun mən sizə deyim. Biz – sən və

---

[48] Karen Armstrong, "A History of God: From Abraham to The Present: The 4000-year Quest for God", səh: 401; Vintage Books, London, 1999

[49] Richard Dawkins, "The Blind Watchmaker: Why The Evidence of Evolution Reveals a Universe Without Design", səh: 5; W.W. Norton & Company, New York, 1986

[50] Alister McGrath, "The Twilight of Atheism: The Rise and Fall of Disbelief in The Modern World", səh: 98; Doubleday, New York, 2004

[51] Richard Tarnas, "The Passion of The Western Mind: Understanding The Ideas That Have Shaped Our World View", səh: 395; Harmony Books, New York, 1991

> mən - Onu öldürmüşük. Hamımız onun qatilləriyik. Amma biz bunu necə *etmişik? D*ənizin suyunu içib qurtarmağa necə qadir olduq? Üfüqün tamamını silib yox etmək üçün süngəri bizə kim verdi? Biz bu Yeri öz günə*şind*ən qırıb azad etməklə nə etdik? İndi hara doğru gedir bəs? Bütün günə*şlə*rdən uzaqlara? Biz davamlı dalış etmirikmi? Arxaya, kənarlara, qarşıya, hər istiqamətə? Bundan sonra ümumiyyətlə yuxarı və aşağı qalıbmı? Sonsuz heçliyin içərisind*ən keçirmişik kimi yol*umuzu azıb girlə*nmirikmi? Boş f*əzanın nəfəsini hiss etmirikmi? Daha da soyuq deyilmi? Davamlı olaraq gecə və yenə də gecə gəlmirmi? Səhərlər çıraqlar yandırılmamalıdırmı? Allahı dəfn edən qəbir qazanların səsind*ən bir şey həl*ə d*ə eşitmirikmi? … Allah ölüdür…* və *Onu biz öldürmüşük. Bundan sonra biz, qatill*ərin qatili, özümüzə necə təskinlik tapacağıq?”[52]

Bu sözləri ilə Friedrich Nietzsche iyirminci əsrin postmodern münasibəti üçün “peyğəmbərlik” edir və ateizmin gətirib çıxaracağı nihilizmə eyham edir. Nietzsche eyni zamanda bəşəriyyətin hələ də bu böyük hadisənin nəticələrini dərk etmədiyini də etiraf edirdi. “Nəhayət (dəli adam) fənərini yerə elə atdı ki, sınıb param parça oldu və çıxıb getdi. “Mən çox erkən gə*lmiş*əm” – sonra o dedi. “Mənim vaxtım hələ gəlməyib. Bu əzəmətli hadisə hələ də yolundadır, dolaşıb gəzir. Bu hələ də insanların qulağına gəlib çatmayıb.” Onun verdiyi bu xəbə*ri ingilis şairi Thomas* Hardy 1908-1910-cu illərdə yazdığı şerində poetik sözlərlə ifadə edir və *şerini* “Tanrının cənazəsi” adlandırır. Buna nəzərən demək olar ki, Virginia Woolf və həmçinin Bloomsbury yazıçılar qrupunun digər üzvlərinin dinə qarşı dilə gətirdikləri sentimentlər özlərindən öncəki əsrin kölgələridir.

On doqquzuncu əsrin sonlarından başlayaraq cəmiyyətdəki təhsil strukturları *geniş çapda sekulyar dünya görüşünü m*ənimsəməyə başladı. Pozitivistlərdən *başlayaraq ateistlər geniş kütləyə* “təbiət elmlərini” öz malları kimi satmağa nail olublar və bununla yanaşı Din ilə Elm arasında bir konfliktin olduğunu aşılayıblar. İyirminci əsrin sonlarında ateist intellektualların sayı qabarıq şəkil aldı. Bu gün çox təəssüf ki, mövcud olan təəssürat, insanların beynində “nə üçün alimlər ateist olurlar?” sualını doğurur. Bu təəssürat uzun illər boyunca aparılmış ideoloji təbliğatın nəticəsidir. Həqiqət görəsən necədir? Doğurdanmı dünyanın ən ciddi alimləri ateistdirlər? Əgər nobel laureatlarına nəzər salsaq bunun heç də elə olmadığını görəcəyik. İsrailli genetikaçı bioloq Baruch Aba Shalev’in 2003-cü ildə nəşr etdirdiyi “Nobel mükafatlarının 100 ili” adlı kitabında laureatların həyatları ilə bağlı əksər mövzulara toxunduğu kimi onların dini görüşləri və dünya

---

[52] F. Nietsche, “The Gay Science”, səh: 119-120;

baxışlarına da yer verir. Baruch Shalev bu mövzudakı araşdırmasının yekununu bu şəkildə təqdim edir:

> “1901 və 2000-ci illər arasındakı Nobel mükafatlarını araşdırdıqda aydın olur ki, 654 laureat 28 fərqli dinə aiddir. Onların əksəriyyəti (65,4 %) dini tərcihlərini xristianlığın müxtəlif formaları olaraq müəyyən ediblər… Ateistlər, aqnostiklər, dinsizlər, Nobel mükafatı qazanmış alimlərin tamamının 10,5 faizini təşkil edirlər; amma Ədəbiyyat kateqoriyasında bu tərcih kəskin şəkildə 35 faizə qədər qalxır.”[53]

Kitabın ingilis dilindəki orijinalında “dinsizlər” olaraq tərcümə etdiyimiz söz “freethinkers” sözüdür. Hərfi mənada “azad düşünürlər” mənasını versə də bu söz ilə özünü heç bir dinə aid etməyən kəslər qəsd olunur. Bura ümumilikdə deistlər də, panteistlər də daxil olurlar. Bu araşdırmadan öyrənirik ki, özünü ateist, aqnostik və dinsiz hesab edənlər nobel laureatlarının kiçik bir hissəsini təşkil edir. Maraqlı olan isə budur ki, ateistlər daha çox fiziklər, kimyaçılar arasında yox, ədəbiyyat sahəsində fəaliyyət göstərən yazıçılar arasında seçilirlər. Əslində tarixən elmin müxtəlif sahələrinin əsasını qoymuş alimlər Allaha inanan insanlar olublar. Shalev’in araşdırması nobel laureatları arasındadır, daha geniş araşdırma isə Rice universitetinin professoru Elaine Howard Ecklund və onun kolleqaları tərəfindən aparılıb. “Science vs. Religion; What Scientists Really Think” adı ilə çap etdiyi kitabda 1700 elm adamı araşdırılıb və onlardan 275-i ilə birbaşa müsahibə aparıb. Ecklund qeyd edir ki, bu alimlərin yarısı özlərini dindar olaraq vəsf edirlər, əksəriyyəti Allaha inandığını etiraf edir. Burada daha bir önəmli nöqtəni Ecklund’un sözləri ilə çatdırmaq lazımdır. O deyir: “Həmçinin sosiologiya alimləri ümumi əhalini araşdırdıqlarında tapdıqları budur ki, yaşlı fərdlərin gənclərə nisbətdə daha güclü dini inanc və əməl ifadə etməkləri daha möhtəməldir. Fəqət alimlərlə bağlı mənim apardığım araşdırma bunu başı aşağı çevirdi; Allaha inanması və dini ayinləri ziyarət etməsi daha çox gözlənilənlər gənclər oldular. Mən alimlərlə bağlı etdiyim araşdırmamı otuz beş il əvvəl edilmiş bir başqa araşdırma ilə müqayisə etdiyimdə gənc alimlərin imana sahib olmaq ehtimalının artdığını gördüm. Əgər bu hal bu elit alimlər izdihamı üçün karyera həyatı boyunca davam edərsə bu, akademiyadakılarda dinə münasibətin dəyişdiyini göstərəcək.”[54] Bu onu göstərir ki, elmi icmadakı münasibətlər sabit bir məcra izləmir və dünyada gedən trendi əks etdirir. Son əlli il içində teoloq filosofların səsi güc qazandığı üçün ateist təbliğatı ciddi bir müqavimətlə qarşılaşıb və bu, sözsüz ki, elmi dünyaya da təsirini göstərməlidir. M.I.T. professoru Alan Lightman isə inanır ki, alimlər də

---

[53] ”100 Years of Nobel Prizes”, səh: 57

[54] Elaine H. Ecklund, “Science vs. Religion; What Scientists Really Think”, səh: 32-33; Oxford University Press, 2010, New York

siravi xalqın içindən çıxırlar və onlarda etiqad bölgüsü necədirsə alimlərdə də elədir. “*Şübhəsiz ki, populyar düşüncə*nin əksinə” - Lightman deyir – “dini mövzulara gəldikdə ictimai kütlədəki münasibətlər *çeşidinin eynisi alimlə*rdə də mövcuddur.”[55]

[55] Henry F. Schaefer, “Science and Christianity: Conflict or Coherence?”, səh: 11; The Apollos Trust, Georgia, 2004

## HITCHENS ULTRAKREPIDARYANİST

*"Haqqında tamamilə heçnə bilmədiyin bir şeyi inkar etməyin cahilliyin ən ağır formasıdır."*

Wayne Dyer

Hitchens'in teoloji, tarixi və fəlsəfi müzakirələrində etdiyinin maraqlı bir adı var: ultrakrepidaryanizm. Sadə *xalq bu işin* ən mahir ustalarıdır. Roma yazıçısı və filosof Böyük Gaius Plinius "Təbiət Tarixi" kitabında Makedoniyalı İskəndərin favoriti, antik dövrün ən böyük rəssamlarından biri olan Apelles haqqında yazarkən deyir: "Onun adəti belə idi ki, bir sənət əsərini və ya rənglən*miş bir tablonu bitirib* əlini ondan çəkdikdə onu açıq bir qalereyada və ya ana yolda sərgiyə qoyardı ki, yoldan keçən insanlar tərəfindən görülsün. Özü də şəklin arxasında bir yerdə durardı ki, öz işində hansı eyiblərin tapıldığına qulaq assın; beləliklə də öz rəyindən daha çox sadə xalqın mühakiməsinə üstünlük verərdi, onların daha yaxından incələyəcəklərinə və özünün görə bilmədiyi qüsurları onların daha tez görəcəklərinə inanırdı. Deyilənə görə bir dəfə bir ayaqqabı ustası şəklin yanından keçərkən şəkildəki ayaqqabını və ya çəkənəyi incələməyə başladı və ayaqqabıda bağlardan birinin çatışmadığına diqqət çəkdi; Apelles adamın haqlı olduğunu etiraf edərək növbəti günə düz*əliş etdi və* tablosunu bir daha adətinə uyğun olaraq sərgiyə çıxardı. Həmin ayaqqabı ustası növbəti gün oradan bir daha keçərkən daha əvvəlki gün tapdığı eyibin aradan qaldırıldığını gördü və daha əvvəlki nəsihətinin o qədər gözəl qarşılandığını görərək qürurlandı və bu səfər şəkildəki bacağa ilişməyə başladı. Apelles artıq buna dözmədi və şəklin arxasından başını çıxararaq nifrətli baxışlarla adamı acıladı: "Ay adamcıq, sadəcə bir ayaqqabı ustası olduğunu unutma, ona görə də məsləhət görürəm ki, ayaqqabıdan *başqa işlər*ə burnunu soxma!" Onun bu sözləri daha sonra yayğın bir atalar sözünə çevrildi: "Ne sutor ultra crepidam."[56] İngilis dilinə "qoy ayaqqabı ustası öz ayaqqabı qəlibindən o tərəfə keçməsin" mənasına gələn bu deyim "ultrakrepidaryanizm" sözünün kökünü tə*şkil edir.* O zamandan bəridir ki, öz sahəsindən, öz ixtisasından və sənətindən kənar mövzular haqqında iddialı danışanlar haqqında bu misalı çəkirlər. Çox maraqlıdır ki, nədənsə on doqquzuncu

[56] J. Newsome, "Pliny's Natural History: A Selection From Philemon Holland's Translation", səh: 282; Oxford University Press, Glasgow, 1964

əsrin Avropasında ayaqqabı ustaları radikallıqları və üsyankarlıqları ilə tanınıblar.[57] Əgər kənd əhli arasından bir ateist çıxırdısa bu, çox zaman kəndin ayaqqabı ustası olarmış. G. K. Chesterton öz fiktiv qəhrəmanlarından birini, detektiv rahib Brown'u hekayələrinin birində Bohun Beacon kəndinin ayaqqabı ustası ilə qarşılaşdırır və onu oxucusuna təqdim edərkən deyir: "Ayaqqabı ustası, bir çox kənddə olduğu kimi (burada da) bir ateist idi."[58] Cornell universitetinin tarixini qələmə almış tarixçi alim Morris Bishop, universitetin yerləşdiyi İthaca şəhərciyinin on doqquzuncu əsrin sonlarındakı sosioloji mühitini vəsf edərkən qeyd edir ki, bu bölgənin "kənd ateistləri" ya "səyyar kitabçı", ya da "ayaqqabı ustası" olurdu.[59] Bu kənd ateisti obrazı xüsusilə Qərb ədəbiyyatında təsvir edilən bir xarakterdir; kəndin meydanında durub kilsəyə gedən sadə müti əhali ilə yol üstündə höcətləşən, onların dini etiqadları ilə lağlağı edən, anlamadığı mövzularda gurultulu iddialar edən birinin adıdır. Kənd ateistinin cahil və savadsız olması şərt deyildir, filosof Warren Steinkraus'a görə günümüzdəki "jurnalistik və ya populyar ateizm hardasa ənənəvi kənd ateisti kimidir." Steinkraus jurnalistik ateistlərin və *ya başqa adla populyar ateistlə*rin bir çoxunun təkamülçü bioloqların mövqeyini dolğun şəkildə çatdırmaq üçün kifayət qədər savadlı olmadıqlarına diqqət çəkir, lakin bununla belə təkamülçü mövqeyi bir fanatik kimi müdafiə edirlər. Bunun sadəcə olaraq ataların dininə qarşı üsyan etmək olduğunu və bu cür ateistlərin ən yaxşısı psixoloqlar tərəfindən qarşılıq görməsi gərəkdiyini deyir, çünki onun nəzərində onların ateistik mövqeləri nadirən intellektual səbəblər üzərində durur, daha çox duyğusal reaksiyadır.[60]

Dinə bu qədər marağı olan bir kəsin dinlər haqqında dərin biliklərinin olduğunu *düşünə* bilərsiz. Əgər həyatının ən əsas hissəsini din və ədəbiyyat kritikasına həsr edirsənsə mütləq tənqid etdiyin obyekti xırdalığına qədər araşdıracaqsan. *Əfsuslar* olsun ki, bu gün dini tənqid edən ateistlərin əksəriyyəti dini biliklərdə ciddi qüsurlara yol verməkdən utanmırlar. Hitchens də istisna deyildir. Yazılarında ciddi xətalara yol verən Hitchens bu s*əriştə*sizliyində öz dostları arasında ən pis nümunə sayılmaz. Richard Dawkins bu işdə onu geridə qoyur. Mədəniyyət, incəsənət, tarix və sosioloji hərəkatlar barəsində yazıları və tənqidləri ilə tanınan m*əşhur akademik* Camille Paglia 2015-ci ildə "Salon" jurnalına verdiyi müsahibəsində neo-ateistlər haqqında fikril*ərini bölüş*ərkən bizim bu dediyimizi təsdiqləyir: "Mən onlara yeniyetmə kimi baxıram. "Parıldayan Surətlər" adlı sonuncu kitabımın

[57] Bax: E.J. Hobsbawm & Joan Wallach Scott, "*Political Shoemakers*", Past & Present, say: 89, səh: 86-114; Oxford University Press, noyabr, 1980
[58] G. K. Chesterton, "Father Brown: The Essential Tales", səh: 132; Modern Library Edition, New York, 2005
[59] M. Bishop, "A History of Cornell", səh: 6; Cornell University Press, New York, 1962
[60] Warren E. Steinkraus, "Taking Religious Claims Seriously: A Philosophy of Religion", səh: 102-103; Rodopi B.V., Amsterdam, 1998

müqəddiməsində deyirəm ki, “dinə *rişx*ənd etmək uşaqlıqdır, qüsurlu təxəyyülün əlamətidir.” Bu, onların valideynləri ilə əlaqəli olan davamlı yeniyetməlik vəziyy*ətini ifşa edir* – onlar dolayısına öz atalarına istehza edirlər.” Ümumilikdə neo-ateistlər haqqında fikrini bildirdikdən sonra Camille deyir: “Christopher Hitchens’in “Tanrı Böyük Deyil” kitabı təhrifedici bir parodiyadır. O, kitabını möhtəşəm fəsil başlıqlarına görə sata bildi… Bu, qorxunc bir əmək idi və bu, həmin adamın din haqqında danışa bilməyəcək qədər tam bir fırıldaq olduğunu nümayiş etdirdi. Görünür ki, etdiyi elmi araşdırma çox az olub. Dünyanın başqa dinləri bir kənarda qalsın, Hitchens heç yəhudi və xristian dinlərini yaxşı bilmirdi.”[61] Burada Camille xanımın əslində bir ateist olduğunu, üstəlik incəsənət və mədəniyyət tarixində bir araşdırmacı olduğunu xatırlamağımız lazımdır. Bu baxımdan onu qərəzli dindarlıqda ittiham etmək mümkün deyildir və bəlkə də Hitchens haqqında rəy bildirməyə ən uyğun olan kəslərdən biridir. Qarşıdakı sətrlərdə Camille’nin nə qədər haqlı olduğunu görmək şansımız olacaq.

Kitabının doqquzuncu f*əslinin girişində* dini mətnlərin tərcüməsində göst*ərilmiş* mühafizəkarlığı qınayan Hitchens deyir: “İntəhası nəzərə çarpan bir fakt vardır ki, bütün dinlər öz müqəddəs mətnlərinin insanların anlayacağı dillərə tərcümə olunması cəhdlərinə qarşı – Cranmer’in dualar kitabının xarakterizə etdiyi kimi - qətiyyətlə müqavimət göstəriblər… Ruhani təbəqəsinin tilsimi artıq qırılıb. Yalnız İslam dinində bir reformasiya olmayıb və bu günə qədər də Quranın istənilən yerli dilə tərcüməsi mütləq ərəbcə olan paralel mətn ilə çap olunmalıdır.” Bu məzmunu *tam* şəkildə oxuyan oxucu onun burada dinlərin hamısı haqqında eyni hökmü verdiyini görəcək. İddiaya əsasən xristian, yəhudi və müsəlman dininin xadimləri, müqəddəs mətnlərin tərcümə olunmasına qarşı tarix boyu müqavimət göst*ərmiş,* xristianlıqda və yəhudilikdə bu müqavimət əzmi qırılmış, amma müsəlmanlarda isə hələ də bu müqavimət davam edir*. Ümumi* şəkildə isə xristianlıq reformasiyadan keçib, amma İslam hələ də reform olunmayıb. Sözünü etdiyi Thomas Cranmer (1489-1556) İngiltərədə kilsə reformasiyasının lideri hesab olunur və anqlikan kilsəsinin Romadakı katolik kilsəsindən qopub ayrılmasında müstəsna xidmətləri olub. Cranmer’in irsi arasında liturgiyada istifadə olunan duaları latın dilindən ingilis dilinə tərcümə edərək hazırladığı kitab da yer alır. Cranmer 1556-cı ildə katolik kraliça Mariya Tüdor tərəfindən “bir dönük və siyasi üsyankar kimi” edam edildi; “o, Mariya’nın taxta keçməsinin qarşısını almaq üçün çox fəal çalışmışdı.”[62] Hitchens həmişəki kimi siyasi zəmində *baş vermiş hadis*ələri yalnız dini çalarda təqdim etməyə çalışır. İngilis dövlətinin roma kilsəsinin nüfuzundan qurtulması və

---

[61] David Daley, “*Camille Paglia Takes on Jon Stewart, Trump, Sanders: “Liberals Think of Themselves as Very Open-minded, But That’s Simply Not True*”, Salon, 29 iyul, 2015

[62] Hans J. Hillerbrand, ”A New History of Christianity”, səh: 194; Abingdon Press, Nashville, 2012

öz ölkəsinin müstəqil kilsəsini qurmaq cəhdləri dini yox, daha çox siyasi bir konfliktdir. Bunun dindən daha çox İngilis kralı s*əkkizinci Henry'nin* şəxsi həyatı ilə əlaqəsi var idi.[63] Müqəddəs kitabların tərcüməsinə gəldikdə isə Bibliya hələ birinci əsrdə arami dilinə, ikinci əsrdə yunan dilinə, qədim latın dilinə, üçüncü əsrdə suryani dilinə, dördüncü əsrdə koptik misirlilərin dilinə, qədim alman və latın dillərinə tərcümə *olunmuşdu. Beşinci* əsrdə isə erməni, efiopiya və gürcü dillərində bibliyanın tərcümələri mövcud idi. Həmçinin səkkizinci əsrdə qədim nubiya dilinə, doqquzuncu əsrdə qədim slavyan dilinə və onuncu əsrdə isə ərəb dilinə tərcümə *edilmişdi.*[64] Əslində Bibliyanın tərcümə edilməsi fikrinin özünə qarşı bir müqavimət yox idi, bu tərcümənin rəsmi ruhani dairələrdən başqaları tərəfindən edilməsinə qarşı qadağa var idi. Bibliya tarixçisi William Hamblin qeyd edir ki, Bibliyanın tərcümə edilməsi "heç də sadəcə müasir bir fenomen deyildir."[65] Hitchens öz iddiasını dəstəkləmək üçün hətta b*əzi tarixi* şəxsiyyətləri yandıraraq öldürür. "Wycliffe, Coverdale və Tyndale kimi imanlı adamlar" – Hitchens deyir – "erkən tərcümələrə cəhd etdikləri üçün diri-diri yandırılıblar."[66] H*ər şeydə*n əvvəl ona diqqət çəkməyimiz lazımdır ki, Hitchens bununla öz ayağına atəş açır, özü öz tezisini çökürdür. John Wycliffe, William Tyndale və Myles Coverdale'in hər üçü də din alimi və kilsə xadimi olublar. *Əgə*r Bibliyanı ingilis dilinə tərcümə ediblərsə deməli tərcümə üçün mübarizə aparanlar da elə dindarların özləri olublar. Üstəlik *Hitchens'in bu üç kişini diri*-diri yandırmasına baxmayaraq onların heç biri iddia olunduğu kimi diri-diri yandırılmayıb. John Wycliffe 1384-cü ildə ikinci dəfə iflic olaraq öz doğma qəsəbəsində, Lutterworth'da bu dünyaya vəda edib.[67] O, roma-katolik kilsəsini tənqid etdiyi üçün, Roma papası haqqında ağır ifadəl*ər işlə*tdiyi üçün kilsə tərəfindən 1415-ci ildə, yəni ölümündən 31 il sonra küfrdə ittiham edilib və sümüklərinin qəbrindən çıxarılaraq yandırılmasına qərar verilib. Yalnız 1427-ci ildə bu qərar icra edilir. Bibliyanı tərcümə etdiyi üçün diri-diri yandırılmayıb, sadəcə olaraq roma kilsəsinə qarşı apardığı mübarizəyə görə öldükdən sonra sümükləri yandırılıb. Onu da əlavə edək ki, bu gün Wycliffe Bibliyası adı ilə tanınan tərcümə əslində heç də onun özünün tərcüməsi deyildir. Bruce Metzger'ə görə "müqəddəs mətnlərin tərcüməsində *Wycliffe'in bir başa*

---

[63] David Loades, "The Religious Culture of Marian England", səh: 85; Routledge, Oxon/New York, 2016

[64] Bax: David Noel Freedman, "Anchor Bible Dictionary", cild 6, səh: 787-851 Doubleday, New York, 1992; həmçinin bax: Bruce M. Metzger, "The Bible in Translation", MI: Baker Academic, Grand Rapids, 2001

[65] Richard Seymour, "Unhitched: The Trial of Christopher Hitchens", səh: 63; Verso, London, 2012

[66] GIG, səh: 125

[67] Gale Heide, "Timeless Truth in The Hands of History: A Short History of System in Theology", səh: 100; Pickwick Publications, Eugene, 2012

*iştirak etmə*si sual altındadır…"[68] Bir tək Tyndale həqiqətən də yandırılıb, amma Hitchens'in dediyi kimi diri-diri yandırılmayıb, "bir alim olaraq fərqləndiyi üçün" boğularaq öldürülüb və cəsədi yandırılıb.[69] Myles Coverdale isə Bibliya'nı bir neçə buraxılışda tərcümə edib, Avropanın fərqli universitetlərində teologiyadan dərslər verib, İngiltərədə hakimiyyət dairələri tərəfindən tərcümələrində dəstək görüb[70] və 1569-cu ildə öz əcəli ilə ölüb. Nə dirisini, nə də ölüsünü yandırmayıblar. İşin həqiqətində buradakı mübarizə siyasi bir mübarizə idi, hegemonluğu qorumağa çalışan katolik kilsəsi ilə Roma ruhaniliyindən qurtulmağa çalışan müstəqil kilsələr arasında gedən müharibə idi. Doğrudur ki, müqəddəs mətnlərin xalq dilində tərcümə edilməsi Kilsə tərəfindən qadağan edilirdi, lakin bu, həqiqəti tam bir şəkildə əks etdirnir. H*ər şeyd*ən əvvəl ona diqqət çəkmək istəyirik ki, bu qadağanı çeynəyənlər və buna müxalif davranaraq tərcümə edənlər də yenə din xadimləri özləri olublar. İkinci və daha önəmli olan nöqtə budur ki, müqəddəs mətnlərin *başqa dillə*rə tərcümə edilməsi Kilsə nəzərində bir günah deyildi, bu qadağanın arxasında tamamilə *başqa bir m*əntiq dururdu; Kilsənin öyrətdiyi doktrinalara, yəni ortodoksluğa müxalif olan dönük fikirlər əsasən bu cür Bibliya tərcümələri vasitəsi ilə yayıldığı üçün Kilsə tərcümə *işi üzə*rində kontrolu saxlamağa çalışırdı. Tyndale və Wycliffe'in tərcümələrini qadağan edən ruhaniyyət, digər tərəfdən özü – ehtiyac gördükdə - Bibliyanı başqa dillərə tərcümə edirdi və ingilis dilində bunun ən mə*şhur* misalı Douay-Rheims Bibliyasıdır.[71] Bibliya kitabının özündə müqəddəs mətnləri tərcümə etməyi qadağan edəcək heç bir göst*əriş* yoxdur. Dini tənqid edəcək adam məsələyə bu tərəfdən baxmalıdır. Səltənətin sahiblərinə *çevrilmiş* din xadimləri o *dövrün* şərtlərinə uyğun olaraq öz səltənətlərini qorumaq üçün hər bir aləti sui-istifadə ediblər. Müsəlman dünyasına gəldikdə isə vəziyyət fərqli olub. Xristian dünyasında mülki səltənət ilə ruhani səltənət arasında, saray ilə kilsə arasında mübarizə getdiyi halda İslam dünyasında səltənət yalnız saraya aid olub. Tarixin fərqli dövrlərində milyonlarla müsəlmanın üzərində ruhani hakimiyyətə sahib olan bir obraz olmayıb, yəni bizdə "bağdad papası" kimi ali ruhani rütbə mövcud deyildi. İran İslam Respublikası tarix səhnəsinə çıxana qədər İslam dünyasında heç bir dövlət ruhani vəzifə sahibləri tərəfindən idarə olunmayıb və sözün həqiqi mənasında teokratik bir dövlət olmayıb.[72] Bu gün İranın simasında fəaliyyət

---

[68] B. M. Metzger, "The Bible in Translation: Ancient and English Versions", səh: 57; Baker Adademic, Grand Rapids, 2006

[69] David Teems, "Tyndale: The Man Who Gave God An English Voice", səh: 258; Thomas Nelson, Nashville, 2012

[70] B. M. Metzger, "The Bible in Translation: Ancient and English Versions", səh: 60-61; Baker Adademic, Grand Rapids, 2006

[71] Allan K. Jenkins & Patrick Preston, "Biblical Scholarship and The Church", səh: 224; Ashgate Publishing, Hampshire, 2007

[72] Seyyed Hossein Nasr, "The Heart of Islam: Enduring Values for Humanity", səh: 148-149; Harper Collins, New York, 2004

göstərən model isə əslində müasir bir fenomendir və h*ətta şiə*lərin çoxu tərəfindən qəbul olunmur.

Hitchens'in Bibliya tərcümələri haqqındakı bilikləri o qədər qüsurludur ki, hətta kitabında tərcümələri bir-biriləri ilə qarışdırır. Kitabında Reformasiya və tərcümələr haqqında danışarkən deyir: "*Əgər* Bibliyanın "vulqata" versiyasına keçirmək üçün *verilmiş uzun mübarizə* olmasaydı və beləliklə də ruhani monopoliyası qırılmasaydı heç bir Protestant Reformasiyası baş verm*əyəcə*kdi."[73] Hitchens elə güman edir ki, "Vulgata" reformistlərin alman dilinə və digər yerli dillərə etdikləri tərcümələrdir.[74] Həqiqətdə isə "Vulgata" Bibliyanın miladdan sonra dördüncü əsrdə latın dilinə *edilmiş t*ərcüməsidir, yəni bu tərcümə Martin Luther'dən on bir əsr öncə mövcud idi və katolik kilsəsi tərəfindən istifadə olunurdu. Sadə xalq Bibliyanı latın dilində oxuya bilmirdi və reformistlər əslində ruhani monopoliyasını sadə tərcümə ilə qırmağı məqsəd güdmürdülər. Çünki Bibliyanın alman dilində tərcüməsi hələ Martin Luther'dən öncə var idi. 1350-ci ilə aid edilən Augsburg Bibliyası yeni əhdin tərcüməsidir. Hələ Martin doğulmadan öncə 1466-cı ildə Johannes Mentelin almanların yerli xalq dilində tərcüm*əsini Strasbourg* şəhərində *çap etmişdi. 1518*-ci ilə qədər Mentel bibliyası olaraq tanınan bu tərcümə ən azından 13 dəfə yenidən n*əşr edilmişdi.* Reformasiyanın həyata keçməsi Bibliya kitabının tərcüməsindən asılı deyildi və görünür ki, Hitchens bu barədə çox məhdud təsəvvürə malikdir. Üstəlik o dövrdə avropalıların arasında oxumaq və yazmaq səviyyəsi çox aşağı idi və adi insanlar kitab oxuya bilmirdilər. Reformasiyanı mümkün edən əsas faktorlar tamamilə *başqa idi.* Tərcümənin olmaması əsas amil deyildi. Yalnız latın dili bilikləri zəiflədikdən sonra yerli dillərdə tərcümələrə ehtiyac yaranmağa başladı. Hətta bu zaman belə ciddi bibliya tədqiqatının latın dilində aparılması əksəriyyət tərəfindən qəbul edilirdi. 1305-ci ildə Dante'nin yarımçıq buraxdığı "De Vulgari Eloquentia" adlı essedə o, yerli dillərdə yazının önəmini mübahisə edirdi. Dante bu əsərinin özünü belə latın dilində yazmışdı və bu bir daha onu göstərir ki, savadlı kütlə arasında yayğın olan dil latın dili idi. Digər tərəfdən o dövrlərdə artıq yerli dildə ədəbiyyatın ortaya çıxması üçün lazım olan şərtlərin tədricən əmələ gəldiyini görürük.

Quran və digər dini mətnlərin tərcümələrinə gəldikdə isə bu, müsəlmanlarda çox erkən zamandan başlayır. Muhəmməd peyğəmbərin silahdaşlarından biri olan Salman Farisi fars dilli kütlə üçün fatihə surəsini tərcümə *etmiş*di. Quranın ilk tərcümələri və təfsirləri də fars dilində olub. Misal üçün biz bilirik ki, mötəzili

[73] GIG, səh: 125

[74] Etiraf etməliyəm ki, Hitchens'in kitabının əksər çap versiyasında burada "Vulgata" yerinə vernakulyar sözü keçir. "Vulgata" burada çap xətası da ola bilər. Bizim istifadə etdiyimiz n*əşrdə, yəni New York* şəhərindəki Hachette Book Group'a aid olan Twelve nəşriyyatının 2009-cu ildə çap etdiyi versiyada "Vulgata" keçməkdədir.

alimlərindən *Əbu Əli Cubbə*i ( m.s. 849-915) Quranı fars dilində tə*fsir etmişdi.*[75] 819-999-cu illər arasında Xorasan və Məvərənnəhr torpaqlarını idarə *etmiş* Səmanilər sülaləsinin sultanlarından olan Mənsur bin Nuh'un tələbi ilə Tabərinin təfsir kitabı fars dilinə tərcümə *edilmişdi.*[76] Carl W. Ernst üstəlik qeyd edir ki, həmin bu farsca tərcümə daha sonra türk dilinə tərcümə *edilmişdi və* "zəruri olaraq Quran mətninin o dillərə verbal tərcüməsini də özündə daşımalı idi."[77] Miladdan sonra 10-cu və 11-ci əsrlərə aid müəllifləri məchul olan bir çox Quran tərcüməsi bizim zamanımıza qədər gəlib çatıb. Bu əlyazmalardan biri Cambridge universitetində*, bir başqa* əlyazma İstanbuldakı Fateh kitabxanasında saxlanılır. 908-ci ilə aid daha bir tərcümənin müəllifi isə Muhəmməd bin Fəzl olaraq bilinir. Daha sonrakı əsrlərdə də Qurana fars dilində xeyli xidmət olunub. Miladdan sonra 1079-cu ildə v*əfat etmiş fars müsəlman alim Şahfur* bin Muhəmməd İsfərayini "Təcut-Təracim fi Təfsiril-Quranil-Kərim lil-*Əacim" ad*ında farsca təfsir kitabı yazıb və həmin kitab Tehranda çap olunub.[78] Ondan on il sonra v*əfat etmiş bir başqa* fars dilli müs*əlman alim Şeyxulislam Abdullah H*əravi də fars dilində təfsir kitabı qələmə alıb, lakin təəssüf ki, kitabın bu gün əlyazmaları tapılmır. 1141-ci ildə vəfat *etmiş və* Qivamus-Sunnə ləqəbi ilə tanınan isfahanlı İsmail bin Muhəmməd Təmimi də fars dilində bir neçə cilddən ibarət təfsir kitabı yazıb. Quranın tərcümələri və təfsirləri erkən əsrlərd*ən başlayaraq fars, türk, urdu, malay və başqa* dillərdə edilib və bunların bir çoxu ərəbcə orijinal mətn olmadan basılıb.[79]

Burada bir qədər Əndəlüsdə yerli ispan dilində yazılmış islam ədəbiyyatı ilə tanışlıq verməyimiz lazımdır. Daha geniş məlumat üçün Gerard Albert Wiegers'in yazdığı "Islamic Literature in Spanish and Aljamiado" adlı kitaba müraciət etmək olar. İspan dilində dini mətnlərin ortaya çıxması rekonkista hərəkatı il*ə paralel baş* vermişdi. Xristian krallıqların müsəlmanlardan ələ keçirdikləri torpaqlarda *yaşama*ğa davam edən müsəlmanlar tədricən ərəb dilindən uzaqlaşırlar. Bir müddət sonra yerli dillərdə mətnlərin yazılmasına ehtiyac yaranır. Burada o dövrün savadlılıq səviyyəsini də nəzərə almağımız lazımdır, çünki kitab oxumaq çox xüsusi bir qrupun imtiyazı idi və biz bu ehtiyacdan danışarkən onları qəsd edirik. Bu tərcümə *işində* xüsusilə Yça Gidelli adlı müsəlman alim haqqında danışmadan keçmək olmaz. Yça de Gebir Gidelli 15-ci əsrin ortalarında Madrid şəhərindən 70 km aralıda şimal-qərb istiqamətində yerləşən Segovia qəsəbəsində

---

[75] İbn Asəkir, "Təbyin Kəzbil-Muftəri", səh: 138;

[76] Hamid Dabashi, "The World of Persian Literary Humanism", səh: 59-60; Harvard University Press, Cambridge, 2012

[77] Carl. W. Ernst, "How To Read The Qur'an: A New Guide, With Select Translations", səh: 68; University of North Carolina Press, 2011

[78] *Əhm*əd bin Muhəmməd ər-Rumi, "Tabəqat əl-Mufəssirin", səh: 419; Məktəbətul-Ulum val-Hikəm, Riyad, 1997

[79] Jane D. McAuliffe, "Encyclopedia of The Quran", cild: 5, səh: 340-358; Brill, Boston, 2006

yaşayıb. Onun dəqiq doğum tarixi barəsində tarixçilər məlumatsızdırlar. Yça de Gebir Gidelli çox ehtimal ki, ərəb dilindəki İsa bin Cabir Şazili adının ispanlaşdırılmış versiyasıdır. Fərqli ədəbiyyatlarda Gidelli nisbəti ispan dilində Guidili, Cidili və ya Xadel olaraq da qeyd edilir. Yça Gidelli ərəb dilində və şəriət elmlərində təlim görmüş ispaniyalı müsəlman din alimi olub. Hətta onun Segovia *da baş müfti və* qazi kimi fəaliyyət göstərdiyini dəstəkləyəcək tarixi dəlillər mövcuddur.[80] O, ispan ədəbiyyatında Quranı qədim ispan dilinə, daha dəqiq desək kastiliya ispancasına çevirməklə tanınır. Həmin tərcümənin itirilmiş olduğu deyilir. G.A. Wiegers isə tərcüm*ənin Toledo* şəhərindəki ictimai kitabxanada mövcud olduğunu söyləyir.[81] O, 1455-ci ildə xristian din alimi Juan de Segovia'nın dəvəti ilə Fransadakı Savoy şəhərinə səyahət edir və orada bir yerdə üç dildə Quran tərcüməsi hazırlayırlar. Yça onu ərəb dilindən ispan dilinə tərcümə edir, Juan isə ispan dilindən latın dilinə tərcümə edir. Müsəlman bir alim ilə xristian alimin arasında tamamilə könüllü zəmində *baş vermiş bu* əməkdaşlıq dünya tarixində özünə əlahiddə bir yer tapmış hadisədir. Beləliklə də 1455-1456-cı illər arasında Yça Gidelli ispan dilinə Quranı tərcümə edir və özü ilə onun bir nüsxəsini Segovia şəhərinə aparır. 1462-ci ildə isə ispan dilində sünnətin hökmlərini əhatə edən "Breviario Sunni" və ya " Breviario Segoviano" adlı bir mətn hazırlayır. Bu mətn daha sonra ispan inkvizisiyası tərəfindən diqqətlə öyrəniləcək və müsəlmanların təqibində alətə çeviriləcəkdi,[82] çünki 16-cı əsrdə üzdə katolikliyi q*əbul etmiş keçmiş* müsəlmanların, yəni "moriskoların" arasında gizli müsəlmanları tapmaq üçün müsəlman adətlərini öyrənməyə ehtiyac hiss edirdilər. 1609-cu ildə İspaniyadan tamamilə qovulana qədər onlara islam kitablarını saxlamaq qadağan edilmişdi, hətta əllərə və saçlara xına qoymaq, ictimai hamamlarda çimmək və ya evində hamama sahib olmaq qadağan *edilmişdi*.[83] Bütün bunlara baxmayaraq Yça Gidelli'nin ispan ədəbiyyatındakı əməyi müasir tədqiqatçılar tərəfindən etirafla qarşılanır və Segovia'da bu gün belə Calle de Yza Gidelli adı ilə bilinən küçə yerləş*ir və* həmin müsəlman alimin adını daşıyır. İspan dilində Quran tərcümələri bundan sonra daha geniş yayılıb və əsasən 16-cı və 17-ci əsrlərə aid olan "aljamiado" ədəbiyyatında bununla qarşılaşırıq. Aljamiado ədəbiyyatı isə ispan dilində, lakin ərəb əlifbası ilə yazılmış mətnlərə deyilir. Xüsusilə də 1606-cı ildə Aragon əyalətinin Villafeliche kəndinə g*əlmiş bir moriskonun k*ənd əhalisindən

---

[80] Ana Echevarria, "Knights on The Frontier: The Moorish Guard of The Kings of Castile", səh: 189; Brill, Leiden, 2009

[81] Gerard Wiegers, "Islamic Literature in Spanish & Aljamiado: Yça of Segovia (fl.1450), His Antecedents & Successors", səh: 108-114; E.J. Brill, Leiden, 1994

[82] Gerard Wiegers, "Islamic Literature in Spanish & Aljamiado: Yça of Segovia (fl.1450), His Antecedents & Successors", səh: 118; E.J. Brill, Leiden, 1994

[83] Mercedes Garcia-Arenal & Fernando Rodriguez Mediano, "The Orient in Spain: Converted Muslims, The Forged Lead Books of Granada and The Rise of Orientalism", səh: 166; Brill, Leiden, 2013

aldığı Quranın aljamiado tərcüməsindən latın hərflərinə köçürdüyü əlyazma bu günə qədər qalır.[84] *Əslində* bu ispaniyalı müsəlmanın köçürdüyü Quran daha əvvəl sözünü etdiyimiz Gidelli tərcüməsidir və Toledo kitabxanasında saxlanan əlyazma da məhz həmin tərcümənin ispan dilində, latın hərfləri ilə köçürülmüş versiyasıdır. Onu da qeyd edək ki, İberiya yarımadasında ispan dilində Quran tərcüməsinə ehtiyacın ortaya çıxması ərəb dilinin zəifləməsinə görə idi.[85]

Ümumilikdə Quran kürd, türk, fars, alban, bosniya, çin[86], urdu, sindi və *başqa* dillərə tərcümə olunub. Hitchens burada tərcümənin özündən çox tərcümə ilə paralel olaraq ərəbcə orijinalın da verilməsini problem edir. Amma bunun nə üçün problem olduğunu doğrusu başa düşməkdə çətinlik çəkirəm. Müsəlmanların məgər Quranın orijinal dilinin ərəb dili olduğuna, həqiqi Quranın yalnız ərəb dilində ola biləcəyinə və digər tərcümələrin Quranın tam haqqını verə bilməyəcəyinə inanmaqları ciddi bir problemdirmi?! İtalyanlar eyni səbəblə bu fikri belə ifadə edirlər: tradire □ tradure. Yəni "tərcümə etmək xəyanət etmək deməkdir". Mənim səmimi rəyimdir ki, Hitchens'in öz kitabını bizim azərbaycan dilinə çevirməklə içindəki ingilis dilinə xarakterik olan yumorları, kinayələrin haqqını vermək imkansızdır. Onun dinə qarşı başlatdığı ironiya müharibəsini tam *başa düşmə*k üçün orij*inaldan oxumaq* şərtdir. Quran tərcüməsinə qarşı yönəltdiyi tənqiddə ən əsas hissə budur ki, guya tərcümələrdə paralel olaraq ərəb dilində mətnin olması da şərtdir. Əlbəttə ki, bunun doğru olub olmadığını yoxlamaq çətin *bir iş deyildir*. Bu, sadəcə olaraq nə*şriyyat şirk*ətlərinin seçimindən asılıdır. *Hitchens'in bu* şəkildə əsassız iddiaları az deyildir. Bütün bunların işığında sizcə onun Səudiyyə sponsorlu Quran tərcümələrinin yayılmasından şikayət etməsini necə dəyərləndirməliyik?! "Bununla bərabər başıboş multikulturalizm də buna öz töhfəsini verdi və bütün vasitəsələr arasında Amerikanın həbsxana sistemində istifadə edilməsi üçün Quranın kütlə*vi şəkildə çap edilmiş ucu*z səudiyyə buraxılışının paylanmasını təmin etdi. Bu vahhabi mətnləri xristianlara, yəhudilərə və dinsizlərə qarşı müqəddəs müharibəni tövsiyə etməkdə orijinaldan da daha irəli getdi." Hitchens'in sözlərində – hə*r şeyd*ən öncə - bir isteriya, sonra isə səmimiyyətsizlik sezmək olur. Bir tərəfdən müqəddəs mətnlərin tərcüməsinə qarşı dini institutların çıxmasını qınayır, digər tərəfdən isə bu tərcümələrin yayılmasında *multikulturalizmin rolundan şikay*ətlənir.

---

[84] Consuelo Lopez-Morillas, "The Quran in Sixteenth-Century Spain: Six Morisco Versions of Sura 79", səh: 20; Tamesis Books Limited, London, 1982

[85] Pier Mattia Tommasino, "The Venetian Qur'an: A Renaissance Companion to Islam", səh: 8; University of Pennsylvania Press, Philadelphia, 2018; Sylvia Notini tərəfindən orijinal italyan dilindən ingiliscəyə tərcümə edilib.

[86] Müsəlman dünyasında Abdulqayyim Ruhuddin Yusuf adı ilə tanınan çinli müsəlman alim Yusuf Ma Dexin ( m.s. 1794-1874) Quranı çin dilinə tərcümə edib.

Onun dinlər barəsində cahil iddiaları təkcə İslam dinində dayanmır, əksinə aid olduğu yarımkürədə ənənəvi olaraq yaşanılmış xristian və yəhudi dinləri haqqında da eyni xətalara yol verir. Hətta bəzən xurafat olduğu bilinən iddiaları belə kitabına alıb. Kitabının ilk çapında o, yəhudilərin cinsi həyatını gülü*ş obyekti etmə*kdən ötrü onlar haqqında "şəhər əfsanəsinə" çevrilmiş bir iddianı təkrarlayır; guya yəhudilər cinsi əlaqəyə girərkən *dö*ş*ə*kağında bir deşik açırlar və *o deşik vasitə*si ilə bir-biriləri ilə *sevişirlə*r. Doğrudur ki, 2007-ci ildə "Vanity Fair" jurnalında nə*şr etdiyi bir* məqaləsində buna görə yəhudilərdən üzr istədi və kitabın yeni çapında o xətasını düzəltdi.[87] Amma belə bir xəta sizcə nədən xəbər verir? Özünü də ana tərəfdən yəhudi hesab edən Hitchens kimi bir jurnalist bir az əziyyət çəkib yəhudi dinini – təməlli demirəm, heç olmasa kafi miqdarda - öyrənməyib. Xeyr, heç rudimentar bir araşdırma belə etməyib. *Əksinə* dinlər haqqında əlinə keçən və asanlıqla istehzaya çevirə biləcəyi hər bir məlumatı kitabına almaq meyli göstərir. Ondakı bu meyli "dindar" Pakistan haqqında yazdığı bir səfsətədə görə bilirik. "Pakistanın QİÇS Kontrol Proqramında çalışan bir məmur" – Hitchens yazır - "2005-ci ildə Foreign Policy jurnalına (verdiyi müsahibədə) deyir ki, "daha yaxşı sosial və islami dəyərlərə" görə problem onun ölkəsində daha kiçikdir. Bunu, elə bir dövlət haqqında deyir ki, orada qardaşın törətdiyi cinayətin xəcalətini aradan qaldırmaq üçün onun bacısına qrup tərəfindən zorlanmaq hökmünü kəsməyin qanun ilə icazəlidir."[88] Bunun yalan olduğunu anlamaq üçün nə hüquqçu, nə də jurnalist olmaq lazım deyildir. Dünyanın heç bir yerində qanun günahsız qadının qrup tərəfindən zorlanmasına icazə vermir. Belə bir şeyi yalnız ən çılğın və ən təəssübkeş ağıl uydura bilər. Pakistanda əksinə zorlamaya görə ölüm hökmü *dü*şür. Pakistan haqqında yayılan bu təsəvvür əslində bəzi pakistanlı müəlliflərin yazdıqları kitablar və Qərbin informasiya vasitələrinin bu kitabları kütləviləş*dirmə*k üçün hazırladıqları media materiallar vasitəsi ilə formalaşıb. Muxratan Bibi kimi pakistanlı qadının öz başına gələnləri kitabında yazması ilə Pakistan haqqında belə bir fikir yayılmağa başladı, ingilis dilli dünyanın oxucuları bu "qrup zorlaması" hadisəsini bir normaya çevirdi; sanki Pakistan cəmiyyətində bu, qəbilə adətinin bir hiss*əsi imiş.* Hitchens kimi ateist müəlliflər isə daha da irəli getdilər və gördüyümüz kimi bunu artıq Pakistanın qanun məcəlləsinə daxil ediblər. Əslində isə belə bir təsəvvür həqiqəti əks etdirmir. "Pakistanda yaxın tarixdə bu cür kollektiv zorlama halları baş veribmi?" sualına cavab verən North Texas universitetinin pakistanlı professoru Masood Ashraf Raja deyir: "Bəli, çox uzaq bölgələrdə *(baş verir)* və hər dəfə mədəni qanunların pozulması və əxlaq normalarından uzaqlaşmaq kimi

[87] Christopher Hitchens, "*God Bless Me, It's A Best-Seller!*", Vanity Fair, 15 avqust, 2007
[88] "GIG", səh: 46;

(dəyərləndirilir), lakin bu, heç bir zaman zəruri olaraq bir norma olmayıb."[89] Həqiqət budur ki, hansısa qadını zorlamağa görə Pakistan qanunu ölüm hökmü kəsir[90], qardaşının cinayətinə görə bacısına zorlama hökmünün kəsilməsinə icazə vermir. Hitchens'in oxucusuna sırımağa çalışdığı bu "məlumat" yalandır, lakin bunu üstəlik "islami dəyərlər" məzmununda təqdim etməsi bu yalana ürəkbulandırıcı bir çirkinlik qatır.

"Görünür ki, iddia olunana əsasən Muhəmməd peyğəmbərin dediyi və müsəlman təlimləri ilə barışdırılması çətin olan bəzi sözlər mövcuddur. Quran alimləri bu çevrəni çərçivələş*dirməyə* cəhd edərək bu hallarda peyğəmbərin özü də istəmədən Allahın deyil, şeytanın buyuruğunu qəbul etdiyini deyiblər. Orta əsrlərin ən dolanbac xristian apologetika məktəbini belə utandırmayacaq bu kələk, müqəddəs yazı ilə ədəbiyyat arasındakı əlaqələri araşdırmaq üçün bir novelistə əla bir imkan sağlamışdı. Lakin hərfi zehniyyət kinayəli zehniyy*əti başa düşmür və* bunu hər zaman təhlükə qaynağı kimi görür. Üst*əlik Rüşdi bir müs*əlman kimi *böyüdülmüşdü və* Quranı anlayırdı, bu isə öz növbəsində onun mürtəd olması mənasına gəlirdi. Mürtədlik isə Qurana görə ölüm ilə cəzalandırılır."[91] Bu sözləri Hitchens - ultrakrepideryanizmin çempionu olaraq – dinin öldürücü olduğunu sübut etmək üçün gətirir. "Çevrəni çərçivələş*dirmə*k" ifadəsi ingilis dilində həddindən artıq çətin və ya imkansız bir işə *girişmə*k mənasını verir. Sanki "şeytan ayələri" adı verilmiş hadisəyə müsəlman alimlərinin verməyə çalışdıqları izah, çevrəni çərçivələş*dirmək üçün edilmiş bir c*əhddir. Hitchens'in cahil olduğu nöqtə isə əslində budur ki, müsəlman alimlər bəzi kitablarda keçən bu xəbərin əslən uydurma olduğunu deyiblər. Hələ doqquzuncu və onuncu əsrlərdə yaşamış məş*hur* alim *Əbu M*ənsur Maturidi ( m.s. 853-944) "Təvilət *Əhlis*-Sunnə" adlı təfsirində şeytanın peyğəmbərin dilinə hansısa sözlər atması hadisəsinin xurafat olduğunu izah edirdi. Bir digər Quran alimi İbn Cəvzi ( m.s. 1126-1200) təfsir kitabında deyir: "Mütəxəssis alimlər deyiblər ki, bu (xəbər) doğru deyildir."[92] Onun müasiri Fəxruddin Razi (1149-1209) isə təfsir və tarix kitablarında bu xəbərin yer almasını şərh edərkən deyir: "Bu (xəbər) səthi bilikləri olan təfsirçilərin əksəriyyətinin rəvayətidir. İşinin ustası olan alimlərə gəldikdə isə deyiblər ki, bu rəvayət batildir və uydurmadır." ər-Razi bir neçə sətr sonra bu alimlərinin sözlərinə yer verərək deyir: "Sünnətə gəldikdə isə Muhəmməd bin İshaq bin Xuzeymə'dən rəvayət olunur ki, ondan bu hekayə haqqında soruşublar və o, - "bu, zındıqların uydurmasıdır" – deyib və bu barədə bir kitab yazıb. İmam *Əbu B*əkr *Əhm*əd bin

---

[89] Aroosa Kanwal & Saiyma Aslam, "The Routledge Companion to Pakistani Anglophone Writing", səh: 356; Routledge, Oxon/New York, 2019
[90] Rubya Mehdi, "The Islamization of The Law in Pakistan", səh: 123; Routledge, Oxon/New York, 2013
[91] GIG, səh: 29;
[92] "Zədul-Məsir fi İlmit-Təfsir", 3/245;

Həsən Beyhəqi də deyib ki, bu hekayə nəql baxımından sabit deyildir."[93] Qısa bir araşdırma göstərəcək ki, *Əbu Bə*kr Bəzzar (vəfatı m.s. 905), İbn Xuzeymə (m.s. 837-923), *Əbu Cə*fər Nəhhəs (vəfatı m.s. 949), *Əbu Bə*kr Beyhəqi (m.s. 994-1066), Qadi Əbu Bəkr İbn Arabi (m.s. 1076-1148), Qadi İyad bin Musa (m.s. 1083-1149), *Əbu Abdillə*h Qurtubi (m.s. 1214-1273), Nasiruddin Beydavi (vəfatı m.s. 1286), İbn Kəsir (m.s. 1301-1373), Bədruddin Ayni (1360-1453) və daha bir çox tarix və təfsir alimləri bu hekayənin doğru olmadığını deyiblər. Ümumiyyətlə ömrünü bütlərə qarşı mübarizəyə həs*r etmiş* şəxsiyyətin bütpərəstləri razı salmaq üçün onların üç bütünü təriflməsi mümkündürmü?! Hitchens bu kitabın müsəlmanlardan nə üçün bu qədər etiraza səbəb olmasını anlamaqda çətinlik çəkir, çünki onun dünyasında həqiqi mənada "müqəddəs" deyilə*n bir şey yoxdur. Lakin müsə*lmanlar onun dünyasında yaşamırlar. "Axı dindar insan kinayənin, satirik üslubun nə olduğunu hardan bilsin?!" – deməklə *Hitchens öz dostu Salman Rüşdini göy*lərə qaldırmağa, dindarları isə alçaltmağa çalışır. Bu hindistanlı müəllifin yazdığı kitabdakı xarakterlərdən birinə Mahound adını verib və məlumdur ki, Mahound adını İslam peyğəmbəri üçün ilk dəfə istifadə edənlər – Edmund Spenser və Alexander Pope – bununla onun saxta bir peyğəmbər olduğunu qəsd edirdilər; orta əsrlərdə ibadət olunan büt mənasında qəbul edilirdi.[94] Hicab mənasına gələn "Curtain" adındakı əxlaqsızlıq yuvasında çalışan qadınlara isə İslam peyğəmbərinin pak və iffətli həyat yoldaşlarının adlarını verir. Görəsən bütün bunlardan sonra *Rüşdi* və onun dostu Hitchens müsəlmanlardan alqış gözləyirdi?! Onun kitabı müsəlmanları təhqir etmək cəhdidir və fə*rqli* şəxslərin müəllifini müdafiə etmək məqsədi ilə gətirdiyi üzrlər mənasızdır. Carl Ernst də yaxşı qeyd edir ki, kitabının içində yazdıqları onun gətirdiyi üzrlərə bəraət qazandırmağa mane olurdu.[95] Amma Xomeyni'nin – bəlkə də kitabı heç oxumamışdı - populistik fətvasından sonra Rüşdi məşhurlaşdı, müzakirə obyektinə çevrildi, kitabı da gözlənilməyən maraq əldə etdi. Hitchens *Rüşdinin* müsəlman kimi böyüdüyünü və Quranı anladığını deməklə əslində onun cinayətini göst*ərmiş* olur; müsəlmanların arasında böyüyən biri bu addımın nə dərəcədə müsəlmanları təhqir edəcəyini, onlara psixoloji zərbə vuracağını gözəl bilməlidir. Əgər bununla belə bu cür bir kitabı yazmaq qərarına gəlirsə bununla öz məqsədinin çirkinliyini *ortaya qoymuş olur.* Hitchens'in cahilliyini də şərhsiz buraxa bilmərik. Dinləri tənqid etməyi özünə *peşə* seçmiş adamın mütləq dinləri yaxşı bir şəkildə araşdırması lazımdır. Hətta – "mürtədlik isə Qurana görə ölüm ilə cəzalandırılır" – iddiasını oxuyarkən bilirsən ki, bu jurnalist ev tapşırığını etməyib. Qısa bir

---

[93] "Məfətihul-Ğayb", 23/237;
[94] Jonathan E. Brockopp, "The Cambridge Companion to Muhammad", səh: 28;; Cambridge University Press, New York, 2010
[95] Carl W. Ernst, "Following Muhammad: Rethinking Islam in The Contemporary World", səh: 98; The University of North Carolina Press, Chapel Hill, 2003

araşdırma etsəydi görəcəkdi ki, mürtədlik haqqında Quranda belə bir hökm yoxdur.

Kənd ateistləri arasında yayğın olan fikirlərdən biri də budur ki, İsa peyğəmbər tarixi bir şəxsiyyət olmayıb, sadəcə olaraq insanlar tərəfindən *uydurulmuş* əfsanəvi bir varlıqdır. Hitchens'in də kitabında bir neçə yerdə eyni fikri səsləndirməsi təəccüblə qarşılanmamalıdır. Çünki bu tip kənd ateistləri dinlərin əleyhinə *edilmiş* hər bir iddianı böyük məmnuniyyətlə qəbul edirlər. Bu, özlüyündə onların intellektual səmimiyyətsizliklərinin əlamətlərindən biridir. "İsanın tamamilə mübahisəli mövcudiyyətinin sübutu üçün bildiyim ən yaxşı arqument budur"[96] deyən bu ingilis "intellektual" dinə qarşı mübarizəsini bu cür ucuz iddialar üzərində qurur. Richard Dawkins, Victor Stenger kitablarında, ictimai çıxışlarında eyni *şübhələrə* yer verirlər. Tarixən dinləri t*ənqid etmiş* ən m*əşhur* mütəfəkkirlər, filosoflar və alimlər heç bir zaman İsanın və ya digər peyğəmbərlərin tarixi mövcudiyyətlərini inkar etməyiblər. David Hume (1711-1776) "Natural History of Religion" kitabında, Edward Gibbon (1737-1794) "Decline and Fall of the Roman Empire" kitabında və ya Thomas Paine (1737-1809) "Age of Reason" *əsərində radikal* şəkildə dinin mənşəyini tənqid etsələr də *heç bir* şəkildə belə bir fikrə imkan tanımayıblar. On səkkizinci əsrin sonlarında radikal ingilis deist Lord Bolingbroke'un tələbələri İsanın tarixən mövcud olmaması fikrini yaymağa başladılar. Xristianlığa heç bir simpatiya bəsləməyən Voltaire belə bu iddianın absurd olduğunu düşünürdü. Buna baxmayaraq 1790-cı illərdə fransız maarifçiləri arasından ən radikal olanlardan bəziləri xristianlığın və İsanın əfsanə olduğunu yazmağa başladılar. Bu tezisi həqiqi mənada yayıb populyarlaşdırmağa çalışan ilk yazıçı Bruno Bauer (1809-1882) olub.[97] Lakin Bauerin tezisi akademik standartlara cavab vermədiyi üçün dövrünün akademikləri tərəfindən qəbul edilmədi, hətta bu fikrin özü ilə razılaşan John Mackinnon Robertsson (1856-1933) onun arqumentləri ilə qane olmamışdı.[98] Bu işi bir addım ötəyə götürən Karlsruhe universitetinin fəlsəfə üzrə professoru Arthur Drews (1865-1935) oldu və 1911-ci ildə yayınladığı "The Christ Myth" kitabı ilə bu fikri qismən də olsa məşhurlaşdırdı. Arthur özü tarixçi deyildi və kitabında bu işin bir tarixçi tərəfindən ediləcəyinə ümid bəslədiyini, amma belə birini tapa bilm*ədiyi üçün özünün bu işi* etdiyini etiraf edir.[99] Arthur Drews'u oxuyanlar arasında Vladimir Lenin də var idi və kitabdan təsirlənən Lenin İsanın mövcud olmaması söhbətini tarixi bir fakt kimi qəbul edir; buradan başlayaraq sovet ideologiyasında dinlərin yaranması ilə bağlı

---

[96] GIG, səh: 114

[97] Robert E. Van Voorst, "Jesus Outside The New Testament: An Introduction to The Ancient Evidence", səh: 8; Eerdmans Publishing, Grand Rapids, 2000

[98] J. M. Robertson, "The Historical Jesus: A Survey of Positions", səh: 196-197; Watts & Co, London, 1916

[99] A. Drews, "The Christ Myth", səh: 13-14, T. Fisher Unwin, London, 1910

əsas mövqe bu mifologiya iddiasına əsaslanırdı.[100] Avropa kontinentindən kənarda da İsa peyğəmbər haqqında qəribə fikirlər səslənib. Amerika Birləşmiş Ştatlarında fəaliyyət göstərmiş *John Remsberg (1848*-1919) İsanın həqiqətdə bütpərəstlərin ilahlarından biri olduğunu iddia edirdi. Amma bu fikrə Amerika qitəsində həyat qazandıran ixtisasca riyaziyyatçı olan William B. Smith və onun yazdığı "The Birth of The Gospel" kitabı oldu. Fransada P. L. Couchoud və G. Fan bu mövzuda yazmış başqa yazıçılardır. Bunların heç biri bu fikrə tam bir mə*şhurluq qa*zandıra bilməmişdi, çünki yazdıqları mövzu öz sahələrinə aid deyildi. Tarixçilər həmişə bu iddiaları qətiyyətlə rədd ediblər. İşə cüzi olaraq ciddilik qazandıran isə "The Sacred Mushroom and the Cross" kitabı ilə John Allegro (1923-1988) oldu. O, "ölü dəniz əlyazmaları" ilə məşğul olmuş tarixçilərdən idi, amma 60-cı illərdə yaydığı bu kitabı ilə tarixçilər yanında öz reputasiyasını m*əhv etmiş oldu.* Allegro'nun kitabında irəli sürdüyü iddiaya görə erkən xristianlıq sadəcə olaraq hallüsinasiyaya səbəb olan göbələklərin təsiri altında edilən və törəmə bolluğu üçün tə*şkil edil*ən azğın orgiya kultu idi; beləliklə də İsa sadəcə bir simvol idi, reallıqda belə *bir* şəxs mövcud olmayıb və bu göbələklərin təsiri altında erkən xristianlar tərəfindən uydurulub. Guya "İsa" adı (Jesus, Joshua) əslində "xilas edici toxum", Peter isə göbələk deməkdir. İddialar o qədər çılğın və aşırı idi ki, kitabı oxuduqda "görəsən müəllif özü bunu yazarkən hansı göbələyin təsiri altında idi?" sualı ortaya çıxır. Bu cəfəngiyyatı əsas alaraq Britaniyadan on dörd görkəmli alimi – və onların arasında Allegro'nun öz mentoru Godfrey Driver də yer alırdı – bu kitabı ictimai olaraq qınadılar və rədd etdilər. Kitabı çap edən n*əşriyyat r*əsmən üzr istəməli oldu və Allegro özü universitetdəki vəzifəsindən istefa verməli və 1988-ci ildə, altmış beş yaşında ölənə qədər "akademiyadan sürgünə göndərilmiş halda" yaşamalı oldu.[101] Bu yazıçıların və onların kitablarının heç biri London universitetinin Birkbeck kollecində alman dili professoru olaraq çalışan George Albert Wells'in 1971-ci ildə mövzu haqqında çap etdirdiyi "The Jesus of The Early Christians" adlı kitabı qədər səs-küy qaldırmamışdı. Richard Dawkins bu iddianın akademikliyini müdafiə etmək üçün məhz bu Wells'in araşdırmasına istinad edir. Alman dili bilikləri sayəsində Drews, Bauer və başqalarının yazdığı radikal əsərləri araşdırmaq imkanına sahib olan Wells sözün həqiqi mənasında bir tarixçi deyildi. Richard France qeyd edir ki, "Wells bu əfsanə nəzəriyyəsinin ən bacarıqlı müdafiəçisi olsa da o, iqna edici ola bilmədi və demək olar ki, indi (bu rəyi müdafiə edən) tənha

[100] James Thrower, "Marxist-Leninist Scientific Atheism and The Study of Religion and Atheism in The USSR", səh: 426; Mouton Publisher, Berlin, 1983

[101] James Vanderkam & Peter Flint, "The Meaning of The Dead Sea Scrolls: Their Significance for Understanding The Bible, Judaism, Jesus and Christianity", səh: 324; T&T Clark, London, 2002

bir səsdir."[102] Hətta o "tənha səs" belə tədricən öz fikrindən dönməli oldu və ilk kitablarında müdafiə etdiyi İsanın əfsanəvi xarakter olması fikrini tərk etməli oldu. "İsa haqqında yazdığım ilk kitablarımda" - Wells deyir – "incildəki İsanın erkən epistolalardakı İsanın tamamilə əfsanələşdirilərək şişirdilmiş forması olduğunu müdafiə edirdim. Kitabımın bu bölməsində "The Jesus Legend" və "The Jesus Myth" kitablarından çıxardaraq təqdim etdiyim xülasə açıq şəkildə göstərir ki, mən əvvəlki rəyimdə deyiləm."[103] Heç şübhəsiz ki, İsanın tarixiliyini inkar edən əksər yazıçılar professional tarixçilər olmayıblar. Müasir tariximizdə yalnız Sovet dövlətində akademiklər arasında bu fikir özünə yer edə bilmişdi və onlar ideolojik zəmində dinlə mübarizə namına bu tezisi dəstəkləyiblər. Hətta sovet dövlətinin son illərində və süqutundan sonra, başqa sözlə ateistik kommunist ideologiyası iflasa uğradıqdan sonra bu məşhurluq səhnədən tamamilə itdi. Bəs həqiqi tarix elmi nə deyir? Həqiqi mütəxəssis tarixçilərin bu barədə rəyi nədir? Bu sualların qısa cavabı budur ki, keçmiş əsrlərdə tarixçilərdən heç kim belə bir iddia irəli sürməmişdi, nə də ki, belə bir iddia ilə onlar tanış deyildilər. Müasir tarixçilərin arasından qəti çoxluq belə bir fikri tamamilə rədd edirlər və bu fikri əsassız, qeyri-elmi fikir adlandırırlar. Son otuz ildə İsanın tarixiliyini araşdırmış ən görkəmli fiqurlardan biri olan Amerikanın Duke universitetinin professoru Ed Sanders deyir: "İsanın həyatının ümumi axarı – nə zaman və harada yaşamağı, təxminən nə zaman və harada ölməyi və ictimai fəaliyyəti əsnasında etdiyi şeylər - haqqında əsaslı heç bir şübhə yoxdur..."[104] Yaxud da İngiltərənin Oxford universitetinin professoru Christopher Tuckett deyir: "Bütün bunlar İsanın özünün mövcudluğunun xristian uydurması olması haqqındakı ehtimaldan uzaq olan teoriyanın ən azından ağla sığmaz olduğunu göstərir."[105] Almaniyanın tarixçilərindən Gerd Thiessen də bu barədə deyir: "İsanın qədim tarixçilər tərəfindən zikr olunması onun tarixiliyi barəsindəki şübhəni zəiflədir. Yəhudi və büdpərəst yazıçılar(ın yazıların)da... - xüsusilə də Josephus'(un yazısın)da, Sarapion və Tacitus'un məktubunda olan – qeydlər sübut edir ki, qədimdə İsanın tarixiliyi şübhəsiz qəbul olunurdu və bunda haqlı idilər; çünki yuxarıdakı mənbələr barəsindəki iki müşahidə bizə göstərir: İsa haqqındakı tarixi qeydlər bir-birindən asılı deyildir. Fərqli keçmişlərə sahib olan üç müəllif, bir yəhudi aristokrat və tarixçi, suriyalı bir fəlsəfəçi və romalı dövlət adamı və tarixçi, tam müstəqil şəkildə İsa haqqındakı məlumatlardan istifadə ediblər. Onların hər üçü də İsanın edamı haqqında xəbərdar idilər, lakin bir-birindən fərqli

[102] Robert E. Van Voorst, "Jesus Outside The New Testament: An Introduction to The Ancient Evidence", səh: 13-14; Eerdmans Publishing, Grand Rapids, 2000
[103] G. A. Wells, "Can We Trust The New Testament? Thoughts on The Reliability of Early Christian Testimony", səh: 49-50; Open Court Publishing, Chicago, 2004
[104] E. P. Sanders, "The Historical Figure of Jesus", səh: 11, Penguin Books, London, 1993
[105] Christopher Tuckett, "The Cambridge Companion to Jesus", səh: 124, Cambridge University Press, Cambridge, 2001

şəkildə xəbərdar idilər: Tacitus məsuliyyəti Pontius Pilat'ın üzərinə qoyur, Mara bar Sarapion (bunu) yəhudi xalqının üzərinə və Testimonium Flavianum isə (bunu) yəhudi aristokratiyası və roma valisinin üzərinə qoyur…"[106] 1977-ci ildə nə*şr* etdirdiyi "Jesus; an Historian's Review of The Gospels" adlı kitabında tarixçi alim Michael Grant buyurur: "Müasir elmi-tənqidi metodlar "əfsanə Məsih" teoriyasını dəstəkləyə bilmir. Bu (teoriyanın iddiaları)na dəfələrlə birinci dərəcə alimlər tərəfindən cavab verilib və darmadağın edilib**.**"[107] Nəzərə alaq ki, bu tarixçilərin arasında Ed Sanders kimi aqnostiklər və ateistlər vardır. Bu cür tarixçilərin İsanın tarixiliyini qəbul etməsini sırf məslə*k işi kimi q*əbul edə bilərik. Amma İsanın tarixiliyini rədd edənlərin ümumən dinə qarşı mübarizə aparan fiqurlar olduğunu, əksəriyyətinin isə tarixçi alimlər olmadığını diqqətə *alsaq işin sadə*cə bir vəhmdən ibarət olduğunu görəcəyik. İsanın tarixən mövcudluğuna şübhə gətirənlər, dinin təbiəti haqqında hazır fikirlər formalaşdırmaq istəyən kəslərdir.[108] Onu da əlavə edək ki, yunan filosofu Celsus, livanlı filosof Tirli Porfiri və ya dövlət xadimi, tarixçi Sossianus Hierocles kimi qədim anti-xristian yazıçılardan heç biri xristianlığı bu şəkildə gözdən salmaq üçün İsanın tarixiliyini inkar etmirdilər. *Əlavə* edə biləcəyimiz önə*mli olan başqa bir d*əlil isə Tarsus'lu Saul'un məktublarıdır. Bu tarixi şəxsiyyətin adı yunan dilində adı Paulus (Pavel) olaraq bilinir, bəzən onu Müqəddəs Paulus (Pavel) və ya Həvari Paulus çağırırlar. Onun İsa Məsih'in müasiri olduğunu bilirik, dəqiq doğum tarixini bilmək mümkün deyildir, amma ümumən miladdan öncə *beşinci il ilə* miladdan sonra beşinci il arasında doğulduğu deyilir. Bu mövzuda onun məktublarının əvəz edilməz bir rolu vardır, çünki erkən xristianlığın formalaşmasında heç kimin Paulus kimi əməyi olmayıb. Məktublarında əhəmiyyətli olan xüsusiyyətlərdən biri tarixi hadisələrin xronoloji olaraq qeyd edilməsidir, yəni Paulus müxtəlif xristian icmalarına göndərdiyi məktublarda öz həyatında etdiyi əməlləri, atdığı addımları tarixlərinə görə zikr edir. Bu məlumatlardan bilirik ki, Paulus özü İsanın davamçılarından birinə çevrilmədən öncə onun ilk davamçılarını Qüds şəhərində təqib edənlərdən idi. Miladdan sonra təxminən 32-ci ildən başlayaraq o, xristianlığı qəbul edərək bu yolda missiya həyatına başlayır. Paulusa aid edilən 13 məktubdan yeddisinin həqiqətən də onun tərəfindən yazılmasında heç bir fikir ayrılığı yoxdur; tarixçilər o məktubların müəllifinin özü olmasında ittifaq edirlər.[109] Paulus bu məktublarında İsanın qardaşı ilə, ən böyük həvarisi Peter ilə *görüşdüyünü də* qeyd edir. Əgər İsa uydurulmuş bir

---

[106] Gerd Theissen, Annette Merz, "The Historical Jesus; A Comprehensive Guide", səh: 93-94, Fortress Press, Minneapolis, 1998

[107] Michael Grant, "Jesus: an Historian's Review of The Gospels", səh: 200, Schribners, New York, 1977

[108] Steuart Campbell, "The Rise and Fall of Jesus; A Complete Explanation for The Life of Jesus and The Origin of Christianity", səh: 17; Tectum Verlag, Baden-Baden, 2019

[109] David G. Horrell, "An Introduction to The Study of Paul", səh: 181; Bloomsbury T&T Clark, London/New York, 2015

xarakter olsaydı o zaman bu cür erk*ən bir dövrün şahidliklə*rini belə bir iddia ilə bir araya gətirmək olmur. *Əksinə bu tarixi şahidliklə*r bu iddianı tamamilə rədd edir. Etiqadında aqnostik olan Bart Ehrman "Did Jesus Exist? The Historical Argument for Jesus of Nazareth" adlı kitabında tarixi dəlilləri qane edici şəkildə təqdim edir. Mövzunu araşdıranlar üçün onun kitabını xüsusilə tövsiyə edirik. Hitchens'in də professor Ehrman'ın fəaliyyətləri ilə tanışlığı var. Ehrman'ın xristian inancını tərk edərək aqnostik olmasını çox həvəslə təsvir edir və bunu edərkən onun ciddi bir akademik olduğuna, yunan və yəhudi dillərini səlis bildiyinə diqqət çəkir. Təəssüf ki, haqqında danışdığı bu professorun adını belə Hitchens öz kitabında doğru yazmağı bacarmayıb. Təəssüfün iki qatı ondadır ki, Ehrman kimi bibliyaşünasların və erkən xristianlıq tarixini araşdırmış tarixçilərin yazdıqları ədəbiyyatı ciddi bir şəkildə vərəqləmədən İsa haqqında edilən ucuz iddialarla oxucuların vaxtı israf edilir.

## MUHƏMMƏD PEYĞƏMBƏR

"*Louis Pasteur və Jonas Salk kimi insanlar birinci mənada liderlərdir. Qandi, Konfutsi, İskəndər, Sezar və Hitler ikinci mənada və bəlkə də üçüncü mənada lider sayıla bilərlər. İsa və Budda isə yalnız üçüncü kateqoriyaya aiddir. Bəlkə bütün zamanların ən böyük lideri Muhəmməd idi ki, özündə bütün üç funksiyanı birləşdirmişdi. Ondan bir qədər aşağıda Musa da belə idi.*"

Jules Masserman

Hersoq Karl August 1808-ci ilin sentyabr ayında Napoleonu qarşılamaq üçün E*isenach'a getmişdi; onu oradan Weimar'a d*əvət edəcəkdi və Ettersberg'də maral ovuna çıxmağa çağıracaqdı. Məğlub olmuş Prussiyanı bir daha alçaltmaq üçün Napoleon həm də *Jena döyüşünün baş verdiyi* əraziləri ziyarət etməyi təklif edir. Sentyabr ayının 29-u h*ersoq Karl, alman şairi* və yazıçısı Johann Wolfgang von Goethe'ni Erfurt şəhərinə dəv*ət etmişdi və* oktyabr ayının 2-si Goethe saat on birdə Napoleonun audensiyasına çağırılır. Onun məclisinə qəd*əm qoyan böyük alman şairi onu s*əhər yeməyi yeyərkən görür. Napoleon ona diqqətlə baxdı və tam bir vurğu ilə "Voila un homme!" dedi.[110] Onun məclisində onunla birlikdə Talleyrand, Daru, Savary və Berthier *oturmuşdu. Goethe söhb*ətə başlamağa cürət etmir və ilk sualı Napoleon verir: "Neçə yaşınız var?" "Altmış." "Heç də pis görsənmirsiz. Siz faciələr yazmısız." Onun nəzərində faciələr yazan bir yazıçının iztirabı zahirində əks olunmalı idi. Bu arada ədəbi zövqə malik olan Daru müdaxilə edərək Goethe'nin əsərlərini mədh etməyə başlayır və xüsusilə də Voltaire'in "Mahomet" əsərini də alman dilinə tərcümə etdiyini qeyd edir. Bu dialoqa toxunan tarixçi Hume Brown bu əsərlə bağlı Napoleon'un reaksiyasını da qeyd edir: "Dünyanın ən əzəmətli adamlarından birinə qarşı haqsızlıq etdiyi üçün Napoleon (Voltaire'in) bu ə*sərini şidd*ətlə qınayırdı."[111] "Bu, yaxşı bir əsər deyil" – Napoleon dedi və bunun səbəbini izah etməyə başladı.[112]

Goethe özü Voltaire'in əsərini alman dilinə könüllü tərcümə etm*əmişdi.* Weimar'ın hersoqu Carl August öz arvadının ad günündə səhnəyə qoyulması üçün həmin kitabı tərcümə etməyi Goethe'yə *əmr etmişdi. Alman ədəbiyyatşünas*

[110] Heinrich Düntzer, "Life of Goethe", səh: 578-579; Estes & Lauriat, Boston, 1884
[111] P. Hume Brown, "Life of Goethe", cild 2, səh: 546; John Murray, London, 1920
[112] Heinrich Düntzer, "Life of Goethe", səh: 579; Estes & Lauriat, Boston, 1884

Katharina Mommsen qeyd edir ki, bu sifarişi aldıqda o, çox tərəddüd keçirirdi.[113] Sonunda hersoqun tələbinə baş əyməli olur, çünki direktoru olduğu Weimar teatrını maliyyələşdirən o idi. Tarixçilər qeyd edirlər ki, Goethe əsəri alman dilinə tərcümə edərkən dilini yumşaltmış, bir çox kobud sözləri əvəz etmiş, bəzi sətrləri ümumiyyətlə kənarlaşdırmışdır. Goethe'nin ən görkəmli müasirlərindən sayılan Johann Gottfried Herder bu faciə əsərini ciddi bir şəkildə tənqid edənlərdən biri idi, çünki Herder İslam peyğəmbərinin şəxsinə qarşı xüsusi bir hörmət bəsləyirdi. Johann Herder tərcümənin özünün uğurlu olduğunu hesab edirdi, amma əsərin özünün saxtakarlıq olduğuna inanırdı, çünki Muhəmməd kimi bir şəxsiyyəti təhqir edəcək qədər tarix təhrif edilmişdi. Herder'in həyat yoldaşı Karoline'nin verdiyi məlumatlara əsasən o, dostu Karl Ludwig'ə yazdığı məktubunda buyururdu: "Möhtəşəm, möhtəşəm beytlərdir, amma məzmunu bəşəriyyətə və hər şeyə qarşı cinayətdir."[114] Üstəlik belə bir əsəri alman dilinə tərcümə etməklə Goethe həm İslam peyğəmbərinə, həm də özünə qarşı haqsızlıq etmiş olur. Çünki öz etirafına əsasən, peyğəmbər haqqında alman dilində bir əsər yazmaq fikrində idi: ".. onu mən heç bir zaman saxtakar hesab edə bilməzdim... Qısa bir müddət əvvəl şərq peyğəmbərinin həyatını çox böyük maraqla oxumuş və öyrənmişdim və ona görə də belə bir ideya üçün müəyyən dərəcədə yaxşı hazırlaşmışdım."[115] Goethe həm İslamın peyğəmbərinə, həm də Napoleone'a böyük bir sayğı və sevgi bəsləyən biri idi. 1806-cı ildə Fransa lideri avstriyalılara qarşı Ulm yaxınlığında qələbə çaldıqda Goethe onu – digər ləqəblərlə yanaşı - "Mahomet der Welt" (Cahanın Muhəmmədi) olaraq ləqəbləndirir və bu ad ilə ona zəfər çələngi geyindirirdi.[116] 1770-ci ildə o təhsil məqsədi ilə *Strasbourg* şəhərinə gedir və orada Johann Gottfried Herder ilə qarşılaşır. Qarşıdakı illərdə Herder onun üçün yaxın bir dost və mentor olacaqdı. Lüteran rahibi olaraq Herder İslam peyğəmbərinin həqiqi peyğəmbər olduğuna inanmırdı, lakin bununla belə onu "tacir, peyğəmbər, orator, şair, qəhrəman və qanunverici" olaraq vəsf edir.[117] Islam peyğəmbərinin və Quranın təsirini Goethe'nin həyatında tapmaq araşdırmacılar üçün çətin bir iş olmayıb. 1772-ci ildə Herder'ə yazdığı məktubunda o, deyirdi: "Mən Quranda

---

[113] Katharina Mommsen, "Goethe und die arabische Welt", səh: 222; Insel Verlag, Frankfurt am Mein, 1988

[114] Stephanie M. Hilger, "Women Write Back: Strategies of Response and the Dynamics of European Literary Culture, 1790-1805", səh: 102-104; Rodopi B.V., Amsterdam, 2009

[115] J. W. von Goethe, "Aus Meinem Leben: Dichtung unde Wahrheit", Sämtliche Werke, XIV, səh: 685; Deutscher Klassiker Verlag, Frankfurt am Mein, 1986

[116] Katharina Mommsen, "Goethe und die arabische Welt", səh: 215; Insel Verlag, Frankfurt am Mein, 1988

[117] Ian Almond, "History of Islam in German Thought: from Leibniz to Nietzsche", səh: 70; Routledge, New York, 2010

keçdiyi kimi Musanın etdiyi dua ilə dua etmək istəyirəm: "Ey Rəbbim, köksümü açıb genişlət!"[118]

Böyük fatehlərin və şairlərin pərəstişini qazanmış İslam peyğəmbəri, Hitchens kimi ucuz bir komikin kitabında böyük bir zülmə məruz qalır. Kifayət qədər mütaliəsi olan biri Hitchens'in buradakı ucuz taktikasını dərhal müəyyənləşdirə bilir. Bu səfər də istifadə edilən arqumentlərin heç biri ciddi intellektual arqumentlər deyildir, sadəcə olaraq hamamda öz səsini bəyənmiş amatörün repertuarından növbəti bir fəlakətdir. "Muhəmmədin iddialarına ilk əvvəldə minimum maraq göstərən yeganə insanlar, bunu öz həcc bizneslərinə təhlükə kimi dəyərləndirən Məkkədəki məbədin xəsis hamiləri və iki yüz mil aralıda yerləşən Yəsrib şəhərinin çalışqan yəhudiləri idilər ... Birinci qrup getdikcə daha təhdidamiz və ikinci qrup daha dostyana oldular və bunun nəticəsində Muhəmməd Yəsribə səfər və ya hicrət etdi.."[119] Maraqlıdır ki, görəsən İslam peyğəmbərinin həyatı ilə bağlı hər hansı bir kitabı vərəqləyibmi? Təbii ki, vərəqləyib və çox ehtimal ki, hardasa öz beynində canlandırdığı tarixi ssenariyanı dəstəkləmək üçün bir iki məlumat tapıb. İslam peyğəmbərinin dəvətinə cavab verən ilk quşaq müsəlmanlar Hitchens'in iddia etdiklərindən uzaq kəslər olublar, İslama maraq cəmiyyətin hər bir təbəqəsində ilk əvvəldən oyanmağa başlamışdı. İslama ilk maraq göstərənlər və onu yeni bir din kimi qəbul edənlər arasında Məkkə cəmiyyətinin fərqli təbəqələri yer alırdı; onların arasında Əbu Bəkr, Osman kimi zənginlər olduğu kimi İbn Məsud, Ammar kimi kasıblar, Bilal kimi kölələr də var idi. Qureyşin böyüklərinin oğulları bir-bir peyğəmbərin çağırışına cavab verirdilər və yeni dinə sadiqliklərini döyüş meydanlarında öz atalarına qarşı vuruşmaqla göstərdilər. Yəsrib şəhərinin yəhudilərinə gəldikdə isə peyğəmbərin hicrətini təşkil edənlər və ya buna səbəb olanlar heç bir şəkildə onlar deyildilər. Peyğəmbəri öz şəhərlərinə dəvət edənlər Əvs və Xəzrəc adları ilə tanınan iki ərəb qəbiləsi idi.[120] Yəhudilərin müsəlmanlara və müsəlmanların peyğəmbərinə dostyana münasibət göstərdiyini iddia etmək ən yumşaq dildə desək cahillikdir, ən real qiymətləndirmədə isə tarixin təhrifidir. Bəli, doğrudur ki, yəhudilərin arasından İslam peyğəmbərinə dəstək verənlər olublar, lakin bir qrup olaraq peyğəmbərin hicrətində heç bir rol oynamayıblar. Mark Cohen qeyd edir ki, "yəhudilərin Muhəmmədə qarşı kinləri bir çox baxımdan İsaya qarşı yəhudi düşmənçiliyindən daha aşkar idi… Oradakı yəhudi qəbilələrində Muhəmmədə qarşı yəhudi düşmənçiliyi dərin şəkildə nüfuz etmişdi."[121] İslam dünyasındakı yəhudilərin tarixi üzrə ən görkəmli

[118] J. W. von Goethe, "Goethes Briefe und Briefe an Goethe", cild 1, səh: 132; Beck, Munich, 1988
[119] GIG, səh: 128;
[120] Irving M. Zeitlin, "The Historical Muhammad", səh: 11; Polity Press, Cambridge, 2007
[121] Mark R. Cohen, "Under Crescent & Cross: The Jews in The Middle Ages", səh: 23; Princeton University Press, New Jersey, 1994

mütəxəssislərdən biri sayılan, Princeton universitetinin təqaüdə çıxmış professoru Mark Cohen görünür ki, Hitchens'in bildiklərindən və oxuduqlarından xəbərsiz *imiş*.

"Daha bir çətinlik Qüdrətli Tanrının özünü yalnız Yaxın Şərqin çöllüyündə *yaşayan oxuma*-yazma bacarmayan, kvasi-tarixi fərdlərə göstərmək meylidir…" Kvasi-tarixi fərd dedikdə Hitchens, peyğəmbərlə bağlı tarixi hadisələri sorğulayır və hətta yalanlayır. Kitabının bir çox yerində bu şəkildə İslamın peyğəmbəri haqqında bilinən tarixi məlumatları əsassız bir şəkildə *şübhə* altına alır ki, bunu qarşıda qısaca ələ alacağıq. Yaxın şərqə gəldikdə isə dinlər vəhyin yalnız Yaxın Şərqlə məhdudlaşdığını iddia etmir. *Əksinə* dini mətnlər təkrar-təkrar vurğulayırlar ki, ilahi vəzifə *başqa qövmlər*dən *olan* şəxslərə də verilib. Quranın dili ilə bunu ifadə etməli olsaq "hər bir qövmün bir yolgöstərəni vardır." (13:7) Lakin Hitchens əslində sualı belə verməli idi: "Nə üçün Qüdrətli Tanrının endirdiyi vəhy bizə yalnız Yaxın Şərqdən gəlib çatıb?" Bu sual daha doğrudur və bu sualın cavabı da çətin deyildir. *Əslində* mədəniyyətlər tarixini bilən, antropologiya elmi haqqında təsəvvürü olan insan belə bir etiraz etməz. H*ər şeyd*ən əvvəl biz buna fərqli dinlərin bir coğrafiyadan meydana çıxması kimi baxmamalıyıq. Nəticə etibarı ilə bu dinlər fərqli olsalar da qaynaq etibarı ilə birdirlər. Bu dinlərin hamısı ibrahimi dinlər kimi tanınırlar və bu coğrafiyada yaşamış və səyahət etmiş İbrahim peyğəmbərlə bağlıdır. Xristianlıq yəhudilikdən ayrı müstəqil bir inanc sistemi deyildir, əksinə İsa özü yəhudi olub, tövrata əməl edib və insanları da Musanın dininə dəvət edib. Müsəlmanların peyğəmbəri də müstəqil bir fikir iddiasında olmayıb, özündən əvvəlki peyğəmbərlərin missiyasını davam etdirdiyini deyib; bu missiya insanları saxta bütlərə ibadət etməkdən qurtarıb tək və həqiqi Allaha inanmağa yönəltmək olub. Dünyanın başqa yerlərində də ayrı-ayrı etnosların arasından eyni risaləni, eyni fikri səsləndirən "yolgöstərənlər" olub. Lakin məhz Yaxın Şərqdə bu vəhylər sistematik dinə çevriliblər, yazılıblar, növbəti nəsillər buna varis olublar, onu zənginlə*şdiriblə*r və beləliklə də tarixin qeydlərinə salıblar. Bunun isə bir çox aydın səbəbləri var. Mədəniyyətlərin beşiyi bu coğrafiya sayılır; şimal-şərqi Afrika və cənub-qərbi Asiya. Bura Misir, Mesopotamiya və ərəblərin əraziləri daxildir. Hətta Avropanın ən əsas sivilizasiyası sayılan qədim Yunan mədəniyyəti də məhz bu coğrafiyanın təsiri ilə formalaşıb. Tim Whitmarsh yazır: "Arxaik Yunanıstan şərq və c*ənub qonşular ilə* qarşılıqlı əlaqələr nəticəsində formalaşmışdı."[122] Bu gün bizim "əlifba" adlandırdığımızı avropalıların alfabet adlandırması təəccüblü gəlməməlidir. İlk yazı sistemi də finikiyalılar tərəfindən tətbiq edilib. Üstəlik tarixə *düşə* biləc*ək* şəkildə *geniş v*əhy təbliğatına məhz bu ərazilərdə ehtiyac olub, çünki

[122] Tim Whitmarsh, "Battling the Gods: Atheism in the Ancient World", səh: 18; Faber & Faber, London, 2016

şəhər idarə sistemləri, böyük dövlətlər ilk olaraq bu ərazilərdə ortaya çıxıb. Bu cür əhali sıxlığına, qarışıq cəmiyyətlərə, yüksək mədəniyyətlərə, sistemləşmiş idarələrə malik ərazilərdə ilahi vəhyin təbliğ edilməsi heç şübhəsiz ki, böyük bir rezonansa səbəb olmalı idi. Eyni effektin uzaq ərazılərdə bəsit qəbilə və tayfa səviyyəsində yaşayanlar arasında da olacağını gözləyə bilmərik. Sizcə bizim bu ingilis müəllif bunları bilmir? Əlbəttə ki, bilir və bu barədə yaxşı bir təsəvvürə sahibdir. Lakin görünən budur ki, məqsəd oxucunu istehzalı atmacalar ilə əyləndirmək, İslam peyğəmbərini də qeyri-ciddi bir xarakterlə eyniləşdirməkdir. Voltaire belə İslam peyğəmbərinə qarşı etdiyi bütün alçaqlıqlarına baxmayaraq onu bu qədər kiçiltməzdi, əksinə dahiliyinə, böyüklüyünə şahidlik edərdi. Voltaire "ömrünün sonlarında Muhəmmədi kitab və təlqin sayəsində tarixi dəyişən və dini islah edən bir rol model və böyük şəxsiyyət kimi görürdü."[123]

Hitchens kinayə ilə "oxuma-yazma bacarmayan" deyərək işin içindəki təəccübə eyham edir. "Hətta tanrı ərəb idisə və ya ərəbdirsə, oxuyub yazmağı bacarmayan və öz növbəsində (tanrının) sözlərini dəyişdirmədən (insanlara) ötürməyə ümid edə bilməyəcək bir kəs vasitəsi ilə Özünü tanıtmağa necə bel bağlaya bilərdi?!"[124] Burada gülməli olan Hitchens'in istehzalı sözləri deyildir, tanrını Vanity Fair heyətində çalışan özü kimi jurnalistlərlə eyniləşdirməsidir; yəni demək istəyir ki, mən Hitchens olaraq yazdığım bu qədər məqalə vasitəsi ilə oxuyub yazmağı bacaran kütlələrə acınacaqlı yumorumu çatdıra bilmirəmsə Göylərin və Yerin yaradıcısı olan Allah hansı qüdrət ilə oxuyub yazmağı bacarmayan bir nəfərin vasitəsi ilə insanlara Öz sözlərini təhrif edilmədən çatdıra biləcək?! Bu adam özü də düşünmədən əslində müsəlmanlara əllərində tutduqları Kitabın nə qədər möcüzəvi bir kitab olduğunu isbat edir; bütün çətinliklərə baxmayaraq, ağır şərtlərə baxmayaraq Muhəmmədin bizə əmanət buraxdığı kitab günümüzə qədər təhrif olunmadan gəlib və bütün dünyada müsəlmanların tək bir Quranı vardır. Bəs Allah nə üçün oxumaq və yazmaq bacarmayan birinə vəhy endirir? Müsəlmanlara bu sualı versəniz cavabını çox sadə bir şəkildə deyəcək; Quranı aç və oxu! "Sən bundan əvvəl nə bir kitab oxumusan, nə də onu əlinlə yazmısan. Əgər belə olsaydı, onda batilə uyanlar şübhə edərdilər." (29:48) Əgər Muhəmməd oxumaq və yazmaq bilən, dövrünün savadlı kəslərindən biri olsaydı şübhəsiz ki, onun zamanındakılar üçün "Muhəmməd bunları oxuduğu kitablardan götürüb" demək asan olacaqdı, onun peyğəmbərliyini inkar edəcəkdilər. Əksinə yazmağı və oxumağı bacarmayan birinin əvvəlki peyğəmbərləri, İbrahimin dinini, vəhy olunmuş kitabları çox bəlağətli dildə insanlara başa salması onları tamamilə silahsızlaşdırır, onları düşünməyə vadar edir. Beləliklə də Allahın Özünü məhz

[123] John Tolan, "Faces of Muhammad; Western Perceptions of The Prophet of Islam From the Middle Ages to Today", səh: 168; Princeton University Press, New Jersey, 2019
[124] GIG, səh: 124

Muhəmməd kimi oxumaq-yazmaq bilməyən insanlara göstərməsində bir ecazkarlıq vardır. Allah inanmaq istəyənlər üçün inanmaq yollarını asanlaşdırar, çətinləşdirməz. Ona görə də orientalistlərdən bir çoxu Muhəmmədin oxuyub yazmaq qabiliyyətinin olmamasında şəkk ediblər; onlara görə belə bir kitabı yazmaq üçün Muhəmmədin mütləq oxuyub yazmağa qadir olması lazımdır, mütləq digər kitabları oxuyub oradakı məlumatlardan faydalanmış olması lazımdır. Bunu dedikdən sonra bəzi şeyləri izah etməyə çətinlik çəkiblər. Muhəmməd ömrü boyunca bunu insanlardan necə gizli saxlamağı bacardı? Uşaq vaxtında və ya yetkin çağında bunu öyrənmişdisə ərəblər və xüsusilə də ona inanmış öz yaxın qohumları bundan necə xəbərsiz olublar?! Amerikanın xristian missionerlərindən olan Samuel Zwemer – misal üçün – inanırdı ki, Muhəmməd "ilahi vəhyin möcüzəvi təbiəti üzərində vurğu etmək üçün və Quranı özünün yazması barədə hansısa mümkün spekulyasının qarşısını almaq üçün özünü elə aparırdı ki, guya oxumaq və yazmaq bilmirdi."[125] Bu o deməkdir ki, Muhəmməd peyğəmbərliyini uşaq çağından planlaşdırırmış və oxumağı-yazmağı bacardığı halda bunu qırx yaşında peyğəmbərliyini elan edənə qədər gizlətməyi bacarıb. Doğma əmisi Əbu Talib'dən də, öz əmisi oğlu və kürəkəni Əlidən də bunu gizlətməyi bacarıb. Belə bir iddianı absurdluq kateqoriyasından qurtarmaq üçün güclü dəlillərə ehtiyac var. Muhəmmədin oxuyub yazdığını bilən kəslər təbii ki, çox rahatlıqla Quranda bunun əksini iddia edən ayəni yalanlamağa çalışacaqdılar. O dövrün Ərəb yarımadasında oxuyub-yazmaq yayğın bir hal deyildi; ona görə də bu işin əhlini yaxşı tanıyırdılar. Belə aşkar bir halı gizlin saxlamaq çox erkən bir zamandan inanılmaz dərəcədə detallı bir planlama və qeyri-adi əzm tələb edir. Bütün bunlarla yanaşı – orientalistlərin iddia etdikləri kimi – Muhəmməd gizlində xristian və yəhudi qaynaqlarını oxumuş olmalı idi. Yəhudi tarixçi Mark Cohen bu barədə təəccübünü gizlədə bilmir. O, Muhəmmədin yəhudilik və yəhudi qaynaqları haqqında yaxından tanışlıq sərgilədiyini qeyd etdikdən sonra deyir: "Ticari şəhər olan Məkkədə hakimlik edən ərəb qəbiləsindən olan bir tacirin necə və hansı şəkildə yəhudilik haqqında bu qədər çox şey öyrənməsi bu günə qədər sirr olaraq qalır."[126] Bu sirri, bu əsrarəngizliyi müsəlmanlar başqa adla "möcüzə" olaraq adlandırırlar.

Quran sadəcə olaraq yəhudi və məsihilər haqqındakı biliklərin bolluğu və zənginliyi ilə seçilmir, o, həmçinin bu məlumatların dəqiqliyi ilə də seçilir. Əlbəttə ki, peyğəmbərin oxuyub yaza bildiyini fərz etsək belə yəhudilərin və məsihilərin kitabları o dövrdə ərəb dilinə tərcümə edilmədiyi üçün bu biliklərə kitablar vasitəsi ilə yiyələnmək imkansız görünür. Məhz buna görə tarixçilərin bir çoxu buna izahat

[125] Alan Dundes, "Fables of The Ancients? Folklore in The Quran", səh: 2; Rowman & Littlefield Publishers, Lanham, 2003
[126] Mark R. Cohen, "Under Crescent & Cross: The Jews in The Middle Ages", səh: 22; Princeton University Press, New Jersey, 1994

gətirmək üçün peyğəmbərin fərqli yəhudi və xristian qruplarla kontaktda olduğunu irəli sürüblər; iddia olunana görə Məkkədə, daha sonra Mədinədə, eləcə də ticarət üçün səyahət etdiyi yerlərdə yəhudilərdən və xristianlardan onların dinlərini öyrənmiş və kitablarındakı hekayələri dinləmişdir. Biz bu iddianın tarixi cəhətdən nə qədər tutarlı olduğunu müzakirəyə çıxarmaq istəmirik, amma bu cür izahların da qənaətbəxş olmadığını göstərəcək bəzi maraqlı faktlara diqqət çəkmədən yan keçə bilməyəcəyik. Daha əvvəl də qeyd etdiyimiz kimi Qurandakı biliklər sadəcə zənginliyi ilə seçilmir, hətta yəhudilər və xristianlar haqqında çox dəqiq məlumatlar verir. O dövrə kiçik bir səyahət edib xristianlarla qarşılaşaq, özümüzü onlarla ünsiyyətdə olan bir ərəbin yerinə qoyaq və soruşaq: əgər İsa peyğəmbər kimlərə göndərilmişdi sualı ilə o dövrün xristianlarına müraciət etsəydik cavab nə olardı? Şübhəsiz ki, yeddinci əsrin xristianları da müasir dövrümüzdəki dindaşları ilə bu nöqtədə ittifaq edirlər ki, İsa peyğəmbər bütün bəşəriyyətə göndərilib. Onlara görə İsa peyğəmbər yalnız İsrail oğullarına göndərilməmişdi. Buna baxmayaraq Quran bu nöqtədə dəqiq məlumat verir və İsanın yalnız İsrail oğullarına göndərildiyini vurğulayır. Patricia Crone bununla bağlı müşahidəsini və təəccübünü bizimlə bölüşərək deyir: "Yeddinci əsrdə yaşayan bir vaiz üçün İsanın israillilərə göndərildiyini iddia etmək heyranedici bir şeydir. Bu, əlbəttə ki, tamamilə doğrudur ki, İsa yəhudilərə vaaz verən bir yəhudi idi və yəhudilərin bir hissəsi iman gətirdiyi halda digərləri iman etmədilər və Yeni Əhddə yalnız bu qədərini oxumaq mümkündür; lakin yəhudi olmayan xristianlar İsanın missiyası haqqında bu cür təsəvvürə sahib deyildilər. Onlara görə yəhudilər, yeni əhdi rədd etmiş və İsanı çarmıxa çəkmiş kəslər idilər, amma İsa və onun həvariləri onlar kimi xristian idilər. Origen izah etdiyi kimi, "İsa "mən yalnız İsrail xalqının itmiş qoyunlarına göndərilmişəm" (Matta, 15:24) dediyində xatırlamalıyıq ki, burada biri cismani olan İsrail var idi və digəri ruhani olan İsrail var idi; biz, anlayışları zəif olan Ebionitlərin iddia etdikləri kimi, Məsihin xüsusilə cismani israillilərə göndərildiyini düşünməməliyik." Lakin məhz əti və qanı ilə israilli olanlara İsanın gəldiyi Quranda deyilir." Beləliklə də üçüncü əsrdən xristian alim Origenin misalında Crone bizə o dövrün xristianlarının nəyə inandıqlarını nümayiş etdirdi, digər tərəfdən isə yəhudi məsihilər olan ebionitlərin doğru inancına da diqqət çəkdi. Crone sözünə davam edir: "Belə bir arqument gətirilə bilər ki, burada gördüyümüz sadəcə olaraq Peyğəmbərin bütün peyğəmbərlərin öz qövmlərinə göndərilməsi inancının bir misalıdır,[127] belə bir inancın Quranda hər zaman keçərli olmadığını (misal üçün Musa israillilərə yox, Firona göndərilmişdi) bir kənara qoysaq, yeddinci əsrdə yaşamış hansısa bir xristianın yəhudiləri İsanın öz xalqı kimi gördüyünə inanmaq çətindir. Peyğəmbərdən gözlənilən onun İsanın xristianlara göndərildiyini deməsi

[127] Crone qeyd edir ki, belə bir arqumenti onun qarşısına gətirən Adam Silverstein olub.

idi. Əlbəttə ki, İsadan əvvəl xristianlar mövcud deyildilər, lakin bu, çətin ki, Peyğəmbərin İsanın Allah tərəfindən onlara göndərildiyini düşünməyinə mane ola bilərdi; və hətta bu cür deyəcək qədər onun tarixi şüurunun həddindən artıq yaxşı inkişaf etdiyini güman etsək belə yenə də onun "israillilər İsanın dəvətinə yəhudilər və xristianlar olmaqla iki hissəyə bölünərək cavab verdilər" deməsi gözlənilərdi ki, bu cür deməsi tarix baxımından doğru olacaqdı. Lakin onun dediyi isə həqiqətdə budur ki, "onlar iman etmiş və iman etməmiş israillilərə bölündülər: dini baxımdan onlar parçalandılar, lakin etnik olaraq eyni qaldılar... Buradakı baxış acısı heç şübhəsiz ki, yəhudi məsihilərinə aiddir."[128] Qısaca olaraq Crone vurğulayır ki, Qurandakı perspektiv ən erkən yəhudi məsihilərinin, yəni İsaya iman gətirmiş ilk yəhudilərin perspektividir və daha sonra Pavelin sayəsində ortaya çıxmış xristianlığın perspektivi deyildir. Burada heyrətamiz olan tərəf budur ki, Peyğəmbərin zamanında artıq ilkin yəhudi məsihi qruplardan heç biri qalmamışdı və üçüncü əsrdə onlar tarix səhnəsindən gerilərə çəkilmişdilər. Əgər İslam peyğəmbəri xristianlığı məhz dövrünün xristianları ilə ünsiyyət vasitəsi ilə öyrənmişdisə o zaman necə olur ki, onların perspektivini deyil də, məhz tarixən ən doğru perspektivə, yəni ilk məsihilərin baxış açısına Quranda yer verib?

Maraqlıdır ki, Hitchens peyğəmbərin həyatından ayrı-ayrı epizodlar haqqında danışdığında ziddiyyətli bir üslub izləyir; o həm tarixi qaynaqlara etibar edilməyəcəyini deyir, həm də eyni qaynaqları istifadə edib İslam peyğəmbərini tənqid edir. O, hər şeydən əvvəl gizlətmir ki, Muhəmmədin tarixi bir şəxsiyyət kimi fiziki olaraq mövcud olmağından əmin deyildir və bunu kitabının bir çox yerində təkrarlayır. "Muhəmmədin fiziki mövcudluğu - hədislər tərəfindən nə qədər zəif isbat olunmağına baxmayaraq – həm İslamın güclü tərəfidir, həm də zəif tərəfidir"[129] – deyir. Görəsən nə üçün Hitchens bu düşüncədədir? Cavabı özündən eşidək: "Onun həyatının ilk dəfə qələmə alınması" – Hitchens deyir: "tam yüz iyirmi il sonra İbn İshaq tərəfindən həyata keçirildi ki, onun kitabının orijinalı bizə gəlib çatmayıb..."[130] Bununla isbat etmək istədiyi budur ki, bu gün əlimizdə peyğəmbərin həyatı haqqında yazılanlara etibar etmək olmaz, çünki bu məlumatlar peyğəmbərdən yüz iyirmi il sonra yazılıb. Açıq-aşkar görünür ki, Hitchens islam alimlərinin hədisşünaslıq və sira ədəbiyyatı haqqında yazdıqlarını incələməyib. Hər şeydən əvvəl onu demək lazımdır ki, peyğəmbərin həyatının öyrənilməsi İslamın ilk dövründən başlayır. İsmail bin Muhəmməd bin Sad deyir: "Atam bizə Allahın elçisinin – salləllahu aleyhi va səlləm – hərbi yürüşlərini öyrədərdi, bizə onları və göndərdiyi döyüş dəstələrini bir-bir sayardı və deyərdi:

---

[128] Patricia Crone, "The Quranic Pagans and Related Matters: Collected Studies in Three Volumes", 1-ci cild, səh: 233-234; Brill, Leiden, 2016
[129] GIG, səh: 135
[130] GIG, səh: 129

"Ey oğul! Bunlar sizin atalarınızın tarixidir, onu unutmayın!"[131] Bu sözlərin sahibi məşhur səhabə Sad bin Əbi Vaqqas'ın nəvəsidir. Peyğəmbərə yoldaşlıq etmiş Sad həm də peyğəmbərin doğma dayısıdır və onun oğlu Muhəmməd öz növbəsində öz oğlu İsmailə peyğəmbərin həyat epizodlarını öyrədirdi. Bu sözlərə kitabında yer verən əl-Xatib əl-Bağdadi ardınca əlavə edir ki, "Əli bin əl-Hüseyn deyərdi: "Biz Qurandan surə öyrəndiyimiz kimi peyğəmbərin – salləllahu aleyhi va səlləm – hərbi yürüşlərini və göndərdiyi döyüş dəstələrini öyrənərdik." Bu isə peyğəmbərin nəvəsi Hüseyn'in oğlunun sözləridir. Sira ədəbiyyatı olaraq tanınan bu janr heç də Hitchens'in iddia etdiyi kimi İbn İshaq ilə başlamayıb. Tarixi qaynaqlar göstərir ki, ilk sira ədəbiyyatı, daha dəqiq desək məğazi materialları səhabələrin övladları tərəfindən qeydlər şəklində qələmə alınıb. Bu müəlliflərin arasından üçüncü xəlifə Osman bin Affan'ın oğlu Əbən, Zubeyr bin Avvam'ın oğlu və Aişənin bacısı oğlu Urva öz tələbələrinə bu məlumatları yazdırardılar.[132] Urva'dan sonra bu işi davam edənlərin arasında üç müəllifin adı çəkilir: bunlar Abdullah bin Əbi Bəkr bin Həzm (vəfatı 747-52), Asim bin Ömər bin Qatədə (vəfatı 737) və Muhəmməd bin Muslim əz-Zuhri (vəfatı 741) kimi məşhur islam alimləridir. Məğazi məzmununda yazılan kitabların formatını məhz onların kitabları müəyyən etdi.[133] Məğazi janrı ilə sira arasındakı fərq isə budur ki, sira ümumilikdə peyğəmbərin həyatı haqqında yazılmış material olduğu halda məğazi xüsusilə hərbi yürüşlər, fəthlər, bu yürüşlərdə iştirak edənlər haqqındadır. İbn İshaq'ın kitabına gəldikdə isə onun orijinalı bizə gəlib çatmasa da bəzi fraqmentləri çatıb və kitabın öz orijinalı dəqiq bir şəkildə rekonstruksiya edilib.[134] Üstəlik miladi təqvimlə 728-ci ildə vəfat etmiş Vəhb bin Munəbbih'in məğazi kitabından bir papirus parçasının zamanımıza qədər gəlib çatdığı deyilir.[135]

Hitchens bu mövqeyində İslam dünyasına qarşı sərgilənən oriyentalizmin ən mənfi ünsürlərini özündə cəm edir. Heç qəribə deyildir ki, kitabında Goldziher kimi hədis ədəbiyyatını etibardan salan şəxsiyyətlərin adlarını oxuyuruq. Hitchens kitabında İslamı və onun qaynaqlarını tənqid etmək üçün ən radikal və ən mənfi mövqeyə yönəlməli idi. Onun müsəlmanlara baxışı bir yenilik deyildir və əslində Edward Said'in ustalıqla tənqid etdiyi oriyentalizmin qeyri-legitim uşağıdır. "Şərq və İslam" – Said deyir: "realdan ötədə, fenomenoloji olaraq elə kiçildilmiş bir

---

[131] əl-Xatib əl-Bağdadi, "əl-Cami li Əxlaq ər-Ravi va Ədəb əs-Səmi", 2/195; Məktəbətul-Məarif, Riyad, 1983

[132] C. Fitzpatrick & A. H. Walker, "Muhammad in History, Thought, and Culture: An Encyclopedia of The Prophet of God", birinci cild, səh: 571-572; ABC-CLIO, Santa Barbara, 2014

[133] A. Duri, F. M. Donner & L. I. Conrad, "The Rise of Historical Writing Among The Arabs", səh: 27; Princeton University Press, New Jersey, 1893

[134] Clinton Bennett, "In Search of Muhammad", səh: 29; Cassell, London, 1999

[135] A. F. Beeston, T. M. Johnstone, R. B. Serjeant & G. R. Smith, "Aabic Literature to The End of The Umayyad Period", səh: 345; Cambridge University Press, New York, 1983

statusa sahibdir ki, onları qərbli mütəxəssisdən başqa heç kim doğru anlaya bilməz. Qərbin Şərq haqqındakı spekulyasiyalarının ilk əvvəlindən, Şərqin edə bilmədiyi tək bir şey var idi; o da özünü təmsil etmək idi. Şərqin dəlilləri yalnız orientalistlərin işlərindəki saflaşdırıcı atəşdən keçdikdən sonra və onun sayəsində möhkəmləndikdən sonra inandırıcı ola bilərdi."[136] Qərbin formalaşdırdığı bu filter bu gün də öz təsirini göstərməkdədir və gizli deyildir ki, bu kitabda azərbaycanlı oxuculara fikirlərimizi böyük ölçüdə Qərbin adamları vasitəsi ilə çatdırmağımız bu fenomenin təsiridir. Kolonializmin coğrafi olaraq geridə qaldığını iddia etmək olar, lakin bunun psixoloji və mədəni olaraq hələ də cəmiyyətimizdə hakim olduğunu inkar etmək doğru olmazdı. Ona görə də Hitchens elə düşünür ki, Goldziher bir qərbli mütəxəssis kimi mövzunun nöqtəsini qoyub. Məhz bu filterin sayəsində İslam və Şərq üzərində mütəxəssislik statusu xüsusilə Goldziher, Schacht, Wansbrough, Crone kimilərə verilir və islamşünaslıqda klassik qaynaqlara daha müsbət münasibət göstərən səslər isə boğulur. Bu diskursda macarıstan yəhudisi Goldziher'in adının hallanması təəccüblü olmadığı kimi, digər tərəfdən Horovitz, Fück, Abbott, Sezgin, Watt kimi alimlərin səslərinə yer verilməməsi də təəccüblü deyildir. Yəhudi orientalist Joseph Horovitz'ə görə "Muhəmmədin ən erkən bioqrafiyasını müəyyən etmək üçün isnadlar kifayət qədər etibarlıdır."[137] Horovitz, Fück, Sezgin, Azami kimi alimlər müsəlmanların metodlarını etibarlı hesab edirlər. Belə bir mövqe tutmaq orientalistlər arasında kifayət qədər akademik hesab edilmir, çünki bütün dini qaynaqları sual altına almaq bir qaydaya çevrilib. Yeni nəsil orientalistlər üçün müsəlman qaynaqlarına münasibətdə təsdiqləyici bir mövqe tutmaq asan deyildir, çünki əks tərəfdə radikal mövqe tutanlar asanlıqla onları "qeyri-kritik" olmaqda ittiham edəcək. Müstəmləkəçi oriyentalizmin kölgəsi hələ də çəkilməyib. Ona görə də bu təsir altında akademiklər bu iki rəy arasında orta mövqe tutmağa çalışırlar. Bu mövqeni təmsil edənlər arasında Gregor Shoeler, Harald Motzki, Andreas Görke kimi akademiklər tənqidi yanaşma izləyərək gəldikləri nəticədə hədis qaynaqlarının əksərinin etibarlı olduğunu təsdiqləyirlər. Qərbin islamşünasları arasında hədis-mətn araşdırmaları ilə tanınan Harald Motzki bir bəhsinin sonunda bu nəticəni belə qeyd edir: "Beləliklə də peyğəmbərin həyatı haqqındakı bütün məlumatlarla bağlı mənbələrin kritik araşdırması edilərsə onun həqiqi tarixi bioqrafiyası yazıla bilər."[138] Bu o deməkdir ki, Hitchens'dən fərqli olaraq Qərbin yetişdirdiyi ən görkəmli hədis mütəxəssisləri hədislərin etibarlı qaynaq olduğunu təsdiqləyirlər.

---

[136] Edward Said, "Orientalism", səh: 283; Penguin Books, London, 2003

[137] Herbert Berg, "The Development of Exegesis in Early Islam: The Authencity of Muslim Literature from The Formative Period", səh: 106; Curzon, Surrey, 2000

[138] H. Motzki, "The Biography of Muhammad: The Issue of The Sources", səh: 233; Leiden, Brill, 2000

Hədis sahəsindəki ultrakrepidaryanizmin ən aşkar misallarından biri də Hitchens'in "Sahih əl-Buxari" haqqında yazdığı bu sözlərdir: "(Hədis toplama) layihəsinə həsr etdiyi ömrü boyunca topladığı üç yüz min xəbər arasından iki yüz min xəbərin tamamilə dəyərsiz və əsassız olduğuna hökm verdi."[139] Görəsən Hitchens bu məlumatını hardan götürüb? Təbii ki, onun ərəb dilindəki qaynaqlardan bunu araşdırdığına inanmırıq. Lakin aşkar olan budur ki, ərəb dilli qaynaqlarda keçən məlumatlar Hitchens'in kitabında təhrif olunub və məğzindən uzaqlaşdırılıb. Məş*hur h*ədis alimi İbnus-Salah yazır: "əl-Buxari dedi: "Mən səhih olan yüz min hədisi və səhih olmayan iki yüz min hədisi əzbərdən bilirəm." Deməli əl-Buxari geridə qalan iki yüz min hədisin dəyərsiz və əsassız olduğunu deməyib, sadəcə olaraq onların səhih olmadığını deyib. Hədis elmi ilə məşğul olan müsəlmanlar çox gözəl bilirlər ki, bir hədisin səhih olmaması onun "dəyərsiz və əsassız" olması anlamına gəlmir. Məsələnin ikinci nöqtəsi isə budur ki, burada hədis deyilərkən Hitchens'in anladığı məna qəsd edilmir. On üçüncü əsrdə vəfat *etmiş* İbnus-Salah hədis elmləri haqqında yazdığı kitabında əl-Buxari'nin sözlərini izah edərkən deyir: "O hədis alimlərinin nəzərində "hədis" sözü deyildikdə həm də səhabələrin və tabiinin xəbərləri də qəsd olunur və əksər hallarda iki isnad ilə rəvay*ət edilmiş bir h*ədis iki hədis hesab edilir."[140] Buradan anlayırıq ki, peyğəmbərdən, səhabələrdən və onların tələbələrindən gələn xəbərlərdən hər birinin isnadı ayrılıqda bir hədis hesab edilib və ola bilər ki, bir hədisin üç isnadı olsun, onlardan ikisi səhih olmasın və yalnız biri səhih olsun. Bu halda həmin hədis nəticə etibarı ilə səhih olacaq. Lakin biz anlayırıq ki, hədis elmləri haqqında anlayışı olmayan bir ingilis jurnalist üçün bunları anlamaq asan iş deyildir, buna baxmayaraq bu, onun hədis sahəsində fikir bildirməyinə mane olmayıb.

"Bu gün uşaqlarım arasından ən az savadı olanlar belə təbiətin nizamı haqqında dinin banilərindən istənilən birindən daha çox bilirlər…" Hitchens kitabının beşinci fəslində bu sözləri ilə keçmişin "cahilliyini" müasir dövrün "aydınlığı" ilə müqayisə edir və buradan çıxış edərək deyir: "… və belə *düşünmə*k istərdim ki, buna görə də - aradakı əlaqə *tam bir* şəkildə göstərilə biləcək növdən olmasa belə - öz bəşər yoldaşlarını cəhənnəmə göndərməyə istəkli olmadıqları görünür." Fikrini burada tamamlayan Hitchens çox gözəl bilir ki, dindar bir kimsə ondan bu iddiasının d*əlilini soruşsa, belə* bir dəlili təqdim etməkdən aciz olacaq, ona görə də özünü yandırmamaq üçün stəkanın ucundan bir az dodaq yeri buraxır. Əgər aradakı əlaqəni göstərə bilməyəcəksənsə iddianı niyə edirsən?! Kainatın astronomik düzəni haqqında biliklərin çoxluğu ilə axirətdə təqsirkarların cəzalandırılacağına inanmaq arasındakı bağı tutmaqda çətinlik çəkirəm. Bəli. Məktəbdəki coğrafiya,

[139] GIG, səh: 132
[140] İbnus-Salah, "Mərifətu Ə*nva Ulum* əl-Hədis", səh: 20-21; Dar əl-Fikr, Dəməş*q, 1986*

astronomiya, biologiya fənlərindən öyrənmək vasitəsi ilə müasir yeniyetmələrin *keçmişin* ən böyük liderlərindən dünya düzəni haqqında daha savadlı olduqlarını inkar etmirik. Lakin bu, bizim mövzuda necə güclü bir göstərici ola bilər ki?! Bu gün məktəbi və ya kolleci yeni qurtarmış yeniyetmələr kainat haqqında Newton və hətta Einstein'in bilmədiklərini bilirlər, məgər bu, onları bu iki alimdən daha dəyərli, daha alim çıxarmaq üçün kifayət edirmi?! Biz bu yeniyetmələrimizi *keçmişin* liderləri və şəxsiyyətləri ilə müqayisə edəcəyiksə günəş *sistemi və* yaxud dünya xəritəsi haqqındakı bilikləri əsas alıb müqayisə etməyimiz həm mənasız, həm də haqsız olacaq. Doğru olan fədakarlıqda, mənəviyyatda, amal uğrunda mübarizədə, ideallar uğrunda səbrdə müqayisə aparmaqdır. Doğru olan bəşər tarixində müsbət bir iz buraxmaq, bəşər cəmiyyətini dəyişmək meyarına üz tutmaqdır. Nüvə silahını icad edəcək şəkildə fizikanı dərinliklərinə qədər bilən gənc bir alim onu insanlara qarşı istifadə etməyin cinayət olduğunu dərk etmirsə onun fizika bilikləri ona necə hörmət qazandıra bilər?! Otto Hahn 1938-ci ildə nüvə parçalanmasını kə*şf etdiyində* bu biliklərin gələcəkdə nüvə silahlarına gətirib çıxaracağından şübhələnmirdi. Yeddi il sonra *Hiroşima* şəhərinin xəbərləri ona çatdığında o qədər üzülmüşdü ki, dostları onun intihar edəcəyindən narahat idilər.[141] *Şübh*əsiz ki, burada mənəvi keyfiyyət fiziki biliklərdən daha önəmlidir. Əgər İslam peyğəmbərini misal götürəcəyiksə onun xüsusilə ərəb cəmiyyətində, ümumilikdə isə şərqdən qərbə uzanan böyük bir coğrafiyada qurduğu bir mədəniyyətin, mirasın dəyərinə nəzər salacağıq. Bütün bu sərvəti bizim zamanımızda kə*şf edilmiş bə*zi elmi faktlara qurban vermək - *ən yumşaq dildə* desək – insafsızlıqdır, mənəviyyatsızlıqdır. Fizika, astronomiya, biologiya kimi fənlərdə savad baxımından müasirlərdən geri qalmaqları onlar üçün eyib olmaz. İslam peyğəmbəri özü bu mövzuda başqalarının ondan daha bilikli olacağını öz yoldaşlarına etiraf etmişdi. Peyğəmbərin öz yoldaşlarına - "*siz dünyanızla bağlı işləri məndən daha yaxşı bilirsiz*"[142] – sözlərini dediyini ən məş*hur,* ən etibarlı hədis qaynaqları qeydə alıblar. Onun bu sözləri öz növbəsində onu göstərir ki, peyğəmbər öz nübuvvətinin doğruluğunu dünyəvi elmlərdəki üstün bilikləri ilə *nümayiş etməyə* cəhd etmirdi. Düny*əvi işlə*rdə başqasının peyğəmbərdən daha bilikli ola bilməsi nə o zamanın, nə də bu günün müsəlmanlarını risalətin həqiqətlərindən uzaqlaşdıra bilməyib. Biz müqayisə etməyə qarşı deyilik, amma müqayisə zamanlar arasındakı imkan fərqləri ilə qərəzli olmamalıdır, əksinə o zaman üçün də, bu zaman üçün də bərabər dərəcədə *mümkün olan işlə*rlə bağlı edilməlidir. Baxacağıqsa peyğəmbərin bəşəriyyət üçün etdiyi xidmətlərə baxmalıyıq. İslamdan öncəki ərəb cəmiyyətində qız uşaqları diri-diri basdırılırdısa,

---

[141] Freeman Dyson, "Disturbing The Universe", səh: 7; Harper & Row Publishers, New York, 1979

[142] "Sahih Muslim", 2363

qadınlar mülkə sahib olmaq, miras almaq hüququndan məhrum idisə İslam dini bütün bu sahələrdə inanılmaz pozitiv dəyişiklərə səbəb oldu. Sosial zəmində qız uşaqları ilə oğlan uşaqlarının eyni dərəcədə Allahdan gələn nemət olduğunu öyrətdi, qız uşaqlarını istəməməyin Allahın nemətinə qarşı küfr olduğunu öyrətdi. Əgər daha öncə istənilən qədər qadın ilə evlənməyə izn var idisə, hətta atası öldükdən sonra onun qadınına varis olmaq halları mövcud idisə İslam bunları ya tamamilə aradan qaldırdı, ya da əhəmiyyətli dərəcədə məhdudiyyət qoydu. İslamın peyğəmbəri cəmiyyətlərdəki sosial bərabərsizliyə qarşı da ciddi mübarizə verdi. İrqçilik fikrinin üstündən xətt çəkən çox saylı Quran ayələrindən biri belə səslənir: "Ey insanlar! Biz sizi kişi və qadından yaratdıq. Sonra bir-birinizi tanıyasınız deyə, sizi xalqlara və qəbilələrə ayırdıq. Şübhəsiz ki, Allah yanında ən hörmətli olanınız Ondan ən çox qorxanınızdır. Həqiqətən Allah Biləndir, Xəbərdardır." (49:13) Allah qatında hörmət qazanmaq ərəb doğulmağa görə və ya avropalı olmağa görə deyildir, yalnız və yalnız Allaha mütilik ilədir. İslam peyğəmbərinin təlimlərində irqçiliyin, qəbiləçiliyin, şovinizmin hər bir növünün təhlükəsinə işarə vardır və tarixə vəda xütbəsi olaraq düşmüş çıxışında on minlərlə insanın qarşısında duraraq bu sözləri demişdir: "Ey insanlar! Rəbbiniz birdir və atanız da birdir! Diqqət edin! Nə bir ərəbin bir əcəmi üzərində, nə bir əcəminin bir ərəb üzərində, nə ağın qara üzərində, nə də qaranın ağ üzərində üstünlüyü yoxdur, üstünlük yalnız Allah qorxusu ilədir."[143] Peyğəmbərin bu sözü kanonik hədis kitablarında yer alır və müsəlmanların təlimlərində məşhurdur. Qulları döyməyi, onlara işgəncə verməyi, onları təhqir etməyi qadağan etmiş, kölə qadını öz uşağından ayırmaq adətini şiddətlə qınamışdır. Eyni şəkildə kölə etmək yollarını məhdudlaşdıraraq əksinə onları azad etməyə təşviq etmişdir. Müharibə qaydalarını tənzimləyərək ağacları kəsməyi, əkinləri yandırmağı, rahibləri, fermerləri, qadınları və uşaqları öldürməyi qəti qadağan etmişdir. Heyvanlara əziyyət verməyi, onları normaldan artıq yükləməyi qınamışdır. Əmisi oğlu İbn Abbas'ın verdiyi xəbərə görə "Bədr günü əsirlərdən bir hissəsinin özlərini azadlıqdan qurtarmaq üçün pulları yox idi və Allahın elçisi – salləllahu aleyhi va səlləm – onlardan girov əvəzinə ənsarın uşaqlarına oxumaq, yazmağı öyrətməyi tələb etdi."[144] Bu isə oxumaq və yazmaq bilməyən bir peyğəmbərin oxumağa, yazmağa verdiyi dəyərin göstəricisidir. Peyğəmbərin səhabələri arasında elminə görə tanınmış Zeyd bin Sabit oxumağı və yazmağı bu əsirlərdən öyrənmişdi. İslam nəbisinin oxumaq və yazmağa verdiyi əhəmiyyəti göstərmək üçün onlarla misallar verə bilərik. Bu sadaladığımız islahatların hər biri ayrılıqda insanı tarixi qəhrəmana çevirir və bu gün tanınan, ehtiram və sayğı ilə yad edilən bir çox böyük şəxsiyyət ya köləliyə qarşı, ya qadın hüquqları üçün mübarizəsi ilə, ya zalımlara qarşı dirənişi ilə, ya kasıbların halını

[143] Əhməd bin Hənbəl, "əl-Müsnəd", 38/474, Müəssəsə ər-Risələ, 2001, Beyrut
[144] Əhməd bin Hənbəl, "əl-Müsnəd", 4/92; Müəssəsə ər-Risələ, 2001, Beyrut

yaxşılaşdırması ilə tanınırlar. İslam peyğəmbəri isə bunların hamısında və daha çoxunda əvəz edilməz bir mübariz və fədakar lider idi. Bu və digər faktlara əsasən amerikalı astrofizik və yazıçı Michael H. Hart 1978-ci ildə yazdığı "Yüzlük: Tarixin Ən Nüfuzlu İnsanlarının Sıralaması" adlı kitabında İslamın peyğəmbərini birinci sırada yerləş*dirir. M*əşhur fransız filosof və siyasətçi Alphonse de Lamartine yazır: "Amalının əzəməti, imkanlarının azlığı və nəticələrinin böyüklüyü əgər insanın dahiliyini göstərən üç ölçüdürsə, müasir tarixin hansısa böyük bir şəxsiyyətini Muhəmməd ilə müqayisə etməyə kim cürət edə bilər?!"[145]

Hitchens'in dinlərə qarşı gətirdiyi bu "cahillik" arqumenti nə qədər də kinayəli sözlərlə, nə qədər də istehzalı atmacalar ilə b*əzədilmiş olsa da mahiyyə*t etibarı ilə ciddi arqument deyildir. Nə üçün müqəddəs mətnlər dinozavrları, Avstraliyadakı bəzi əcaib heyvanların adını çəkmir? Bax bu cür ucuzlaşmış arqumentlər ilə centlmen Hitchens dindarların əzmini və imanını sarsıtmaq arzusundadır. Axı nə üçün ümumiyyətlə müqəddəs mətnlər dinozavrlar haqqında danışmalı idi?! Danışılmaması necə bir arqument ola bilər ki? Bunun hikməti nə olmalı idi? Bakteriyalar, mikroblar haqqında da danışılmır, "çünki" – Hitchens'ə görə - "bu zəruri, amma təhlükəli məxluqların mövcudluğu bilinmirdi və dərk olunmurdu."[146] Bəli, tamamilə mümkün bir haldır, çox ehtimal ki, belə də olub. Peyğəmbərlərin mikroblardan, bakteriyalardan xəbərlərinin olmaması mümkündür, çünki müsəlmanlar olaraq biz onların bəşər olduqlarına inanırıq. İnsanlara dinozavrları, mikrobları, bakteriyaları, fizikanın qanunlarını öyrətmək üçün yox, onlara iman və mənəviyyat həqiqətl*ərini başa salmaq üçün göndərilmişdil*ər. Ona görə də bir peyğəmbərin təbiət haqqındakı təsəvvürünün öz dövrünün biliklərinə müvafiq olması çox normal haldır. Amma burada xüsusi bir möhtəşəmlik vardır. Buna baxmayaraq yenə də onların gətirdikləri təlimlərin bu günün tibbi bilikləri işığında nə qədər doğru olduğunun şahidi ola bilirik. Misal üçün bir hədisdə İslamın peyğəmbəri deyir: "Xəstə olan (dəvə) sağlamın yanına qoyulmamalıdır."[147] Yaxud da Usəmə bin Zeyd'in xəb*ər verdiyi bir başqa h*ədisdə peyğəmbər taun xəstəliyi haqqında müsəlmanlara belə bir göst*əriş verir: "Kim bir yerdə* onun olduğunu *eşid*ərsə ora getməsin v*ə kim onun baş verdiyi yerdə* olarsa ordan qurtulmaq məqsədi ilə ordan çıxmasın!"[148] *Bir başqa x*əbərdə isə deyir: "Cüzam xəstəsindən aslandan qaçdığınız kimi qaçın!"[149] Özü də buna əməl edərək insanlara doğru olanı göst*ərib. Bunu biz bir başqa h*ədisdə görə bilirik ki, əş-Şərid bin Suveyd deyir: "Səqif nümayəndəliyində cüzamlı bir nəfər var idi və peyğəmbər ona xəbər

---

[145] A. Lamartine, "Histoire de La Turquie", birinci cild, səh: 111; Leipzig Chez Wolfgang Gerhard, Paris, 1855
[146] "God is Not Great", səh: 91;
[147] "Musnəd Əhməd", 15/149; Muəssəsə ər-Risələ, Beyrut, 2001
[148] "Sahih əl-Buxari", 9/27; Dar Tavqun-Nəcə, 2001
[149] "Sahih əl-Buxari", 7/126;

göndərdi: “Biz sənin beyətini aldıq, qayıda bilərsən.”[150] Beləliklə də cüzam olan ilə kontaktda olmaq istəmədiyini göstər*mişdir. Taun* xəstəliyinə *yoluxmuş* şəhərə girməməyi, içindəkilərə isə oradan çıxmamağı göstə*riş vermə*k tam bir mənada “karantin” tədbiridir. Bunu mikroorqanizmlər haqqında biliklərə sahib olduğumuz halda etməyimiz o qədər də təəccüblü olmamalıdır. Təəccüblü olan bu mikroorqanizmlər haqqında bir təsəvvür olmadan *ən asan bir* şəkildə bu xəstəliklərdən qorumağın və ya yayılmasının qarşısını almağın yolunu doğru şəkildə göstərməkdir.

[150] “Sahih Muslim”, 4/1752 (2231)

## HITCHENS PSİXOLOQ KİMİ

"*Mənə hər zaman təəccüblü gəlir ki, həyatlarının yeganə mənası, həyatın mənasız olduğunu isbat etmək olan insanlar mövcuddur.*"

Pierre Teilhard de Chardin

Danimarkanın tanınmış filosofu Sören Kierkegaard deyir: "Burada bir hekayəni nəql etməyə özümə icazə verəcəm; *heç bir şeyi dəyişmə*dən olduğu kimi çatdırmağa çalışacağım bu hekayə dəlixanadan gəlir. Belə bir müəssisədə saxlanılan bir xəstə oradan qaçmağa çalışır və həqiqətən də pəncərədən tullanmaqla məqsədinə nail olur və azadlığa aparan yolda addımlamağa hazırlaşır. Bu an onun ağlına bir fikir gəldi (bunun ağıllı yoxsa dəli bir fikir olduğunu deməliyəmmi?) *:* "Şəhərə getsən səni tanıyacaqlar və bir daha bu yerə geri qaytarılacaqsan; buna görə də ağzından çıxaracağın obyektiv həqiqətlərlə insanları tamamilə inandırmağa hazır olmalısan ki, sənin ağlınla bağlı hər şey qaydasındadır!" O, bu barədə *düşün*ərək yolu ilə getdiyi ərəfədə yerdə yatan bir top görür, onu qaldırır və paltosunun arxa cibinə qoyur. Atdığı hər addımda top, yumşaqca desək, onu arxadan vurur və hər dəfə vurduqda deyir: "Danq, Yer kürə formasındadır." Şəhərə gəlib çıxır və dərhal dostlarından biri ilə əlaqə saxlayır; dəli olmadığına onu inandırmaq istəyir və buna görə də bir qabağı, bir arxaya gedərək davamlı deyir: "Danq, Yer kürə formasındadır." Həqiqətən də Yer yumru deyilmi? Yoxsa insanlar Yerin fəsəli kimi yastı olduğuna inandıqları zamandakı kimi, dəlixanalar hələ də bu fikrə görə daha bir dəlinin həsrətindədir?! Yoxsa hamı tərəfindən q*əbul edilmiş və* hamı tərəfindən hörmət edilən obyektiv bir həqiqəti səsləndirməklə ağlı başında olduğunu sübut etməyə ümid edən kəs həqiqətən də dəlidirmi?! Bununla belə həkim üçün xəstənin hələ də sağalmamış olması aydın bir məsələ idi; bununla belə bu xəstənin müalicəsinin Yerin yastı olduğunu qəbul etdirmək yolu ilə mümkün olduğunu demək doğru deyildir. Lakin insanların hamısı həkim deyildir və zəmanənin tələbləri "dəlilik nədir?" sualının cavabında xeyli təsirə sahibdir…"[151] Kierkegaard bununla göstərir ki, bir kəsin sözündə dediyinin obyektiv həqiqət olması onun ağıldan sağlam olmasını sübut

[151] S. Kierkegaard, "Concluding Unscientific Postscript", səh: 174; Princeton University Press, Princeton, 1968

etmir. Burada deyilən sözün hansı məzmunda, hansı tərzdə deyilməsi çox önəmli bir rol oynayır. "Obyektiv vurğu" – Kierkegaard deyir – "deyil*ən şeyin nə* olması üzərinə *düşürsə*, subyektiv vurğu sözün necə deyilməsi üzərinə *düşür."*[152] Hitchens kitabında təkrar-təkrar bəzi faktları qeyd edir, lakin bunları öz məzmunundan çıxararaq elə bir tərzdə çatdırır ki, həmin "obyektiv həqiqətlər" subyektiv vurğunun altında tanınmaz bir hala düşür. *Ən az*ından dindarlar heç bir şəkildə öz dinlərini o məzmunda görmürlər və qəbul etmirlər.

Tanrını böyüklüyünü hədəf alan bu kitab da öz səhifələrində bu cür sağlam olmayan bəzi tərəfləri gizlədir. Diqqətli oxucu Hitchens'in xüsusilə bəzi cinsəl mövzulara ilişib qaldığını görəcək. Dindarların arasında baş verən sıradan kənar bəzi cinsəl əməlləri təkrar-təkrar ortaya çıxarıb onların üzərindən dəxli olmayan suallar vermək sağlam bir fikrin məhsulu ola bilməz. Fərdlər üzərind*ən bu* şəkildə yoğun bir tənqid aparmaq özü normal olmadığı halda bir də bu fərdi hallar üzərindən bütün dinlərlə bağlı ümumiləş*dirmə*lər aparmaq ruhi mərəzin göstəricisidir. Kitabının dördüncü fəslində dinlərin uşaqlarla bağlı bəzi ayinlərini ələ alan Hitchens adətinə sadiq qalaraq dini icmalarda cahilliklər üzünd*ən baş* verən ən çirkin halları misal çəkir. Afrikada qız uşaqlarının sünnət olunmasının q*əddar yollarla baş verdiyini misal verir, halbuki dini m*ətnlərin heç birində bu şəkildə *bir şey* əmr olunmur. Bu kimi hallar dini mətnlərdən və dünyəvi elmlərdən cahil olan əhalinin arasında sağ qalmağı bacarmış qəddar adətlərdir. Katolik kilsəsinin cinsi əlaqədə kondom vasitəsinin istifadə edilməsinə qarşı mübarizəsi haqqında yazır və bunun Afrikada QİÇS xəstəliyinin yayılmasındakı rolunu xüsusilə vurğulayır. Lakin bununla paralel olaraq orada xəstəliklərə qarşı, aclıqlara qarşı mübarizə verən eyni katolik kilsəsinin xeyriyyə fəaliyyətlərindən yazmır. Eyni problemdən danışarkən Afrikadakı müsəlmanlar arasında İİV (HIV) virusunun daha az yayılmasına və bunda sünnət olunmağın roluna heç bir diqqət çəkmir. Ümumdünya Səhiyyə Təşkilatı (WHO) qırxdan çox araşdırmaya əsasən bu faktı təsdiqləyib və *bu virusa yoluxma riskini azaltmaq üçün kişil*ərin sünnət edilməsini pozitiv dəyərləndirib. Təşkilatın səhifəsində qeyd edilən məlumata görə sünnət ad*əti kişil*ərdə heteroseksual olaraq İİV virusuna yoluxmaq riskini 60% azalda bilir.[153] Bütün bunlara baxmayaraq sizcə Hitchens kimi birinin nəzərində sünnətin dəyəri nədir? Kitabının on altıncı fəslində sünnət haqqında birdən çox səhifəni nifrət dolu sözlərlə doldurub. Bir yerdə bunu "əxlaqsız əməl" adlandırır, bir neçə sətr sonra isə "kiçik uşaqları cinsəl olaraq eybəcər hala salmaq" olaraq dəyərləndirir. *Hitchens'in bu* şəkildə gətirdiyi "obyektiv həqiqət" t*əhrif edilmiş bir*

---

[152] S. Kierkegaard, "Concluding Unscientific Postscript", səh: 181; Princeton University Press, Princeton, 1968
[153] Nicola Bulled, "Prescribing HIV Prevention: Bringing Culture into Global Health Communication", səh: 175-177; Left Coast Press, California, 2015

məzmunda çatdırırlır; bu əməliyyatda obyektiv olaraq qan var, ağrı var, itirilmiş bir parça vardır. Oğlan uşaqları üzərində edilən bu əməliyyatı “iyrənc əməliyyat” adlandırdıqdan sonra Hitchens onun məqsədinə toxunaraq bunun “gələcək cinsəl həyatını məhv etmək məqsədi ilə çarəsiz körpənin bədənini eybəcər hala salmaq” olduğunu deyir. Lakin mövzunu bu cür oxuculara çatdırmaq məsələni təhrif etməkdən *başqa bir şey deyildir.* Sünnətə qarşı nifrət və qəzəb digər neo-ateistlərin də arasında adi bir haldır. Richard Dawkins twitter üzərindən sünnət adətinə qarşı qara bir kompaniya başladıb. Bunların görmək istəmədiklərini isə görən həkimlər, alimlər az deyildir. Sidney universitetində molekulyar biologiya üzrə professor Brian J. Morris Washington universitetində urologiya üzrə professor John N. Krieger ilə birlikdə yazdıqları elmi çalışmada[154] sünnə*tin kişilə*rdəki cinsi həssaslığı azaltmadığını, əksinə artırdığını göstəriblər. Kenyada 2784 nəfər buluğ həddinə çatmış kişi üzərində aparılmış araşdırmada John Krieger, Robert Bailey, Corette Parker və digər professorlar eyni nəticələri əldə ediblər.[155] Bütün bunlar Hitchens’in öz məlumatlarını kal-kal dərdiyini sübut edir. İngilis yazıçı publisist Anthony Gottlieb “The New Yorker” dərgisindəki məqaləsində deyir: ”Afrikada qadın cinsəl orqanın eybəcərcəsinə də*yişdirilmə*sinə - ki, bu heç bir müəyyən dinlə möhkəm bağı olmayan yerli ənənəvi adətdir - qarşı haqlı mübarizə apardıqdan *sonra Hitchens kişi sünnə*tinə qarşı hücum çəkir. O, bunun saysız həyatı səfil vəziyyətə salmış tibbi baxımdan təhlükəli bir əməliyyat olduğunu iddia edir. Bu, *kişi sünnə*tinin universal olduğu və aralarında həkimlərin, hipoxondriyanın və lazımsız yerə narahat olan anaların olması adi bir hala çevrilmiş yəhudi icması üçün bir yenilik olacaq. Dünyanın kişi əhalisinin üçdə birini tə*şkil edə*n yəhudilərin, müsəlmanların və başqalarının sünnə*t olmuş kişilə*ri Ümummilli Səhiyyə Təşkilatının QİÇS-in qarşısını almaq üçün sünnəti tövsiyə edən son elanı ilə təskinlik tapa bilərlər.”[156]

Hə*mçinin aşkinazi y*əhudilər arasındakı bəzi dini icmalarda tətbiq edilən *metzitzah b’peh* ayini haqqında danışır və oğlan uşağı sünnət olunduqdan sonra bir mohel[157] tərəfindən yaradakı qanın ağız ilə sorulub tüpürülməsini qınayır. Bəli, bu gün bilinir ki, bu adət nəticəsində moheldə olan bəzi xəstəliklər uşağa keçə bilər. Lakin Hitchens’in haqqında qafil qaldığı yer budur ki, yəhudilərdə müqəddəs sayılan, vəhy hesab olunan heç bir mətndə bu adət əmr olunmayıb. Yəhudilər özləri etiraf edirlər ki, bu dini hökm Tövratdan gəlmir, lakin rabbinlərin hökmlərini

---

[154] Morris B. J, Krieger J. N. “Does male circumcision affect sexual function, sensitivity, or satisfaction?--a systematic review”, J Sex Med, 10 (11), 2644-2657, noyabr 2013

[155] Krieger J.N, Mehta S.D, Bailey R.C, Agot K, Ndinya-Achola J.O, Parker C, Moses S, “Adult male circumcision: effects on sexual function and sexual satisfaction in Kisumu, Kenya”, J Sex Med, 5 (11), səh: 2610-2622, noyabr 2008

[156] Anthony Gottlieb, “*Atheists With Attitude*”, The New Yorker, 14 may, 2007

[157] Yəhudilərdə uşağı sünnət edən şəxs

özündə cəm edən *Mişna* ənənəsindən qaynaqlanır. Başqa cür desək bu, yəhudi cəmiyyətində dindar yəhudilərə ayinləri necə yaşamağı öyrətmiş *rabbinlərin*, haxamların təlimi olaraq ənənəyə çevrilib. Bu rabbinlər öz dövrünün tibbi biliklərinə əsasən qanın sorulmamasının uşağın sağlamlığına zərər ola biləcəyinə inanırdılar, ona görə də öz dini icmalarına bu göstərişi veriblər. Bu o deməkdir ki, Hitchens bu gün uşaqların sağlamlığından ötrü narahat olaraq bu adəti qınadığı kimi o dövrün rabbinləri də uşağın sağlamlığını düşündükləri üçün qanı sormağı doğru hesab ediblər.[158] Yunan təbib Pergamon'lu Galen ( m.s. 129-217) hələ öz zamanında ən etibarlı tibbi mütəxəssis kimi bu hallarda qanın bir yerdə yığılmasını zərərli hesab edir, onun oradan kənarlaşdırılmasını uşağın sağlamlığı üçün doğru hesab edirdi.[159] Bu yalnış təsəvvür nəticəsində qanın sorulmasına ehtiyac yaranmışdır. Bu təsəvvürdən çıxış edərək uşaqların sağlamlığını nəzərə alan rabbinlər belə bir göstəriş veriblər. Dördüncü əsrdə yaşamış rabbin Rav Papa yazırdı ki, "qanı sormağı tərk etmək uşaq üçün təhlükəlidir və buna görə də yaranı sormayan umman (sünnət edən) vəzifəsindən azad edilməlidir."[160] Alman həkim Julius Preuss hələ on doqquzuncu əsrin sonunda bu sitatı qeyd etdikdən sonra vurğulayır ki, bu əməl artıq yəhudilərdə sünnət adətinin bir hissəsi deyildir və yalnız tibbi məqsədlərlə edilib və əlavə edir ki, "Almaniyada və bəzi digər ölkələrdə uşağın yoluxmasından qorunmaq üçün şüşə borunun ucuna pambıq sarıq bağlayır və ağzına ağızlıq keçirib oradan sorur." Hitchens müasir tibbi bilikləri əsas alaraq bu ritualı tənqid etməkdə haqlıdır, lakin məzmunu doğru çatdırmır. Məzmun isə budur ki, yəhudi dinində bu əməlin yer alması da məhz tibbi məqsədlərlə bağlıdır. Onu da qeyd edək ki, bu adəti tənqid etmək müasir bir fenomen deyildir. Hələ 13-cü əsrdə xristian polemik yazıçı Raymond Martini bu adətin qeyri-gigiyenik olmasını göstərərək onu qınayırdı və bu adətin tibbi faydaları haqqında yəhudilərin gətirdikləri arqumentləri rədd edirdi. Bu arqumentləri rədd edərkən müsəlmanların sünnət adətini misal verirdi; əgər zərərli olsaydı müsəlmanların uşaqlarında bu zərəri görərdik, lakin belə bir şeyin şahidi olmuruq.[161] Bu əməlin tənqidi qədim olduğu kimi bunun problemli tərəflərinin də nəzərə alınıb reform edilməsi də müasir deyildir. Bir əsrdən çox müddətdir ki, ortodoks yəhudilərin əksəriyyəti adətin bu hissəsi üçün steril şüşə borudan istifadə edirlər.[162] Bununla bağlı maraqlı bir hadisəni bilməyimiz lazımdır. 1836-cı ildə *Vyana* şəhərindəki yəhudilər yeni

[158] David Biale, "Blood and Belief: The Circulation of A Symbol between Jews and Christians", səh: 99; University of California Press, Berkeley & Los Angeles, 2008

[159] Michael Lesher, "Sexual Abuse, Shonda and Concealment in Orthodox Jewish Communities", səh: 100; McFarland & Company, Jefferson, 2014

[160] Julius Preuss, "Biblical and Talmudic Medicine", səh: ; Rowman & Littlefield Publishers, Maryland, 2004

[161] David Biale, "Blood and Belief: The Circulation of A Symbol between Jews and Christians", səh: 99; University of California Press, Berkeley & Los Angeles, 2008

[162] Michael Lesher, "Sexual Abuse, Shonda and Concealment in Orthodox Jewish Communities", səh: 100; McFarland & Company, Jefferson, 2014

doğulmuş uşaqları arasında xəstəliklərin yayıldığını və bəzilərinin nəticədə *öldüyünü müşahidə* etdilər. Şəhərin rabbini Elazar Horowitz bu uşaqların eyni mohel tərəfindən sünnət edildiyinə diqqət yönəltdi. Rabbin dövrünün həkimləri ilə məsləhətləşdikdən sonra bu xəstəliklərin bu adətdən qaynaqlana biləcəyi qənaətinə gəlir və həkim dostu S. Wertheim ona qanı ağız ilə sormaq əvəzinə şəraba batırılmış süngər ilə təmizləməyi məsləhət görür. Horowitz bundan sonra *Bratislava* şəhərindəki yeşivanın[163] müdiri rabbin Moses Sofer'ə yazaraq bu metod barəsində məsləhətləşir və bu metodun təsdiqlənməsinə nail olur.[164] Bu, dini bir qrup tərəfindən və onların böyükləri tərəfindən göstərilmiş həssaslığın nümunəsidir. Çox təəssüf ki, Hitchens bu cür misalları verərək pozitiv addımları tərifləməz, əksinə bunlardan yan keçərək həmişə istisna halları misal göstərərək qınayar. Əgər Stalin kimi ateistlərin idarə etdiyi rejimlər cinayət törədirlərsə Hitchens onlardakı fanatizmi qəsd edərək bunu onların özlərinə xas "dindarlıqları" olaraq göstərir, yenə də dini tənqid etməyə çalışır. Hitlerin rejiminə qarşı müqavimət göstərdiyi üçün öldürülmüş lüteran rahib Dietrich Bonhoeffer'dən danışarkən bu qəhramanlığı onun imanına yox, humanizminə borclu olduğunu deyir. Beləliklə də Christopher Hitchens hər imkanda günahı dinin üzərinə yükləyir.

*Bu gün ateist olmuş bəzi keçmiş* yəhudi və ya müsəlmanlarda sünnət adətinə qarşı qeyri sağlam bir münasibət formalaşıb. "Mən sünnət olunmuşam və qoy sənə deyim: Mən buna nifrət edirəm. Mən buna nifrət edirəm. Mən buna nifrət edirəm." Bu sözləri ilə öz cinsiyyət orqanının dəyişdirilməsinə etiraz edən radio proqramın aparıcısı Howard Stern'dir. Əgər bunların imkanı olsa əməliyyat edib kəsilmiş dərini geri qaytararlar. Bu gün ateistlər arasında öz həyatını sünnət adətinə qarşı mübarizə verməyə, kişi cinsiyyət orqanının başını örtən dəri parçasını qurtarmağa həsr edən insanlar vardır. Bizim üçün çox mənasız bir həyat məqsədi kimi görünsə də bir ateistin zehnində bu, şərəfli missiya kimi görünür. Ateist olduqdan sonra sünnət olunmuş cinsiyyət orqanına nifrət etmək bir yenilik deyildir. Miladdan öncə Fələstin torpaqlarında yaşayan yəhudilər arasında özlərini yunanlara oxşatmağa çalışanlarda da eyni hal mövcud idi. Miladdan öncə ikinci əsrdə dördüncü Antiochus'un zamanında Helen mədəniyyəti Fələstin torpaqlarına və cəmiyyətə *çox güclü nüfuz etmişdi.* Bu təsir ondan sonra bir neçə əsr o torpaqlarda öz əhəmiyyətini qoruyub saxlamağı bacarmışdı. Yəhudi cəmiyyətindəki varlı ailələr özlərini yunan mədəniyyətinin bir hissəsi kimi görməyə və bu mədəniyyətin ideallarına uyğun yaşamağa çalışırdılar. Atletik oyunlarda və ya ictimai hamamlarda çılpaq şəkildə insanların arasına çıxmaq da bu

[163] *Yeşiva* yəhudilərdə tövrat, talmud, mişna kimi dini mətnləri öyrədən məktəblərin adıdır.
[164] Jacob Katz, "Divine Law in Human Hands: Case Studies in Halakhic Flexibility", səh: 360; Magnes Press, Jerusalem, 1998

mədəniyyətin bir hissəsi idi. Sünnət olunmuş yəhudilər bu çılpaqlıqda özlərinin yəhudiliklərini gizlətməyə və buna nail olmaq üçün cinsiyyət orqanının dərisindən ağır çəki daşları asaraq dərini uzatmağa çalışırdılar. Josephus yazır: "Onlar tənasül orqanlarının sünnət olduğunu gizlədirdilər ki, çılpaq olduqlarında belə yunanlar kimi görünsünlər."[165] Bu əməliyyata hətta xüsusi bir ad da vermişdilər. Epispasm və ya epispasmus deyirdilər və əməlin belə xüsusi bir ad alması sənə əməlin nə qədər yayğın olduğunu bildirməlidir. İşin qəribə tərəfi isə budur ki, o dövrün yunanlarında çılpaq idmanla məşğul olmaq, ictimai hamamlarda çılpaq gəzmək yüksək mədəniyyətin təmsili hesab olunduğu halda digər tərəfdən kişi cinsiyyət orqanının baş hissəsinin görünməsi ədəbsizlik sayılırdı. Sünnət olunmuş yəhudilər arasında özünü yunanlara bənzətmək istəyənlərin buna görə nə qədər utandıqlarını bir düşünün!

Bütün bu hellenləşdirmə prosesinin qarşısını almaq üçün yəhudilər miladdan əvvəl 167-ci ildən 160-cı ilə qədər davam edəcək üsyana əl atdılar. Tarixə Makkabi üsyanı olaraq keçmiş bu müqavimət aqressiv hellenləşdirmə prosesinə qarşı bir əks reaksiya idi. Hitchens bu hadisəni bəşər tarixinin faciəsi adlandırır. "Əgər kimsə bəşər tarixinin ən faciəvi hadisəsini müəyyən edə bilsəydi o, bu gün cansıxıcı və zəhlətökən Hannuka bayramı ilə qeyd edilən tarixi hadisə olardı. … Lakin miladdan əvvəl 165-ci ildə Yəhudi Makkabi'ni Qüdsdəki Məbədi yenidən müqəddəsləşdirməyə və beləliklə də Hannuka'nı mötədil şəkildə qeyd edənlərin bu gün mənasızcasına xatırladıqları bir tarixə çevirməyə vadar edən multikulturalizmlə heç bir əlaqəsi olmayan bir şey idi. Həşmuni sülaləsinin əsasını qoymuş Makkabilər Fələstində və başqa torpaqlarda hellenizmin təsirinə düşmüş yəhudilərin əleyhinə musəvi fundamentalizmini məcburi olaraq bərpa edirdilər. Bu erkən həqiqi multikulturalistlər "qanundan" bezmişdilər, sünnət adəti ilə təhqir olunmuşdular, yunan ədəbiyyatı ilə maraqlanmışdılar və gimnaziyanın fiziki və zəkalı məşqləri tərəfindən cəzb olunmuşdular və fəlsəfəyə xeyli bələd idilər…"[166] Oxucu bu sözlərdə Makkabilərin musəvi qanunu bərpa etməyə qarşı, qədim Fələstin torpaqlarında hellenizmin perspektivinin ölməsinə qarşı duyulan təəssüf hislərini rahatlıqla sezə bilər. Hitchens bunu gizlətmir, əksinə çox açıq sözlərlə bu hadisəyə "əfsus!" deyir. Problem əslində Hitchens'in sadələşdirməyə çalışdığı qədər sadə deyildir. Buna dindar, geridə qalmış kənd əhalisi ilə yunan mədəniyyətini mənimsəmiş şəhər əhalisi arasında baş vermiş vətəndaş müharibəsi gözü ilə baxmaq bütün baş verənlərin haqqını verə bilməz. Yaxın Şərqdə Makedoniyalı İskəndərdən miras qalmış Səluki xanədanı zorakılıqla, qəddarlıqla yunan mədəniyyətini təbliğ edirdi. Səluki hökmdarı dördüncü Antiox (miladdan əvvəl

[165] Flavius Josephus, "The Jewish Antiquities", 12-ci kitab, beşinci fəsil, səh: 362, Whiston tərcüməsi, Philadelphia
[166] "God is Not Great", səh: 273-274

175-ci il ilə 164-cü illər arasında hökmranlıq edib) m.ə. 169-cu ildə Məbəd xəzinəsini qarət etmişdi və iki il sonra Qüdsün bütün sərvətlərini talan edir, çox sayda yəhudi və fələstinli öldürür, çoxunu da köləyə çevirir. Ənənəvi dini ayinlərin hamısını qadağan edir və dini kitabları yandırmağı əmr edir. *"O, şəhəri talan etdi və onu atəşə verdi, evlərini və hasar divarlarını dağıtdı. Qadınları və uşaqları əsir aldı, mal-qaranı müsadirə etdi... Onlar mədəbin ətrafında hər yerdə məsum qanlar axıtdılar və məbədin özünü də murdarladılar. Onların üzündən Qüdsün əhalisi qaçdı, şəhər yadların yaşayış yerinə çevrildi... Kral Qüdsə və Yəhudanın şəhərlərinə elçisi ilə fərmanlar göndərdi, ölkəyə yad olan adətləri qəbul etməyi onlara göstəriş verdi. Məbəddə qurban yandırılışını, qurban şərbətlərini qadağan etdi, şənbə gününü və bayramları ləkələdi. Məbədi və müqəddəs hər bir şeyi alçaltdı. Öz bütlərinə qurbangahlar, mehrablar və məbədlər tikdi, onlara donuz və digər murdar heyvanları qurban kəsdi. Yəhudilərin oğullarını sünnətsiz buraxdı və qadınlarını özlərini hər bir çirkli işə və rəzalətə satmağa məcbur etdi... Kimdə əhdin nüsxəsi tapılsaydı və ya kim ona əməl edərkən görülsəydi kralın fərmanına görə ölümə məhkum olurdu... Fərmana əsasən uşaqlarını sünnət elətdirmiş qadınlar - körpələri boyunlarından asılı şəkildə - öldürülməli idilər və onların ailə üzvləri də, sünnəti icra edənlər də onlarla birlikdə edam olunurdular."*[167] Katolik kilsəsinin Bibliyaya daxil etdiyi Birinci Makkabilər kitabında hadisələr bu cür vəsf olunur. Səlukilərin apardığı belə siyasət nəticəsində Hitchens'in "erkən həqiqi multikulturalistlər" adlandırdığı insan təbəqəsi ortaya çıxdı. Bu siyasətin sonuna qədər gətirib çatdırılmasını, Fələstin ərazisində şəhərlərdən tutmuş kəndlərə qədər hər kəsin hellenləşdirilmiş olmasını hamıdan çox Hitchens arzu edirdi. Bəs görəsən nə üçün bu üsyanın baş verməyini faciə adlandırır? Cavabı məncə təxmin etmək çətin olmamalıdır. "İşin sonunda romalılar, Aralıq dənizi işığında öz toqalarında[168] parlayan, militanlıqları və fanatiklikləri daha az olan yəhudilərin yerinə zorakı və xurafatçı makkabilərə üstünlük verdi və buna görə də köhnə fikirli ultra-ortodoks Sanhedrin ilə imperiyal quberniya arasında əziyyətli sözləşmə üçün səhnə quruldu. Bu qaranlıq münasibətlər sonunda xristianlığa (daha bir yəhudi bidəti) və beləliklə də qacınılmaz olaraq İslamın doğuşuna gətirib çıxaracaqdı. *Bütün bunlardan qurtulmuş ola bilərdik."*[169] Yəni ki, Makkabi üsyanı baş verməsəydi və ya səlukilər tərəfindən uğurla boğulsaydı nə xristianlıq, nə də İslam ortaya çıxmazdı. Dinin bu insanda doğurduğu ikrah hissi tarixi hadisələrə də təhrif olunmuş şəkildə yanaşmasını asanlaşdırır. Bu gün ateist çinlilərin dindar uyğurlara qarşı apardığı siyasət də yuxarıda tarixindən danışdığımız hadisələrdən çox uzağa

---

[167] Birinci Makkabi kitabı, birinci fəsil: 31-61

[168] Toqa Roma imperiyasında roma vətəndaşı olan kişilərin tunika üzərindən geyindikləri yun əbadır. Vətəndaş olmayanlara geyinmək icazəli deyildi.

[169] "God is Not Great", səh: 274;

*düşmür. Ramazan orucunu mə*cburi açdırmaq üçün su içizdirmək verə biləcəyimiz ən yumşaq misallardandır. Dindar müsəlman ailələrinin qızlarını hədə-qorxu altında ailələrindən alaraq cavan çinli oğlanlara evlənməyə məcbur etmək və ya çinli ailələrdə yaşamağa məcbur etmək isə bu siyasətin ən çirkin formalarından biridir. Sonuncu ramazan bayramında qürbətdə *ya*şayan uyğurlardan birinin evində toplaşdığımızı xatırlayıram. Orada həmin uyğurların bu vəziyyətə *düşmüş* müsəlman qızlar üçün intiharın bir alternativ olmasını mübahisə etmələri faciənin ağırlığını göstərirdi. Bu siyasətə qarşı çıxa biləcək hər bir müqavimət amansızca basdırılır, müqavimət göstərənlərin ailələri və dostları artıqlaması ilə bu müqavimətin əziyyətini çəkməli olurlar. Din alimləri həbsxanalarda çürüyürlər, ya da edam olunurlar. Kilsələr və məscidlərin dağıdılması da tez-tez xəbərlərdə izləyə biləcəyimiz bir hala çevrilib. Bununla bağlı eşitdiyimiz ən sonuncu xəbərlər Hitchenslə eyni qəna*əti bölüşə*n ateist çinlilərin milyonlarla müsəlman uyğuru konsentrasiya kamplarına toplaması barəsindədir. Bu cür dövlət sponsorlu ateist tədbirlərində müsəlmanlara məcburi olaraq dinsizlik təlqin edilir. Bütün bunlar din reallığını cəmiyyətdən silib atmaq üçün kommunizm və materializm şüarı altında aparılır. Hitchens'in dünya görüşündə bütün bu tədbirlər v*əhşiliklə* aparılsa da "pozitiv" bir nəticə ilə sonlanacağı üçün yalnız müsbət qiymət almağa layiqdir. Burada pozitiv nəticə isə - ona görə - cəmiyyətlərin dindən təmizlənməsidir. Əlbəttə ki, kimsə deyə bilər ki, Hitchens artıq ölüb və bu konsentrasiya kamplarını təqdir etməyi onun adına yazmaq olmaz. Xeyr, yazmaq olar. *Əgə*r rusların kommunistlərinin v*əhşi n*ailiyyətlərini alqışlayıbsa Çinin etdiklərini alqışlayacağını da gözləməyimiz təbii haldır.

Bütün bu v*əhşiliklə*rə bəraət qazandırmış ingilis jurnalist kitabında hər imkan *düşdükdə* özünü uşaqların çempionu kimi göstərməyi unutmur. Eyni fəsildə dini ayinl*ərin uşaqlar üzə*rində tətbiq edilməsinə qarşı çıxaraq deyir: "Amma müdafiəsiz uşağı bu məramlara məcbur etmək elə *bir şeydir ki, h*ətta ən sadiq dinsiz belə bunu rahatlıqla günah adlandıra bilər."[170] Gurultulu nidaların, hərbi barabanın döyüntül*əri, şeypurun qorxuducu s*ədaları ilə bu sətrləri yazan Hitchens'in uşaqları müdafiəyə qalxdığını hiss edə bilirsizmi? Hətta onun kimi dinsiz bir insan belə uşaqlarımıza dini ayinləri tətbiq etməyimizi günah hesab edir. Sən demə Azərbaycan xalqı hələ bu gün belə məsum oğlan uşaqlarından kiçik bir dəri parçasını kəsməklə ağır bir cinay*ət işlə*yir. Daha da gülünc olan budur ki, Hitchens bu məzmunda İbrahim peyğəmbərin öz oğlunu Allaha qurban vermək istəyini də misallar arasına daxi*l edib. Başqa yerdə* isə "hərfi zehniyyət kinayəli zehniyyəti *başa düşmür" sözl*ərini dindarların əleyhinə atəş kimi yağdırmağa cəhd edən Hitchens deyildimi? Ona görə dostu Salman *Rüşdi* kinayəli zehniyyətin şanslı

[170] "God is Not Great", səh: 52;

sahibi idisə, dindarlar hərfi zehniyyətin qurbanları idilər. Əgər Hitchens burada İbrahimin öz oğlunu qurban gətirməsi hekayəsini – özünün də qınadığı - hərfi zehniyyət ilə oxumasaydı *başa düş*ərdi ki, bütün hekayənin məğzi budur ki, Allah bizdən övladlarımızı öldürüb Ona qurban kəsməyimizi istəmir, lakin bizdən Ona sadiq olmağımızı istəyir. Müqəddəs kitabları öyrənməyə həyatlarını ithaf etmiş alimlər bu nöqtədə ittifaq halındadırlar və onların Hitchens kimilərin qarşısında səsləndirdikləri ən əsas etiraz da məhz bəzi mətnlərin anlayışını "hərfi zehniyyət" üzərində qurmaqla bağlıdır. Allahın varlığına, Allahın insanlar arasından seçdiyi peyğəmbərləri ilə danışdığına inanmadıqdan sonra İbrahim peyğəmbərin qərarını anlamaq təbii ki, imkansız olacaq. Çünki bu xəbər, yalnız Allah ilə insan arasındakı münasibət işığından bir məna qazanır və istənilən bir mövzunu öz məzmunundan, *öz şə*rtlərindən alıb qopardıqdan sonra onu tənqid etmək asanlaşır. *Əlbəttə* ki, burada sınağın yeganə məqsədi İbrahim peyğəmbərin imandakı möhkəmliyini yoxlamaq deyildi. Allah onun nə seçim edəcəyinə onsuz da şahid idi, lakin İbrahim peyğəmbər həm də bütün möminlər üçün bir lider, bir nümunə olub. "Vaxtilə Rəbbi İbrahimi bir neçə sözlə sınağa çəkmişdi. O da onları tamamilə yerinə yetirdi. Allah dedi: "Mən səni insanlara imam təyin edəcəyəm." [2:124] Danimarkalı Soren Kierkegaard (1813-1855) İbrahimin bu əməli üzərində ən çox fikir yürütmüş filosoflardandır; bu təfəkkür prosesində Kierkegaard yuxarıda sözünü etdiyimiz həqiqətə diqqət çəkir. İbrahim peyğəmbər Allahın əmrində şəkk etmirdi, çünki "*əgər şəkk etsəydi başqa bir şey edə*rdi, şanlı bir əməl edərdi; axı İbrahim kimi biri yalnız və yalnız möhtəşəm və şanlı olanı edə bilərdi! … O, bıçağı öz sinəsinə saplayardı. (Oğlunun yerinə özünü qurban gətirdiyi üçün) bütün dünyada *pərəstiş qaz*anmış olacaqdı və adı heç zaman unudulmayacaqdı; lakin *pərəstiş olunmaq bir şeydir və* iztirab çəkənləri xilas edən bələdçi ulduz olmaq isə *başqa bir şeydir."*[171] Bəli! İbrahim peyğəmbər məhz həyatın sınaqlarında iztirab içində olanlar üçün bələdçi bir ulduzdur. Allah hər bir zaman insanları öz övladları ilə sınağa çəkir; kimisi xəstə övladının ölümünü yaşamalı olur, kimisi də xəstə övladla birlikdə yaşamalı olur. Bu kimi hallarda İbrahim peyğəmbər möminlər üçün Allahın qəzası ilə barışmağın nümunəsidir, həyatın ən ağır sınaqlarından təslimiyyətlə keçməyin misalıdır.

Kitabında daha bir yerdə dinlərdə Allaha qurban kəsməyi tənqid edərkən eyni "bəsit təfəkkürü" sərgiləyir; "bizim gündəlik danışığımızda "günah keçisi tapmaq" ifadəsini doğru olaraq pis mənada qəbul edirik" deyir Christopher. Bundan sonra "din, açıq-*aşkar günah keçisi tapmaqdan ibarə*tdir" deyir.[172] Onun tənqidi bəlkə də xristian dini üçün hədəfini vurur, amma İslam dininə gəldikdə isə hədəfindən

---

[171] S. Kierkegaard, "Fear and Trembling and The Sickness unto Death", səh: 35; Princeton University Press, New Jersey, 1974
[172] "GIG", səh: 211;

*ciddi bir* şəkildə yayınır. İslam dini qurban kəsməyi, qan ilə günah yumaq kimi dəyərləndirmir. İslam dini keçmişin "qurban kəsmə" ibadətini daha pozitiv bir sosial fəaliyyətə çevirir. Quranın dili ilə desək "onların nə əti, nə də qanı, Allaha çatmaz. Ona yalnız sizin təqvanız çatar."[173] Qurban kəsmək bir müsəlmanın öz mülkünü Allah yolunda fəda etməsidir, çünki kəsilən heyvan yandırılmır, yaxud da qurbangahda tərk edilmir, əksinə onun əti kəsənin ailəsinə və əksər hallarda fəqir-füqəraya dağıdılır. Bu gün belə həcc ibadətində kəsilən heyvanların ətləri ayrı-ayrı müsəlman ölkələrindəki kasıbların süfrəsinə çatdırılır. Beləliklə də qurban ibadətinin də zəkat kimi bir xeyriyyə ənənəsi olduğunu demək olar. Quran açıq dillə qeyd edir ki, kəsilən heyvanın nə əti, nə də qanı Allah üçün deyildir, Allahın istədiyi öz heyvanını kəsən kəsin mütiliyi, onun əməlisalehliyidir.

Hitchens kinayəli zehniyyətini də *işə* saldığında çox ziddiyyətlərə *düşür.* Uşaqların müdafiəsinə qalxan Hitchens tərəddüd etmədən uşaqların dini ayinlərə məruz tutulmasını günah adlandırır; "bu işin canisi cəzalandırılmalıdır" tələbini qəti *bir* şəkildə irəli sürür. Lakin eyni entuziazm ilə donuzları müdafiə etdikdə maraqlı bir fikir səsləndirir. "Qadağan edənlər – və bunun üçün ağır cəzalar tələb edənlər – (qadağan etdiyi əməllərdə*) iştirak etməyə* - şüur altında gizlətdiyi – bir meyli/istəyi olmasaydı homoseksuallıqdan tutmuş zinaya qədər heç bir könüllü əməl cəzaya layiq görülməzdi." Bu fikrin yaxşı anlaşılmasında maraqlı olan Hitchens üstəlik bunun üçün gözəl bir misal da verir: "Shakespeare'in bunu "Kral Lear" əsərində izah etdiyi kimi, qəhbəni qamçılayan bir polis işçisi, vurduğu qamçıların səbəbi *olmuş h*əmin cinayəti etmək üçün həmin qadını istifadə etməyə qızğın bir ehtiyac hiss edir."[174] Bu sözlərlə Hitchens dindəki qadağaların arxasındakı psixoloji motivləri izah etmək üçün bir anlıq Freud cildinə girməli olur. Dindarlar və ya dini əhkam kəsənlər əgər zinanı, homoseksuallığı, masturbasiyanı, donuz ətini qadağan edirlərsə bu əməlləri etməyə meyl etdikləri üçün, daxilən o əməlləri *işlə*məyə ehtiyac duyduqları üçün qadağan edirlər. Hitchens oxucularına bunu deyir. Fikir həqiqətən də çox maraqlıdır*, çox düşündürücüdür* və mənim burada *nəyə işarə* etmək istədiyimi artıq bəlkə də anlayanlar anlamışdır. U*şaqlardan kiçik* dəri parçasının kəsilməsini qadağan edən və bunun üçün cəzalar tətbiq etməyə hazır olan elə Hitchens'in özüdür. İndi burada Hitchensin öz psixo-analitik metodunu tətbiq etməli olsaq nə deyə bilərik? Kitabında sətr altından istehzalı kinayələrlə tənqid etdiyi yəhudi mohel kimi bəlkə balaca uşaqların şeyini dadmağa meyl edib?! Əgər bir şeyi qadağan etmək və buna cəza tələb etmək əslində insanın daixilində h*əmin şeyi etməyə* meylin olmasından qaynaqlanırsa, o zaman eyni şeyi Hitchens haqqında da deyə bilərik. Hitchens sadəcə olaraq öz qazdığı quyuya necə

[173] Həcc surəsi, ayə 37;
[174] "God is Not Great", səh: 40;

düşdüyündən xəbərsizdir. Amma əlbəttə ki, oxucular anlayırlar ki, biz Hitchens'in bu psixoanalitik sərgüzəştlərini təsdiqləmirik. Biz Hitchens haqqında bunu düşünmürük, sadəcə olaraq adamın öz təfəkkürünün özünü saldığı gülünc vəziyyətə işarə edirik. Bəzən dini qadağaları istehza obyektinə çevirmək məqsədini güdərkən düşünmədən öz dabanına atəş açır.

Donuzlarla bağlı açdığı fəsili başdan axıra qədər təəccübsüz, heyrətsiz oxumaq mümkün deyildir. Yuxarıda sözünü etdiyimiz psixoloji analizi də məhz bu fəsildə aparır. Oxucu haqlı olaraq "polisin qəhbəni döyməsi" ilə donuz arasındakı əlaqə hardadır sualını verə bilər. Bunu anlamaq üçün başa düşmək lazımdır ki, Hitchens bütün bunlara fetiş mənasını verir. Qadağan olunmuş hər bir şey daxili istəyi boğmaqdan ötrüdür. Bu fəsildə donuzlar haqqında çox maraqlı məlumatlar verir. "Onların öz balalarını, hətta öz ifraz etdiklərini yeməkləri naməlum deyildir... Lakin bir çox halda müşahidə edilib ki, donuzlar öz istəklərinə tərk edilsələr, onlara kifayət qədər geniş məkan verilsə, özlərini təmiz saxlayacaqlar, kiçik yuvalar düzəldəcəklər, ailə saxlayacaqlar və digər donuzlarla sosial ünsiyyətə girəcəklər. Bu məxluqlar çox sayda zəka əlamətlərini nümayiş etdirirlər..." Bu hələ yetməzmiş kimi Hitchens bunları da əlavə edir: "Bu gözəl heyvan bizim xeyli yaxın kuzenlərimizdən biridir. Bizim DNT-nin böyük hissəsini bölüşür və son zamanlar donuzlardan insanlara dəri, ürək klapanları və böyrəklər kimi orqan köçürmələri olub." Qəsdini anlamaq çətin olmamalıdır. Qısacası donuz əti insan ətinin dadını verir. "Mənim özümün münasib dequstativ təcrübəm olmayıb, amma belə görünür ki, biz – yeyildiyimiz halda – böyük miqdarda donuz dadını veririk."[175] İnsan bəzən bu sətrləri oxuduğuna inana bilmir. Düşünürsən ki, bu sözləri yazan müəllifin ağlından nələr keçirdi? Həqiqətən də özü bu sözlərin məğzini yaxşı başa düşürmü? Hitchens donuz ətinin yəhudilikdə və İslamda qadağan olunmasına "rasional" bir izah tapmağa çalışır, daha doğrusu bu qadağanı istehza obyektinə çevirməyin yollarını araşdırır. İsti klimatlarda donuz ətinin tez pozulması və trixinolloz qurdunun əmələ gəlməsini səbəb göstərən izahları Hitchens rədd edir, bunları tutarlı hesab etmir. Etiraf edə bilərəm ki, bu nöqtədə onunla razılaşmağa meylliyəm. Amma belə bir izah nə qədər bütün suallara cavab verməsə də yenə də qismən elmi bir izahdır. Bizim jurnalistin vermək istədiyi izah isə absurdluqdan ötə bir şeydir. Donuz ətinin dad baxımından insan ətinə bənzədiyini mənim də bilməyim mümkün deyildir, çünki nə donuz əti, nə də insan əti yeməmişəm. Cinayət araşdırmalarında cinayətin qurbanı üzərindəki yaraları yoxlamaq üçün donuz cüssəsindən istifadə edildiyini bilirəm; donuz əti ilə insan əti arasındakı oxşarlıqlar haqqında məlumatımız var. Amma dini qadağanın donuz ətinə, dolayısıyla insan ətinə qarşı duyulan güclü şəhvət hissi ilə izah etmək xeyli axmaq

[175] Səh: 40-41;

bir alternativdir. Məlumdur ki, bütün dünyanın dindarları da, dinsizləri də insan ətini yeməyi qadağan edirlər, bütün cəmiyyətlərdə qəbul edilməz hal sayılan kannibalizmin nə üçün qadağan edildiyini *başa düşmək* üçün güclü xəyal gücü tələb olunmur. Amma Hitchensin məntiqini götürsək ortaya çıxan nəticə bu olacaq ki, bu qadağanın səbəbi bütün cəmiyyətlərdə insan *əti üçün gizli bir* şəhvətin olması ilə bağlıdır və *bu* şəhvəti şüur altında basdırdığımız üçün onu yeməyi qadağan edirik. Görəsən özünün təklifi nə idi? İnsan ətinə icazə verilməlidirmi?! Halbuki məsələ çox sadədir. "Donuz, çünki o qoşadırnaqlı olsa da, gövşəmir, sizin üçün natəmizdir." (Levililər, 11:7) Bibliyanın bu cümləsində haramlıq sözü "natəmizlik" olaraq qeyd edilib. "De: "Mənə gələn vəhylər içərisində ölü heyvan, axar qan, donuz əti – çünki o, murdardır – və Allahdan başqasının adı ilə günah olaraq *kəsilmiş heyvanlar istisna olmaqla, hər* hansı bir kəsin yediyi yeməklər içərisində hara*m buyurulan bir şey görmürə*m." (6:145) *Ənam surə*sindəki bu ayədə donuzun haramlığı onun murdar olması ilə izah olunur.

# İMAN ADAMI VƏ MÜASİR ELM

*"Elmin məhdud olması onun uşaqların ilk və son şeylər haqqında verdikləri elementar suallara cavab verməkdən aciz olmasında özünü göstərir; "Hər şey necə başladı?" "Biz nə üçün burdayıq?" "Həyatın mənası nədir?"*

Sir Peter Medawar

Sir Arthur Conan Doyle yazdığı məş*hur detektiv silsilə*sinin ilk kitabında doktor John Watson'u elə kitabın ilk səhifələrində Sherlock Holmes ilə tanış edir. Doktor Watson yeni dostunun biliklərinə heyran olduğunu ifadə etməklə yanaşı onun bəzi mövzularda cahil olmağından da qəribəlik hissi ilə danışır. "Onun cəhaləti də bilikləri qədər heyrətamiz idi" deyir Doktor. "Təsadüfən onun kopernik nəzəriyyəsi və günəş *sisteminin düz*əni barəsində cahil olduğunu öyrəndiyimdə mənim təəccübüm ən zirvəyə çıxdı. Bizim bu on doqquzuncu əsrdə hər hansı mədəni bir insanın Yerin Günə*şin* ətrafında səyahət etdiyindən xəbərsiz ola biləcəyi mənə o qədər fövqəladə görünürdü ki, mən bunu çox çətinliklə dərk edə bilirdim." Watson'un bu təəccübünü görən Sherlock isə dostunun bu şaşqınlığını yox etmək üçün öz cahilliyinin üzrünü bu cür izah edir: "Bilirsizmi... Mənə görə insan beyni ilk əvvəldən *kiçik boş çardaq kimidir və* oranı seçiminə görə avadanlıqlar ilə təmin etməlisiz. Axmaq biri əlinə keçirdiyi hər cür sınıq-salxaq mebeli ora elə doldurur ki, ona faydalı ola biləcək biliklər sıxışdırılaraq atılır və ya ən yaxşı halda dig*ər şeylə*rlə elə qarmaqarışıq şəkildə dolaşır ki, ona əl qoymaqda çətinlik çəkir. Fəqət bacarıqlı usta həqiqətən beyin çardağının içinə qoyduğu *şeylə*rdə çox qayğıkeş davranır. O öz işini görməkdə ona lazım olacaq alətlərdən *başqa heç bir şeyi götürmür, amma onlardan onda çox çeşid var və* onların hamısı mükəmməl bir nizam ilə düzülüb. Həmin otağın elastik divarlarının olduğunu və istənilən ölçüdə *genişlən*ə bilə*cəyini düşünmə*k xətadır. *Əmin olun ki, hə*r bir əlavə məlumat üçün əvvəldən bildiyiniz bir şeyi unudacağınız vaxtlar da olur. Mənasız faktların faydalı olanları dirsəkləyib çölə çıxarmasının qarşısını almaq həddindən artıq əhəmiyyətlidir." Sherlock h*əmişə* öz praktikliyi ilə tanınıb və oxucuları onda ən çox cəlb edən xüsusiyyətlərdən biri də h*əmişə* bu olub. Onun praktikliyini hətta öyrəndiyi biliklərdə də gözləməsinin nadir bir hal olduğunu deyə bilərsiz, amma heç bir vəch ilə bunun axmaqlıq olduğunu demək haqqınız yoxdur. Watson da onun bu məntiqi qarşısında bir qədər acizlik hiss etdikdən sonra özünü itirmədən

etiraz etdiyini xatırlayır: "Amma söhbət Günəş *sistemində*n gedir axı!" – mən etiraz etdim. "Bundan mənə nə?" – səbrsizliklə mənim sözümü kəsdi; "siz bizim günə*şin* ətrafında dolandığımızı deyirsiz. *Əgər* ayın ətrafında fırlansaydıq bunun mənə və ya mə*nim işimə zərrə* qədər bir fərqi olmayacaqdı."[176] Hər kəs hardasa *Sherlock kişinin dedikl*əri ilə razılaşacaq. Onun dedikləri soyuqqanlı Viktoriyan erasında keçərli olduğu kimi bu gün də k*eçərlidir. Şirkə*tdə *mühasib işləyə*n bir kəs *əgər öz işini gözə*l bacarırsa onun Günəş *sistem*i haqqında biliklərinin qüsurlu olması heç bir fərq etməməlidir. Kopernik doğulmadan əsrlər əvvəl insanların axtardığı həyat fəlsəfəsi ilə bağlı suallar, supernovaların öyrənildiyi bizim bu erada hələ də aktual olaraq qalır. Tarixin bütün dini liderləri insanlara coğrafiya, astronomiya öyrətmək üçün gəlməyiblər, əksinə onların missiyası insanlara mənəvi və ruhani rəhbərlik etmək olub. Müasir kə*şfl*ərdən xəbərsiz olduqları üçün *keçmişin görk*əmli və *dahi* şəxsiyyətlərini alçaltmaq, buna görə onların dəyərini azaltmağa çalışmaq psixoloji problemlərdən xəbər verir.

Bir də unutmayaq ki, hər öyrənən kəs bilən kəs deyildir. Alexandre Dumas'ın yaratdığı obrazın dili ilə desək "öyrənmək bilmək deyildir, bir var öyrənənlər, bir də var öyrə*nmişlə*r; birinciləri formalaşdıran yaddaşdır, digərlərini isə fəlsəfə."[177] İtalyan rahibin gənc Edmond Dantes'ə öyrətdiyi bu hikməti haqqı ilə anlayırıqsa, çox məlumata sahib olmağın o məlumatları həyatda doğru tətbiq etməyə bərabər olmadığını biləcəyik. Hitchens görkəmli xristian filosof Ockham'ı dəyərləndirərkən "o, nebula'lar haqqında bizim bildiyimizdən daha az bilirdi… daha doğrusu o, onlar haqqında heç bir şey bilmirdi"[178] deyir. Görəsən onun öz dövründə nebulalar haqqında bir şey bilməməsi nəyi sübut edir ki?! *Əksinə* Ockham öz dövrünün imkanlarına görə möhtəşəm fəls*əfi müşahid*ələr aparıb. Dəyərləndirmə buradan başlamalıdır. Ockham bir fideist olaraq Allahı yalnız iman ilə tanımağın mümkün olduğuna inanırdı. O, Allahı sübut etmək üçün təqdim olunan bütün arqumentləri inkar edirdi, ona görə Yaradıcını görmək üçün əqli arqumentlər kifayət etmir, mütləq qəlbdə iman olmalıdır. Ockham'a görə bütün əqli arqumentlərin içində problemli məqamlar vardır və onları Allahın varlığını göstərmək üçün istifadə etmək faydasızdır.[179] Görünür ki, Ockham'ın bu cür iddiaları Hitchens'in ürəyinə sərin su səpib və onun haqqında kitabında birdən çox yerdə müsbət qiymət verir. Həqiqət budur ki, ateistlər öz xeyirlərinə olduqda "Ockham'ın ülgücünü" dibindən vururlar, öz əleyhlərinə olduqda isə ülgücü bağlayıb qırağa qoyurlar. Orta əsrlərin bu ingilis filosofu bu gün yaşasaydı ateistlərin onun ülgücünü necə sui-istifadə

[176] Sir Arthur Conan Doyle, "A Study in Scarlet & The Hound of The Baskervilles", səh: 22-23; The Reader's Digest Association, New York, 1986
[177] "The Count of Monte Cristo", səh: 154;
[178] GIG, səh: 69;
[179] James Hitchcock, "History of The Catholic Church: from The Apostolic Age to The Third Millenium", səh: 231; Ignatius Press, San Francisco, 2012

etdiklərinə təəccüblənərdi. Necə də olmasa bu ülgücün sahibi onu Allahı inkar etmək üçün yox, əksinə Allahın varlığını sübut etmək üçün istifadə edib. Hər bir halda Ockham'ın fəlsəfəsi digər dindarlar tərəfindən də tənqid olunub. Onun rəqibi saya biləcəyimiz Thomas Aquinas çox təəssüf ki, Hitchens tərəfindən eyni səxavət ilə qarşılanmır. *Beşinci fəslin girişində yerləşdirdiyi sitatlarda məşhur xristian* teoloq Thomas Aquinas üçün bu sözləri nisbət edir: "Mən bir kitabın adamıyam."[180] Bununla Thomas'ın dar düşüncəli biri olduğunu göstərməyə çalışır, çünki bir kitabın adamı, yəni təfəkküründə tək bir kitabdan kənara çıxmayan biri olmaq – Hitchens'ə görə - dar *düşüncə*li, fanatik, məhdud bilikli bir kəs olmaq deməkdir. Belə dahi sxolastik filosof alim axı necə "bir kitabın adamı" ola bilər? Problem isə budur ki, bu italiyalı filosof bir kitabın adamı olmayıb və əksinə elə bir söz də deməyib. Tarixən ona nisbət edilən söz latın dilində dediyi "*hominem unius libri timeo*" sözləridir ki, bizim dilimizdə mənası "mən bir kitabın adamından qorxuram" deməkdir. Bu dəfə də Hitchens'in atdığı ox hədəfini tapa bilməyib. Thomas nəinki bir kitabın adamı olmayıb, o, hətta bir kitabın adamından qorxduğunu deyib. "Bir kitabın adamı" sözünün özünü f*ərqli şəkillərdə başa düşmə*k mümkündür[181], amma əgər Hitchens'in anladığı mənanı götürsək Thomas'ın onun iddiasının əksinə *üfüqü geniş, mütaliəsi bol olan bir* şəxs olduğunu qəbul etməliyik. Müasir araşdırma onu göstərir ki, Thomas yunan filosoflarının, şərqin xristian alimlərinin yazılarından ziyadə İbn Sina, İbn Rüşd, Ğazəli, Fərabi, Fərğani kimi müsəlman mütəfəkkirlərin, İbn Cəbirul, Musa bin Məymun kimi əndəlüslü yəhudi filosofların əsərləri ilə tanış idi və onların latın dilindəki tərcümələrindən istifadə edirdi.[182] Orta əsrlərin Avropasındakı standartlara əsasən Thomas'ı gəzən kitabxana adlandıra bilərdik.

*Hitchens dini* şəxsiyyətləri alçaltmaq üçün onların müasir elmi kəş*flə*rdən cahil olmaqlarından sui-istifadə edir. Isaac Newton'u Bibliyaya inandığı üçün və əlkimya ilə məşğul olduğu üçün qınayır. (Tarixin ən dahi aliminin kim olduğu sualını Neil *deGrasse Tyson'dan soruşsan "şübhə*siz ki, Sir Isaac Newton'dur" deyəcək.) Augustine haqqında onun "özü ilə məşğul olan fantazist və Yer kürəsinin mərkəzdə olduğuna inanan cahil"[183] olduğunu deyir. Məgər ki, Yer kürəsinin mərkəzdə olmadığını bilmək insanın intellektual dəyərini aşağı salırmış. Həqiqət budur ki, yüz il bundan sonra bizim kainat haqqında bu gün qəbul etdiyimiz bəzi təsəvvürlərin xətalı olduğu ortaya çıxacaq, çünki keçmişin kosmoloji biliklərinin

[180] "God is Not Great", səh: 63;
[181] Clarence Brown, "The Portable Twentieth-Century Russian Reader", səh: 246; Penguin Books, New York, 1993
[182] Bax: Leo J. Elders, "Thomas Aquinas and His Predecessors: The Philosophers and Church Fathers in His Works", The Catholic University of America Press, Washington, 2018
[183] "God is Not Great", səh: 65;

xətalı olduğunu görmüşüksə *eyni şeyin* gələcəkdə də təkrarlanmasını gözləmək ən təbii bir yanaşmadır. Görəsən yüz il sonranın Hitchensi bu günün Hitchensinə baxıb eyni səbəblə ona cahil deyəcəkmi? Hitchens kimilərin bu etirazlarını Gai Eaton "*uşaq münasibə*ti" adlandırır: "Uşaqların özləri kimi ağaca dırmaşmağı bacarmayan, səkkiz yaşlı uşaqların rahatlıqla həll etdikləri pazlı çözə bilməyən böyüklər üzərində bir üstünlük hiss etməkləri normal bir haldır və *bir uşaq tə*bii *olaraq düşünə* bilər ki, həyatının hər günü dondurma və ya şokolad almağa imkanı olan böyüklər niyə belə etmirlə*r?! Eyni* şəkildə biz də qədim insanların Yer üzünün sərvətlərindən səmər*əli* şəkildə istifadə etməyin yollarını tapa bilməməklərinə təəccüblənə bilirik. Lakin böyüklərin prioritetləri fərqlidir."[184]

Xatırladaq ki, kainatın artan sürət ilə *genişlə*nməsi, "Big Bang" kimi nəzəriyyələrdən əvvəl kainat homogen və statik bir varlıq olaraq qəbul olunurdu. Hətta Albert Einstein özünün ümumi nisbilik nəzəriyyəsinin düsturunu hazırlayarkən statik kainatdakı cazibə qüvvəsi problemini gördüyü üçün öz tənliyinə "kosmoloji vahidi" daxil etməli oldu. Çünki kainat statikdirsə o zaman cazibə qüvvəsinin təsiri ilə bir-birini çəkərək yığılmalı idi və *əgər bu baş vermirsə* digər bir qüvvənin olması da lazım idi. Einstein'in bu dünya görüşünün xətalı olduğunu, onun müasirləri sübut etməli olacaqdılar. Maraqlıdır ki, Einstein'ə bunu sübut edən də belçikalı katolik rahib Georges Lemaitre oldu. Bəli, məhz kilsənin içərisindən çıxmış bir rahib iyirminci əsrin dahisi sayılan Einstein'ə diqqətdən qaçırdığı bir mümkünlüyü öyrədib. Hitchens'in amansız məntiqinə görə Einstein bu gün Hitchens'in bildiyi kosmoloji biliklərdən cahil idi və taleyin ironiyası ilə məhz bir katolik rahib tərəfindən iqna edilməli oldu. Bu belçikalı rahib 1927-ci ildə elmi əsaslar ilə, riyazi düsturlar ilə və b*əzi astronomik müşahidə*lər ilə Kainatın *genişlə*ndiyini və nə zamansa kiçik bir nöqtədə, "ibtidai atomda" (primeval atom) mövcud olduğunu sübut etməyi bacardı. Amma Einstein ilk əvvəllər bunu qəbul etmək istəmirdi və rahibin yeni fiziki model üçün hazırladığı riyazi sübutları belə *şərh etmişdi: "S*ənin riyazi hesablamaların doğrudur, amma fiziki biliklərin ikrah oyadıcıdır."[185] Sonunda 1931-ci ildə bu fiziki modeli qəbul etməsi üçün dörd il vaxt çəkəcəkdi. Dörd il boyunca bunu qəbul etmək istəmədi. Bu gün müzakirə edilən "qaranlıq maddə" və ya "qaranlıq enerji" kimi son elmi kə*şflə*rdən iyirminci əsrin əvvəlində yaşamış dahi astronomlar, fiziklər cahil idilər. Və nə olsun? Hitchens bu məntiqlə nəyi sübut etməyə çalışır? Məşhur riyaziyyatçı və fizika teoretiki Freeman Dyson'un anası çox ağıllı qadın olub. Oğlunun yeniyetmə ikən aşırı dərəcədə riyaziyyat elmi ilə məşğul olduğunu görən qadın onun nə zamansa

---

[184] Gai Eaton, "King of The Castle: Choice and Responsibility in The Modern World", səh: 143; The Islamic Texts Society, Cambridge, 2012

[185] R. D. Holder & S. Mitton, "Georges Lemaitre: Life, Science and Legacy", səh: 162; Springer Verlag, Berlin, 2012

bu rəqəmlər içində insanlığını itirəcəyindən narahat olur. "Sən bir gün buna görə *çox peşman olacaqsan"* – deyir: "bir gün böyük bir alim olduğunda ayılıb görəcəksən ki, yaxşı dost qazanmağa vaxtın olmayıb. Sənin *zəfərini paylaşmaq* üçün yanında arvadın və uşağın yoxdursa Riemann hipotezini sübut etməyin sənə nə xeyri olacaq?"[186] İnsan varlığı əgər hardansa dəyər qazanırsa bu, Yer kürəsinin fəzadakı yerini bilməkdən və ya kosmik nebulanın varlığından xəbərdar olmaqdan qaynaqlanmır.

Lemaitre bizə sadəcə "big bang" nəzəriyyəsinin teoretik əsaslarını sübut etməyib, o, həm də d*ərin dindar bir* şəxsiyyət olmaqla yanaşı dünyəvi elmin köməyi ilə kainatı da oxuya bilməyin mümkün olduğunu sübut edə bilib. Bu həqiqəti sübut edən ilk adam o olmayıb və sonuncu da olmayacaq. O, rahiblərə xas olan yaxalığı ilə Belçikadakı Leuven katolik universitetində ömrünün sonuna qədər fizika dərsi verməyə davam etdi. "Mən misal üçün oxuyuram" – Hichens yazır – "ki, xristianlar bəzi ekumenik konfranslarında özlərinin açıq təfəkkürlü olduqlarını göstərmək istəyirlər və bunun üçün bəzi fizikləri ora dəvət edirlər."[187] Əgər xristian rahib eyni zamanda görkəmli fizik və kosmologist ola bilərsə kilsələrin öz tədbirlərinə fizikləri dəvət etməklərində qəribə nə ola bilər ki?! Üstəlik bu ingilisi *heç cür anlamaq olmur. Keçmişin kils*əsini, fizikləri və astronomları təqib etməkdə ittiham edir, onları elmin düşməni adlandırır və bu gün kilsə öz fəaliyyətini təbiət alimləri ilə canlandırmağa çalışanda da yenə bundan narazı olur. Kilsənin nə etməsindən asılı olmayaraq bunun kimi adamlar razı qalmayacaqlar. Bir də onu da əlavə edək ki, ümumən kilsənin fizikləri, astronomları tarixən təqib etməsi fikri ateistlərin, din əleyhdarlarının uydurduqları bir əfsanədir və bu gün ciddi tarixçilər bu əfsanəni və onun necə formalaşmasını ifşa ediblər.[188] Bu barədə öz yerində söz açılacaq.

Hitchens eyni fəsildə Fred Hoyle kimi görkəmli ingilis astronomu haqqında *"keçmiş aqnostik" sözünü işl*ədir. "Dizayn fikri ilə m*əftun olmuş keçmiş aqnostik* Fred Hoyle "big bang" terminini *zərb etmiş Cambridge astronomu idi." Bütün* bunları Hitchens dindarların dar düşüncəli olmaqlarının gülməli həddini göstərmək üçün qeyd edir. "O, bu gün kainatın başlanğıcı haqqında qəbul edilmiş teoriyanı gözdən salmağa cəhd etməkdən ötrü bu axmaq söz birləşməsini çıxardı."[189] Bəli, m*əşhur* nəzəriyyə üçün "big bang" adını ilk işlədən Fred Hoyle olub. Amma bilirsiz nə var? Fred Hoyle ateizmdən tövbə *etmiş biri olaraq yeni kosmoloji n*əzəriyyəni

---

[186] F. Dyson, "Disturbing The Universe", səh: 15; Harper & Row Publishers, New York, 1979
[187] "God is not Great", səh: 65;
[188] Başlanğıc üçün Ronald L. Numbers'in redaktəsi ilə hazırlanmış "Galileo Goes to Jail and Other Myths About Science and Religion" kitabını oxumağı təklif edə bilərəm. Bu kitabda öz yerində bu barədə bir qədər m*əlumat vermişik.*
[189] "God is not Great", səh: 65;

inkar etmirdi, o elə həmişə aqnostik olaraq tanınıb və ömrünün sonunda kosmosun dizayn olunmasını etiraf edib. Hitchens'in bu cür hallardan tez-tez narahat olduğunu görürük. O burada haqlı olaraq Fred'in "big bang" nəzəriyyəsini inkar etdiyini qeyd edir və o, bu misalı din ilə təbiət elmlərinin hər zaman mübarizədə, ziddiyyətdə olduğunu göstərmək üçün gətirir. Amma öz cahilliyi və ya qərəzliyi səbəbi ilə öz qazdığı tələyə *düşür; çünki* Fred Hoyle bu elmi nəzəriyyəni dini motivlərə görə inkar etmirdi, əksinə ateistik motivlər əsasında inkar edirdi. Çünki o qeyd edirdi ki, belə bir nəzəriyyə dindarların dediyini təsdiqləyir və iddiasına görə bu, elmi nəzəriyyə kimi qəbul edilməməli, bir psevdo-elm hesab olunmalıdır. Axı başlanğıcı olan, bir "partlayış" ilə ortaya çıxan kainat fikri materiyanın, ümumilikdə isə kainatın əbədi olduğunu deyən ateistlərin fikrinə zidd gəlirdi. Fred'ə görə *genişlə*nən kainatı başqa cür də izah etmək mümkün idi və "başlanğıcı olan kainat" fikrini rədd etməkdən ötrü "big bang" nəzəriyyəsinə alternativ olaraq "sabit hal" (steady state) nəzəriyyəsini irəli sürdü. BBC radiosunda çıxışında Hoyle irəli sürdüyü nəzəriyyəni digər iki həmkarı ilə birlikdə Dead of Night filminə baxdıqdan sonra təsəvvür etdiyini etiraf edir.[190] Üç riyaziyyatçı və astronomun 1945-ci ilin sentyabrında Cambridge kinoteatrında baxdıqları bu film, fermada oturub kabus hekayələrindən danışan bir qrup və o qrupun içində bu hadisələri hər gün yenidən yaşadığına inanan bir adam haqqındadır. Həmin adam günün axırında digər qrup üzvlərini öldürür və səhər tezdən yuxudan ayıldıqda bunun bir yuxu olduğunu anlayır. Sonra zəng gəlir və bu hekayələri danışan qrup onlara qoşulması üçün onu ferma evinə dəvət edir. Beləliklə də yuxuda gördüklərini bir daha yaşayır. Bu şəkildə dairəvi hadisələr zəncirinə *düşmüş bu* adamın həyatı həmin üç alimə kainat haqqında bir ideya verir: Bu dairəvi struktur kainat üçün bir model ola bilərmi? Kainatın genişlənməyinə baxmayaraq özünü daim yeniləməsi, yeni maddələr yaratması mümkündürmü? Fred Hoyle'un "sabit hal" nəzəriyyəsi bu kinodan ilhamlanaraq hazırladığı bir nəzəriyy*ədir. Bunun işin* tam həqiqəti olduğunu deyə bilmərik, çünki həqiqi tanrının riyaziyyat olduğuna inanan Hoyle kimilər başlanğıcı olan kainat fikrini həm də antiteist motivlərə əsasən deyirdilər. "Alimlərin "big bang" nəzəriyyəsini bəyənməklərinin səbəbi, onların (Bibliyadakı) Yaradılış kitabının təsirində olmaqlarındadır. Yaradılış kitabının ilk səhifəsinə inanmaq əksər alimlərin psixikasının dərinliklərindədir."[191] *Başqa sözlə* "big bang" nəzəriyyəsi dindarların iddiasına müvafiq olduğu üçün Fred Hoyle onu rədd edir. Məhz din əleyhinə olduğu üçün bu nəzəriyyəni inkar etməyi və əvəzinə *başqa nə*zəriyyə irəli sürməyi həyatının missiyasına çevirir. Antixristian mövqeyi ilə tanınan və kitablarında bunu gizlətməyən Hoyle'un öz dövrünün ən

[190] Simon Mitton, "Fred Hoyle: A Life in Science", səh: 117; Cambridge University Press, New York, 2011

[191] Adam Curtis, "*A Mile or Two Off Yarmouth*", BBC, 24 fevral, 2012

son elmi, kosmoloji nəzəriyyəsini inkar etməsinin səbəbi antiteizm oldu.[192] O, bu müxalifətində tək deyildi. Nəzəriyyəsini dəstəkləmək üçün hazırladığı elmi işə Thomas Gold və Hermann Bondi də şərik idilər. 60-cı illərdə*n başlayaraq ateist* dairələrdə Big Bang nəzəriyyəsinə qarşı müxalifət ciddi bir forma almışdı. Steven Weinberg etiraf edir ki, "bəzi kosmoloqlar fəlsəfi səbəblərdən, xüsusilə də - "sabit hal" nəzəriyyəsində olduğu kimi – (Bibliyadakı) Yaradılış problemindən gözəl bir şəkildə qurtulduğu üçün "yığılıb-açılan" modelə meyl edirlər."[193] Bu bizə onu öyrədir ki, elmi nəzəriyyələrdəki xətalı təsəvvürlər təkcə din leyhinə qərəzlilikdən qaynaqlanmır, həmçinin din əleyhinə olan qərəzdən də qaynaqlanır. "Nature" jurnalının redaktoru ingilis alimi John Maddox da ateist motivlərə əsasən yeni kosmologiyanı inkar edənlərdən biri idi və hətta 1989-cu ildə Nature jurnalında dərc etdiyi məqalədə deyirdi: "Fəlsəfi olaraq qeyri-məqbul olmasından ziyadə Big Bang (nəzəriyyəsi) Kainatın başlanğıcının çox sadəlövh izahıdır və qarşımızdakı on ili sağ başa vurması möhtəməl deyildir."[194] Fəlsəfi olaraq qeyri-məqbul olması fəlsəfədə Aristotelin fikrinə və *dini izaha işarə*dir, çünki son bir neçə əsrin ateistləri arasında kainatın əbədi olması fikri şəkk götürməyən fəlsəfi həqiqət kimi qəbul olunurdu. "Down with the Big Bang" adlı həmin məqalədə Maddox bu müxalifətini izah edərkən qeyd edir ki, "öz rəylərinə dəstək axtaran yaradılışa inananlar və onlarla eyni əqidəni daşıyanlar Big Bang doktrinasında özləri üçün bol-bol bəraət tapacaqlar." *Əgər* on altıncı əsrdə - iddia olunana görə - Allahın inkar olunacağı qorxusu ilə kilsələr bəzi elmi iddialara qarşı çıxırdılarsa iyirminci əsrdə də ateistlər Allahın varlığının qəbul olunacağı qorxusu ilə bəzi elmi kə*şflər*ə qarşı çıxıblar. Maddox'un on ili gəlib çoxdan keçib və nəzəriyyə bu gün belə öz məkanını qoruyub saxlaya bilib. Nəzəriyyə öz statusunu qorumaqda nə qədər inadkar idisə bəzi dinsiz alimlər də onu inkar etməkdə o qədər inadkar idilər. Hoyle 2001-ci ildə vəfat edənə qədər Big Bang nəzəriyyəsini qəbul etmədi.[195] Maddox'un proqnoz etdiyi on il də çoxdan ötüb keçib, amma yeni nəzəriyyə yaşamağa davam edir.

Müasir təbiət elmləri haqqında naturalist və ateist fəlsəfənin əsassız iddiaları az deyildir. Bu fəlsəfə tərəfdarları Allahı inkar edərək onun yerinə təbiəti və o təbiətin açarı hesab etdikləri təbiət elmlərini gətirirlər. Heç də qəribə deyildir ki, müasir təbiət elmlərinin yaradıcı tanrıya ehtiyac buraxmadığını iddia edənlər də həmin *düşüncə*nin nümayəndələridir. Hitchens kitabında böyük bir həvəslə fransız alim

[192] A.R. Peacocke, "The Sciences and Theology in The Twentieth Century", səh: 33-34; University of Notre Dame Press, Notre Dame, Indiana, 1981

[193] S. Weinberg, "The First Three Minutes: A Modern View of The Origin of The Universe", səh: 143; Bantam Books, New York, 1979

[194] John Maddox, "*Down With The Big Bang*", Nature, 10 avqust, 1989

[195] Helge Kragh, "Masters of The Universe: Conversations with Cosmologists of The Past", səh: 204; Oxford University Press, New York, 2015

Laplace ilə Napoleon arasında keçən dialoqa yer verir. Napoleon ona deyir: "Cənab Laplace, mənə deyirlər ki, siz kainat sistemi haqqında bu qədər böyük bir kitab yazmısız, amma heç bir yerdə bir dəfə də olsun onun Yaradıcısının adını çəkməmisiz." İddiaya görə Laplace belə cavab verib: "Mənim o hipotezə ehtiyacım yox idi."[196] Bu hekayə və bənzərləri ateistlər tərəfindən müasir təbiət elmlərinin yeni simasını göstərmək üçün istifadə olunur: təbiət elmləri təbiəti izah etmək üçün Allaha ehtiyac duymur. Metodoloji naturalizm adlanan bu fəlsəfə müasir elm adamlarının elmi metodunu izah edən ən dəqiq addır. "Elm hər *şeyə* qadirdir və hə*r şeyi izah ed*əcə*k* və təbiətdən ötədə *heç bir şey yoxdur." Bu iddi*anın özü elə özlüyündə bir inancdır, müşahidələrə əsaslanan elm deyildir. Görəsən insan öz əqlinin və cihazların vasitəsi ilə bütün sualların cavabını tapa biləcəkmi? Almanlar riyaziyyat fəlsəfəsində bunu "entscheidungsproblem" adı ilə təqdim ediblər. Riyaziyyatçı Gottfried Leibniz özünün hesab maşınını quraşdırmışdı və insanların nə zamansa bütün riyazi-elmi iddiaların doğruluğunu və ya saxtalığını müəyyən edən bir cihazı icad edə biləcəklərinə inanırdı.[197] O zamandan bəri bir çox elm adamı bu sualı cavablandırmağa çalışıblar; belə bir cihazı icad etmək mümkündürmü? Elm adamlarının özləri bunun imkansızlığının misallarını veriblər və burada Heisenberg'in "qeyri-müəyyənlik prinsipi" və ya Gödel'in "natamamlıq teoremi" haqqında danışmaq olar.[198] Təbiət elmlərinin təkcə perspektivi yox, həmçinin metodu da məhduddur, bununla belə bu elmə arxalanan bəzi kəslər Allaha heç bir ehtiyacın qalmadığına inanırlar. Nə qədər də təkəbbürlü bir xəyaldır! Laplace çox ehtimal ki, elə bir söz deməyib[199], lakin deməsə də bu cür bir söz o dövrün materialist alimlərinin təsəvvürünə uyğundur. Bu sözlə o, Allahın varlığını inkar etmir, lakin təbiətin necə çalışdığını anlamaq üçün Allaha ehtiyac olmadığına inanması onun kitablarında öz əksini tapan bir elm fəlsəfəsi idi. Amma həyatında, şəxsi münasibətlərində Allaha ehtiyacını gizlədə bilmirdi. Oğluna yazdığı məktubunda bir ata qayğısı ilə Allaha olan ehtiyacını Laplace belə ifadə edirdi: "Mən dua edirəm ki, Allah sənin günlərini himayə etsin! Hər zaman Onu, eləcədə atanı və ananı ağlından çıxarma!"[200] Bu gün Laplace'ın bu sözlərini misal gətirib aşırı nəticə çıxaranlar müasir elmin tanrı izahına ehtiyac buraxmadığını deməklə kifayətlənmirlər, onlar hətta iddia edirlər ki, müasir elm tanrı izahını rədd edir.

[196] W.C. Dampier, "A History of Science and Its Relations with Philosophy and Religion", səh: 181; Cambridge University Press, London, 1971
[197] Melanie Mitchell, "Complexity: A Guided Tour", səh: 59; Oxford University Press, New York, 2009
[198] Hugh G. Gauch, "Scientific Method in Practice", səh: 368; Cambridge University Press, Cambridge, 2003
[199] Roger Hahn, "*Laplace and The Mechanistic Universe*", "God & Nature: Historical Essays on The Encounter Between Christianity and Science", səh: 256; University of California Press, Berkeley, 1986; Herve Faye, "Sur L'Origine du Monde: Theories Cosmogoniques Des Anciens et Des Modernes", səh: 109-111; Gauthier-Villars, Paris, 1884;
[200] "Oeuvres de Laplace", birinci cild, səh: v-vi; Gauthier-Villars, Paris, 1878

Dawkins'in dünya baxışına görə "Darwin (tanrı inancını) biologiya elmindən çıxarıb atdı…" və fizikaya gəldikdə isə *bu işi Hawking h*əyata keçirməkdədir.[201] Belə bir təsəvvür elmi fəlsəfədə *infantil bir yanaşma kimi d*əyərləndirilə bilər. Carl Sagan kimilərin qarajında yaşayan əjdahalar da bu infantil yanaşmanın əsəridir. Yalnız bu dərəcədə primitiv bir fəlsəfəyə sahib olan kəs Allah inancını qarajda *yaşayan gözə* görünməz əjdaha ilə müqayisə edə bilər; Sagan'a görə qarajda *yaşayan gözə* görünməz, qeyri-cismani əjdahanı sübut etmək mümkün olmadığı kimi tanrını da sübut etmək mümkün deyildir.[202] Əlbəttə ki, Sagan, Hitchens, Dawkins kimi ateistlərin inancına görə müasir təbiət elmlərinin fiziki olaraq isbat edə bilm*ədiyi bir şey mövcud deyildir. Bu, bizə* görkəmli ingilis astronom Sir Arthur Eddington'un elmi metodun məhdudiyyəti haqqında gətirdiyi alimin misalını xatırladır. Dənizin dibindəki balıqları öyrənməyə çalışan alim bunun üçün *deşiklə*ri 5 sm-dən böyük olmayan bir tor istifadə edir. Dənizin dibindən xeyli sayda nümunələr çıxardıqdan sonra belə bir nəticəyə gəlir ki, dənizin dibində 5 sm-dən kiçik balıq yaşamır. "Eddington'a görə bizim balıq tutmaq metodumuz, nəyi tuta biləcəyimizi müəyyən edir. Əgər elm selektivdirsə onun təsvir etdiyi həqiqət portretinin tam olması barəsində iddialı ola bilməz."[203] Elm və rasionallıq adı ilə fövqəltəbii h*ər şeyi inkar ed*ənlər intellektual təkəbbürlüyün qurbanlarıdırlar. Onların öz metodlarına və ya inanclarına rasionallıq donu geyindirmələri isə psixoloji təzyiqd*ən başqa bir şey deyildir. Bu yerdə* Frithjof Schuon'un sözləri yerinə *düşür: "Quyunun dibində* yaşayan bir qurbağanın rasionalizmi dağların mövcudluğunu inkar etməkdən ibarətdir; ola bilsin ki, bu da öz yerində bir növ məntiqdir, amma bunun reallıqla heç bir əlaqəsi yoxdur."[204]

Ümumiyyətlə elmi araşdırmaların əsasını tə*şkil ed*ən fəlsəfə, materializm olarsa *çox xoşa g*əlməyən nəticələr ilə qarşılaşa bilərik. Elm bu baxımdan fərdlərə və ümumilikdə bəşəriyyətə *xoşa g*əlməyən baxış acısı verə bilər. H*ər şeyd*ən əvvəl təbiəti öyrənən elmlər onu ən önəmli, ən dəyərli xüsusiyyətlərdən məhrum edə bilər. Həyatı sadəcə olaraq cansız atomların qarşılıqlı əlaqələrindən ibarət olaraq görürüksə, mənəvi gözəlliklərə o həyatda yer qalmırsa və həyat öz müqəddəsliyini itirirsə orada bizim üçün sağ qalmaq ilə ölüm arasında ciddi bir sərhəd olmayacaq. Müasir dünyada təbiət elmləri ilə məşğul olanlar bu qorxunc perspektivdən xilas olmaq üçün spirituallığa baş vururlar, ruhu mənəvi zənginlə*şdirm*əyin yollarını axtarırlar. Vaxtında Charles Darwin həyatın dadını qaçırmaqdan şikayətlənərdi.

---

[201] J. C. Lennox, "Gunning for God: Why The New Atheists are Missing The Target", səh: 10; Lion Hudson, Oxford, 2011

[202] C. Sagan, "The Demon-Haunted World: Science as a Candle in The Dark", səh: 160-161; Headline, London, 1997

[203] Ian G. Barbour, "Religion and Science: Historical and Contemporary Issues", səh: 88; HarperSanFrancisco, New York, 1997

[204] Frithjof Schuon, "Logic & Transcendence", səh: 36; World Wisdom, Bloomington, 2009

Sir J. D. Hooker'ə 1868-ci ildə yazdığı məktubunda musiqidən əvvəlki kimi həzz almadığını şikayət edir: "*Bu, bir daha eşitmək istədiyim bir şeydir, lakin etiraf* etməliyəm ki, buna əvvəlki günlərimdəki kimi dəyər verə bilməyəcək qədər ruhum quruyub. O zaman özümü çox həvəssiz hiss edəcəm, çünki Elmdən *başqa heç bir* şey üçün marağım qalmayıb. Bu bəzən mənim Elmə nifrət etməyimə səbəb olur..."[205] Bu bəlkə də insanı heyvanlar aləmi ilə eyniləş*dirmək*, heyvanları isə cansız maddələr dünyasının bir parçası etməkdən qaynaqlanır. Artıq həyatın gözəlliklərinin arxasında ülvi mənalar yox, sadəcə mənasız fiziki proseslər durur; həyatı bu cür təsəvvür etmək damağın dadını qaçırır, onu zövqsüz edir. On səkkizinci və on doqquzuncu əsrin romantizmi də özündən əvvəlki maarifçiliyə qarşı bu baxımdan bir üsyan cəhdi idi. Maarifçilər insan əqlini və məntiqini o qədər ilahlaşdırdılar ki, məntiqdən kənar olan insan təcrübələrinə yer qalmamışdı. Ona görə də Goethe'nin qəhrəmanı Faust – məsələn – bütün elmi biliklərə məharətlə yiyələnmi*şdi*, lakin bunların boş və mənasız olduğunu görür və həyatın müxtəlif anlarındakı diriliyə, enerjiyə dalmaqla məna dolğunluğu axtarmağa başlayır. Shelley və Byron kimi yazıçılar həyatda dolğunluq, dostluq və məhəbbət axtaran yaradıcı fərdləri və romantik qəhrəmanları şöhrətləndirirdilər.[206] Mənəviyyatdan, dolğunluqdan yoxsul olan elmin mənfi təsiri budur. Darwin yazır: "Mənim ağlım, böyük faktlar külliyyatından ümumi qanunlar üyüdüb çıxaran bir maşına çevrilib, lakin bunun bütün ali zövqlərin asılı olduğu həmin beyin parçasında nə üçün atrofiyaya səbəb olduğunu anlaya bilmirəm... Əgər həyatımı bir daha yaşaya bilsəydim daha çox şer oxumağı, ən azından həftədə bir dəfə musiqiyə qulaq asmağı həyatımda bir qayda edərdim..."[207]

Burada özümüzə önəmli bir sual verməliyik. Elmi ən doğru şəkildə necə dəyərləndirməyimiz lazımdır? Ateist və materialist çevrələr adətən təbiət elmləri, eksperimental elmləri aliləş*dirirlər* və hətta bir növ müqəddəsləş*dirirlə*r. Hər bir *şey sanki tə*biət elmlərinə nisbətdə dəyər qazanmış olur. Hitchens'in sevimli yazıçısı George Orwell hələ keçən əsrin qırxıncı illərində bu təhlükəli tendensə diqqət çəkirdi. Tribune qəzetində də*rc edilmiş mə*qaləyə reaksiya verən Orwell, məqalə müəllifinin sosiologiya və iqtisadiyyat kimi sahələri "elm" hesab etməməsinə etiraz edir. Qeyd edir ki, gündəlik istifadə olunan dildə insanlar "elm" dedikdə yalnız kimya, fizika kimi dəqiq elmləri qəsd edirlər, lakin cəmiyyətin savadlı, intellektual təbəqəsi isə bu söz ilə *daha geniş mə*nanı nəzərdə tuturlar, insanların analitik, mə*ntiqi düşüncə*dən öyrəndikləri hər bir şey bu baxımdan elm

[205] Francis Darwin, "The Life and Letters of Charles Darwin", cild 2, səh: 273; D. Appleton and Company, New York, 1893
[206] Ian G. Barbour, "Religion and Science: Historical and Contemporary Issues", səh: 40; HarperSanFrancisco, New York, 1997
[207] Francis Darwin, "The Life and Letters of Charles Darwin", cild 1, səh: 81; D. Appleton and Company, New York, 1887

*hesab edilir. Orwell şikay*ətlənir ki, "bioloq, astronom, bəlkə də psixoloq və ya riyaziyyatçı "elm adamı" kimi qiymətləndirilir, lakin heç kim bir siyasətçi üçün, bir *şair, bir jurnalist və* ya hətta bir filosof üçün bu adı istifadə etməyi ağlından keçirmir. Gənclərin elm yönündə təhsil almasının önəmli olduğunu bizə deyənlər bununla az qala h*əmişə* onu qəsd edirlər ki, daha dəqiq fikir yürütməkdənsə (gənclər) daha çox radioaktivlik və ya ulduzlar və ya öz bədənlərinin psixologiyası haqqında öyrənməlidirlər."[208] Bizim bu günümüzdə də həmçinin eyni təfəkkür ilə qarşılaşırıq; dəqiq elmlər aşırı dərəcədə müqəddəsləş*dirilir və* onların təlimi üzərinə vurğu edilir. Orwell deyir: "(Elm sözündəki) bu məna qarışıqlığı – ki, qismən qəsdli şəkildə edilir – özündə çox böyük bir təhlükə daşıyır." Daha çox elmi təhsilin verilməsini tələb edənlərin tələblərindəki "iddia budur ki, dəqiq elmlərdə təlim görmüş birinin bütün mövzulara yanaşması belə bir təlim almamış *k*əslə müqayisədə daha ağıllı olacaq." Beləliklə də dəqiq elmlərdə təlim almış "bir alimin siyasi rəylərinin, onun sosioloji məsələlərdəki, əxlaq mövzularındakı, fəlsəfədəki, bəlkə də hətta incəsənət sahəsindəki fikirlərinin" bu elmlərdə təhsil almamış kəslərin rəylərindən "daha dəyərli olması güman edilir. Başqa sözlə desək dünyanın idarəsi əgər alimlərin əlində olsaydı o zaman dünya daha gözəl yer olardı. Lakin gördüyümüz kimi "bir alim" praktikada dəqiq elmlərdən birində ixtisaslaşmış mütəxəssis deməkdir. Belə çıxır ki, bir kimyaçı və ya fizik bu baxımdan siyasi elmlərdə *bir şaird*ən və ya hüquqçudan daha ağıllıdır. Faktiki olaraq artıq buna inanan milyonlarla insan var."[209] Orwell öz zamanında bu cür *düşünə*n insanların milyonlarla olduğunu deyirdisə bu gün həmin say daha da çoxalıb. Lakin Orwell bu inancın doğruluğunu sual altına alır: "Həqiqətən də "bir alim" – sözün dar mənasında – başqalarına nisbətdə "qeyri-elmi" problemlərə daha obyektiv yanaşacaqmı?" Bu sualın həmən ardından özü də cavab verir: "Bu cü*r düşünmə*k üçün yaxşı səbəb yoxdur." Orwell daha sonra bunun misallarını verir və hə*r şeyd*ən əvvəl milliyyətçilik mövzusuna toxunur. Xatırladır ki, "praktikada bütün ölkələ*rin elmi işçil*əri öz hökumətlərini dəstəkləyirlər." Bu mövzuda – ona görə - yazıçılar və sənətkarlar daha çox müqavimət göstərirlər. Əlavə edir ki, Almaniyadakı elm işçiləri ümumilikdə "Hitlerə qarşı müqavimət göstərmədilər… Onlar olmasaydı alman hərbi maşını heç zaman qurula bilməyəcəkdi." Bunun Almaniya ilə məhdudlaşmadığını, bütün ölkələrdə belə olduğunu deyir. Bunun üçün müxtəlif ölkələrdə nüvə silahı üzərində çalışan alimləri də misal gətirir. Həmin alimlərin özlərinin də bir qədər doğru təhsildən

[208] Sonia Orwell & Ian Angus, "In Front of Your Nose 1945-1950", The Collected Essays, Journalism and Letters of George Orwell, cild 4, səh: 10-11; Harcourt Brace Jovanovich Publishers, Orlando, 1968
[209] Sonia Orwell & Ian Angus, "In Front of Your Nose 1945-1950", The Collected Essays, Journalism and Letters of George Orwell, cild 4, səh: 11; Harcourt Brace Jovanovich Publishers, Orlando, 1968

faydalanması lazım olduğuna işarə edir. "Bu məqaləni yazmadan bir qədər əvvəl bir amerikan jurnalında oxudum ki, bir neçə ingilis və amerikalı fizik nüvə silahının hansı məqsədlər üçün istifadə ediləcəyini yaxşı bildikləri üçün ilk əvvəldən onun üzərində araşdırma aparmaqdan imtina ediblər. Qarşımızda lunatiklər dünyası içində bir qrup ağlı başında insan görürük. Onlardan heç birinin adı dərc olunmamışdı, amma onların ümumi mədəni-mən*əvi bir keçmişə* sahib olduqlarını, tarix və ya ədəbiyyat və ya incəsənətlə tanış olduqlarını söyləməyimin sağlam bir təxmin olacağını güman edirəm."[210] George Orwell bu sözlərini 1945-ci ilin okytabr ayında d*ərc etmişdi. Bundan dörd il sonra ruslar öz nüvə* silahlarını uğurla test edəcəkdilər.

Orwell'in həmkarı Aldous Huxley bu mövzuda daha kirtikdir və elmin təhlükələri haqqında xəbərdarlıq etməyi unutmur. Onun "Brave New World" kitabı məhz dəqiq elmlərin və texnolohiyanın inkişafı nəticəsində insanlığın gəlib çıxdığı distopik bir gələcək haqqındadır. Bu gələcəkdə dəqiq elmlər artıq tam bir şəkildə müqəddəslə*şdirilib, aliləşdirilib. Huxley bizə* Mustapha Mond'un dili ilə bu fikri çatdırır: "Elm təhlükəlidir; biz onu xeyli ehtiyat ilə *zəncirlənmiş və* sakitlə*şdirilmiş* halda saxlamalıyıq."[211] Huxley kitabı boyunca bizə göstərməyə çalışır ki, təbiət elmlərinin təhlükəsini göz ardı etmək, ona birtər*əfli yanaşmaq qorxunc n*əticələrə gətirib çıxara bilər. Elmin təhlük*əsi budur ki, o, baş ver*ənlərin yalnız bir hissəsini bizə təsvir edir, xüsusi növ həqiqəti çatdırır; burada doğru olmayan budur ki, həmin xüsusi həqiqət yeganə və tək həqiqət olaraq qəbul edilir. İşin sonunda nə bu dəqiq elmlərdən əldə edilən biliklər, nə də texnologiyanın bəhrələri özlüyündə insanlara *xoşb*əxtlik bəxş *etmir.*[212] Huxley 90 il əvvəl genetika kimi elm sahəsinin inkişafı nəticəsində həyatın tanınmaz hala düşəcəyini, insanlığın mənəviyyatından məhrum olacağını xəbər verirdi. Eksperimental elmin təhlükələrini canlandırmağa çalışan ilk və son yazıçı Huxley deyil. Hələ öz zamanında qadın yazıçı Mary Shelley "Frankenstein" kitabı ilə öz dövründə gördüyü elmi k*əşfl*ərin təhlükəsin*ə işarə* edirdi; insanın öz əlləri ilə yaratdığı məxluq insanlığa düşmən kəsilir, yaradıcısının kiçik qardaşını, daha sonra isə həyat yoldaşını öldürür. Shelley – gənc yaşına baxmayaraq – yeni texnologiya ilə sərhədləri aşmağın ağır nəticələr gətirə biləcəyini dərk edirdi.

Thomas Love Peacock yaratdığı xarakterlərdən biri olan Doctor Opimian'ın dili ilə bizlərə bunu çatdırır: "Elm bir şeydir, müdriklik isə *başqa bir şeydir. Elm iti*

---

[210] Sonia Orwell & Ian Angus, "In Front of Your Nose 1945-1950", The Collected Essays, Journalism and Letters of George Orwell, cild 4, səh: 12; Harcourt Brace Jovanovich Publishers, Orlando, 1968
[211] Aldous Huxley, "Brave New World", səh: 270; Harper & Row Publishers, New York, 1946
[212] Peter Bowering, "Aldous Huxley: A Study of The Major Novels", səh: 234-235; Bloomsbury Publishing, London, 2013

bir alətdir ki, onunla insanlar uşaq kimi oynayırlar və öz barmaqlarını kəsirlər. Sən əgər elmin öz arxasınca gətirdiyi nəticələrə baxsan görəcəksən ki, f*əsaddan başqa bir şey deyildir. Bax gör tə*kcə "Partlayış" sözü ilə - ki, qədim insanların bundan heç bir xəbəri yox idi - nə qədər şey bağlıdır: barıt dəyirmanlarında və barıt anbarlarında Partlayışlar, şaxtalarda və evlərdə kömür qazının, gəmilərdə, qayıqlarda və fabriklərdə yüksək təzyiqlə çalışan mühərriklərin (Partlayışları). Sən hələ məhv etmə yollarındakı, tapançalardakı, tüfənglərdəki və mərmilərdəki, roketlərdəki və toplardakı mürəkkəbliyə və təkmilləş*məyə* ba*x! Toqquşmalara və* qəzalara, quruda və dənizdəki hər növ fəlakətə bax! Bunların çoxu sürət uğrunda edilən dəlisovluqdan qaynaqlanır... Bizim elmi kanalizasiyamıza bax: tör-töküntüləri zəhərə *çevirir. London* şəhərindəki torpağın alt qatına bax: hər dəfə altını üstünə çevirdikdə (görürük ki,) qaz sızıntıları nəticəsində ölümcül bir qara maddəyə *çevrilib ki, o cür torpaqda heç bir bitki yetişmir* və hər şeydən əvvəl sürətlə artan rahatsızlıqlar üzündən heç bir canlı əziyyətsiz nəfəs ala bilməyəcək. Bizim elmi makinalarımıza bax: evlərdə edilən istehsalı məhv edib, (evdə) düz*əldilmiş* əşyadakı gücü, çürüklük ilə əvəz edib, ustalardakı sağlam və rahat kənd həyatını, izdihamdan əziyyət çək*ə*n şəhərlərdəki fiziki tənəzzül ilə əvəz edib. Əgər elmin bəşəriyyətə vurduğu zərərləri saymağa çalışsam bir günə sayıb qurtara bilmərəm. Mən inanıram ki, elmin ən son aqibəti insan irqini məhv etməkdir."[213] Cənab Opimian qədər dramatik olmağa ehtiyac yoxdur, lakin dediklərində həqiqət payı çoxdur. Eksperimental elmlərin bəşəriyyətə gətirdiyi faydaları görsək də onun – bəzilərinin iddia etdiyi kimi – insanlıq üçün bir xilaskar olduğuna, müasir dünyanın "müasir məsihi" olduğuna inanmırıq. Təbiət elmləri sadəcə olaraq bir alətdir, lakin özündə inanılmaz təhlükə daşıyan bir alətdir. Peacock öz dövründə texnologiyanın səbəb olduğu partlayışların d*əhş*ətindən danışırdı və təsəvvür edin ki, bu ingilis yazıçı zamanımızın nüvə silahındakı ölüm potensialını ağlına belə gətirə bilmirdi. Əsrlər əvvəl minlərlə insanı qətl etmək üçün sözün əsl mənasında qəddar, qana susamış hökmdarlar, sərkərdələrin olması şərt idi və onların qəddarlığını tətmin etmək üçün mövcud olan silahlar – *Allaha şükür olsun ki,* - məhdud idi. Halbuki bu gün minlərlə insanı məhv etmək üçün eyni qəddarlığa ehtiyac yoxdur, ofisdə oturub quru hesablama edən, rəqəmlərə baxıb qərarlar qəbul edən Harry Truman kimilərin göndərdikləri tək bir təyyarə və ya atdıqları tək bir roket kifayət edir. Bəzi araşdırmalara görə *Hiroşima və* Naqasaki şəhərlərinə atılmış iki nüvə bombası nəticəsində 400 000 insan qısa bir zaman keçidində ölümlə üzləş*iblə*r.[214] Onların xeyli hissəsi özlərindən sonra toz belə buraxmayıblar ki, qohumları və ya yaxınları cəsədləri ilə sonuncu dəvə *vidalaşa*

---

[213] T. L. Peacock, "Gryll Grange", səh: 160-161; Parker Son and Bourn, London, 1861
[214] Darrell J. Fasching, "The Ethical Challenge of Auschwitz and Hiroshima: Apocalypse or Utopia?", səh: 97; State University of New York Press, New York, 1993

bilsinlər. Sovetlər İttifaqının 1961-ci ildə sınaqdan keçirdiyi hidrogen bombası *Hiroşima* şəhərinə atılmış nüvə bombasından beş min dəfə daha dağıdıcı idi.[215] Hətta tanınmış elm adamları da bu qorxunc ssenariya qarşısındakı rahatsızlıqlarını gizlətmirdilər; təbiət elminin həvariləri özləri ilə birlikdə gətirdikləri ölümün elçiləridirlər. Hawking bir çıxışında insanlığa bir əsr müddətində səbr etməyi, ehtiyatlı olmağı məsləhət görür: "Biz ən az yüz il müddətində kosmosda özünü təmin edən koloniyalar qura bilməyəcəyik, ona görə də o vaxta qədər ehtiyatlı olmağımız lazımdır."[216] Elmi eksperimentlərin bəşəriyyətin sonuna gətirib çıxaracağına dair yazanlar təkcə *apokaliptik düşüncə* sahibi olan dindarlardan ibarət deyildir. İngilis astrofizik Martin J. Rees "Our Final Hour" adlı kitabında bu mövzu ilə bağlı rahatsızlığını və bu rahatsızlıqdan doğan fikirlərini oxucuları ilə bölüşür; o, insanlığın qarşısında yalnız iki yolun olduğunu deyir: ya bəşəriyyət məhv olub gedəcək, ya da insanlar kosmosda yerləşə biləcəklər.[217] Rees yaşadığımız bu əsrin ən kritik dönəm olduğuna inanır, ya bəşəriyyətin inkişafı onun öz məhvinə gətirib çıxaracaq, ya da təhlükəni atlayacağıq. Əgər təhlükədən yan keçə bilməsək və nəticədə bəşəriyyət məhv olarsa və Yer üzündə son insan və ən son filosof olaraq Hitchens kimi bir ateist qalarsa görəsən onun bəşəriyyətin elmi nəaliyyətlərinə münasibəti necə ola bilər? Görəsən indi etdiyi kimi təbiət elmlərini müqəddəsləş*dirməyə*, aliləş*dirməyə* səbəb tapa biləcəkmi?!

---

[215] Michael Kort, "Global Issues: Weapons of Mass Destruction", səh: 16; Infobase Publishing, New York, 2010
[216] Mike Berners-Lee, "There is No Planet B", səh: 3; Cambridge University Press, Cambridge, 2021
[217] Martin Rees, "Our Final Hour: A Scientist's Warning: How Terror, Error and Environmental Disaster Threaten Humankind's Future in This Century – on Earth and Beyond", səh: 170; Basic Books, New York, 2003

## DİZAYN VƏ HITCHENS

"*Suyu ilk kəşf edənin kim olduğunu bilmirik, amma əminik ki, bunu edənlər balıqlar olmayıb.*"

Marshall McLuhan

Bir neçə il əvvəl Leninqrada ziyarətimdə harada olduğumu öyrənmək üçün bir xəritəni incələdim, lakin baş çıxara bilmədim. Durduğum yerdə bir neçə nəhəng kilsə görə bilirdim, amma əlimdə tutduğum xəritədə onlardan əsər-əlamət yox idi. Sonunda bir tərcüməçi mənim köməyimə gəldikdə mənə dedi: "Biz öz xəritələrimizdə kilsələri göstərmirik." Mən onun doğru demədiyini sübut etmək üçün (xəritədə*) aşkar* şəkildə *işarələnmiş birini ona* göstərdim. "O bir muzeydir", mənə dedi, "bizim "canlı kilsə" adlandırdığımız (kilsə) deyildir. Biz yalnız "canlı kilsələri" göstərmirik." Həmin anda dərk etdim ki, bu, mənim əlimə *verilmiş, gözümlə* görə bildiklərimi göstərməkdən aciz olan ilk xəritə deyildi. Məktəb və universitet boyunca mənə *verilmiş h*əyat və bilik xəritələrinin çoxunda mənim üçün ən dəyərli olan və həyatımı yaşamaq üçün mümkün ola biləcək ən əhəmiyy*ətli şeyl*ərdən heç bir iz yox idi. İllər boyunca heyrətimin tamamlandığını və heç bir tərcüməçinin mənim köməyimə yetmədiyini xatırladım. Öz dərk etmə vasitələrimin sağlamlığına şübhə etməyi buraxana qədər və əvəzində xəritələrin doğruluğuna şübhə etməyə *başlayana q*ədər (həmin heyrət) məndən əl çəkmədi.[218] Kitabına bu sözlərlə *giriş edə*n məşhur iqtisadiyyatçı alim Ernst Schumacher öz dövrünün "məqsədli korluğundan" şikayətlənirdi. Ölümünə sadəcə beş gün qalmış Schumacher öz qızını yanına çağıraraq ona "A Guide for The Perplexed" (Heyrət İçində Olanlara Bələdçi) kiabını verir və buyurur: "Bu, bütün həyatımın məni gətirib çıxardığı son nəticədir."[219] Schumacher bizə xatırladır ki, gözümüzlə görə *bildiyimiz, şüurumuzla hiss edə* bildiyimiz bəzi həqiqətlər var ki, müasir ateistik cəmiyyətlər o həqiqətləri bizim həyat xəritəmizdən silib çıxarıb və ya buna davamlı cəhd edir. Sovet dövrünün ateizmi, kilsələri xəritələrdən sildiyi kimi müasir dövrün ateistik materializmi də *eyni ş*əkildə bəzi

---

[218] E. F. Schumacher, "A Guide for The Perplexed", səh: 1; Harper Colophon Books, New York, 1977

[219] Joseph Pearce, "Literary Converts: Spiritual Inspiration in An Age of Unbelief", səh: 356; Ignatius Press, San Francisco, 2006

*aşkar h*əqiqətləri populyar zehnlərdən kənarlaşdırmağa çalışır; beləliklə də biz sadəcə təsadüfən ortaya çıxmış bioloji yan məhsullar oluruq, bizim azad iradəmiz sadəcə illüziyadır və ətrafımızda gördüyümüz dizayn varsa o, əslində dizayn edilmə*mişdir, t*əsadüfən ortaya çıxmış dizayna-bənzərlikdir.

İngiltər*ənin Amesbury ş*əhərindən 3 km aralıda Stonehenge adlı əsrarəngiz bir monument durur. Çox sadə *bir quruluşun ibar*əsi olan bu halqa formasında durmuş daş parçaları günümüzün alimlərinin fikrini məşğul etməyi bacarıb. Verdikləri sual isə budur ki, hündürlüyü təxminən 4 metr, eni 2.1 metr, ağırlığı isə 25 ton olan bu daş parçalarını qədim insanlar iki min il əvvəl necə qaldıra biliblər? Bu alimlərin arasından bunun sadəcə təbiətdə tədricən əmələ g*əlmiş, insan* əməyi olmayan bir yer olduğunu deyən heç bir nəfəri belə tapa bilmirsən. Nə üçün? Çünki sağlam *düşüncə* bu daşların quruluş düzəninə əsaslanaraq onlara, bunun arxasında bir zəkanın, intellektin olduğunu deyir. Təbiətdəki düzəni görən insan bu sağlam *düşüncə*nin təsiri altında həmin düzəni Yaradanın varlığına da inanıb. Hitchens kitabının altıncı fəslində teistlərin Allahın varlığını sübut etmək üçün istifadə etdikləri "dizayn" arqumentini ələ alarkən bu sağlam düşüncənin heç də o qədər də sağlam olmadığını sübut etməyə çalışır. Məlumdur ki, dizayn arqumenti qədim zamanlardan bizə qədər gəlib çatmış fəlsəfi ədəbiyyatda fərqli adlar altında özünə yer tapıb. Socrates, Plato kimi qədim yunan filosofların kitablarında bu cür arqumentlərə rastlamaq çətin deyildir və fəlsəfədə buna teleolojik arqument deyirlər. İnsanlar qədimdən bəri təbiətdə bir nizamın, müasir dildə desək bir dizaynın olduğunu müşahidə ediblər. Sadə *bir düşüncə* bizə - "dizayn varsa, dizayner də olmalıdır" - fikrini təlqin edir. Bu dizayn o qədər aşkardır ki, hətta ən bariz ateistlər belə bu dizaynı təsdiqləyiblər. Ben Stein'in apardığı "Expelled: No Intelligence Allowed" adlı sənədli filmdə çox maraqlı bir epizod keçir. Həyatın, yəni ilk canlı hüceyrənin necə əmələ gəlməsi haqqında alimlərin heç bir anlayışının olmadığını etiraf edən Dawkins bu sual ilə qarşılaşır: "Səncə "intelligent design" (zəkalı dizayn) nəzəriyyəsi genetikada və ya darvinist təkamüldə (cavab verilməmiş) hansısa sualların cavabı ola bilərmi?" – Stein soruşur. Dawkins'in ateist dostlarını məyus edəcək cavabı belə olub: "Bu növbəti cür *baş verə* bilər: ola bilər ki, qədim zamanlarda kainatın hansısa bir yerində canlı bir mədəniyyət darvinist metod ilə çox-çox yüksək texnologiya səviyyəsinə qədər təkamül edib. Onlar həyatın bir növünü dizayn edirlər və o həyatı – möhtəmələn – bu planetə əkirlər. Belə bir mümkünlük vardır və çox maraqlı bir mümkünlükdür və güman edirəm ki, əgər biokimyanın, molekulyar biologiyanın detallarına nəzər salsan bunun üçün dəlil tapmağın mümkündür. Sən hansısa bir dizaynerin imzasını tapa bilərsən."[220] Neo-ateistlərin papası Dawkins'in də dizaynerin imzasının olduğunu təsdiq etməsi ən

[220] Nathan Frankowski, "Expelled: No Intelligence Allowed", 1:30:30; (2008)

skeptik ağıllara da nəsə *bir şey* ifadə etməlidir. Ümumiyyətlə bu etiraf təkcə Dawkins'də dayanmır, əksinə digər ateist alimlər bu dizaynı etiraf edirlər. Təkamülçü bioloq Jerry A. Coyne "Why Evolution is True" (Təkamül nə üçün haqdır?) adlı kitabını bu sözləri ilə başlayır: "Təbiət barəsində *düz olan bir şey* varsa o da budur ki, bitkilər və heyvanlar öz həyatlarını yaşamaq üçün çox qəliz və az qala mükəmməl şəkildə dizayn ediliblər."[221] Coyne da antiteist karvanının üzvlərindəndir. Digər antiteist Michael Sh*ermer bunu* şərh edərkən deyir: "Dizayn nəticəsini çıxarmaq təbii olan bir şeydir. İnsanların dünyanı bir Dizaynerin yaratdığını düşünməkləri dünyanın dizayn edilmiş görünməsinə görədir." Coyne, Shermer, Dawkins… hamısı dünyanın dizayn edilmiş bir görünüşə sahib olduğunu qəbul edirlər. Amma bu dizaynerin kim və ya nə olduğuna gəldikdə tamamilə fərqli bir izah verirlər. "M*ən düşünür*əm ki, biz bu dizayn nəticəsini çıxarmaqdan qurtulmaq məqsədi ilə mövzudan yayınmamalıyıq, əksinə həyatın dizayn edilmiş olaraq göründüyünü etiraf etməliyik, çünki həqiqətən də dizayn edilib: təpədən dırnağa qədər təkamül tərəfindən (dizayn edilib)."[222] Deməli dizayn edilib, amma dizayn edən – Shermer'ə görə - üstün elmə, mərifətə sahib bir varlıq yox, şüursuz, idarə olunmayan təbii bir mexanizmdir. Əksər ateist bioloqlar Shermer'in dediyini iddia edirlər. Dawkins yuxarıda sözünü etdiyimiz sənədli filmdə hətta bunları əlavə edir: "Hmm… həmin dizayner kainatın başqa bir yerindən olan üstün zəka ola bilər." Deməli bu dizaynerin nə zamansa planetimizi ziyarət etmiş uzun boğazlı, iri gözlü, yaşıl sifətli yad planetlilər olmasını qəbul etmək olar, amma h*ər şeyə* qadir, h*ər şeyi bil*ən ilahi varlıq olduğunu isə heç cür, amma heç cür qəbul etmək olmaz. Dawkins'in cavabında iki maraqlı nöqtə vardır. O, bu dizaynın arxasında zəkanın, ağılın, yüksək intellektin imzasının olduğunu təsdiq edir. İkinci maraqlı tərəf isə budur ki, hətta yad planetliləri belə - əgər belə varlıqlar varsa – darvinin təkamül qanununa tabe tutdurur. Ona görə təbii seçmə universal bir mexanizm olmalıdır, təkcə bizim planetdə yox, bütün kainatda çalışan bir qanun olmalıdır. Bu isə öz növbəsində tanrının ilahi özəlliklərini müsadirə edib onları darvin nəzəriyyəsində nəzərdə *tutulmuş, amma h*ələ də *tam* şəkildə müəyyən edilə bilm*əmiş abstrak* qanuna verməkdir. Shermer'in iddiasına – yəni dizaynerin əslində təkamül qanunu olmasına – gəldikdə isə bu barədə öz yerində söz açılacaq.

Ateist filosof Bradley Monton öz "ateistlik karyerasını" riskə ataraq ID nəzəriyyəsinin elmi əsasları olduğunu müdafiə etdikdə sərt reaksiya özünü çox gözlətmədi. 2009-cu ildə "Seeking God in Science" adlı kitabı işıq üzü gördükdə ateist yoldaşları onu şöhrət ovçusu olmaqda ittiham etdilər. Bəli, orta əsrlərin kilsəsini iman uğrunda "elmi" təqib etməkdə ittiham edən ateistlər səhnəni ələ

---

[221] J. A. Coyne, "Why Evolution is True", səh: 1; Oxford University Press, New York, 2009
[222] Michael Shermer, "Why Darwin Matters: The Case Against Intelligent Design", səh: 65; Owl Books, Henry Holt and Company, New York, 2006

keçiriblər və teizmi dəstəkləyəcək heç bir nəzəriyyəyə aman vermirlər. Fred Hoyle və tələbəsi Chandra Wickramasinge elm dünyasında panspermia nəzəriyyəsini məşhurlaşdırarkən eyni dizayn aqrumentlərindən çıxış edirdilər. 1983-cü ildə Hoyle "The Intelligent Universe" kitabını nəşr edərkən planetimizdə həyatın sadəcə idarə olunmayan proseslər nəticəsində əmələ gəlməsini tamamilə rədd edirdi. Hoyle Allaha inanmırdı, amma təbiətdəki və kosmosdakı dizaynı yaxından görən bir alim kimi ağıl və zəkadan uzaq bir proses tərəfindən həyatın əmələ gələ biləcəyi fikrini də qəbul etmirdi. Onun sübut etməyə çalışdığı bu nəzəriyyə qədim yunan filosof Anaxagoras'a nisbət edilsə də onu həqiqi mənada elmi dairələrdə məşhurlaşdıran on doqquzuncu əsrin alman alimi Hermann Richter oldu və "panspermia" adını da o zərb edib.[223] Richter və onun kimi düşünənlər – onların arasında William Thomson (1824-1907) və alman fizik Hermann von Helmholtz (1821-1894) yer alır - darvin nəzəriyyəsinin Yer üzündə ilk həyatın əmələ gəlməsini izah etməkdən aciz olduğunu görürdülər və bu səbəblə bu acizlikdən qurtulmaq üçün tamamlayıcı izah axtarırdılar.[224] Bu nəzəriyyəni 1908-ci ildə daha da populyarlaşdıran nobel mükafatı qazanmış isveçli alim Svante Arrhenius oldu; o, ilkin həyatın Yer üzünə günəş işıqları ilə hərəkətə gələn və saniyədə 186 000 mil qət edən sporlarda gəldiyini irəli sürdü.[225] Təbiət elmlərini araşdıran bu alimlərin hamısı ilk hüceyrələrin cansız maddələrdən əmələ gəldiyini sübut etməyin imkansız olduğunu başa düşürdülər. Ona görə də onlar kainatın əbədi olduğuna, beləliklə də həyatın da əbədi olduğuna inanırdılar və ilk canlı hüceyrələrin əzəldən bəri daim mövcud olması fikrini müdafiə edirdilər. *Başqa dildə* desək bu canlı hüceyrələr kainatda hər zaman mövcud olublar və bizim planetə də kosmosdan gəliblər. Panspermia nəzəriyyəsinin daha xüsusi forması "yönləndirilmiş panspermia" adlanır. Panspermia teoriyası həyatın Yer kürəsinə özündə mikroblar daşıyan meteoritlər tərəfindən gətirildiyini nəzərdə tutursa, "yönləndirilmiş panspermia" bunun məqsədli şəkildə yad planetlilər tərəfindən Yer kürəsinə əkildiyini iddia edir. Rejissor Ridley Scott "Prometheus" (2012) fikmini çəkərkən bu nəzəriyyədən ilham alıb; filmin ssenariyası Yer üzündə insan DNT molekulunun yadplanetli intellekt tərəfindən idxal edildiyini göstərir. 1960-cı illərdə panspermia fərziyyəsinə maraq salanlardan biri də Carl Sagan olub və o, bunun mümkünlüyü ilə bağlı riyazi model hazırlamağa çalışır; o, bu çalışmasını 1966-cı ildə nəşr etdiyi "Intelligent Life in The Universe" kitabında

---

[223] D. S. Halacy, Jr. "Genetic Revolution: Shaping Life for Tomorrow", səh: 37; Harper & Row Publishers, New York, 1974

[224] Joseph Sechbach, "Origins: Genesis, Evolution and Diversity of Life", səh: 24; Kluwer Academic Publishers, Dordrecht, 2004

[225] D. S. Halacy, Jr. "Genetic Revolution: Shaping Life for Tomorrow", səh: 37; Harper & Row Publishers, New York, 1974

işıqlandırırdı.[226] 1964 və 1971-ci illərdə Ermənistandakı Byurakan rəsədxanasında təşkil edilmiş konfransda Carl Sagan, David Hubel, Marvin Minsky, Francis Crick kimi alimlər bir araya gəlib yad planetlərdə mədəniyyətləri müzakirə edirdilər. Həmin konfrans Carl Sagan və onun sovet həmkarı Nikolay Kardaşevin xüsusi əməyi sayəsində baş verə bilmişdi.[227] 1953-cü ildə DNA molekulunu kəşf etdiyinə görə nobel mükafatı qazanan Francis Crick (1916-2004) həmin yığıncaqda "yönləndirilmiş panspermia" nəzəriyyəsini elan etdi. İngilis kimyaçı Leslie Orgel də (1927-2007) eyni fikri müdafiə edirdi. Bu gün hər iki alim bu nəzəriyyənin ən məşhur təmsilçiləri kimi tanınırlar. Stephen Hawking də bu ideyaya çox isti yanaşırdı; belə bir fərziyyəni onun üçün inandırıcı edən səbəb isə o idi ki, Yer üzündə həyatın yaranması prosesi üçün çox az vaxt olub.[228] Qəliz informasiya kodunu daşıyan və amino turşulardan ibarət olan, özünü təkrarlayan molekulun Yer üzündə "prebiotik şorbada" formalaşmasına inanmaqda çətinlik çəkən Crick və Orgel bunun yad planetlilər tərəfindən yerləşdirilməsi fikrini daha doğru hesab edirdilər; "canlı varlıqlarda Yer üzündə aşırı dərəcədə nadir olan elementlərin yer alması göstərə bilər ki, həyat Yer planetindən başqa yerdə başlayıb."[229] Bütün bu alimlər bir sözlə etiraf edirlər ki, həyatın Yer üzündə material şərtlərdə əmələ gəlməsi inandırıcı deyildir. Unutmayaq ki, Charles Darwin öz fikirlərini formalaşdırarkən həyatımızın əsasını təşkil edən DNT molekulları hələ kəşf edilməmişdi və onun dövründə insan bədənini təşkil edən hüceyrələr barəsində primitiv təsəvvür var idi. Onlar hüceyrələrin inanılmaz dərəcədə dəqiq çalışan və çox qəliz struktura malik fabrikalar olduğunu bilmirdilər. (Çox təəssüf ki, Hitchens keçmişin insanlarının cahilliklərinə misallar verərkən bu cür misallara toxunmur.) Ona görə də onların təsəvvüründə insan bədəni bəsit hüceyrələrdən ibarət idi. Özündə informasiya kodunu daşıyan bu molekulların kəşfi bəzi ateistlərin allahsızlıq inancını da sarsıtmağı bacardı. İyirminci əsrin barmaqla işarə olunan ateistlərindən biri olmuş Antony Flew (1923-2010) məhz son elmi kəşflərin göstərdiyi aşkar dizayn səbəbi ilə köhnə ateistliyini tərk etməli oldu və artıq özünü deist adlandırmağa başladı. "Mənim tək və yeganə münasib dəlilim, törəyib arta bilən ilk növlərin DNT molekulundan həyatın başladığını izah edən naturalistik teoriyanın açıq-aydın mümkünsüzlüyüdür" – Flew deyir.[230] Naturalistik teoriya ilə, bir şeyin kənar ağılın təsiri olmadan, sırf təbii proseslərlə baş verməsi

[226] Amir D. Aczel, "Probability 1: The Book Thet Proves There is Life In Outer Space", səh: 91; A Harvest Book Harcourt Inc., New York, 1998
[227] Ray Spangenburg & Kit Moser, "Carl Sagan: A Biography", səh: 75; Greenwood Press, Westport, 2004
[228] Kitty Ferguson, "Stephen Hawking: His Life and Work", səh: 311; Bantam Press, London, 2011
[229] Emily Monosson, "Evolution in A Toxic World: How Life Responds to Chemical Threats", səh: 54; Island Press, Washington, 2012
[230] Jack Huberman, "The Quotable Atheist: Ammunition for Nonbelievers, Political Junkies, Gadflies, and Those Generally Hell-Boun", səh: 117; Nation Books, New York, 2007

qəsd olunur. “Bu simpoziumda, “həyatın başlanğıcı sahəsində *edilmiş* ən son çalışmaların yaradıcı Ağılın fəaliyyətinə *işarə* edirmi?” sualı ilə qarşılaşdığımda dedim: Bəli, mə*n indi düşünür*əm ki, edir… DNT araşdırmalarına görə demək olar ki, (bu çalışmalar) tamamilə *(buna işarə* edir). Fikrimcə DNT materiyalının etdiyi bu oldu ki, o, həyatı əmələ gətirmək üçün lazım olan az qala inanılmaz dərəcədə qəliz tərtibat vasitəsi ilə bizə *nümayiş etdirdi ki, bu h*əddindən artıq çeşidli elementləri bir yerdə çalışdırmaq üçün ağıl mütlə*q iştirak etm*əli idi.”[231] Bunlar bir zamanlar ateist icma tərəfindən sevilən və hörmət edilən Flew tərəfindən yazılmış etiraflardır. Özünü açıq fikirli, ziyalı kimi göstərməyə çalışan bu ateist yoldaşlar onun Allahın varlığına inandığını eşitdiklərində qaralama kampaniyasına başladılar. Onu yaşlaşdığı üçün zehninin kütləşməsində ittiham etdilər.[232] Amma Flew bu hücumlara boyun əymədi və nə üçün ateizmi tərk etdiyini izah edən bir kitab yazdı. Britaniyalı-avstraliyalı biokimyaçı Michael John Denton da həyatın dizayn nəticəsində ortaya çıxdığına inanır, amma Allaha inanc məsələsində özünü aqnostik adlandırır. Bill Gates bu nizamı, tərtibi və mütəşəkkilliyi belə izah edir: “DNA bir kompyuter proqramı kimidir, amma (insan tərəfindən) yaradılmış istənilən proqramdan xeyli üstündür.”[233] MIT-də fizika üzrə dərs vermiş ilk qadın professor sayılan Vera Kistiakowsky intervyusunda deyir: ”Bütün bu prosesin, ilk kompleks molekulların formalaşmasından tutmuş insan zəkasının təkamülünə qədər hamısı – mənə görə - möcüzədir.”[234]

Qədimdən bu günümüzə qədər dillərdə və kitablarda təzahürləri təsvir olunan bu dizaynı William Paley (1743-1805) “Natural Philosophy” kitabında “saatsaz” analogiyası ilə ifadə edirdi. Hitchens öz kitabında Paley və onun kitabını xüsusi həvəslə mühakiməyə çəkir. “Güman et ki, bir bozqırı keçərkən ayağı*m daşa də*ydi və o daşın ora necə *düşdüyünü məndən soruşdular. M*ən bildiyim h*ər bir şeyin* əksinə olaraq belə cavab verə bilərəm ki, h*əmin daş orada* əzəldən yatır və ola bilsin ki, bu cavabın absurdluğunu göstərmək çox asan olmayacaq. Lakin güman et ki, mən yerdə bir saat tapıram və o saatın haradan ora gəldiyini araşdırmaq lazımdır. “Bildiyim qədər ilə saat orada h*əmişə* yatmış ola bilər” deyərək daha əvvəl verdiyim cavabı burada da verəcəyimi çətinliklə təsəvvür edirəm. Amma bununla belə nə *üçün bu cavab daş* üçün keçərli olduğu halda saat üçün keçərli olmamalıdır ki? Bu və yalnız bu səbəbə görə biz saatı müayinə etdiyimizdə, *daşda kəşf edə* bilmədiklərimizi görürük ki, onun çox hissəsi bir məqsəd üçün istehsal

---

[231] Antony Flew with Roy Abraham Varghese, ”There is a God; How the World’s Most Notorious Atheist Changed His Mind”, səh: 75; Harper One, New York, 2007
[232] Hans Schwarz, ”Vying for Truth – Theology and The Natural Sciences: From The 17th Century to The Present”, səh: 211; Vandenhoeck & Ruprecht, Göttingen, 2014
[233] Bill Gates, “The Road Ahead”, səh: 188; Viking Publishers, New York, 1996
[234] Roy Abraham Varghese, “Cosmos, Bios, Theos”, səh: 53; Open Court Publishing Company, 1992, Chicago

olunub və bir araya gətirilib ki, hərəkət əmələ gətirmək üçün formalaşdırılıblar və uyğunlaşdırılıblar və hərəkət özü günün saatını göstərmək üçün tənzimlənib... idrak etdiyimiz əqli nəticə tamamilə qaçınılmazdır ki, saatın bir yaradanı olmalıdır və müəyyən bir zamanda və müəyyən bir yerdə bir sənətkar və ya sənərkarlar olub..."[235] Bu, Paley və onun müasirləri tərəfindən dizayn arqumentini sadə dildə izah etmək cəhdləridir. Viktoriyan eranın yetişdirdiyi bu dindar şəxslər təbiətdə, heyvanlarda gördükləri bəzi orqanlardakı möhtəşəm funksiyaların izahını yalnız "ağıllı dizaynda" tapa bilirdilər. Hitchens bu məzmunda J. Farrell'in yazdığı "The Siege of Krishnapur" əsərinə müraciət edir və oradan dindar Padre ilə skeptik Fleury arasında gedən dialoqdan bir parçanı oxucuya təqdim edir. Krishnapur şəhəri sadəcə olaraq yazıçı Farrell'in xəyalının məhsuludur. Padre həmin şəhərdə mühasirəyə düşmüş ingilislərin ağır itkilərinin məhz Fleury'nin güman edilən dinsizliyi üzündən Allah tərəfindən endirilmiş bir cəza olduğuna inanır. Padre bunun qarşısını almaq üçün Paley'nin "saatsaz" arqumentini ona xatırladır, balıqların gözlərini qırpmamağının funksiyasına işarə edir, hind donuzunun dişlərinin funksiyasından danışır. "Dəvənin qarnı barəsində düşün! Hər gün getməli olduğu səhra bölgəsi üçün ehtiyacı olan çox miqdarda suyu daşımaq üçün uyğunlaşıb..." Padre bir qədər sonra əlavə edir: "Doğmaqda olan qadının südünü *düşün!*"[236] Bu misallar ilə Fleury'ni dinsizlikdən döndərməyə ümidli olan Padre ona dizaynın izlərini göstərir. Hitchens burada hind donuzu misalı haqqında ucuz bir şərh verməkdən özünü saxlaya bilmir: "Dünyanın Dizaynerinin öz bəşər məxluqlarının əksəriyyətinə donuzla sanki şeytan və ya cüzam xəstəsi imiş kimi davranmağı nə üçün əmr etdiyini Paley burada izah etmək üçün özünə əziyyət verməyib." Ucuz dedik, çünki dinlər heç də donuzla şeytan və ya cüzam xəstəsi kimi davranmır. Amma xüsusilə qeyd etməliyik ki, Hitchens'in donuzlara xüsusi simpatiyası var. Kitabında dinlərə qarşı donuzun şərəfini müdafiə etmək məqsədi ilə ayrıca bir fəsil açıb. Amma bunun müzakirəsini burada etməyəcəyik. Paley dizayn arqumenti ilə məşhurdur və Hitchens'in məhz onun adını hallandırması qəribə deyildir. Paley'nin "özündən razılığını və xəta üzərində inadkarlığını" guya yazıçı Farrell kitabında Padre'nin obrazında canlandırır.[237] Vəssalam, Hitchens'in dünyasında bir arqumenti öldürmək bu qədər sadədir. Lakin əsrlər boyunca ən dahi insanların təfəkkürünü işğal etmiş və hələ də bunu etməyə davam edən dizayn arqumenti onun görmək istədiyi qədər bəsit deyildir, hətta David Hume kimi skeptiklər belə dizayn arqumentini nə qədər tənqid etsələr də onun gücünü tam inkar edə bilmirdilər. Hume "Dialogue" kitabında Philo'nu dilə gətirərək deyir: "Mən etiraf etməliyəm - Philo cavab verdi - ki, başqa mövzulara nisbətdə mən

[235] William Paley, "Natural Theology", səh: 1; Philadelphia, 1802
[236] J. G. Farrell, "The Siege of Krishnapur", səh: 176-177; Warner Books, New York, 1976
[237] GIG, səh: 77

Təbii Din[238] məsələsində daha az ehtiyatlıyam; çünki həm bilirəm ki, sağlam *düşüncə* sahibi olan heç bir kəsin prinsiplərini korlaya bilmərəm və həm də əminəm ki, məni ağlı başında biri kimi qəbul edən heç bir kimsə mənim qəsdimi yalnış anlamayacaq. Xüsusilə də s*ən, ey Cleanthes,… başa düşürs*ən ki,… Təbiətdəki əsrarəngiz ixtiraçılıq və sənətkarlıq üzərində təfəkkür edən kəsdən daha də*rin bir* şəkildə dini təəssürata malik heç kimsə ola bilməz və İlahi Varlığa ondan güclü pər*əstiş ed*ən bir başqası ola bilməz. Bir məqsəd, bir amal, bir dizayn ən diqqətsiz, *ən düşüncə*siz adamı belə hər yerdə valeh edir və heç kimsə bunu inkar edəcək qədər absurdlaşmayıb… Bütün elmlər bizi özümüzdən asılı olmayaraq ilk zəkalı Müəllifə gətirib çıxarır…"[239] Philo qeyd edir ki, bütün dialoq boyunca qaldırdığı skeptik suallar heç də inancları, təsəvvürləri inkar etmək mənasını daşımırdı; xüsusilə də təbiətdəki nizamın Allaha dəlaləti o qədər aşkardır ki, onu inkar etmək absurd olacaq, ona görə də bu barədə skeptik sualların xətalı anlaşılmayacağına inanır. Burada yaratdığı bir xarakterin vasitəsi ilə Hume dizayn arqumentini tam inkar etmədiyini etiraf edir və Hitchens də razılaşır ki, Hume təqdim etdiyi dialoqda öz fikirlərini Philo'nun adından səsləndirir.[240] Qəribədir ki, - bəlkə də qəribə olmamalıdır - Hitchens bu mövzuda Hume'un fikirlərini dolğun şəkildə oxucuya təqdim etmədən onu da özü ilə eyni cəbhədə *vuruşan* əsgər kimi təqdim edir. Həqiqət isə budur ki, onun fikirləri daha kompleks olub və nə qədər yanılsa da Hitchens kimi ucuz təfəkkürün adamı olmayıb. Mən hətta deyərdim ki, yazıçı Farrell öz kitabında Padrenin timsalında başqa bir obrazı, Hitchens'i canlandırmağı bacarıb; hər ikisi də fiziki elmi nəaliyyətləri bir fəlsəfənin doğruluğunun sübutu kimi görürdülər. "Bacon və Milton'un ədəbiyyatı" - Padre deyir – "Haqq və Gözəlliyə olan yeni iştahı oyadır…Qərbin dəqiq elmləri onların aydın və *nümayiş etdirilə* bilən faktları və qaçınılmaz nəticələri ilə Hinduizmin fiziki xətalarının bütün ayıblarını ortaya qoyur."[241] Sadəcə olaraq aradakı fərq budur ki, Padre Avropanın elmi inkişafını xristianlığın qələbəsi kimi qəbul etdiyi halda Hitchens bunu ateizmdə görür.

Təbiətdən gətirilən dizayn misallarından Hitchens'in narazılığı qısaca olaraq belə yekunlaşdırıla bilər ki, h*ər şey bir m*əqsəd üçün dizayn edilməyib, əksinə hər bir *şey t*əbiətd*əki* şərait üçün təkamül mexanizmi nəticəsində uyğunlaşıb. İnsan qulağı yaxşı eşitmək üçün dizayn edilməyib, sadəcə olaraq yaxşı eşitmək üçün tədricən təkamül edib, formalaşıb və uyğunlaşıb. Bunu Hitchens hələ doqquz yaşında ik*ən başa düşürdü.* Problem budur ki, Hitchens bəzi təkamül

---

[238] Təbii Din Allahı təbii yollarla, təbiət vasitəsi ilə öyrədən dini qəsd edir; bu mənada Təbii Din vəhy ilə *endirilmiş dind*ən fərqlidir. Təbii Din tarixdə daha çox deistlər ilə əlaqələndirilib.
[239] D. Hume, "Dialogues Concerning Natural Religion", 214-215, The Bobbs-Merrill Company, New York, 1947
[240] GIG, səh: 267;
[241] J. G. Farrell, "The Siege of Krishnapur", səh: 132; Warner Books, New York, 1976

nəzəriyyələrini göstərməklə "ağıllı dizaynı" rədd etdiyini güman etməkdə xəta edir. Hətta bütün bu qəliz orqanik strukturların tədricən təkamül etdiyini göstərmək *mümkün olsa da bu, heç bir* şəkildə bunların dizayn olunmadığını sübut etməz. Orqanizmlərdə müəyyən funksiyaları həyata keçirən tərkib hissələri məhz o məqsədlər üçün mövcuddur. "Məqsəd" isə mahiyyəti etibarı ilə ağılsız materiyada mövcud ola bilməz. "Məqsəd" və "qəsd" yalnız "bilən", "fikirləşən" varlığa xas ola bilər. Təbii orqanizmləri *heç bir* şəkildə onların tərkib hissələrinin sayəsində izah etmək mümkün deyildir. Bu dediyimizi təkcə DNA molekulu üzərində *düşünmək* kifayət edir. Columbia və New York universitetlərindəki genom mərkəzində aparılmış bir araşdırmaya görə bir qram DNA molekulunda 214 petabayt informasiya saxlamaq mümkündür.[242] İnsanın bədənindəki bu DNA molekulları da insan haqqında məlumatları daşıyır, yəni informasiya daşıyıcısı rolunu oynayır. Təsəvvür et ki, Cessna modelindən şəxsi bir təyyarədə iki alim səyahət edir. Bu iki alimdən biri teist, digəri isə ateistdir. Qaranlıq səmadan aşağı baxdıqlarında adalardan birinin üstündə atəş *ilə* SOS yazıldığını görürlər. Teist ateist olandan *soruşur: M*ənə bu adanın üstündə gördüyünü sadəcə fiziki tərkib hissələri ilə izah edə bilərsənmi? Sadəcə molekul və atomlar səviyyəsində o adada SOS sözünün necə əmələ gəldiyini izah etmək mümkündürmü? Heç bir ağıl və intellektə müraciət etmədən belə *bir şeyi izah etmə*k olarmı? Bu günə qədər heç bir ateist bunun öhdəsindən gələ biləcəyini iddia etməyib. Fakt budur ki, özündə informasiya və məna daşıyan simvolları sadəcə atomların hərəkətləri ilə, fiziki proseslər ilə izah etmək mümkün deyildir. Eyni şey bizim haqqımızda informasiya daşıyan DNA molekulları üçün də keçərlidir.

Əlavə edək ki, Hitchens bunu sadəcə təbiətə aid etmir. *"Eyni şey kainat* haqqında da - eyni mənada – doğru deyildir"[243] deyir. Yəni kainat da – ona görə - dizayn olunmayıb. "Qırmızı nəhəngləri, ağ cırtdanları və *qara deşiklə*ri ilə kosmosun vıyıldayan, fırlanan boşluğuna, onun əzəmətli partlayışlarına və (ulduzlarının) sönməsinə gəldikdə isə biz yalnız solğunluqla və soyuqdan titrəyərək bu nəticəyə gələ bilərik ki, dizayn hələ *tam bir* şəkildə tətbiq edilməyib və görəsən meteorlar Yer kürəsinin atmosferini dağıdıb keçdikdə və ibtidai bataqlıqlar boyunca gedən nəriltili rəqabətə *son qoyduqda dinozavrlar da eyni şeyi hiss* edirdilərmi?!" Bu sözlərlə Hitchens kosmosdakı dizaynı inkar etməyə çalışır. Görəsən kosmosdakı partlayışlar, ulduzların sönməsi hansı yolla dizaynın olmadığını göstərir? Dinozavrlar haqqında yazdığı sözlərdəki ironiyanı da görməmək mümkün deyildir. Hitchens özü paleontoloq deyil, nə də geoloqdur, amma dinozavrların başına nə gəldiyindən əmindir. Paleontoloqlar, geoloqlar isə

---

[242] G. Ranganathan, J. Chen & A. Rocha, "Inventive Communication and Computational Technologies", səh: 479; Springer Nature, Singapore, 2020

[243] "God is Not Great", səh: 79;

o qədər də əmin deyillər və buna görə də mövzu haqqında birdən çox nəzəriyyə var. Meteoritlərin buna səbəb olması nəzəriyyəsi pop mədəniyyətdə daha çox reklam olunduğu üçün daha məşhurdur, amma paleontoloqlar arasında məşhur olan rəy budur ki, dinozavrların ölümünün səbəbi uzun bir müddət ərzində tədricən baş vermiş klimat dəyişikliyi olub.[244] Hər bir halda dinozavrların ölümünün səbəbinin nə olmasından asılı olmayaraq onlar üçün bu "bədbəxt" taleyə Hitchens də daxil olmaqla bəşəriyyət sevinir. Başqa dildə desək bu "fəlakət" dinozavrlar üçün bədbəxt, bəşəriyyət üçün isə xoşbəxt hadisə idi. Hitchens bəlkə də əlinə ov tüfəngi götürüb ayıların, canavarların hakimlik etdiyi bir meşəyə gedə bilərdi, amma tirannozavr-reksin dolaşdığı bir meşəyə yaxın durmağa cürət etməzdi. Hithens yuxarıda yazdığını yazmadan öncə dinozavrların ölümü üçün Allaha şükür etməli idi. Sheffield universitetinin təkamülçü biologiya professoru Frank Ryan deyir: "(Dinozavrların) məhvi, sonradan Homo sapiens'in təkamülü üçün böyük əhəmiyyət daşıyırdı, çünki dinozavrların hakimiyyətinə son qoymaqla məməlilərin dövrünün təkamül qapısını açmış oldu."[245] Maraqlıdır ki, National Geographic 2017-ci ilin noyabr ayında öz internet səhifəsində dərc etdiyi məqalədə "dinozavrları öldürən asteroid, qırğını törətmək üçün məhz ən doğru yeri vurub" deyir. NASA'nın jet mühərriki laborotoriyasında Yer kürəsinə yaxın obyektləri araşdıran qrupun müdiri Paul Chados bu məqalədə deyir ki, "... toqquşan obyektin böyük ölçüsünə baxmayaraq kütləvi qırğının baş verməsi ehtimalı çox aşağı idi."[246] Başqa dildə desək həmin asteroid əgər Yukatan yarımadasına yox, başqa yerə dəysəydi dinozavrların hamısı ölməyəcəkdi. NASA-nın iddiası budur ki, asteroidin məhz həmin nöqtədə Yer ilə toqquşması bəşəriyyət üçün böyük bir uğurdur.

Hitchens'in təkamül nəzəriyyəsinin bioloji, biokimyəvi və genetik əsasları haqqında çox kasıb bilgilərə sahib olduğunu asanlıqla söyləmək olar. Onun, bu barədə mövcud olan akademik müzakirələri araşdırıb təkamül haqqında bir qərara gəldiyini iddia etmək inandırıcı deyildir. Onun kimi ateistlər bunu etməyə ehtiyac görmürlər, onlar üçün etibar etdikləri bioloqların, biokimyaçıların sözləri kifayət edir. Kitabında bunu kəşf etmək üçün dərin bir incələməyə ehtiyac qalmır. Gözün təkamül prosesisinin sübut edildiyini deyir və bunun necə baş verdiyini görmək üçün təkamülün keçid formalarının təbiətdə müşahidə olunduğuna diqqət çəkir. Dostu Shermer'ə istinad edərək deyir: "Shermer'in işarə etdiyi kimi gözün təkamülünə dair əlavə sübut da vardır. Bu, onun dizaynındakı səriştəsizlikdir: "Faktiki olaraq gözün anatomiyası "dizayndakı zəkadan" başqa hər bir şeyi

---

[244] Donald R. Prothero, "After The Dinosaurs: The Age of Mammals", səh: 39; Indiana University Press, Bloomington, 2006
[245] F. P. Ryan, "Darwin's Blind Spot: Evolution Beyond Natural Selection", səh: 177; Houghton Mifflin Company, New York, 2002
[246] Michaelle Z. Donahue, "*Dino-Killing Asteroid Hit Just The Right Spot to Trigger Extinction*", National Geographic, 9 noyabr, 20170

göstərir. O, başı aşağı və tərsinə qurulub; işıq siqnalını sinir impulsuna çevirən işığa həssas çubuqcuqlar və kolbacıqlara çatmadan öncə işıq fotonlarını buynuz qişadan, büllurdan, şüşəyə bənzər cisimdən, qan damarlarından, gangliyon hüceyrələrdən, amakrin hüceyrələrdən, horizontal hüceyrələrdən, iki qütblü hüceyrələrdən keçməyə vadar edir və bundan sonra bunları mənalı formalara salmaq üçün beynin arxasında yerləşən görmə qabığına göndərir. Nə üçün ağıllı bir dizayner optimal görmə qabiliyyəti üçün gözü bu cür başı aşağı və tərsinə qurub?!"[247] Shermer'in izahı bir az aydın olmaya bilər, ancaq onun demək istədiyi budur ki, işığa həssas olan hüceyrələr, *başqa cür desə*k işığı qəbul edən reseptorlar işığa tərəf baxmırlar. Əksinə işıq fotonlarını sinir impulsuna çevirdikdən sonra onu ötürmək üçün *işlə*tdikləri naqilləri işığa tərəf baxır, özləri isə arxalarını işığa tərəf çeviriblər. Bu bioloqlar deyirlər ki, insanların içindən ən zəki dizaynerlərə bir göz dizayn etməyi tapşırsanız heç kim onu bu cür dizayn etməz, çünki bu cür dizayn etmək "absurddur". *Əksinə* gözün daha iti görmək qabiliyyətinə nail olmaq üçün bu reseptorların işığa tərəf baxması lazımdır. Bu cür arqumentlər son zamanlar bəzi ateist bioloqlar tərəfindən tez-tez səsləndirilir. "Scientific American" jurnalının 2001-ci ilin mart buraxılışında "insanlar əgər davamiyyətli qurulsaydılar" adı altında də*rc edilmiş mə*qalədə Jay Olshansky, Bruce Carnes və Robert Butler bu cür "dizayn qüsurlarından" ürək dolusu yazıblar.[248] Bu üç nəfər, insanın ömrünü artırmaq üçün bəd*əni başqa cür dizayn etmə*k barəsində fikir eksperimentləri aparıblar. Gözün, nəfəs və qida borusunun və digər bədən orqanlarının zəifliklərindən danışan bu üçlük bəzi yerlərdə maraqlı təkliflər irəli sürüblər. Onlara görə nəfəs borusu ilə qida borusunu ayıran yerdə yeməyin nəfəs borusuna getməsi riski mövcuddur. Bu problemdən qurtulmaq üçün nəfəs borusunu buruna yaxınlaşdırmaq üçün yuxarı qaldırmağı, beləliklə də yeməyin nəfəs borusunun yanından keçməsini təklif edirlər. Özləri də eyni zamanda etiraf edirlər ki, bu cür etdikləri təqdirdə ağızla nəfəs almaqda və danışmaqda pozuntular əmələ gələcək. Biz onu da əlavə edək ki, nəfəs borusu əgər boğazdan keçib buruna qədər qalxarsa boğaz anormal şəkildə böyük olmalı və boynun hərəkətinə mane olmalıdır. Ağızdan nəfəs almaq imkanı məhdudlaşacaqsa burnu tutulan insanlar ölüm halı ilə üzləşəcəklər. Bu üç alimdən birinin öz üzərində bu cür dizayn də*yişikliyinin* edilməsinə razı olacağına da inanmıram. Onlar yaxşı bioloq ola bilərlər, amma inanın ki, çox bərbad mühəndisdirlər. Shermer, Dawkins və digər ateist bioloqlar da bu cür fikir eksperimentlə*ri apararaq gözü başqa cür dizayn etmə*kdən danışırlar. Görəsən zamanımızda biologiya ilə məşğul olan bu öncül alimlər nə əcəb kor insan üçün təzə bir göz dizayn etmirlər?! Öz ideyalarını tətbiq etmək üçün

[247] "God is Not Great", səh: 82
[248] S. J. Olshansky, B. A. Carnes, R. N. Butler, "Scientific American", 284-cü cild, nömrə 3, səh: 50-55, mart, 2001

onların qarşısında laboratoriya dovşanı kimi masanın üzərinə yatmağa hazır olan kor bir fanat tapmaq çətin olmayacaq. Bu qədər danışmaq əvəzinə bunu real təcrübədə bəşəriyyətə *nümayiş ets*ələr daha gözəl olardı.

Buradakı ikinci məqam budur ki, gözün quruluşunun bu cür olması heç də mənasız deyildir, əksinə görmək istəyən bioloqlar bu önəmli funksiyaları da qeyd ediblər. İşıq reseptorları, yəni işığa həssas olan hüceyrələr bədəndə ən yüksək metabolik sürətə malık olan toxuma növünə aiddir. Bu o deməkdir ki, onlar çoxlu qida və oksigen (enerji) tələb edirlər. Gözün qan təchizatının dörddə üçü "choriocapillaris" *adlanan kapillyar damarlar* şəbəkəsindən keçir və *bu* şəbəkə retinanın arxasında yerləş*ir. Bu* şəbəkə ilə işığa həssas hüceyrələr arasında bir ara qat vardır ki, ona tibbdə "retinal piqment epiteliya" (RPE) deyirlər. Oksigeni və qidaları bu həssas hüceyrələrə daşımaqdan ziyadə RPE-nin iki əlavə funksiyası da var: Birincisi ondakı qara piqment yayılmış və parçalanmış işığı özünə çəkib alır və bununla da gözün optik keyfiyyətini yaxşılaşdırır. İkincisi isə işığı tutma prosesində bu həssas hüceyrələrin ifraz etdikləri toksik kimyəvi maddələri aradan qaldırır. Silindr və konus formasında olan bu işığı tutan hüceyrələrin içərisində disklər mövcuddur və Richard Young 1967-ci ildə *eksperimental* şəkildə sübut etdi ki, bu disklər daim təzələnirlər.[249] Fotoreseptorlar RPE-yə yaxın hissədəki diski ifraz edir və hüceyrənin digər tərəfində *yeni sintez olunmuş disk onu* əvəz edir. Bu zaman RPE həmin atılmış diski öz canına çəkərək ondakı toksini neytrallaşdırır. İşığa həssas olan hüceyrələrin ağzı ona qidanı və enerjini gətirən, onun toksinlərini *zərərsizləşdir*ən RPE-yə baxmalı, impulsu ötürən sinir naqillərini ordan uzaq tutmalıdır. Çünki daim təzələnən disklər arxadan çıxa bilməz, işığı qəbul edən tərəfdən çıxır və disk ağızdan ifraz edilir, üstdəki disklər atıldıqdan sonra onların yerinə altdakı disklər keçirlər. Əgər bu hüceyrələrin ağızları işıq gələn tərəfə baxsaydı atılan disklər RPE tərəfindən götürülərək *zərərsizləşdirilməyə*cəkdi, əksinə şüşəyə bənzər cisimdə toplanaraq gələn işıqların qarşısını alacaqdı. Sinirlər şəffaf olduğu üçün gələn işıq fotonları üçün ciddi bir məhdudiyyət yaratmır. Bir sözlə gözümüzün nə üçün bu cür dizayn edilməsinə izah tapmaq mümkündür. Optimal görmə qabiliyyətinə gəldikdə isə gözün bu cür quruluşunun optimallığa mane olduğunu demək doğru deyildir. Bu bioloqlar özləri də gözlərin görmə qabiliyyətinin pis olduğunu demirlər, sadəcə olaraq daha yaxşı dizayn etmək mümkünlüyünə vurğu edirlər. Qəribədir, "daha yaxşı" etmək imkanı çox sərhədsiz bir sözdür. *Əlb*əttə ki, Krypton planetindən qonaq gəlmiş Clark Kent kimi yandırıb ərid*ən şüalar saç*an gözlərə malik olmağı kim istəməz *ki?! Bu cür düşüncə* çox

[249] H. Kolb, H. Ripps & S. Wu, "Concepts and Challenges in Retinal Biology", səh: 620; Elsevier Science, Amsterdam, 2001

*primitiv bir düşüncə*dir. H*ə*r *bir şey ehtiyaca görə dizayn edilir, bir şeyi nə* ehtiyacdan artıq, nə də ehtiyacdan az dizayn etmək optimal sayıla bilməz.

Sovetlərdən həmən sonrakı dövrü xatırlayanlar iqtisadi böhran ərəfəsində qadınların gündəlik problemlərini yada sala bilər. Onların *ən çox şikay*ət etdikləri "dərdlərdən" biri kapron corablarının tez-tez süzülməsi idi. Bu "ağır sosial hadisənin" ən böyük səbəbkarı "RAF marşrutları" idi. Yazıq qadınlarımız, nə qədər etsələr də o zəhrimara minməli idilər, kapron corab olmadan da çölə çıxmaq olmazdı. Axı sosial norma o gözəl ayaqların qismən görünməsini tələb edirdi. Bu, son əsrin fenomenidir. 1900-cu illərə qədər qadınların bacaqları uzun donların altında gizli idi, heç kim onların gözəlliyində *şübhə etmirdi. Kişil*ərə qadın bacaqlarının başqa cür dizayn edilməsi imkanını versəniz etiraz edərdilər. 1800-ci illərdə feministlər uzun don geyinməyi tənqid edərkən bunu hərəkətə mane olduğuna görə və natəmizliyə səbəb olduğuna görə tənqid edirdilər. Ona görə də *şalvar geyin*ən ilk qadınlar Birinci Dünya Müharibəsi əsnasında gözə görünəndə ictimaiyyət tərəfindən təəccüblə qarşılanmışdı. Necə də olmasa o gözəl qıçların formasını görməyə ictimaiyyət alışmamışdı. Hətta Edwards Nina'nın yazdığına görə birinci dünya müharibəsindən əvvəl əksər qadınlar bacaqlarını qırxmırdılar, bacaq tükləri cazibədar hesab olunurdu.[250] Bacaqlar günəş işığına çıxdıqdan sonra onun tükləri də eybəcər görünməyə başladı. Artıq bacaqların bu "qüsuruna" bir çarə tapmaq lazım idi və bununla da "bacaq s*ənayesi" işə düşdü. Gözə*l bacaqlar yarışması, artıq tükləri qırxmaq ehtiyacı və bu bədən üzvü ilə bağlı digər məhsulların satışı bu sənayeni o vaxtdan bu vaxta qədər həyatda saxlamağı bacarıb. Bizim bacaqlardakı gözəl dizaynı misal vermək istə*diyimizi düşünürsüzsə* xəta edirsiz. Bizim misalımız bir az əvvəl sözünü etdiyimiz corablarla bağlıdır. 1939-cu ildə *DuPont şirk*əti dünyanı neylon materialı ilə tanış etdi. Qısa bir zamanda bacaq industriyası bu materialdan qadınlar üçün gözəl neylon corablar istehsal etməyə başladı. Neylon corablar qadınların hər zaman problemi olub; tez üzülüb cırılan bu neylon corablar haqqında necə müsbət rəydə olmaq olar?! Heç bu qədər də pis dizayn ola bilərmi?! *Əgə*r belə *düşü*nürsənsə xəta edirsən, əziz oxucu! Bu tez cırılan neylon corablar çox usta bir dizaynın nəticəsidir. Amma xatırladaq ki, ilk neylon corablar çox möhkəm idi, hətta onun möhkəmliyini *nümayiş etdirm*ək üçün onları maşınları dartmaqda istifadə edirdilər. Ona görə də 1939-cu ildə *New York* şəhərində keçirilən dünya yarmarkasında bu corabları satışa çıxardıqlarında dörd gün ərzində dörd milyon cüt corab satılmışdı. Ancaq tezliklə DuPont öz "xətasını" anladı. *Əgə*r bu corablar çətin cırılacaqsa o zaman qadınların yeni corablara ehtiyacı qalmayacaq. Bu "xətanı" aradan qaldırmaq üçün

[250] Edwards Nina, "Dressed for War; Uniform, Civilian Clothing and Trappings, 1914-1918", səh: 93; I.B. Taurius & Co Ltd, 2015, New York

şirkətin kimya mühəndislərinə materiala xüsusi zəiflik əlavə etməyi tapşırırlar. 1950-ci illərdə möhkəmliyi ilə reklam edilən naylon corablar artıq 1960-cı illərdən sonra rahatlıqla cırılırdı.[251] Burada oxucunu bu sual üzərində düşünməyə dəvət edirik: Bu corablara dözümsüzlüyü qəsdən əlavə edən mühəndislərin dizaynını qüsurlu adlandıra bilərikmi? Güman edirəm ki, adlandıra bilmərik, əksinə o mühəndislər onların qarşısına qoyulmuş tapşırığı mükəmməl yerinə yetiriblər və şirkətin ehtiyac duyduğu məhsulu əldə etmək üçün yaxşı bir dizayn ortaya qoyublar. Bəli, qadınlar üçün bu dizayn heç də yaxşı deyildi, amma şirkətin nəzərində bu dizayn ən yaxşı dizayn idi. İnsan dizaynını da dəyərləndirərkən bu cür baxmağımız lazımdır. Duke universitetinin tarixçi alimi və eyni zamanda mühəndis olan Henry Petroski bunu belə ifadə edir: "Bütün dizaynlarda bir-biri ilə konfliktdə olan birdən çox məqsəd olur və buna görə də kompromisə ehtiyac yaranır. Ona görə də ən yaxşı dizayn ən yaxşı kompromisi ortaya qoyan dizayndır."[252] İdeallaşdırılmış bəzi versiyalara uyğun gəlmədiyi üçün bioloji dizaynı tənqid etmək – ki, S. J. Gould kitablarında bunu tez-tez edir – çox müftə bir üslubdur. William Dembski xatırladır ki, "dizaynerin məqsədlərini bilmədən, dizaynerin həmin məqsədlər arasında xətalı bir kompromis seçdiyini deməyə Gould'un heç bir haqqı yoxdur."[253] Əgər kimsə bizim yaşlanmağımızı, xəstələnməyimizi dizaynda qüsur kimi başa düşürsə əslində həqiqi qüsur onun anlayışında və təsəvvüründədir. Əgər Yaradıcı məqsədli şəkildə insanı xəstəliyə, yaşlaşmağa məruz olaraq yaratmaq istəyibsə bu, dizaynda qüsur yox, dizaynda kamillik sayılmalıdır, çünki Yaradıcı Öz istədiyinə tam uyğun şəkildə yaratmış olur. Gözün misalı da bunun kimidir. Allah biz insanlar üçün belə bir göz yaratmağı istəmiş və onu yaratmışdır. Tərsinə dizayna sahib qartalların və şahinlərin gözləri 3-4 km uzaqlıqdan kamuflyaja bürünmüş şikarını görməyə qadirdir. Bu heyvanlarda da gözün quruluşu insanlardakı kimidir və tərsinə dizayn onların gözlərindəki optimallığa mane olmayıb. Eyni şəkildə bayquşların qaranlıqda görmə qabiliyyətləri də digər canlılardan yaxşıdır və onların da gözlərinin quruluşu insanlardakı kimi "tərsinədir". Yaradıcının məqsədi mükəmməl göz yaratmaq deyildir, lakin xəstələnə bilən, qocaldıqca zəifləyən göz yaratmaqdır, ona görə də Onun dizaynı tam məqsədə uyğundur. "Biz insanı ən gözəl biçimdə yaratdıq. Sonra da onu ən aşağılara göndərərik." (95:4-5)

Dizayn haqqında deyilə biləcək məlumatlar çoxdur. Məktəb dərsliklərindən öyrənmişik ki, Yer kürəsinin maqnitik sahəsi (maqnitosfer) onu solar küləklərdən

---

[251] Alptekin Erkollar, "Enterprise & Business Management: A Handbook for Educators, Consultants and Practitioners", səh: 375; Tectum Verlag, Baden-Baden, 2020

[252] H. Petroski, "Invention by Design: How Engineers Get from Thought to Thing", səh: 30; Harvard University Press, Cambridge, 1996

[253] W. A. Dembski, "The Design Revolution: Answering The Toughest Questions about Intelligent Design", səh: 59; Inter Varsity Press, Downers Grove, 2004

qoruyur. Van-Allen radiasiya qalxanı adı ilə tanınan bu maqnitik kəmər olmasaydı Günəşin göndərdiyi solar küləklərdəki yüksək enerji hissəcikləri bioorqanizmləri zəhərləyərdi. Günəşdə baş verən güclü tufan Yer üzündə geomaqnitik tufanlara səbəb olur və belə tufanlarda telekommunikasiya və naviqasiya sistemləri sıradan çıxa bilir. Elektrik stansiyalarının işi də pozula bilər. 1989-cu ildə mart ayının 13-ündə Quebec şəhərində və ABŞ-ın şimal şərqində 6 milyon insanın doqquz saat işıqsız qalmasının səbəbi də məhz güclü solar küləklər olmuşdu. Zərərin yalnız bununla kifayətlənməsində biz Yer kürəsinin maqnitosfer tərəfindən himayə olunmasına borcluyuq. Həqiqətən də şanslı olduğumuzu deyə bilərik. Günəş sistemində heç bir başqa planetin bu cür güclü maqnit sahəsi yoxdur. Yer kürəsinin müdafiə mexanizmi sadəcə burada qurtarmır. Ozon qatı olaraq tanıdığımız stratosfer qatı Günəşdən gələn zərərli ultrabənövşəyi radiasiyanı udur və bununla da insanlar üçün təhlükə ola biləcək miqdarın qarşısını alır. Atmosfer özü kosmosdan gələn yad ünsürləri içinə alaraq yandırmaqla, onları kiçik parçalara bölməklə zərərlərini azaldır. Bu yaxınlarda bəzi astronomlar qurduqları simulyasiyalar nəticəsində Yupiter planetinin də Yer kürəsi üçün himayəçi rolu oynadığını elan etdilər. Onlara görə Yupiter öz həcmi ilə və bunun nəticəsində formalaşan nisbətən güclü cazibə qüvvəsi ilə ən təhlükəli asteroidləri özünə çəkir və onlara qarşı Yer kürəsi üçün qalxan funksiyasını yerinə yetirir.[254] Bir sözlə günəş sisteminin bu cür quruluşunda Yer kürəsi "ən şanslı" planet sayıla bilər.

Bir də "incə kökləmə" (fine tuning) adlandırdığımız fiziki balans mövcuddur. Başqa cür desək yaşadığımız və müşahidə etdiyimiz kainat inanılmaz bir incəliklə köklənib. Bu incəliyi biz həm kosmik masştabda, həm də atom səviyyəsində görə bilirik. Karbon rezonansı və güclü nüvə qüvvəsi bizə bunu sərgiləyən misallardan biridir. Hidrogen, helium, litium kimi yüngül maddələr məlum olan fiziki prinsiplər ilə izah edilə bilər, amma karbondan başlayaraq daha ağır maddələrin formalaşmasını izah etmək asan bir iş olmayıb. George Gamow 1946-cı ildə Ralph Alpher və Robert Herman ilə birlikdə apardığı araşdırmalarda bu maddələrin ilkin qaynar və sıx kainatda əmələ gəldiyini göstərməyə çalışıb.[255] Lakin sonradan öyrəndilər ki, yalnız hidrogen və helium izotoplarının formalaşması bu yolla izah edilə bilər. Yəni daha ağır maddələr nə "big-bang" adlandırdığımız kosmik genişlənmə zamanı əmələ gələ bilməzdi, nə də adi ulduzların daxilindəki enerji bu maddələri formalaşdırmaq üçün kifayət qədər güclü deyildi.[256] 1950-ci ildə elm aləmində helium ilə karbon arasındakı bu boşluq hələ

---

[254] Stuart Ross Taylor, "Destiny or Chance: Our Solar System and Its Place in The Cosmos", səh: 71; Cambridge University Press, Cambridge, 2000

[255] Helge Kragh & Malcolm Longair, "The Oxford Handbook of The History of Modern Cosmology", səh: 213-215; Oxford University Press, New York, 2019

[256] Tom Yulsman, "Origins: The Quest for Our Cosmic Roots", səh: 66-67; CRC Press, Florida, 2002

də doldurulmamışdı. 1951-ci ildə eston-irlandiyalı astrofizik Ernst Öpik bunun nəhəng qırmızı ulduzlarda baş verə biləcəyini sübut etdi. Amma onun çalışması az tanınmış bir jurnalda dərc edildiyi üçün elm dünyasında ciddi bir təsirə səbəb olmadı, astrofiziklərin çoxu bu çalışmadan xəbərsiz idi.[257] Digər tərəfdən Öpik'in çalışmasından xəbərsiz olan avstriyalı Edwin Salpeter daha təfsilatlı bir çalışma ilə eyni nəticəyə gəldiyində bu sirrin çözülməsi yolunda ümid işığı görünməyə başladı. Bu alimlər karbon 12-nin əmələ gəlməsini üç alfa hissəciyinin, yəni üç helium molekulunun birləşməsi ilə mümkün ola biləcəyini deyirdilər. Belə *bir şey iki* addımda mümkün olacaqdı; ilk əvvəl iki helium atomu birləşərək berillium elementi əmələ gələcəkdi və daha sonra berillium ilə *bir başqa helium birləşər*ək karbonu əmələ gətirəcəkdi. Berillium qeyri stabil nüvəyə malik idi və əmələ gəldikdən sonra tez parçalanırdı. Hesablamalar göstərirdi ki, qırmızı nəhənglərin mərkəzində olan enerji berillium-8 nüvəsinin qısa müddətə də olsa əmələ gəlməsinə imkan verirdi. Lakin berillium əmələ gələrkən eyni zamanda, eyni anda digər helium hissəciyi ilə reaksiyaya girməzsə karbonun əmələ gəlməsi mümkün deyildi. Belə bir sürətli reaksiya üçün eksperimentlərin göstərdikləri enerji səviyyələri məlum deyildi.[258] Məlum olan enerji səviyyələri ilə mümkün olan reaksiya sürəti ilə kainatda *müşahidə* olunan miqdarda karbonun əmələ gəlməsi heç cür mümkün deyildi. Üstəlik hesablamalara görə bilinən rezonanslarda əmələ gələn karbon tez əldən çıxır və daha bir helium ilə birləşərək oksigen əmələ gətirirdi. Bu, altından xətt çəkərək qeyd edirik ki, bilinən rezonanslar haqqında idi. Əgər proses belə olubsa o zaman nə üçün kainatda bu gün bu qədər karbon mövcuddur? Karbonun təbiətdə inanılmaz dərəcədə çoxluğu tələb edirdi ki, üç helium hissəciyinin birləşməsi ilə əmələ gələn karbon qalıcı olmalı və əldən çıxaraq oksigenə çevrilməməli idi. Fred Hoyle bu problemlə məşğul olarkən belə bir nəticəyə gəlir ki, karbonun bu cür əmələ gəlməsinin yeganə yolu onun rezonansının 7,65 MeV səviyyəsində olması ilə mümkündür. Əgər kainatda bu qədər karbon varsa mütləq bu səviyyədəki rezonansının olması lazımdır. Əgər bir az çox olsaydı və ya bir az olsaydı kainatda bu miqdarda karbon ola bilməyəcəkdi və karbon həyatın əsasını təşkil etdiyi üçün bu rezonansın olması zəruri idi. Hoyle deyir: "Mən mövcudam, deməli karbon-12 nüvəsi mütləq 7.65 meqaelektronvolt enerji səviyyəsinə malik olmalıdır."[259] Bu, antropik prinsipə əsasən *edilmiş ilk elmi proqnoz idi.* Amma o dövrdə heç kim eksperiment ilə karbonun bu rezonansını göstərə bilmə*mişdi. Xoşb*əxtlikdən bir il müddətində Hoyle'un təşəbbüsü ilə amerikalı eksperimentalist Willy Fowler komandası ilə birlikdə karbon-12 üçün belə bir enerji səviyyəsinin

---

[257] Mario Livio, "Brilliant Blunders: From Darwin to Einstein", səh: 171; Simon & Schuster, New York, 2013
[258] Eyni mənbə: 171-172
[259] Günther Hasinger, "Astronomy's Limitless Journey: A Guide to Understanding The Universe", səh: 54; University of Hawai'i Press, Honolulu, 2015

olduğunu göstərə bildi. Əgər karbon yalnız bu enerji səviyyəsində həyat üçün lazım *olan miqdarda formalaşa bi*lirsə o zaman belə bir rezonansın mövcud olmasında biz inanılmaz dərəcədə şanslıyıq. Günther Hasinger qeyd edir ki, "bu, bəzi astrofizikləri fizika qanunlarının arxasında ağıla əsaslanan bir planın olmasına iqna edə bildi."[260] Hətta Hoyle ilk dəfə bu iddiasının doğruluğunu yoxlamaq üçün Fowler'in yanına gəldikdə sonuncusu buna skeptik yanaşmışdı və The Guardian qəzetinin yazdığı məqaləyə əsasən "Fowler üçün bu qeyri-adi məntiq elmdən çox din qoxurdu."[261]

İncə köklәmənin ən aşkar misalları rəqəmlərdə görünür. Alimlər bu nəticəyə gəliblər ki, qalaktikalar və *ulduzlardan tutmuş subatomik hiss*əciklərə qədər hər bir *şey*, kainatın quruluşunun özü, fundamental sabit vahidlər və rəqəmlərdən asılıdır. Bu rəqəmlər o qədər incəliklə və dəqiqliklə tənzimlənib ki, onların birində xəfif d*əyişiklik baş ver*ərsə həyat imkansız olacaq; ulduzlar, planetlər, kimyəvi elementlər mövcud olmayacaq. Misal üçün cazibəni nəzərdən keçirək. Cazibənin gücünü müəyyən edən cazibə konstantı ($6.67408\mathrm{x}10^{-11}$ $m^3kg^{-1}s^{-2}$) var və əgər bu konstant $1/10^{60}$ miqdarında d*əyişikliy*ə uğrasa bizim heç birimiz həyatda mövcud olmayacaqdıq və bu sualları müzakirə etmək imkanımız olmayacaqdı. Bunun nə qədər kiçik, nə qədər dar bir yerdə durduğunu təsəvvür etmək üçün bədənimizdəki hüceyrələrin sayının təxminən $10^{14}$ miqdarında olduğunu düşün! Astrofizik Paul Davies bunu belə ifadə edir: "Əgər cazibə qüvvəsi xəfifcə az olsaydı və ya elektromaqnitizm xəfifcə daha güclü olsaydı, (və ya elektronlar protonlara nisbətən xəfifcə daha ağır olsaydı) bütün ulduzlar qırmızı cırtdanlara çevrilərdilər. Mütənasib olaraq əks tərəfə xəfifcə dəyişiklik olsaydı onlar mavi nəhənglərə çevrilərdilər."[262] O zaman kainat elə sürətlə *genişl*ənəcəkdi ki, ulduzların formalaşması imkansız olacaqdı və əksi olsaydı *genişl*ənmək istəyən kainat yenidən sıxılıb çökəcəkdi. Hər iki halda da ulduzlar, planetlər, kimyəvi elementlər, beləliklə də həyat mövcud olmayacaqdı. Bundan da incə köklәmə kosmoloji konstant adlandırdığımız rəqəmdir və bu konstant əslində anti-cazibə rolunu oynayır. Einstein'in cazibə düsturundakı kosmoloji konstant maddədən təmizl*ənmiş m*əkanda, yəni vakuumda enerjinin sıxlığını təmsil edir. Əgər bir həcmi bütün fiziki hissəciklərdən azad etdikdən sonra orada qalan enerji miqdarını bu sıxlığa bərabər etsək görəcəyik ki, alınan nəticə *mü*şahidə olunan reallıqdan inanılmaz dərəcədə böyükdür. Rəqəmlə ifadə etsək reallıqda müşahidə olunan enerji sıxlığının kvantum fizikasının tələblərinə görə teoretik enerji sıxlığına nisbəti $1/10^{120}$ nisbətinə bərab*ərdir. Düşün ki, kosmoloji konstant t*əqribən $1\mathrm{x}10^{-120}$-yə bərabərdir, yəni bu, sıfıra yaxın bir rəqəmdir. Bu qədər incəliyin təsadüf olduğunu

---

[260] Eyni mənbə: səh: 54-55;

[261] Marcus Chown, "*Open Minds Reap Rewards*", The Guardian, 13 mart, 2003

[262] P. Davies, "The Accidental Universe", səh: 73; Cambridge University Press, Cambridge, 1984

söyləmək belə ən inadkar ateistlərə belə ağır gəlir. Məşhur astrofizik Stephen Hawking bunu növbəti sözləri ilə ifadə edir: "Bizim kainat və onun qanunları həm bizi təmin etmək üçün "dərzi tərəfindən biçilmiş" kimidir və həm də - bizim mövcud olmağımız halında – dəyişikliyə çox az yer qoyacaq şəkildədir. Bunu izah etmək asan deyildir və "nə üçün bu belədir?" şəklində səslənən təbii sualı ortaya atır..."[263]

"Collision" adlı sənədli filmin sonunda göstərilən kadrlarda Christopher Hitchens öz debat yoldaşı ilə birlikdə maşında arxa oturacaqda maraqlı bir söhbətə başlayır: "Şübhəsiz ki, hansısa bir məqamda bizim hamımızdan soruşurlar ki, qarşı tərəfdən qarşılaşdığın ən yaxşı arqument hansıdır? Düşünürəm ki, bizim hamımız ən maraq doğurucu arqument olaraq burada "incə kökləmə" (fine-tuning) arqumentini seçir... Bəli, incə kökləmə... Bir dərəcə, bir tük qədər fərqli olsaydı heç bir şey olmayacaqdı. Bu, yenə də dizaynı sübut etməsə də, yenə də Dizaynerin olduğunu sübut etməsə də.. Allah olmadan da incə kökləmə baş verə bilər...Yenə də bir müddət bunun üzərində düşünməli olursan, üzərində çalışmalı olursan. Dəyərsiz bir arqument deyildir. Biz hamımız bunu deyirik." Çox maraqlıdır ki, bu sənədli filmdə incə kökləmə arqumentinə dəyər verən Hitchens dizayn haqqında danışarkən heç bir yerdə ona toxunmur. Yazıq William Paley'ni hədəfə almaq çox asandır, necə də olmasa bir diri insan yüz ölüyə qalib gələ bilər. Hitchens həmçinin bu "incə kökləmənin" dizayna dəlalət etməkdə necə uğursuz olduğunu da izah etmir.

[263] Hawking, Mlodinow, "The Grand Design", səh: 164;

## DİZAYN VƏ MÜASİR ELM

*“Əqlin gücünə inanaraq yaşamış alim üçün hekayə pis bir yuxu kimi qurtarır. O, cahillik dağını dırmaşıb çıxır və o dağın ən hündür zirvəsini fəth etmək üzrədir; özünü ən sonuncu qayanın üstündən dartıb aşırdıqda, orada artıq əsrlər boyunca oturmuş teoloqlar tərəfindən salamla qarşılanır.”*

Robert Jastrow

İyirminci əsrin əvvəllərində alimlər bütün kosmosun yalnız Süd Yolu kəhkəşanından ibarət olduğuna inanırdılar. Bütün kosmosun mərkəzində bizim qalaktikanın durduğunu iddia edən qalaktosentrik təsəvvür 1920-ci ilə qədər davam etdi. Hətta dahi Albert Einstein 1916-cı ildə özünün ümumi nisbilik nəzəriyyəsini nə*şr etdikdə* kainatın yalnız Süd Yolu qalaktikasından ibarət olduğuna inanırdı. O, həmçinin bu vaxt inanırdı ki, kainat əzəlidir və heç bir başlanğıcı yoxdur. Edwin Hubble'ın kosmik müşahidələri bu təsəvvürün xətalı olduğunu sübut etdi.[264]

Müasir biliklər ilə *keçmişin t*əsəvvüründəki məhdudiyyətlərə cavab vermək çətin *bir iş deyildir,* çətin olan müasir biliklər ilə müasir dövrün təsəvvürünə cavab verməkdir. Hitchens'dəki bu “qələbə” xəyalı son iki əsrin dinsizlərində hakim olan bir haldır. On doqquzuncu əsrdəki pozitivizm ruhunda təbiət elmlərinin izah edici gücündə *heç bir* şəkk yox idi. Charles Darwin öz nəzəriyyəsini irəli sürdükdən sonra ateistlər din üzərində qələbə çalındığını güman etməyə başladılar. Maddənin əzəli olduğuna inanan materialistlər Yer üzündə həyatın əmələ gəlməsi sirrinin cavabının təkamül nəzəriyyəsində olduğuna inanırdılar. Darvinizmin cavab verə bilmədiyi suallara illər keçdikcə cavabların tapılacağına şəkk etmirdilər. Əgər elmin izah edə bilm*ədiyi boşluqlar var idisə* onların dolması zaman məsələsi olaraq görülürdü. Belə bir atmosferdə ateistlər dindarların tanrısını bu boşluqlara sıxışdırdıqlarını deyirdilər və istehza ilə möminlərin inandıqları ilahı “boşluqların tanrısı” adlandırırdılar. Hələ günümüzə qədər bu ad ateistlərin sevimli ifadələrindən biri olaraq qalır. Allaha inanan əksər insanlar bu “boşluqların tanrısına” iman etmirlər. Onlara görə Allah hər bir şeyin tanrısıdır və bizim üçün

[264] Mary-Jane Rubenstein, ”Worlds Without End: The Many Lives of The Universe”, səh: 142-143; Columbia University Press, New York, 2014

yalnız elmdəki boşluqları doldurmaq üçün Allaha ehtiyacımız yoxdur, elmin özünün necə dəqiq riyazi qaydalara əsasən çalışa bilməsinin yeganə izahı elə Allahdır. Allahı "boşluqların tanrısı" olaraq görənlər teistlər deyil, ateistlərdir. Lakin son əsrin elmi kəşfləri qələbə xəyalında yaşayan bu ateistləri xəyal qırıqlığına salıb. Bu məyusluğu dildə ifadə etməsələr də psixoloji olaraq onu yaşayırlar. Bu məyusluğun ilk səbəbi budur ki, azalması gözlənilən *boşluqlar* əksinə daha da artıb. Həm makro aləmdə, həm də mikro aləmdə hər *il yeni boşluq kəşf edilir.* Hər bir suala cavab tapıldıqda ən azından üç yeni sual peyda olur. Thomas Kuhn kitabının bir yerində Planck'ın radiasiya qanunu və Bohr'un atom modeli haqqında danışarkən qeyd edir ki, hər iki nəzəriyyə "həll edə bildiyindən daha çox problem ortaya çıxarmışdı."[265] Daha əvvəl atom haqqında nüvədən və ətrafında fırlanan elektrondan ibarət bir təsəvvür mövcud idisə bu gün bunun doğru olmadığını bilirik. Artıq fizikanın "elementar hissəciklər" adlandırdığı bu inşaat parçaları çoxalmaqla bu zərrəciklər ailəsinin getdikcə böyüdüyü görülür. Muon, pion, hiperon, meson, K-meson, Higgs boson, aralıq vektor bosonu, baryon, taxyon, lipton və adlarını qeyd etmədiyimiz daha bir çox fiziki hissəciklər bu ailənin yeni üzvlərinə aiddir. Hətta bəzi fiziklər bu sonu bitməyən kəşflərin qarşısında məyusluğunu ifadə ediblər. Wolfgang Pauli dostuna yazdığı bir məktubunda deyirdi: "Halhazırda fizika elmi yenə də ciddi bir çıxılmazlıq içindədir. Hər bir halda bu, mənim üçün çox çətindir və *düşünürəm ki, kaş ki, kinoda komik aktyor* olardım və ya bənzər *bir işlə* məşğul olardım, fizika haqqında heç bir şey eşitməmiş olardım."[266] Müəyyən bir hissəciyin adını soruşanda tələbəsi Leon Lederman'a müəllimi italyalı fizik Enrico Fermi belə *cavab vermişdi:* "Gənc oğlan, əgər bu hissəciklərin adlarını yadımda saxlaya bilsəydim botanist olmağı tərcih edərdim."[267] Bu hələ 1954-cü ildə olub. Ondan 10 il sonra bir məqalədə 60-70 subatomik hissəcikdən danışılırdı. Fermi'nin cavabındakı ironiyanı görməmək mümkün deyildir. Bu gün fizika hələ də ən sonuncu olaraq tapılmış hissəciklərin elementar hissəciklər olduğunu əminliklə deyə bilmir. Makro aləmdə isə big-bang'in kəşfindən bu günə qədər təsəvvürlər dəfələrlə yenidən yazılmalı olub. Bu gün astrofiziklərin ən mütəvazi etirafına görə kainatın yalnız dörd-*beş faizi müşahidə* oluna bilir. Hal-hazırda bu alimlər "qaranlıq maddə" və "qaranlıq enerji" barəsində danışırlar. "Qaranlıq" adlandırmaqlarının səbəbi isə onu görə bilməməkləri və eksperimentlər ilə mövcudluğunu sübut edə bilməməkləridir.

---

[265] Thomas S. Kuhn, "The Structure of Scientific Revolutions", səh: 154; The University of Chicago Press, Chicago, 1996

[266] Thomas S. Kuhn, "The Structure of Scientific Revolutions", səh: 83-84; The University of Chicago Press, Chicago, 1996

[267] L. M. Lederman, "The God Particle: If The Universe Is The Answer, What Is The Question?", səh: 15; Dell Publishing, New York, 1993

Xəyal qırıqlığının ikinci böyük səbəbi son kəşflərin mahiyyətidir. Təbiət elmlərindəki ən son kəşflər ateist alimlərin ürəyincə olmayıb, çünki bu kəşflər Allah inancını, səmavi kitabların iddialarını dəstəkləyir. Bunlardan ən məşhuru "big bang" hadisəsidir və bu hadisə kainatın, daha dəqiq desək məkan və zamanın başlanğıcının olduğunu göstərir. Alexander Friedman ilə birlikdə kainatın başlanğıcı olduğunu teorik olaraq göstərən katolik rahib Lemaitre'ə Cambridge universitetində dərs vermiş Sir Arthur Eddington (1882-1944) bu ideyanı bəyənmirdi; kainatın bir başlanğıcı olması fikrinə nifrət edirdi. "Təbiətin indiki nizamının bir başlanğıcı olduğunu düşünmək fəlsəfi olaraq çox çirkindir... Mən bundan həqiqi bir qurtuluş yolu tapmaq istəyirəm"[268] - Eddington deyirdi. Fəlsəfi olaraq çirkin olması ilə qəsd etdiyi, bunun ateist dünya görüşünə uyğun olmamasıdır. Eyni dünya görüşünə sahib olan John Maddox, Fred Hoyle da bu fikri tamamilə rədd edirdilər. Onların sözləri ilə kitabımızın başqa yerində tanış olduq. Helge Kragh yazır: "Ateist Bonnor big-bang teoriyasını inkar edərkən əsasən Hoyle ilə eyni səbəblərə görə inkar edirdi; bu səbəblərin arasında (teoriyanın) ilahi yaradılışa dəstək verməsi də keçir."[269] Kitabın sonunda[270] qeydlərin birində Helge yazır ki, Bonnor'dan aldığı məktubda onun big-bang nəzəriyyəsini ateist qənaətindən çıxış edərək rədd etdiyini etiraf edir. William Bonnor (1920-2015) akademik karyerasının əsas hissəsini London universitetində riyaziyyat üzrə professor olaraq keçirmiş olsa da astrofizika, kosmologiya, ümumi nisbilik nəzəriyyəsi sahələrində araşdırmaları ilə daha çox tanınır. O, kitabında big bang haqqında deyir: "Bunun arxasında duran motiv əlbəttə ki, Tanrını bir yaradıcı olaraq ortaya çıxarmaqdır. Bu (nəzəriyyə), on yeddinci əsrdə elmin rasional insanların beyinlərindən dini kənarlaşdırmağa başladığı zamandan bəri xristian teologiyasının gözlədikləri bir fürsət kimi görünür."[271] Stephen Hawking bu barədə yazır: " Çox insan vaxtın başlanğıcının olması ideyasını sevmir, çünki bundan ilahi müdaxilə qoxusu gəlir. (Digər tərəfdən katolik kilsəsi big bang modelini dərhal qəbul etdi və 1951-ci ildə onun Bibliyaya müvafiq olduğunu elan etdi.) Buna görə də big bang hadisəsinin baş verməsi nəticəsindən qurtulmaq üçün bir neçə cəhdlər oldu. Ən geniş dəstəyi qazanan təklif "sabit hal teoriyası" (steady state) adlanırdı. Bu, 1948-ci ildə Nazi Almaniyası tərəfindən işğalda olan Avstriyadan qaçmış iki nəfər, Hermann Bondi və Thomas Gold və bir də müharibə ərəfəsində radarların inkişafı üzərində onlarla birlikdə

[268] Sir Arthur Eddington, "The End of The World: From the Standpoint of Mathematical Physics", səh: 450; Nature, 127, 1930

[269] Kragh Helge, "Cosmology and Controversy: The Historical Development of Two Theories of the Universe", səh: 259; Princeton University Press, 1999, Princeton, New Jersey

[270] Eyni mənbə: səh: 431

[271] W. B. Bonnor, "The Mystery of The Expanding Universe", səh: 117; Macmillan, New York, 1964

çalışmış britaniyalı Fred Hoyle tərəfindən irə*li sürülmüşdü*… Big bang hadisəsinin *baş verm*əsi, beləliklə də zamanın başlanğıcının olması nəticəsindən qurtulmaq üçün daha bir c*əhd iki rus alimi, Yevqeni Lifşiç və* İsak Xalatnikov tərəfindən oldu. Onlara görə big bang yalnız Friedmann modelinə xas bir xüsusiyyət ola bilərdi…"[272] Hawking'in sözlərindən də anlaşıldığı kimi kainatın başlanğıcının olması fikrinə qarşı ateist alimlər arasında ciddi bir müqavimət var idi. Onlar illərlə yeni modellər, yeni nəzəriyyələr üzərində çalışırdılar ki, bu başlanğıcın olmadığını sübut etsinlər. Nə üçün? Bu qədər əziyyət çəkməyin mənası nədir ki? Əgər bunu sırf Allahı inkar etmək üçün edirlərsə təbiət elmlərini öyrənən alimlərin necə qərəzsiz olduqlarını söyləyə bilərik? Axı onlar "dəlil bizi hara götürürsə biz ora gedirik" prinsipinin ən sadiq dostları olmalı deyildilərmi? Həqiqət budur ki, ateistlər sadəcə olaraq dəlil çatışmamazlığına görə Allahı inkar etmirlər, onlar Allahın varlığı ideyasını ümumiyyətlə sevmirlər. Dinsiz alımlər haqqında formalaşmış qərəzsiz və tərəfsiz bir araşdırma əzmi təsəvvürü doğru deyildir. Michael Polanyi bu həqiqəti belə ifadə edir: "Elmdə k*əşf prosesində yeni müşahid*ələrin və eksperimentlərin rolu adət*ən şişirdilir. Heç bir n*əzəriyyənin leyhinə qərəzli olmadan, səbrlə *müşahidə* məlumatları toplayan və nəticədə yeni böyük bir ümumi nəzəriyyəni isbat etməyə nail olan alim haqqında formalaşmış populyar obraz çox xətalıdır."[273]

Hawking özü də bu "yaradılış" fikrini sevməyənlərdən idi. Ona görə də kitabında özünün təklif etdiyi dünya modelini rədd etm*ək üçün başqa bir ideya* təklif edir. Hawking qeyd edir ki, Evklid həndəsəsinə görə məkanın üç boyutu olduğu üçün müasir nəzəriyyələrdə məkan-zaman (space-time) sturukturu ümumilikdə dörd boyut olmalıdır. Buradakı dördüncü boyut zamana aiddir, çünki zaman bir xətt üzərində təs*əvvür olunur; onun keçmişi və* gələcəyi yalnız bir xətt üzərində *inkişaf edir.* Hawking buna görə də etiraf edir ki, "real məkan-zamana əsaslanmış klassik cazibə teoriyasına görə kainatın davranışı üçün yalnız iki variant vardır; ya əzəli müddətdə mövcud olub və ya məhdud bir müdd*ət keçmişdə* "singularity" (adlandırdığımız fiziki vəziyyət)də başlanğıcı olub." Singularity bu gün əksər astrofiziklərin qəbul etdiyi teoretik bir vəziyyətdir ki, orada kainatın başlanğıcı sıfır nöqtədə, sonsuz sıxlıqda, sonsuz istilikdə mövcud olub. Big bang nəzəriyyəsi kainatın əzəli bir vaxtda mövcud olmasının imkansız olduğunu göstərib, ona görə də qarşımızdakı bu iki alternativdən yalnız ikincisi son elmi k*əşflər* tərəfindən dəstək qazanıb. Vaxt və beləliklə də kainat əzəli deyildir. Hawking özü kitabında qeyd edir ki, Roger Penrose'un ulduzlar üçün təklif etdiyi riyazi modelini tərs qaydada kainata tətbiq edərək "singularity" adlanan teoretik

---

[272] Stephen Hawking, "A Brief History of Time", səh: 46; Bantam Books, New York, 1988

[273] M. Polanyi, "Science, Faith and Society", səh: 28; The University of Chicago Press, Chicago, 1964

vəziyyətin mövcudluğunu özü təklif edib və fiziklər tərəfindən qəbul edilib. Daha sonra Hawking'in həyatında çox maraqlı bir *tendens müşahidə* olunur; o özü bu singularity adlandırdığımız, tamamilə teoretik olan vəziyyətdən qurtulmaq istəyir və bu məqsəd ilə yeni ideyaları araşdırır və yeni bir təklif irəli sürür. Bəlkə zaman bir boyutdan, yəni bir ölçüdən ibarət deyildir, bəlkə də zaman da məkan kimi üç boyutdan mütəşəkkildir. Bu təqdirdə zamanın mütləq başlanğıcının olduğunu söyləmək mümkün olmayacaq. Bu halda - Hawking'ə görə - "elmin qanunlarının çökdüyü heç bir singularity olmayacaq və zaman-məkanın ucu-bucağı olmayacaq ki, bunu izah etmək üçün Allaha və ya məkan-*zamana hüdud* şərtləri qoymaq üçün yeni bir qanuna ehtiyac qalmayacaq."[274] Maraqlıdır, deyilmi? Hawking özü belə ilahi müdaxilə "qoxusundan" qurtulmaq üçün yollar axtarırdı. Çox təəssüf ki, bu kimi hallarda elmi nəzəriyyələri qabağı aparan qüvvə həqiqətləri kə*şf etmə*k istəyi deyil, Allahsız dünya təsəvvürünü doğru çıxarmaq istəyidir. O özü də bunu etiraf edir və bu sözlərindən bir neçə sətr sonra deyir: "Mən vurğulamaq istərdim ki, zaman və məkanın "hüdudsuz" məhdud olması ideyası sadəcə bir təklifdir; bu, başqa hansısa bir prinsipdən deduksiya yolu ilə çıxarıla bilməz. İstənilən digər elmi teoriya kimi bu teoriya da aestetik və ya metafizik səbəblərə görə irəli sürülə bilər, amma həqiqi sınaq onun müşahidələrlə razılaşa bilən proqnozlar verə bilib bilməməsindədir." Hansısa aestetik və ya metafizik səbəb burda nə ola bilər? Metafizik səbəbin nə olmasına gəldikdə bunun cavabı aşkardır. Özü bu metafizik səbəbi belə izah edir: "Məkan və zamanın hüdudsuz qapalı səth əmələ gətirməsi ideyasının kainatın işlərində Allahın rolu ilə bağlı çox dərin nəticələri vardır. Hadisələri izah etməkdə elmi teoriyaların uğuru ilə insanların çoxu belə bir inanca gəliblər ki, Allah kainatın qanunlar sistemin*ə müvafiq* şəkildə təkamül etməsinə izn verir və bu qanunları pozmaq üçün kainata müdaxilə etmir. Fəqət qanunlar bizə "kainat ilk əmələ gəlməyə başladıqda necə olmalı idi" sualına cavab vermir və saatın mexanizmini sazlamaq və onu necə başlatmağa qərar vermək yenə də Allahın işi olaraq qalacaq. Kainat bir başlanğıca malik olduğu müddətdə onun bir yaradıcısının olduğunu güman edə bilərik. Amma kainat əgər tamamilə özü-özünü təmin edəcək haldadırsa, hüdudsuz və ucsuz-bucaqsızdırsa o zaman onun nə başlanğıcı, nə də sonu olmayacaq; sadəcə olaraq olacaq. Bu halda "yaradıcıya" nə ehtiyac qalır ki?!"[275] Sitatın sonu.[276] Hawking dönə-dönə, gizlətmədən öz oxucusuna çatdırmaq istəyir ki, yeni nəzəriyyənin ovuna çıxmasının səbəbi elmin

---

[274] Stephen Hawking, "A Brief History of Time", səh: 136; Bantam Books, New York, 1988
[275] Eyni mənbə: səh: 140-141
[276] Hüdudsuz məhdud səthin misalı kürə ola bilər. Çünki kürənin başlanğıcı və sonu olmur, yəni hansısa bir nöqtəni göstərib onun kürənin başlanğıcı olduğunu demək mümkün deyildir. Hüdudsuz deyildikdə bu qəsd olunur, amma kürənin səthi məhduddur. "Hüdudsuz məhdud səth" deyildikdə bunu təsəvvür edin.

kəşf *etdiyi* ən son modeldəki Yaradıcı qüvvəyə olan ehtiyacdan qurtulmaq əzmidir. Bəli, onun irəli sürdüyü nəzəriyyənin metafizik səbəbləri məhz budur.

Mavi ekranlara son illərdə çıxmış “A Theory of Everything” (Hə*r Şeyin* Nəzəriyyəsi) filmi Stephen Hawking’in həyatı haqqında danışır. Film ümumilikdə kosmologiya barəsində çəkilməsə də orada iki kainat modeli və onların teoloji nəticələri haqqında mövzular yer alır. İlk model, standart Big Bang modelidir, ikinci model isə Hawking’in California universitetinin professoru James Hartle ilə birlikdə hazırladıqları ”hüdudsuz məkan-zaman” modelidir. Hawking ömrünün önəmli bir hissəsini birinci model üçün sərf edib, filmdə də bu kəş*fl*ərin gətirib çıxardığı nəticələrə açıq işarələr edilir. Bir yerdə sevdiyi və daha sonra evləndiyi qız Jane ilə onun arasında keçən dialoq çox maraqlıdır:

Jane: Məgər möhtəşəm deyilmi? Bu poeziyadır…
Stephen: Hmmm… Bu, qara deşik teoriyasıdır.
Jane: Zaman müəyyən bir nöqtədə başlayıb… orada Yaradılış anı olub.
Stephen: … bəli..
Jane: … Bu, Allahın işidir!
Stephen: Məncə sən tənliklərin mənə aid olduğunu görəcəksən.. amma.. dediyində məntiq var!

Bu dialoqun ateist fiziklərin, bioloqların, kosmoloqların beynində canlandığını təsəvvür etmək olar. Çoxları bu sualı özünə verir, amma ateizmin də bir ideologiya olduğunu xatırlayaraq deyə bilərik ki, ateist beyni bu fikirdən qurtulmağın yolları üçün çalışır. Filmdə *bir başqa yerdə* yeni bir dialoq diqqətimizi çəkir və bu səfər söhbətə onların dostları Jonathan qoşulur:

Jane: Stephen U-döngəsi edib. Yeni böyük ideya budur ki, kainatın tamamilə heç bir hüdudu yoxdur. Heç bir hüdud… heç bir başlanğıc…
Jonathan: .. və heç bir tanrı. Oh.. başa düşürəm. Mən elə *düşünürdüm ki, s*ən kainatın başlanğıcının olduğunu artıq sübut etmisən və beləliklə də yaradıcıya bir ehtiyac vardır. Deməli x*əta etmiş*əm.
Stephen: Xeyr… (xəta) mənimdir.
Jane: Stephen kainatdakı bütün qüvvələri izah edəcək yeganə nəzəriyyəni axtarır. Beləliklə də tanrı ölməlidir.
Jonathan: Hmm… Tanrı niyə ölm*əlidir ki? Başa düşmür*əm.

Jonathan’ın sualına cavabı biz verməli olsaq deyərik ki, ateistlərin, dinsizlərin *dünya görüşündə* Tanrı sevilməyən bir varlıq olduğu üçün öldürülməlidir. Hawking və ya ondan savayı başqa ateist elm adamı metafizik səbəblərdən motivlənərək kosmologiyanı öyrənməyə çalışırlar və görmək istədikləri yalnız və yalnız allahsız bir kosmosdur. Bütün bu müzakirələrin hamısı kosmologiya ilə yanaşı həm də fəlsəfi müzakirələrdir. Bununla belə Hawking’in ”The Grand Design” kitabında

"*ənənəvi olaraq bunlar fəlsəfəyə aid suallardır, amma fəlsəfə artıq ölüb*"[277] deməsi tamamilə ziddiyyətlidir. Hawking'in öldüyündən əminik, amma fəlsəfə hələ də yaşayır.

Hawking'in rus fiziklərindən gətirdiyi misallara baxsaq maraqlı bir halı müşahidə edərik və görərik ki, big-bang nəzəriyyəsinə ən çox etiraz edənlər rus fizikləri olublar. Ateist-kommunist ideologiyasına bağlı olan dövlət rahatlıqla bu fikri qəbul etmək istəmirdi. "Qismən Engels'in "sonluğu olan məkan və zaman" fikrinə qarşı müxalifətinə görə və (həmçinin) bu konseptlər uzun zamandan bəri idealizm, ruhanilik, burjuaziya ilə əlaqələndirildiyinə görə "sonsuz məkan və zaman" iyirminci əsrin dialektik materializminin bir hissəsinə çevrildi və beləliklə də *kommunist dünya görüşündə* rəsmi doktrina statusu qazandı. 1930-cu illərin sonlarında elan edilmiş Sovet kommunizminin ideologiyasına əsasən tədricən azalmaqda olan istilik, bu səbəblə məhdud zamana sahib kosmoloji modellərin hamısı – onların daşıdığı teistik mənaya görə - rədd olunmalı idi."[278] Helge Kragh o dövrün kommunist müxalifətini bu cür təsvir edir. Andrey Jdanov'un – Stalinin əsas ideologiya və propaqanda nazirinin - 1947-ci ildəki çıxışına müraciət edir. Qeyd edir ki, o çıxışında Jdanov kainatın big-bang' hadisəsindən başladığını nəzəri olaraq göstərən Lemaitre və onun həmfikirlərini "*elmi saxtalaşdıranlar*" adlandırır. Eyni ildə bir başqa çıxışında Edington, Milne və Einstein'in həmfikirlərini sərt tənqid edir. Hətta sovet fiziki Boris Hessen kvant fizikasını və ümumi nisbiliyi dəstəklədiyi üçün hökumət tərəfdarı ideoloqların qəzəbinə *tuş gəlmişdi və* 1936-cı ildə həbs olunaraq "terrorizm" ittihamı ilə güllələ*nmişdi.*[279] Sözümüzün məğzi budur ki, müasir tarixdə *edilmiş* ən böyük elmi kəş*flə*r materializmin əsasını sarsıdıb; artıq materiyanın əzəli olduğuna inanmaq əvvəlki kimi sevilən bir mövqe deyildir və müasir təbiət elmləri tərəfindən dəstək görmür.

Biologiyada big-bang kəş*finin ekvivalenti* bəlkə də DNT molekulunun kəş*fidir.* Bu kompleks molekul insan orqanizminin məlumat bankıdır. Məhz bu və buna bənzər kəş*flə*r Antony Flew kimi iyirminci əsrin ən görkəmli ateist filosoflarından birini fikrindən döndərdi. On doqquzuncu əsrin hüceyrələr haqqındakı sadə təsəvvürü ateist olmaq istəyənlər üçün insan orqanizminin formalaşması üçün asan bir izah idi. *Amma tibb elmi inkişaf etdikcə* hüceyrələrdəki mürəkkə*b quruluşlar,* inanılmaz nizam ortaya çıxdı və 1953-cü ildə DNT molekulunun strukturu da *dünyaya nümayiş etdirildi. B*əzi ateist alimlər də bu cür kəş*flə*rdən sonra abiogenesis'in dizaynsız bir proses olduğunu inkar etməyə başladılar. Fred Hoyle

[277] S. Hawking, L. Mlodinov, "The Grand Design", səh: 5; Bantam Books, 2010, New York
[278] Kragh Helge, "Cosmology and Controversy: The Historical Development of Two Theories of the Universe", səh: 223; Princeton University Press, 1999, Princeton, New Jersey
[279] Brett D. Steele & Tamera Dorland, "The Heirs of Archimedes: Science and The Art of War Through The Age of Enlightment", səh: 7; The MIT Press, Massachusetts, 2005

bunu belə ifadə edirdi ki, "amino turşuların təsadüfən bir araya gələrək tək bir çalışan proteini əmələ gətirməsi ulduzlar sistemini doldurmuş kor adamların eyni zamanda rubik kubunu çözməsi ilə eynidir."[280] Belə bir misal *bunun baş* verməsinin necə imkansız olduğunu göstərirdi. Fred Hoyle yenə də Allaha inanmasa da həyatın Yer kürəsindən kənardan gəldiyinə inanırdı. *Əslində* bu Big Bang hadisəsi sadəcə bir dəfə olmayıb, lakin dəfələrlə təkrarlanıb. Bildiyimiz mə*şhur Big Bang ilə* bir heçdən bütün kainat əmələ gəlib; Məkan və Zaman "bacıları" mövcudiyyətə qədəm qoyublar. Təbiət fəlsəfəsində heçdən hər hansı bir *şey ə*mələ gələ bilməz, ona görə də bu artıq özlüyündə təbiətdən ötə bir hadisədir. Lakin bu Big Bang bizə cansız maddənin əmələ gəldiyini göstərir. Bəs cansız maddədən canlı həyat necə əmələ gəldi? Buna elmi dildə abiogenesis deyirlər. Birincisi kosmoloji big bang sayılırsa buna artıq biz bioloji big bang deyə bilərik. Bu zamana qədər ən dahi alimlər belə laboratoriyada cansız maddələrdən canlı həyat əldə edə bilməyiblər. İnanın ki, bunu dəfələrlə sınaqdan keçiriblər, bunun üçün milyardlarla dollar pullar xərclənib, amma həyat adlandıra biləcəyimiz bir varlıq əmələ gəlməyib. İtaliyalı biokimyaçı Pier Luigi Luisi ən son kitabında bunu belə dilə gətirir: "İki nəsil kimyaçılar laboratoriyada həyatı – hətta onun mümkün ola biləcək ən sadə formasında - yaratmağın şərtlərini kə*şf etm*ək üçün əmək sərf ediblər. Hələlik bizim bu zamanımıza qədər uğursuzluqla üzlə*şiblə*r..."[281] Mary Shelley tərəfindən yaradılmış Frankenstein obrazı hələ də ədəbi fantaziya olaraq qalır. Bioloji big bang bizə sadəcə canlı hüceyrənin əmələ gəldiyini xəbər verir, amma bu qədər canlı növlərin, heyvanların və insanın necə əmələ gəldiyini demir. Bunun üçün bizə üçüncü big bang lazımdır. Bu isə antropoloji big bang adlana bilər. Hətta bu big bang belə sonuncu izah olmur. Heyvanlardakı mexaniki beyindən insanların dərin təfəkkürlü, emosional intellektə sahib beyinlərinin necə əmələ gəlməsi bir başqa sualdır. Heyvanlar incəsənət əsərləri yaratmırlar, etik və estetik mühakimə yürütmürlər. Bu baxımdan insanların heyvanlar aləmindən sıçrayış etməsi ayrıca bir big bang hadisəsi olmalıdır. Buna psixoloji big bang deyə bilərik.

Amma təəssüf ki, Hitchens dizayn haqqında açdığı fəsildə "incə kökləmə", "kosmoloji dizayn" barəsində tək bir söz belə etmir. Bu barədəki araşdırmalar yeni deyildir, əksinə *yetmişinci ill*ərdən bu günə qədər haqqında xeyli material hazırlanıb. Lakin Hitchens bunların heç birinə yer vermir. Halbuki özünün etirafına görə teistlərin ən güclü arqumenti məhz "incə kökləmə" arqumentidir. Dizayn barəsində açdığı fəsildə bu mövzular haqqında danışması doğru olardı,

[280] John Engledew, "Cosmos and Man: A Scientific History", səh: 164; Algora Publishing, New York, 2018
[281] P. L. Luisi, "Essays on Life Sciences: With Related Science Fiction Stories", səh: 29; Cambridge Scholars Publishing, Newcastle, 2020

amma daha çox dindarların dini şüuru ilə istehza etməyə üstünlük verir. Sözünün əvvəlində bütün dinlərin Yaradıcı qarşısında müti olmağa çağırmağına toxunur, amma bunu istehzalı bir üslubda edir. "Duada duruş formaları adətən bəd xasiyyətli monarxın qarşısında duran niyaz verən təhkimli kəndlini bənzəridir" Hitchens deyir. Onun nəzərində dinlərin verdiyi mesaj "davamlı itaətkarlıq, şükür və qorxu" tələb edir. "Digər tərəfdən..." – Hitchens sözünə davam edir – "bunu sanki kompensasiya etməklə din insanlara özünə önəm verməyi və təşəxxüslü olmağı öyrədir. Din onları inandırır ki, tanrı onların hər biri üçün fərdi olaraq qayğıkeşdir və iddia edir ki, kosmos xüsusilə onlar üçün yaradılmışdır."[282] İngilis jurnalist bununla dini mesajda bir ziddiyyətin olduğunu oxucuya çatdırmaq istəyir. Biz onun kitabı boyunca güclü intellektual bir arqument qarşıya qoymadığını, əksinə bütün arqumentl*ərinin bu* şəkildə insanların hislərinə xitab edən arqumentlər olduğunu görürük. Burada da Hitchens "bəd xasiyyətli monarx" obrazını oxucunun beynində canlandıraraq onda neqativ hislər oyatmağa çalışır. Şübhəsiz ki, avtoritetlərindən sui-istifadə edən monarxlara qarşı insanlarda təbii nifrət hissi vardır və Allahı belə monarxlara bənzətmək xətadır. Hitchens əgər bənzətmə edərlən monarxın yerinə, övladlarını sevən, onlara qayğı göstərən və eyni zamanda özünə itaət etməyi tələb edən bir atanı misal versəydi tamamilə *başqa* bir reaksiya ortaya çıxacaqdır. Ata obrazı – nə qədər sərt olsa da, itaət tələb etsə də - qayğıkeşlik ilə bir ziddiyyət tə*şkil etmir,* əksinə *düşün*ən beyində hər iki vəsf *harmonik* şəkildə təsəvvür edilə bilər.

İnsanlar bəlkə də öz acizliklərini dərk etdikləri üçün ilahi bir himayəyə ümidli olmaqları, buna inanmaqları onlara bu həyatda yaşamağı asanlaşdırır. "Mənim dizaynımdakı bir çox nöqsanlardan biri də" – Hitchens deyir – "mənim buna inanmağa və ya arzu etməyə meyilli olmağımdır və intəhası mən də çox sayda digər insanlar kimi xəta olduğunu görə biləcək qədər təhsil sahibiyəm; mən bunun fitri bir şey olduğunu etiraf etməliyəm."[283] Özünün də ara-sıra uğura, şansa meyil etdiyini etiraf edən Hitchens bunu dizaynda xəta kimi qəbul edir. Amma bunun necə xəta olduğunu izah etmir. Əgər insanlarda fitri olaraq fövqəltəbii bir təsirə inanmaq meyli olduğunu qəsd edirsə bunun dizaynda nöqsan olduğunu demək üçün nə əsası vardır?! Əgər həqiqətən də Allah varsa və O, bizim həyatımıza istədiyi vaxt müdaxilə edirsə bu, heç də dizaynda nöqsan deyildir, lakin həqiqətə uyğun olan fitri hislərdir. *Başqa cür des*ək bunun dizaynda qüsur olduğunu sübut etmək üçün h*ər şeyd*ən əvvəl həyatımıza fövqəltəbii bir təsirin olmadığını sübut etmək lazımdır. Bu isə metafizik fəlsəfənin ən əsas suallarından biridir, bəlkə də ən əsas sualıdır. Biz insanlara xas olan qorxu hissi də fitri bir hisdir və kimlərsə

---

[282] "God is Not Great", səh: 73-74;
[283] God is Not Great, səh: 75;

tərəfindən dizaynda qüsur hesab oluna bilər, amma əslində qorxu hissi insanı təhlükədən qoruyan, riskli addımlardan çəkindirən ən böyük faktordur. Bu cür hislər dizaynda qüsur yox, əksinə məqsəddən asılı olaraq dizayn üçün tam lazımlı tərkib hissələridir.

Hitchens dizaynın olmadığını göstərmək üçün kiçikdən, böyükdən əlinə keçən hər mövzunu gülüş obyekti etməyə çalışır. "Nəticələrin əldə olunduğu proses, yavaşdır və sonsuz dərəcədə əziyyətlidir və faydasız tullantılarla dolu olan DNT "sapını" bizə verib"[284] Hitchens deyir. Bununla da bizim DNT strukturumuzun heç bir işə yaramayan artıq molekullardan ibarət olduğunu deyənlərin sözünə işarə edir. 70-ci illərdən başlayaraq alimlər bizim DNT-nin yalnız iki faizinin kodlaşdıran və protein əmələ gətirən DNT molekullarından ibarət olduğunu bilirlər. Yerdə qalmış 98 faizi isə "junk", yəni tullantı adlandırdılar və bunların funksiyasının olmadığını iddia etdilər. Bu, onlar üçün Allahsız təkamülü isbat edən bir dəlil idi. Hitchens də bu iddianı istifadə edərək hər hansı bir dizaynın olmadığını göstərməyə çalışır. Amma işin acınacaqlı tərəfi budur ki, 70-ci illərdən bəri "junk" DNT haqqındakı təsəvvür tamamilə dəyişib və bu gün alimlərin çoxu bunu "junk" (tullantı) adlandırmağı doğru hesab etmirlər. Misal üçün ENCODE layihəsi nəticəsində bu DNT-nin ən azından beşdə birinin tənzimləyici rolu oynadığı ortaya çıxdı. Artıq formalaşan yeni təsəvvür budur ki, 98 faizi təşkil edən molekullar protein istehsal etməsə də özlərinə görə funksiya daşıyırlar. Nessa Carey buna belə bir misal verir: "Bizim maşın istehsal edən fabrikamızdan buna bənzəyən ssenari belə olacaq ki, maşını yığan hər iki işçi üçün biznesi ayaqda saxlayan işlərlə məşğul olan 98 başqa işçi vardır: maliyyə toplayan, hesabat aparan, məhsulu reklam edən, təqaüdləri icra edən, tualetləri təmizləyən, maşınları satan və sair. Bu bəlkə də bizim genomda "tullantı" adlandırdığımız molekulların rolunu izah edən daha yaxşı bir modeldir… Orqanizm nə qədər mürəkkəbdirsə o qədər daha çox "tullantı" DNT-yə sahibdir. Təkamülün doğurduğu mürəkkəbliyin sirrinin "tullantı" DNT-sində ola bilməsi fikri qədər mübahisəli bir fikri yalnız indi alimlər həqiqi mənada araşdırmağa başlayıblar."[285] Dawn Field və Neil Davies bizə xəbər verirlər ki, insan genomundakı genlərin sayı hardasa iyirmi minə yaxındır. "Pomidor bitkisi və su birəsi Dafnia, insanlardan on min ədəd daha çox genə sahibdir. Görünür ki, bizdəki genlərin sayı xeyli ürküdücü olan C. Elegans soxulcanındakı qədərdir." Belə çıxır ki, bizdə protein kodlaşdıran genlərin sayı heç də canlılar iyerarxiyasında ən böyük genomu təşkil etmir. "Eukaryot növlərin arasında komplekslikdəki fərqlərinin çoxu onların genomundakı kodlaşdırmayan DNT-nin nisbətindəki fərqlərlə izah oluna bilir." Əgər insan ilə digər canlılar

[284] God is Not Great, səh: 85;
[285] Nessa Carey, "Junk DNA: A Journey Through the Dark Matter of the Genome", səh: 3-4; Columbia University Press, New York, 2015;

arasındakı komplekslik fərqlərini biz məhz “tullantı” adlandırılan DNT hissəsində görə biliriksə, o zaman bunun mütləq bir rolu olmalıdır. “John Mattick və onun həmkarları 2007-ci ildəki çalışmalarında göstərdilər ki, orqanizmlərdəki kompleksliklik onlardakı kodlaşdırmayan DNT-nin miqdarı ilə düz mütənasibdir; insanlar misal üçün soxulcanlardan daha çox kodlaşdırmayan DNT-yə sahibdir. Əlbəttə ki, məhz kodlaşdırmayan DNT-nin insanı insan edən, soxulcan etməyən hissə olması mümkündür.”[286] İşin acınacaqlı tərəfi budur ki, Hitchens kitabı *boyunca bu cür işlən*məmiş xətalı arqumentlər üzərində öz iddiasını qurur. Bu sadəcə olaraq cahillikdən çıxış edər*ək bir şeyi iddia etm*əkdir. Onun kimi ateistlər elə *düşünürlə*r ki, insan orqanizmində hansısa bir orqanın bir funksiya yerinə yetirdiyini bilmiriksə deməli o orqan rudimentardır, yəni təkamül nəticəsində öz funksiyasını itirib. Amma bu çox xətalı bir arqumentdir, çünki biz bu gün bir orqanın funksiyasının nə olduğunu bilmiriksə bu heç də onun bir funksiyasının olmadığını sübut etməz. Kor bağırsağın uzun bir müddət faydasız bir orqan olduğunu, cərrahların cibinə artıq pul gətirməkd*ən başqa bir iş*ə yaramadığını *düşünürdük, amma* ən son araşdırmalar onu göstərdi ki, kor bağırsaq bizim immun sistemimizdə əhəmiyyətli bir rol oynayır. Bu barədə professor Heather F. Smith’in tapdığı nəticələr haqqında Time jurnalı, İndependent qəzeti 2017-ci ildə məqalə dərc etdilər.[287] Hitchens eyni məzmunda insanlardakı “quyruğu” rudimentar orqan adlandırır. Bu gün təsdiqlənir ki, quyruq sümüyü oturarkən tarazlığı saxlamaq üçün əhəmiyyətlidir, üstəlik bizim çanaq bölgəmizdəki əzələlər və bağlar üçün lövbər rolunu, sinirlər üçün qalxan rolunu oynayır. İddia olunan digər orqanlar və bədən hissələri də belədir. Bizim onların rolu haqqında bu gün məlumatımızın olmaması *heç bir* şəkildə onların funksiyasız olduğunu göstərməz. Hitchens altı yaşında meyvələrin rənglərinin canlılara uyğunlaşdığını başa düşə *bilmişdi, amma bir şeyin* varlığından cahil olmağın onun yoxluğuna dəlil olmadığını başa *düş*ə bilməyib. Burada onu da əlavə etməyimiz lazımdır ki, biz bu müzakirə ilə təkamül nəzəriyyəsindəki elmi sübutları inkar etməyi nəzərdə tutmuruq. Təkamül nəzəriyyəsinin dərininə və eninə doğru haraya qədər doğru olması, haradan sonra əsassız olması müzakirəsi başqa kitabın mövzusudur. Biz təkamül nəzəriyyəsinin materialist yozumunu, xüsusilə darvinizmi tənqid edirik. Belə *bir dünya görüşü* sağlam düşüncəyə ziddir. Alman-kanadalı nevroloq və psixiatr Karl Stern bu cür materialist təsəvvür haqqında bunları deyir: “Əgər arqument xatirinə təkamül nəzəriyyəsini ən elmi xülasədə təqdim etməli olsaq belə *bir şey dem*əliyik: “Nə vaxtsa Yer kürəsindəki temperatur elə həddə gəldi ki, karbon atomlarının oksigen atomları ilə birlikdə azot-hidrogen birləşmələri ilə bir araya gəlməsi üçün ən münbit

[286] D. Field & N. Davies, “Biocode: The New Age of Genomics”, səh: 60-62; Oxford University Press, New York, 2015
[287] Amanda MacMillan, ”*Your Appendix May Not Be Useless After All*”, Time, 11 yanvar, 2017

şərait ortaya çıxdı və böyük topaların təsadüfən bir araya gəlməsi nəticəsində elə molekullar əmələ gəldi ki, həyatın başlaması üçün ən *əlverişli struktura sahib* oldular. O andan başlayaraq zamanın ucsuz-bucaqsız bir müddətini keçib geridə qoydu və sonunda təbii seçmə prosesi vasitəsi ilə elə bir varlıq əmələ gəldi ki, o, nifrət yerinə sevgini, zülm yerinə ədaləti seçməyə, Dante kimi şer yazmağa, Mozart kimi musiqi bəstələməyə və Leonardo kimi rəsm çəkməyə qadir oldu." Əlbəttə ki, kainatın bu cür əmələ gəlməsi təsəvvürü dəlilikdir. Dəlilik deyəndə də heç bir halda jarqon tərzli təhqiri qəsd etmirəm, lakin texniki mənadakı psixozu qəsd edirəm. Dünya tarixi haqqında belə bir rə*y şizofrenik düşüncə*nin bəzi aspektləri ilə ortaq xüsusiyyətlərə malikdir."[288]

Bəli. Dizaynı hə*r bir şeydə* görə bilirik. Mikroorqanizmlərdə*n tutmuş biz* insanlara qədə*r, subatomik dünyadan tutmuş ucsuz*-bucaqsız kosmosun dərinliklərinə qədər hər yerdə dizaynı müşahidə edə bilirik. Hitchens belə özünün kor ateist qənaəti ilə bunu inkar edərkən tərəddüd edir. Müasir elm bu məqamı sübut etməkdə ən effektiv alətdir və kosmologiyadakı ən son elmi k*əşflə*r əsrlər öncə teoloqların dedikləri nəticələrə gətirib çıxarıb. Bio-kimya üzrə nobel mükafatı laureatı Melvin Calvin deyir: "Mən bu inancın haradan qaynaqlandığını görməyə çalışarkən görünür ki, bunu 2000 və ya 3000 il əvvəl k*əşf edilmiş və* Qərb dünyasında ilk dəfə qədim yəhudilər tərəfində*n elan edilmiş sadə* bir təsəvvürdə tapıram: qısacası bu, kainatın hər birinin öz əyalətini öz qanunlarına görə idarə etdiyi çox sayda tanrının istəklərinin məhsulu olmaması, tək bir Tanrı tərəfindən idarə olunması təsəvvürüdür. Görünür ki, müasir elmin tarixi bünövrəsi məhz bu təkallahlıq inancıdır."[289] 1962 və 1978-ci illərin fizika üzrə Nobel mükafatı laureatı Arno Penzias deyir: "Astronomiya bizi nadir bir hadisəyə götürür; heçdən yaradılmış bir kainat, həyatın olmasına imkan tanımaq üçün tələ*b olunan* şərtləri tam dəqiqliklə təmin etməyə möhtac olan incə tarazlığa sahib bir kainat və dərin bir (buna fövqəltəbii də demək olar) plana sahib bir kainat. Beləliklə də müasir *elmin müşahidə*ləri bizi əsrlər öncənin intuisiyasının gəldiyi nəticənin eynisinə götürür."[290] Arno Penzias bu sözləri ilə etiraf edir ki, elmin ən son nailiyyətləri yaradılışa dəlalət edir. Kvantum kimyaçı Henry Schaefer yazır ki, "sonuncu elmi k*əşflə*r heçdən yaradılışa işarə edir."[291] Astronom və planetar fizika alimi Robert Jastrow etiqad baxımından aqnostik idi. O, kosmologiya sahəsində *edilmiş* ən son k*əşflə*r haqqında kiçik bir kitab yazıb və kitabın axırında bu sözləri deyir: "*Əqlin* gücünə inanaraq yaşamış alim üçün hekayə pis bir yuxu kimi qurtarır. O, cahillik

---

[288] Karl Stern, "The Flight from Woman", səh: 290; Farrar, Straus and Giroux, New York, 1965
[289] Melvin Calvin, "Chemical Evolution", səh: 258; Clarendon Press, Oxford, 1969
[290] Roy Abraham Varghese, "Cosmos, Bios, Theos", səh: 83; Open Court Publishing Company, Chicago, 1992
[291] John C. Lennox, "God's Undertaker: Has Science Buried God?", səh: 30; Lion Hudson, Oxford, 2009

dağını dırmaşıb çıxır və o dağın ən hündür zirvəsini fəth etmək üzrədir; özünü ən sonuncu qayanın üstündən dartıb aşırdıqda, orada artıq əsrlər *boyunca oturmuş* teoloqlar tərəfindən salamla qarşılanır."[292]

[292] R. Jastrow, "God and The Astronomers", səh: 116; W.W. Norton & Company, Inc. New York, 1978

## KONFLİKT TEZİSİ

*"Elmi biliklər bizə hər cür iş görməyə imkan verir. Əlbəttə ki, yaxşı işlər görürüksə bunu təkcə elmə borclu deyilik, həmçinin bizi yaxşı iş görməyə yönəldən mənəvi seçimə də borcluyuq. Elmi bilik bizə həm xeyir, həm də şər işlər görməyə imkan verən bir qüvvədir, lakin o, bizə o qüvvəni necə istifadə etməyimiz barədə bir təlimat vermir."*

Richard Feynman

Bu əsrin elmi inkişafı bizi "evtanaziya" adlı bir seçimlə tanış edib. Ölmək istəyən xəstələrə öz istəyinə nail olmaq üçün həkimlərin göstərdiyi xidmətin adına evtanaziya deyilir. 1984-cü ildə Hollandiya bunu qanunilə*şdirdi. Bu qanunu t*ənqid edənlər qeyd etdilər ki, xəstələrin istəyi ilə onları öldürən həkimlər yenə də xəstələri – onlar istəməsə belə - öldürmək üçün kifayət qədər səbəb tapa biləcəklər. Görünür ki, bu tənqidçilərin qorxduğu hal həqiqətən də *baş verib. "The Journal of Medical Ethics" hollanda x*əstəxanalardakı tətbiqatı araşdırarkən bu nəticəyə gəlir ki, 1995-ci ildə Hollandiyadakı ölümlərin üç faizi həkim xidməti ilə *baş vermiş ölüml*ərdir və bu ölümlərin dörddə *biri könüllü baş* verməyib. Həkimlər komada olan yaşlı xəstələri öldürdükdən sonra onların ailəsinə "*şübh*əsiz ki, nənəniz danışa bilsəydi bunu özü istəyərdi" izahını verməklə kifayətləniblər. Bu xəbərlərin nəticəsində çox sayda holland qocalar üzərilərində sertifikat gəzdirirlər; sertifikatda heç bir halda həkimlərinin onların öldürməsinə razılıq vermədiklərini ifadə edirlər. Bu hesabatın müəllifləri olan Henk Jochensen və John Keown onu da qeyd edirlər ki, "holland hökumətinin iddia etdiyi effektiv nəzarət heç də inandırıcı deyildir."[293]

David Berlinski bu misalı elmin və dinin arasında gedən hökmranlıq mübarizəsi məzmununda gətirir. Din və elm arasında bir ziddiyyətin, barışmaz ədavətin olduğunu iddia edənlər üçün Berlinski bir xatırlatma edir; müasir elmin insanlığın qarşısına çıxardığı müasir imkanlarda doğru qərarlar verm*ək heç bir* şəkildə elmin sahəsi deyildir. İşin bu tər*əfini düşünmə*k istəməyən ateistlər böyük həvəslə din ilə elm arasında konfliktin olmasından danışmağı sevirlər. "Tanrı Böyük Deyildir"

[293] David Berlinski, "The Devil's Delusion: Atheism and Its Scientific Pretensions", səh: 32; Basic Books, New York, 2009

kitabını vərəqlədikcə bu cizgini bir çox yerdə görürük və bundan əvvəlki səhifələrdə bunun bir çox misalı ilə tanış olmuşuq. Din ilə elm arasındakı konfliktə misal vermək istəyənlər tez-tez kilsənin arxasındakı tarix qəbiristanlığına baş vururlar. Kilsə və kilsə fəaliyyəti hər bir halda tarixdən öz tənqid payını bol bir şəkildə alıb. Bunu inkar etmək mümkün deyildir. Atalarımız haqlı olaraq deyiblər ki, yıxılan ağaca balta çalan çox olar. Avropada yıxılmış ağaclardan biri də kilsə institutu olub və son iki-üç əsrdə bu yıxılmış ağaca balta çalanlar arasında ateistlər, solçular, hətta müsəlman və yəhudilər də olub. Hətta bunun ən aşkar misallarının başlanğıcını protestant hərəkatında, daha sonra fransız inqilabı ilə gəlmiş anti-ruhanilik hərəkatında tapa bilərik. Ümumilikdə xristian tarixi, xüsusilikdə isə kilsə tarixi haqqında haqlı tənqidlərlə yanaşı çoxlu yalanlar da yazılıb. Hitchens kitabının bir yerində Cənubi Amerika coğrafiyasını "kəşf" etmiş xristian avropalıların törədiyi cinayətləri sayır və bu ərəfədə yerli xalqların, xüsusilə Maya mədəniyyətinin riyaziyyatda və astronomiyada tərəqqisinə toxunur. Maya xalqının ilk dəfə sıfır konseptini yaratdığını əlavə edir və həmən bu arada kilsəyə, beləliklə də dinə hücum çəkmək ehtiyacı hiss edir: "Qeyd edilməsi əhəmiyyətli ola bilər ki, orta əsrlərin papalığı həmişə "sıfır" fikrinə yad və bidət bir ünsür olaraq müqavimət göstərib, bəlkə də bu, həmin fikrin iddia olunduğu kimi ərəb (faktiki olaraq isə sanskrit) mənşəli olmasına görə, bəlkə də özündə qorxuducu bir ehtimal daşımasına görə idi."[294] Maraqlıdır ki, bu iddianı edən ilk və yeganə kəs Hitchens deyildir, onun kimi antiteist müəlliflərdən bir çoxu bu səfsətəni kütləviləşdirməyə çalışırlar. Kilsə tarixini cahillik tarixi, qaranlıq dövrün tarixi kimi göstərmək on doqquzuncu əsrdən başlayaraq məşhurlaşıb və Hitchens də eyni karvanın sonundakı dəvələrindən birini dartır. Həqiqət isə budur ki, burada cahilcəsinə davranan Hitchens'in özüdür və "tutar qatıq, tutmaz ayran" prinsipi ilə dəqiqləşdirmədiyi məlumatları kitabına doldurur. Çox gözəl bilir ki, oxucuların böyük əksəriyyəti bu məlumatları dəqiqləşdirmək üçün nə vaxt, nə də imkan tapa bilirlər. Qeyd etdiyimiz kimi sıfır rəqəmi ilə bağlı bu fikri ilk səsləndirən o deyildir. Həmkarı jurnalist Charles Seife sıfır haqqında "Zero: The Biography of a Dangerous Idea" (Sıfır: Təhlükəli bir Fikrin Tərcümeyi-Halı) adında bir kitab yazıb və bu kitabın mərkəzi fikri sıfrın qadağan edilməsi ətrafında dönür. Amma Hitchensin həmkarı bu iddiası üçün əsaslı tarixi bir sübut təqdim etmir. Yeni ateizmin nümayəndələrindən Peter Atkins də "Galileo's Finger" adlı əsərində bu iddiaya yer verir və kilsəni bununla ittiham edir.[295] Doğrudur ki, Avropaya ümumilikdə ərəb-hind rəqəmləri, xüsusilə də sıfır təqdim edildikdə bir çox narazılıq ortaya çıxdı. Ən böyük sıxıntılardan biri bu ərəb hərflərindən hansının hansı

---

[294] "God is Not Great", səh: 89;
[295] Peter Atkins, "Galileo's Finger: The Ten Great Ideas of Science", səh: 319; Oxford University Press, New York, 2003

rəqəmi təmsil etməsi üzərində idi. Bu günə qədər də avropalıların “sıfır” olaraq yazdıqları simvol ərəblərdə *“beş” r*əqəminə bənzəyir. Ərəblərdə sıfır isə nöqtə olaraq qeyd olunur. Müsəlmanların yanında elm öyrənmiş italiyalı riyaziyyatçı Leonardo Fibonacci (1175-1250) “Liber Abaci” kitabı ilə avropalılara ərəb rəqəmlərini öyrətdiyində onlar üçün “sıfır” ideyası çox ağır gəlirdi. İnsanlar sıfırı bir rəqəm kimi qəbul etmək istəmirdilər. Sıfır necə rəqəm ola bilər axı? Onunla *heç bir şeyi bölmə*k olmaz, amma necə *olur ki, onu bir başqa r*əqəmin yanına artırdıqda həmin rəqəm böyüyür. Birin yanına sıfır artıtsan on olur, ikinin yanına artırsan iyirmi olur. Bu fikri ilk əvvəl avropalılar dərk etməkdə çətinlik çəkirdilər. Ona görə də sıfırın tam qəbul olunması üçün uzun bir müddət keçməli idi. Bu cür qarma-qarışıqlıq üzünd*ən Florens ş*əhərinin idarəçiləri 1299-cu ildə bankirlərə, mühasiblərə ərəb rəqəmlərini istifadə etməyi qadağan etmişdilər.[296] Çünki onlar ərəb rəqəmləri ilə yazılan sənədlərdə aldatma imkanının daha asan olduğunu görürdülər. Rəqəmin sonuna bir sıfır artırmaqla tamamilə *başqa x*ərclər və ya qazanclar göstərmək mümkün idi. Ola bilsin ki, sıfırın qadağan olunması şayəsi buradan qaynaqlanır. Amma gördüyümüz kimi qadağa kils*ənin keşişlə*ri tərəfindən deyil, bankın keşişləri tərəfindən *verilmişdi*. Qısacası heç bir roma papası heç bir zaman dini motivlərə əsasən sıfırı və digər ərəb rəqəmlərini qadağan etməyib. *Başqa sözlə* desək bu bir əfsanə və cəfəngiyatdır. Elm tarixçisi və fizik James Hannam “God’s Philosophers” və “The Genesis of Science” kitabında bunun bir mif olduğunu qeyd edir.[297] O əlavə edir ki, İspaniyadakı müsəlmanların istifadə etdikləri rəqəm yazılışı Şərqdəki müsəlmanların yazılışından fərqlənirdi və avropalıların qəbul etdikləri rəqəmlər İspaniyadakı müsəlmanların rəqəmlərinə uyğun idi. Kilsə tarixçisi Dale Albert Johnson “Newton Minbərdə” adlı kitabında din ilə təbiət elmləri arasında konfliktin olmasını dəstəkləyən əfsanələrə misal verərkən bunu ikinci yerdə qeyd edir.[298] Burada doğru olan bunun əksini iddia etməkdir; çünki Avropanı ərəb rəqəmləri ilə ilk dəfə tanış edən məhz Uriyaklı Gerbert (Gerbert of Aurillac) olub[299] və o, 999-cu ildə roma papasi seçilib və tarixə ikinci Sylvester adı ilə *düşüb.*

Hitchens din ilə təbiət elmləri arasında həqiqi bir ədavətin olduğuna inanan kəslərdəndir. “Dinin tibbə münasibəti dinin təbiət elmlərinə münasibəti kimidir”, deyir Hitchens, “h*əmişə* mütləq problemlidir və çox zaman mütlə*q düşm*ən

[296] C.J. Budd, C.J. Sangwin, ”Mathematics Galore”, səh: 203; Oxford University Press, New York, 2001

[297] James Hannam, “The Genesis of Science: How the Christian Middle Ages Launched the Scientific Revolution”, səh: 153; Regnery Publishing, Washington, 2011

[298] D.A. Johnson, “Newton in the Pulpit”, səh: 31; New Sinai Press, 2017

[299] E. R. Truitt, ”Medieval Robots: Mechanism, Magic, Nature and Art”, səh: 74; University of Penssylvania Press, 2015

mövqeyindədir."[300] Təbiət elmlərinin tarixində bu tezisə "konflikt tezisi" deyirlər. Adından da məlum olduğu kimi din ilə təbiət elmləri arasında bir uzlaşmanın, əməkdaşlığın, qarşılıqlı dəstəyin ola biləcəyini inkar edən bu ideyanı tarixdə məşhurlaşdıran fiqurlar Andrew Dickson White (1832-1918) və John William Draper (1811-1882) adlı iki amerikalı olub. Onlar kilsə ilə italyan alim Galileo arasındakı konflikti kitablarının mərkəzi arqumenti olaraq din ilə təbiət elmləri arasında hər zaman mövcud olan qacınılmaz konfliktin vücuduna sübut olaraq göstəriblər.[301] 1860-cı ildə Oxford muzeyində "Darvinin Buldoqu" ləqəbi ilə tanınan ingilis bioloq Thomas Henry Huxley ilə keşiş Samuel Wilberforce arasında *baş vermiş debat da bu imeci möhk*əmləndirməyə xidm*ət etmişdi.* Bu tezisin tərəfdaşlarına görə orta əsrlərin kilsə tarixi elmdən və m*əntiqi düşüncə*dən xali olan zülmət tarixind*ən başqa bir şey deyildi*. Təəssüf ki, dünya tarixinə köhnə kommunist, marksist baxış açısı bu gün də məktəblərimizdəki tarix kitablarında təkrarlanır. Ona görə də bu gün yayğın olan təsəvvürə görə orta əsrlərin kilsə xadimləri Yerin düz olduğuna inanırmışlar və guya Columbus, daha sonra Magellan Yerin kürə olduğunu isbat ediblər. Bu miflər, əfsanələr o qədər kütlələr arasında məşhurlaşıb ki, onları insanların beyinlərindən söküb atmaq üçün tarixçilərin araşdırmaları kifayət etmir. Tarixin bu versiyasının yalan olduğunu Pierre Duhem (1861-1916), Robert Gunther (1869-1940), Lynn Thorndike (1882-1965) kimi tarixçilər paralel bir zamanda yazırdılar. Müasir zamanımızda isə David Lindberg, Ronald Numbers, Edward Grant, James Hannam kimi tarixçi yazıçılar bu məsələlərə işıq salmağa çalışırlar və orta əsrlərin heç də bizə təqdim olunduğu kimi qaranlıq dövrlər olmadığını göstərirlər. Çoxumuz məktəb dərsliklərində orta əsrlər haqqında yazılanları gözəl xatırlayırıq; dənizçilər okeanların dərinliklərinə getməkdən qorxurdular, çünki "yer diskinin" kənarına çatıb oradan fəzanın boşluğuna düşmək fikri onları vahimədə saxlayırdı. Allahım, o insanlar nə qədər də cahil olublar! Halbuki klassik yunan tarixində yaşamış filosoflar artıq Yerin kürə olduğunu bilirdilər. Necə oldu ki, xristian kilsəsinin görkəmli xadimləri yunanların, romalıların bildiklərindən cahil qaldılar? Çox ehtimal ki, müqəddəs kitablarına inandıqları üçün bu qəd*ər aşkar müşahid*əl*ə*ri yalanlamağa məcbur idilər. Din xadimlərinin cəhalət tərəfdarı, elmi proqresin *düşmə*nləri olduğunu göstərən bundan da aydın misal nə ola bilərdi?! Mövzu haqqında kitab yazmış tarixçi Jeffrey B. Russell bu fikrin on doqquzuncu və iyirminci əsrdə məşhurlaşmasını bəzi tarixçilərin kitabları ilə əlaqələndirir. Onların arasında Charles Raymond Beazley'ni qeyd etdikdən sonra deyir: "Beazley öz

[300] "God is Not Great", səh: 46;
[301] Ian G. Barbour, "Religion and Science", səh: 24; HarperCollins Publishers, New York, 1997; Ronald L.Numbers, "Galileo Goes to Jail", səh: 1-2; Harvard University Press, Cambridge, Massachusetts, 2009; Alister McGrath, "Science and Religion: a New Introduction", səh: 9-10; Wiley-Blackwell, Chichester, 2010

xətalı anlayışını birbaşa Antoine-Jean Letronne'dan götürür və o, Washington Irving ilə birlikdə "yastı dünya xətasını" başladan iki nəfərdən biri idi."[302] Bu təsəvvür daha çox Washington Irving'in (1783-1859) Columbus haqqında yazdığı bioqrafiyadan qaynaqlanır. Tarixçilər onun bioqrafiyasının xeyli hissəsinin "xəyal məhsulu" olduğunu deyirlər.[303] Antoine-Jean Letronne isə Fransa inqilabı dövrünü yaşamış din əleyhdarı arxeoloq, coğrafiyaçı idi. Həm White, həm də Draper kitablarında bu əfsanəni canlandırırlar və ona nəfəs qatırlar. Həqiqət isə budur ki, klassik yunan yazıçılarından sonra gəlmiş orta əsrlərin ziyalıları Yerin kürə olduğuna inanıblar. Aristotel, Eratosfenes, Ptolomey kimi yunan alimləri Yerin kürə olduğunu deyiblər, onların kitablarına şərh yazmış rumlular da eyni şeyi təsdiqləyiblər. Augustine, Jerome və Ambrose kimi erkən xristian alimləri, Thomas Aquinas, Albertus Magnus, Michel Scot, Roger Bacon kimi 13-cü əsrin ən böyük xristian alimləri eyni şeyi deyiblər. Jean de Sacrobosco'nun bu əsrdə yazdığı "De Sphaera Mundi" əsəri də istisna deyildir. Şübhəsiz ki, xristian dünyasında bunu inkar etmiş və Yerin yastı olduğunu iddia etmiş tək-tük marginal şəxsiyyətlər olub, amma kilsənin əsas korpusunu təşkil edən ziyalılar həmişə Yerin kürə olduğunu qəbul ediblər. Hətta amerikalı bioloq Stephen Jay Gould da təsdiqləyir ki, "yastı dünya zülməti alimlər arasında heç bir zaman mövcud olmayıb…Kürəlik barədə yunan bilikləri heç zaman itməmişdi və orta əsrlərin ən əsas alimləri də Yerin kürəliyini kosmologiyada sübut olunmuş bir fakt kimi qəbul ediblər."[304] Eyni vəziyyət müsəlman dünyasında da mövcud idi. İslam alimi İbn Həzm (994-1064) hələ on birinci əsrdə müsəlman alimlərinin bu mövzuda ittifaq etdiyini deyirdi.[305]

On doqquzuncu əsrin anti-ruhani yazıçılarından "xüsusilə Draper İngiltərədə və Amerikada darvinizm üzərində gedən mübarizədən təsirlənmişdi və katolik kilsəsinin acı düşməni idi."[306] Draper kitabı boyunca tarixi analizlərində ciddi xətalara yol versə də, ciddi tarixçilər bu xətalar haqqında yazsalar da nəticə etibarı ilə dünyada məşhurlaşan, nüfuz qazanan Draper'in kitabı oldu. Təkcə Amerika Birləşmiş Ştatlarında 50 dəfə çap edildi və iyirmiyə yaxın əcnəbi dilə tərcümə olundu. Hətta on doqquzuncu əsrin sonlarında Osmanlı dövrünün jön-türkləri tərəfindən türk dilinə tərcümə olundu. Princeton universitetinin professorlarından *M. Şükrü* Hanioğlu deyir: "Təsadüf deyildir ki, John William Draper'in "Din və

[302] Jeffrey B. Russell, "Inventing the Flat Earth: Columbus and Modern Historians", səh: 49; Praeger Publishers, New York, 1991

[303] William L. Hedges, "Irving's Columbus: The Problem of Romantic Biography", "The Americas" jurnalı, 13-cü cild, 2-ci nömrə (okt. 1956) səh: 127-140, Cambridge University Press

[304] Stephen Jay Gould, "Rocks of Ages: Science and Religion in the Fullness of Life", səh: 114, The Ballantine Publishing Group, New York, 1999

[305] İbn Həzm, "əl-Faslu fil-Miləl val-Əhva van-Nihəl", 2/241-242; Darul-Cil, Beyrut, 1996

[306] Wilbur Applebaum, "Encyclopedia of The Scientific Revolution from Copernicus to Newton", səh: 1057; Garland Publishing, New York, 2000

Elm Arasındakı Konflikt" kitabı on doqquzuncu əsrin son illərində türk dilinə tərcümə edildikdə Osmanlı İmperiyasında bestseller oldu." Hətta Atatürkün kitabın fransız dilində tərcüməsini oxuduğunu da qeyd edir.[307] Lawrence Principe araşdırmasında Draper'in anti-katolik münasibətini üç səbəb ilə bağlayır. Bu səbəblərdən biri onun ölən oğlu ilə bağlı idi; katolikliyə dönmüş bacısı ölüm ayağında olan oğluna Bibliya kitabını verməkdən imtina etmişdi. Bacısı onlarla birlikdə eyni evdə qalırdı və bu hadisədən sonra onu evindən qovur.[308] Draper'in kitabı çoxunluqla təsdiqini tapmamış iddialardan, təhrif edilmiş misallardan ibarət idi. Günümüzün ən görkəmli tarixçiləri onun kitabını etibar olunan tarixi bir qaynaq hesab etmirlər. Lakin təəssüf ki, reallıq budur ki, əlli ən görkəmli tarixçinin akademik üslubda yazılmış tarix kitabları Dan Brown'un ədəbi üslubda yazdığı bir kitabı qarşısında uduzur. "Tarixin əvvəlindən," Langdon izah etdi ki, "elm ilə din arasında böyük bir uçurum olub. Copernicus kimi açıqdilli bir alim... elmi həqiqətləri kəşf etdiyi üçün kilsə tərəfindən öldürülmüşdü. Din hər zaman elmi təqib edib."[309] Bu sitat Dan Brown'un kitabındandır. Buradakı iddianın yalan olduğunu, yəni Copernicus kimi alimin kilsə tərəfindən öldürülmədiyi, nə də dinin hər zaman elmi təqib etmədiyi tarixçilər yanında şəkk götürməyən bir həqiqətdir. Lakin gənclərimiz mütəxəssislərin kitablarını oxumağa deyil, populyar ədəbiyyatı oxumağa üstünlük verirlər.

Andrew White'ın kitabındakı antiteizm Draper'in kitabındakı qədər aşkar olmasa da xətalı təsəvvürlərdə, əsaslandırılmamış iddialarda ondan geri qalmır. İddialarının birində protestant liderlərdən John Calvin'ə kopernikanizmi rədd etmək fikrini nisbət edir, halbuki Calvin'in kitablarında ümumiyyətlə Copernicus haqqında bir şey yazılmır.[310] Bu tərzdə antiteist yazıçılar kütlələri din ilə təbiət elmləri arasında bir konfliktin olması fikrinə inandıra biliblər. Hitchens də fikirlərində on doqquzuncu əsrin pozitivizmindən doğan eyni sentimentləri bölüşür. Bu səbəblə orta əsrlərdə hakim olmuş dini sxolastikanı cahilliyə bərabər tutaraq deyir: "**Mələklərin qanadlarının uzunluğunu ölçmək və ya bu mistik varlıqlardan neçəsinin bir çubuğun başında rəqs edəcəyini debat etmək şəklində din alimlərinin mənasız sualları fanatik ciddiyyətlə müzakirə etdikləri zaman haqqında hətta dindarlar belə utanaraq danışırlar.**"[311] Əgər dindarlar özləri bu "faktlar" qarşısında utanc hissi ilə

[307] M. Şükrü Hanioğlu, "Atatürk: An Intellectual Biography", səh: 51; Princeton University Press, New Jersey, 2011
[308] J. Hardin, R. L. Numbers, R. A. Binzley, "Warfare Between Science and Religion: The Idea That Wouldn't Die", səh: 18; Johns Hopkins University Press, Baltimore, Maryland, 2018
[309] Dan Brown, "Angels & Demons", səh: 28; Washington Square Press, New York, 2000
[310] Wilbur Applebaum, "Encyclopedia of The Scientific Revolution from Copernicus to Newton", səh: 1058; Garland Publishing, New York, 2000
[311] "God is Not Great", səh: 68;

yaşayırlarsa o zaman şübhəsiz ki, Hitchens dediklərində haqlı olmalıdır. Biz bəzi dindarların bu cür saxta tarixçiliyin qurbanları olduğunu bilirik və nəticədə bu misallar qarşısında utanc hiss etməklərinə də əfsus deyirik. Həqiqət bəs nədir? Həqiqət budur ki, bu cür iddialar həddindən artıq şişirdilmiş, həm ölçülərindən, həm məzmunundan kənara çıxarılmış məsələlərdir. "Geniş araşdırmalara baxmayaraq bu günə qədər heç bir alim orta əsrlərə aid elə bir kvodlibet və ya *başqa sxolastik teoloji bir* əsər tapmayıb ki, içində iynənin ucunda neçə mələyin rəqs edə biləcəyi müzakirə olunsun. "Swester Katrei" yeganə bilinən orta əslərdən qalmış bir əsərdir ki, onun içində hətta mələklərin iynələrin uclarında durduqları və ya ola bilsin ki, quş kimi qonduqları qeyd edilir. Swester Kartei'nin, iynələrin ucunda duran mələkləri necə rəqs etməyə başladı və nə zaman onların sayı naməlum oldu?!"[312] Əgər Hitchens özünə əziyy*ət verib işin h*əqiqətini araşdırmış olsaydı, o dövr üzrə ixtisaslaşmış tarixçilərin yazdıqlarını oxusaydı bir həqiqəti anlayacaqdı; orta əsrlərin sxolastik alimlərinin müzakirə etdikləri suallar arasında bu formada bir sual olmayıb. Bəli! *Əslində* bu, onlar haqqında satirik bir üslubda deyilmi*ş bir ifad*ədir. Orta əsrlər üzərində ekspert sayılan Stephen J. Harris və Bryon L. Grigsby'nin toplayıb ərsəyə gətirdikləri "Misconceptions About the Middle Ages" (Orta *Əsrlə*r Haqqında Xətalı Fikirlər) kitabında o dövrün rasionallıqdan uzaq bir dövr olması iddiasına da yer veriblər. Bu topluda kanadalı tarixçi Richard Raiswell'in qələmə aldığı "The Age Before Reason" (*Əqli Düşüncə*dən *Əvvə*lki Dövr) adlı məqalədə bununla bağlı fikrini bölüşür. "Orta əsrlərin universitet sistemınə qarşı yönlə*ndirilmiş bu* sarsıdıcı tənqid çox zaman bir çubuğun başında rəqs edə biləcək mələklərin sayını müzakirə edən orta əsr alimlərinin imecində misallaşdırılır. Bu kitabdakı bir çox digər fikirlər kimi bu imecin də orta əsrlər ilə əlaqə*si yoxdur. Şübh*əsiz ki, rəqs edən bu mələklərin mənşəyi ən uzağı erkən on doqquzuncu əsrə qədər izlənə bilər ki, o zaman Isaac D'Israeli... mələklərin cismanilik məsələsi barəsində Thomas Aquinas'ın dediklə*rini satirala*şdıraraq əlavə etmişdi ki, o, sualı belə də qoya bilərdi: "Nə qədər mələk çox incə bir iynənin ucunda bir-birilərini itələmədən rəqs edə bilərlər?"..."[313] Bu tarixçilər sualın bu formasını on doqquzuncu əsrdən ötəyə apara bilmirlər, bunun sadəcə bir satira olduğuna diqqət çəkirlər. Bu suala görə dindarların bu gün utanc hissi keçirməkləri bir kənara qalsın, "orta əsr filosofların...bu cür axmaq sualları müzakirə etməklə vaxtlarını və enerjilərini israf etdiklərinə" inanırsansa "o zaman" – Boston və The King kolleclərinin fəlsəfə professoru Peter John Kreeft'ə görə - "sə*n özün çubuqbaş*san!" Peter Kreeft deyir: "Heç bir orta əsr filosofu bu

[312] T. Koetsier, L. Berhmans, "Mathematics and The Divine", səh: 251; Elsevier, Amsterdam, 2005

[313] S.J. Harris, B.L. Grigsby, "Misconceptions About The Middle Ages", səh: 124; Routledge, New York, 2008

sualı müzakirə etməyib və bu, protestant reformistlər tərəfindən orta əsr sxolastik filosoflara qarşı icad edilmiş bir sataşma tərzidir."[314] *Əslində* bu satirik sataşmanın yəhudiliyi t*ərk etmiş və* heç də protestant olmayan Isaac D'Israeli tərəfindən, yoxsa protestant reformistlər tərəfindən uydurulmuş olması o qədər də önəmli deyildir. Amma görünür ki, Peter Kreeft'in təxmini daha doğrudur; bəziləri bunu protestant yazıçı William Chillingworth'un yazısında tapır.[315] Burada tarixçilərin rəylərini yazıb dolduraraq oxucuları yormaq istəmirik, lakin bunun çox ucuz və əsassız bir tənqid olduğunu anlamaqlarını istəyirik.

Növbəti sətrlərdə kilsə tarixi cahillik tarixi kimi göstərilir, obskürantizmdə ittiham olunur: "Teleskop vasitəsi ilə baxmaq və *(müşahidə)* nəticələri haqqında fərziyələr yürütmək haqqının kilsə tərəfindən əngəllənməsi xüsusi bir əhəmiyyət kəsb etmir. Bu, Ockham'ın xətası deyildir və kilsəni bu qədər axmaq olmağa məcbur edən ümumi bir qayda da yoxdur..."[316] Onun bu sözlərindən anlaşılan budur ki, kilsə teleskop ilə səmanı müşahidə etməyi, səma barədə fərziyələr yürütməyi qadağan edərdi. Bu cür iddiaları oxuduqda b*əzən kitabda faşist* Almaniyasının propaqanda taktikası yada düşür. Xeyr, cənablar! Kilsə teleskop ilə səmanı müşahidə etməyi qadağan etməyib, nə də bununla bağlı fərziyələr irəli sürməyi də qadağan etməyib. M*əşhur rəyə* əsasən kilsə Giordano Bruno (1548-1600) kimi elm adamını astronomik fikirlərinə görə edam edib. Bruno bu gün *dünyaya "elmin ilk* şəhidi" kimi tanıdılır. Carl Sagan'ın "Cosmos" kitabında, həm də kitab üzərində *bina edilmiş və* Neil deGrasse Tyson tərəfindən aparılan sənədli filmdə Bruno süjetin əsas qəhrəmanı kimi təqdim olunur, ən azından baş qəhrəmanlardan biri kimi göstərilir. Andrew White da kitabında astronomiya haqqında yazdıqda Bruno ilə kilsə arasındakı qarşıdurmanı misal gətirir. "O (yəni Bruno) ölkədən ölkəyə təqib olundu və nəhayət onu təqib edənlərə qarşı qorxunc təhqir ilə cavab verdi. Buna görə o, altı il həbs həyatı yaşadı və sonra diri-diri yandırıldı və külü küləklərə səpildi. Buna baxmayaraq yeni həqiqət yaşamağa davam etdi; həqiqət öldürülə bilm*əzdi. Bruno'nun* şəhidiyindən sonra on il içində, böyük çətinliklər və təqiblərdən sonra Kopernik'in doktrinindəki həqiqət Galileo'nun teleskopu ilə isbatını tapdı."[317] White burada onun elmi, astronomik iddialarına görə öldürüldüyünü açıq şəkildə deməsə də astronomiya haqqında açdığı məzmunda bunu müzakirə etməsi bu m*ənaya işarə* edir. Onun izi ilə gedən bir çox yazıçı da bu fikri müdafiə ediblər və Bruno'nu *"elmin ilk* şəhidi" adlandırıblar. Amma reallıq nədən ibarətdir? Bruno həqiqətən də təbiət elmləri

[314] P. Kreeft, "Angels and Demons: What Do We Really Know About Them", səh: 41; Ignatius Press, New York, 1995
[315] Joad Raymond, "Conversations with Angels: Essays Towards a History of Spiritual Communication, 1100-1700", səh: 49; Palgrave Macmillan, Hampshire, 2011
[316] "God is Not Great", səh: 70;
[317] A.D. White, "The Warfare of Science", səh: 33; D. Appleton and Company, New York, 1876;

üzrə bir alim olubmu və kilsə onu elmi iddialarına görə öldürübmü? Sheila Rabin "Stanford Fəlsəfə Ensiklopediyasında" yazır: "Giordano Bruno bir bidətçi kimi dirəyə bağlı yandırıldıqda bunun Kopernikin kosmoloji yazıları ilə heç bir əlaqəsi yox idi və bu, Brunoya qarşı yönəldilmiş ittihamların Finocchiaro tərəfindən rekonstruksiyasında aydın şəkildə göstərilir."[318] Giordano Bruno sözün həqiqi mənasında bir alim olmayıb, lakin fəlsəfə ilə, sehr ilə məşğul olub. Frances A. Yates qeyd edir ki, "Bruno qəti dindar hermetist idi; (yəni) Asclepius'da izah olunduğu kimi misirlilərin sehrbazlıq dininə inanırdı." Bruno sadəcə olaraq mistisizm ilə məşğul idi və Yates'ə görə o, "Kopernikin diaqramını ilahı sirlərin *heroqlifi kimi yozaraq Kopernikin elmi işini elmd*ən əvvəlki dövrə, geriyə doğru, hermetizmə doğru itələyirdi."[319] Yates'in kitabı hələ də bu günə qədər Bruno haqqında yazılmış ən etibarlı, ən yayğın kitab sayılır. Stanley Tambiah da bu fikirləri təsdiqləyərək deyir ki, "Kopernikin günəş*inin Ficino'nun günəş sehri ilə* əlaqəsinin olduğuna inanaraq o, kopernikanizmi dəstəkləyirdi."[320] *Bir başqa sözlə* Bruno heç də elmi əsaslardan çıxış edərək Kopernik'in nəzəriyyəsini müdafiə etmirdi, onun bu nəzəriyyəni müdafiəyə qalxmasının arxasında duran əsas səbəb sehrbazlıq və mistika idi. Stanley Tambiah'nın sözünü etdiyi Marsilio Ficino (1433-1499) astronomiya və sehrlə məşğul olmuş renessans rahiblərindən biri idi. Yəni ki, Kopernikin modelini dəstəkləməsinin elmi araşdırmalar etməsi ilə heç bir əlaqəsi yox idi, mistik fəlsəfə ilə bağlı səbəblərdən çıxış edərək o modeli müdafiə edirdi. Brunonun sehrlə məşğul olduğu, astronomiya və fəlsəfə ilə maraqlandığı mə*lumdur. Hilary Gatti bu tarixi* şəxsiyyət haqqında yazdığı kitabın müqəddiməsində deyir: "Buna baxmayaraq o dövrün Paracelsus, Johannes Kepler, Tycho Brahe, William Gilbert, William Harvey kimi və sonradan Galileo və Francis Bacon kimi təbiət filosoflarının yeni elmlə məşğul olduqları, az və ya çox təbii səbəblər və nəticələr ətrafında metodik araşdırmalar apardıqları deyilə bilər. Hər kəs Bacon'un bu kateqoriyaya daxil olması ilə razılaşmayacaq, amma əminliklə deyə bilərik ki, Bruno bura daxil deyildir. O heç zaman özünün *astronomik müşahid*ələrini aparmayıb."[321] Kilsə Giordano Bruno'nu məhkəməyə cəlb etdikdə, onu dustaq olaraq saxladıqda və sonunda yandırdıqda bunu onun təbiət elmlərinin nümayəndəsi olaraq gördükləri üçün etm*əmişdil*ər. Qısacası Bruno nə Kopernikin modelini müdafiə etdiyi üçün, nə də hansısa digər kosmoloji bir k*əşfd*ən ötrü kilsə tərəfindən təqib olunmamışdı. Burada din ilə elm arasında,

[318] Sheila Rabin, "Nicolas Copernicus", Stanford Encyclopedia of Philosophy; https://plato.stanford.edu/entries/copernicus/

[319] Frances A. Yates, "Giordano Bruno and The Hermetic Tradition", səh: 155; Routledge, London, 1999

[320] Stanley J. Tambiah, "Magic, Science and Religion and the Scope of Rationality", səh: 27; Cambridge University Press, Cambridge, 1990

[321] Hilary Gatti, "Giordano Bruna and Renaissance Science", səh: 2; Cornell University Press, New York, 1999

daha dəqiq desək dindarlar ilə bir alim arasındakı qarşıdurmadan söz gedə bilməz. Sadəcə olaraq o, dini məsələlərdə səsləndirdiyi mistik, qeyri-ənənəvi fikirlərinə görə, okultivizmlə məşğul olduğu üçün kilsənin qəzəbini öz üzərinə çəkmişdi. Əgər sən kilsənin nüfuzunun güclü olduğu bir cəmiyyətdə İsa Məsihi sehirbaz adlandıracaqsansa, İsa ilə bağlı möcüzələri yalan adlandıracaqsansa, özün də kilsə iyerarxiyasında rahib vəzifəsini tutursansa *o dövrün* şərtlərinə görə kilsənin marağını doğurmuş olacaqsan. Orta əsrlərin kilsəsi bu cür elmi iddialara görə insanları öldürmürdü. Əgər Brunonun 1600-cü ildə yandırılmasının səbəbi günəşin *planetar sistemin* mərkəzində olduğunu demək idisə bundan 10 il sonra, yəni 1610-cu ildə Galileo "Sidereus Nuncius" kitabını nəşr edərdimi?! Sən saymaq istəsən əlbəttə ki, Brunonu dini pluralizmin fədaisi saya bilərsən, amma o, "elmin *ilk* şəhidi" adını daşımağa əslən layiq deyildir və din ilə elm arasında iddia olunan konfliktin qurbanı olmayıb. Bunun yalan olduğunu araşdırıb öyrənmək çətin deyildir. Lakin bildiyimiz kimi yalan söz tez yayılar. Mark Twain'ə nisbət olunan bir sitatda deyir: "Haqq ayaqqabılarını hələ geyinənə qədər yalan dünyanın yarısını səyahət edir." Bu sitatın gücü ondadır ki, bu sitatın Mark Twain'ə aid olması özü də yalandır.

Bəli! Kilsə ümumən Brunonu elmi kəşfinə görə yandırmasa da heliosentrik modeli də qəbul etmirdi. Kilsə geosentrik modeli müdafiə edirdi və onlara görə *başqa iddialar* xətalı idi. Bunu qınamaq asandır. Amma bir dəqiqə dayan və *düşün!* Kilsə nə üçün axı Kopernikin və ya onun kimi barmaqla saya biləcəyimiz bəzi astronomların fikirlərini qəbul etməli idi? Kopernikin iddiası o dövrün elmi icmasında mövcud olan konsensusa qarşı idi. Bu gün belə elmi konsensusa qarşı gələn bir iddianı rahat-rahat qəbul etmirik. 2011-ci ildə *Ceneva* şəhəri yaxınlığındakı CERN elmi araşdırmalar mərkəzindəki tədqiqatçılar 730 km aralıda İtaliyada L'Aquila'da yerləşən Gran Sasso Milli Laboratoriyaya neytrino şüaları göndərdikdən sonra onların işıqdan sürətlə getdiklərini qeydə aldılar; ən azından dünyanın elmi icması qarşısında belə bir iddia ilə çıxış etdilər. Elmi icmanın reaksiyası nə oldu? Demək olar ki, hə*r bir alim Eynşteynin* nəzəriyyəsini tərk etmək əvəzinə tədqiqatçıların ölçü alətlərində bir xətanın olduğunu dedilər. Çünki *oturuşmuş və müşahid*ələrimizə uyğun olan fiziki bir modeli tərk etmək asan deyildir. Bəzən belə bir halın dəyişməsi üçün yarım əsr və ya bir əsr vaxt keçməli olur. Buna görə də Edwin Burtt haqlı olaraq yazır: "Bunları nəzərə alaraq demək olar ki, Kopernikin astronomiyasına qarşı heç bir dini tərəddüd olmasaydı belə, Avropanın hər bir yerindəki açıqfikirli adamlar, xüsusilə də ən empirik baxışa sahib olan kəslər, təsdiqlənmə*miş bir t*əsəvvürün kal meyvələrini dərməyin ağılsız bir çağırış olduğunu deyəcəkdilər və bəşər övladının müşahidələrindən çıxarılmış, əsrlər boyunca tədricən *qurulmuş möhk*əm məntiqi nəticəyə daha çox üstünlük

verəcəkdilər... Müasir empirk metod tərəfdarları on altıncı əsrdə yaşamış olsaydılar, yeni kainat fəlsəfəsinə hamıdan qabaq onlar güləcəkdilər."[322] Kilsənin o dövrdəki reaksiyası çox normal idi və kilsənin öz astronomları var idi. Bilmək lazımdır ki, Avropadakı universitetlərin ən böyük sponsorlarından biri də kilsə olub. Hətta Oxford, Cambridge, Bologna, Padua, Paris universitetləri katolik kilsəsi nəzdində katedral məktəblər kimi fəaliyyətlərinə başlayıblar və katolik kilsəsinin dəstəyi ilə böyüyüblər. Çox zaman bu mövzu haqqında danışarkən bu cür faktları göz ardı edirik. Amma əgər din ilə elm arasındakı əlaqəni mövzu obyekti ediriksə bu cür tarixi faktları da nəzərə almağımız lazımdır. Hitchens öz qərəzliyi səbəbilə bu tarixi faktları yaxşı araşdırmadan populistik fikirləri öz kitabında toplayıb. Bəli, bəzi hallarda din, elmin inkişafına mane ola bilər. Philipp Stölzl'in rejissorluğunu etdiyi The Physician (2013) filmində din alimlərinin elmin inkişafına mane olduqları canlandırılır. İsfahanda mollalar İbn Sinanın ölüləri gizlində yaran ingilis tələbəsini şeytanlıqda ittiham edir. Bu filmin bir fiksiya olduğunu, yəni həqiqət olmadığını dərk etmək çətin deyildir, ancaq biz yenə də bilirik ki, tarixdə ölüləri yarmaq dini dairələrdə qəbul görməyib. Fəqət ölüləri elmi məqsəd üçün yarmağı şeytanlıq kimi dəyərləndirmək fikri dini bir fikir deyildir. Dinin buna müqaviməti ümumilikdə dinin insanın istər dirisinə, istərsə də ölüsünə verdiyi yüksək dəyərdən qaynaqlanır. Bu gün belə insanlar ölülərinin elmi laborotoriyalarda eksperiment obyekti olmasına qarşı çıxırlar. Bu, dinin özlüyündə elmə qarşı çıxması kimi dəyərləndirilməməlidir. Qərbdə zamanımızın etik qaydaları heyvanların eksperiment obyekti kimi istifadə edilməsini qadağan edir. Biz bunu misal olaraq istifadə edib "etik qaydalar elmə qarşıdır" demədiyimiz kimi adekvat hallarda dini də ittiham edə bilmərik. *Əgər* biz bu cür misallar verərək din ilə elmi qarşı-qarşıya qoymağı doğru hesab edəcəyiksə eyni tərzdə *başqa ünsürlər*lə də elmi üzləş*dirə* bilərik. Tarixdən misallar verib bu cür cürətli nəticələr çıxarmaq çətin deyildir. Misal üçün mən bu üslubu istifadə edib "ateizm ilə elm bir-birinə ziddir" iddiasını edə bilərəm. Yaxın keçmişimiz Jdanovşina siyasətinin (1946-1953) *şahidi olub. Stalinin era*sında sənətkarlar, alimlər və intellektuallar çalışmalarını, araşdırmalarını partiya xəttinə uyğunlaşdırmalı idilər. Sovetlərin ateist materialist ideologiyası kainatın sonsuz və əzəli olmasını, sabit zəminə sahib olmasını tələb etdiyi üçün Big Bang nəzəriyyəsi, nisbilik nəzəriyyəsi, kvantum fizikası şiddətlə rədd edilirdi. Bu nəzəriyyələr "burjuaziya idealizmi" kimi təbliğ olunur və qınanırdı.[323] Bunu dəstəkləyən elmi çalışmalara məhdudiyyətlər qoyulurdu. Sovet astronomu Boris Voronçov Velyaminov eyni ideologiyanın təsiri ilə öz həmyerlisi

---

[322] E. A. Burtt, "The Metaphysical Foundations of Modern Physical Science", səh: 25; Kegan Paul, Trench, Trubner & Co., Ltd. London, 1925

[323] Helge Kragh, "Cosmology and Controversy; the Historical Development of Two Theories of the Universe", səh: 262; Princeton University Press, New Jersey, 1996

George Gamow'u "amerikanlaşmış mürtəd" adlandırırdı.[324] "Bu gün o dövrün atmosferini təsəvvür etmək çətindir ki, Heisenberg'in əminsizlik prinsipi haqqında danışmaq dialektik materializmin əsaslarına birbaşa hücum kimi dəyərləndirilirdi."[325] O zamanlar nisbilik nəzəriyyəsini, kvantum fizikasını dəstəkləyən alimlər sovet ideoloqları tərəfindən burjuaziya pozuntuları, trotskizmin qalıqları, anti inqilabçılar kimi dəyərləndirilirdilər. Boris Hessen və məsləkdaşı A. O. Apirin bu cür ittihamlar nəticəsində NKVD tərəfindən 1936-cı ilin dekabr ayında güllələndilər. Konflikt tezisini müdafiə edənlər üçün Brunonun misalını məharətlə istifadə etməyə icazə *varsa eyni ş*əkildə Hessen'in misalını göstərib ateizm ilə elm arasında konfliktin olduğunu da iddia etmək olar. Elmi təmsil etdiyi iddia olunan Brunonun simasında tək bir nəfərin öldürülməsi qarşısında xristianlıq hegemoniyasının heç olmasa iki mileniuma yaxın yaşı var, amma ateizmin son bir əsr içindəki ağalığı müddətində öldürdüyü alimlərin sayını bir tək Allah bilir. Biz dinə qarşı istifadə olunan eyni üslubla ateizmə qarşı ciddi bir "iş" ortaya çıxara bilərik. Lakin belə bir üslubun akademik olmadığını bilirik və bunun ictimai diskursa pozitiv bir xidmət göstərməyəcəyinə inanırıq.

Kopernik 1543-cü ildə "De Revolutionibus" kitabını çap etdikdə onu Roma papası üçüncü Pavelə hə*sr etmişdi və* özü kilsədə vəzifə sahibi idi.[326] Kitabı çap etdikdən iki ay sonra da özü ölüb. 1616-cı ilə qədər kitab Avropada alimlərin və tədqiqatçıların ixtiyarında idi və kilsə kitabı qadağan etmə*mişdi. Əksinə* Kopernik kilsədə vəzifə sahibi idi və kitabına görə kilsə tərəfindən təqib olunmamışdı. Kopernikin irəli sürdüyü model təkcə kilsə tərəfindən yox, öz dövrünün elmi icması tərəfindən də qəbul olunmurdu, çünki model bəzi fenomenləri izah etməkdə aciz idi və Kopernikin öz modelini sübut etmək üçün təqdim etdiyi sübutlar xətalı idi. Hər bir halda kilsənin, eləcə də elmi icmanın bu modeldən imtina etməsinin normal bir izahı mövcuddur.[327] Bu barədə elm fəlsəfəsinin mə*şhur* nümayəndələrindən olan Edwin Burtt'ün sözləri ilə tanış olduq. Galileo da istisna deyildi. Kopernikə nisbətdə daha güclü arqumentlər istifadə etməsinə baxmayaraq heliosentrizm hələ də zəif bir model olaraq qalırdı və *müşahidə* olunan problemlər hələ də çözülmə*mişdi. Üst*əlik bu model empirik olaraq sübut edilmə*mişdi.*[328] Bu

[324] Helge Kragh, "Masters of the Universe; Conversations with Cosmologists of the Past", səh: 188; Oxford University Press, Oxford, 2015
[325] S.N. Korsakov, A.B. Kozenko, Q.Q. Qraçeva, "Boris Mixayloviç Qessen; 1893-1936", səh: 144, Nauka, Moskva, 2015
[326] Ronald L.Numbers, "Galileo Goes to Jail", səh: 102; Harvard University Press, Cambridge, Massachusetts, 2009
[327] Bax: Christopher M. Graney, "Setting Aside All Authority; Giovanni Battista Riccioli and the Science against Copernicus in the Age of Galileo", University of Notre Dame Press, Indiana, 2015 (Kitab bütövlükdə bu mövzu haqqındadır)
[328] Edward Grant, "In Defense of the Earth's Centrality and Immobility: Scholastic Reaction to Copernicanism in the Seventeenth Century", səh: 66; The American Philosophical Society, Independence Square, Philadelphia, 1984

gün biz Galileo'nun bəzi arqumentlərinin ciddi xətalar olduğunu bilirik. Misal üçün italyan dilində yazdığı "Dialogo" kitabında Yerin hərəkətdə olduğunu sübut etmək üçün dənizdəki qabarma və çəkilmələri arqument kimi istifadə *etmişdir.*[329] Halbuki biz bu qabarma və çəkilmələrin Yer kürəsinin hərəkəti ilə bağlı olmadığını bilirik. Heliosentrizmin tam qəbul edilməsi üçün hələ bir müddət empirik dəlillərin təqdim olunması tələb olunacaqdı. James Bradley'in (1693-1762) ilk stellar aberrasiyanı[330] *müşahidə* edərək qeyd etməsi bunun empirik dəlillərindən sayılır, daha sonra Giuseppe Calandrelli (1749-1827), Thomas Henderson (1798-1844), Friedrich Bessel (1784-1846) stellar parallaksı[331] *nümayiş etdirmə*klə daha konkret empirik dəlillər təqdim etdilər. *Bütün bu müşahid*ələrə qədər Kopernikin, Galilei'nin, Keplerin əsərləri teoriyadan kənara çıxmırdı və real sübutlara ehtiyac duyurdu. Bəzilərinin – Hitchens də bunlardan biridir - iddiasının əksinə Galileo teleskop ilə heliosentrizmi sübut etmə*mişdi.* Bu baxımdan kilsə*nin mövqeyini başa düşmə*k çətin olmamalıdır. İnkvizisiyanın əsas fiqurlarından biri olan kardinal Roberto Bellarmine kilsənin mövqeyini 1615-ci ildə aprel ayının 12-sində kilsə xadimi Paolo Antonio Foscarini'yə yazdığı məktubunda ifadə edir. Foscarini kilsə daxilində Galileo'nun fikirlərini müdafiə edən və onların Bibliyaya zidd olmadığını göstərməyə çalışan rahiblərdən biri idi. Bellarmine öz məktubunda Foscarini'nin "müqəddəs kitab" ilə heliosentrizmi birlə*şdirmə*k cəhdlərinə heç də doqmatik cavab vermir, əksinə çox balanslı şəkildə qarşılıq verir. Məktubunu "*çox hörmətli ata Paolo Antonio Foscarini'yə*" xitabı ilə *başlayan Roberto Bellarmine'nin* ən maraqlı sözləri növbəti sətrlərdədir: "Üçüncü: Mən deyirəm ki, əgər Günə*şin* dünyanın ortasında, Yerin isə üçüncü səmada olduğuna və Günə*şin Yerin* ətrafında fırlanmamasına, əksinə Yerin Günə*şin* ətrafında fırlanmasına dair həqiqi *nümayiş/ sübut olarsa o zaman Müqə*ddəs Kitablarda bunun əksinə olduğu görünən hissələri böyük qayğı və diqqətlə izah etməli olacağıq və göstərilən nümayişin saxta olduğunu deməkdənsə onları" – bununla müqəddəs mətnləri qəsd edir – "anlamadığımızı demək daha doğru olacaq. Lakin mənə göstərilməyənə qədər belə bir nümayişin olduğuna inanmayacam. Günə*şin mə*rkəzdə və Yerin səmada olduğunu göstərib zahiri görüntünü qorumağı nümayiş etdirməklə" – yəni riyazi model ilə bunun mümkünlüyünü göstərməklə - "Günə*şin mə*rkəzdə və Yerin səmada olduğunu həqiqət*ən nümayiş etdirmək eyni şey deyildir. Çünki m*ən

[329] Thomas F. Mayer, "The Trial of Galileo, 1612-1633", səh: 11; University of Toronto Press, Toronto, 2012

[330] Stellar aberrasiya Yer kürəsinin hərəkət etməsi səbəbi ilə ulduzdan gələn işığın istiqamət də*yişmə*sidir, bu istiqamətdəki də*yişiklik*ləri izlədikdə elips forması cızdığını görürük. Bu da Yerin Günəş ətrafındakı elips formalı hərəkətini təmsil edir.

[331] Stellar parallaks bizə yaxın ulduzu yer də*yişərkən müşahidə* etməkdir. Bunu isə biz daha uzaq bir ulduza görə müəyyən edə bilirik. Çünki Yer kürəsi hərəkət etdikcə daha yaxın ulduz uzaq ulduza nisbətən bizə daha yaxın olduğu üçün daha çox yer də*yişmə*lidir. Bir yaxın ulduz bu şəkildə uzaq ulduzla müqayisə edilir və hətta triqonometriyanın vasitəsi ilə bizə uzaqlıq məsafəsi də ölçülə bilir.

inanıram ki, birincini nümayiş etdirmək mümkündür, amma ikincisi barədə böyük *şübhələrim* vardır və *şübhə* olduğu halda Müqəddəs Kitaba müqəddəs ataların verdikləri izahı tərk etmək olmaz."[332] Bir sözlə inkvizisiyanın əsas fiquru etiraf edir ki, heliosentrizm kifayət qədər dəlillər ilə sübut olunmayıb. Zahirən planetlərin yerlərini göstərə biləcək bir heliosentrik modeli, yəni riyazi bir modeli təqdim etmək heç də qəti sübut sayılmır. Eyni zamanda kilsə inkvizisiyasının ən əsas fiquru olan Bellarmine qəbul edirdi ki, belə bir kosmoloji model sübut olunduğu təqdirdə kilsə müqəddəs mətnləri o modelə uyğun şəkildə izah etməyə hazırdır. Biz bu nöqtənin üzərində çox durmağa ehtiyac duymuruq. Yalnız bunu əlavə edə bilərik ki, bəzi tarixçilərə görə kilsənin belə bir reaktiv davranışı Avropada reformizmin nüfuzundan narahat olması ilə bağlı idi. Bəlkə də Kopernikin yazısına reaksiya verməməkləri, lakin əvəzində Galileo'nun yazısına reaksiya verməkləri bununla izah oluna bilər. Üstəlik onu da əlavə etmək lazımdır ki, Galileo kilsə daxilindən özünə *düşmən* qazandığı kimi güclü bir dəstək qazanmışdı və *eyni* şəkildə sekulyar institutlarda da – misal üçün universitetlərdə - özünə dəstək qazandığı kimi, *düşmənləri* də az deyildi. Bu o deməkdir ki, Galileo'nun müddəalarını inkar edənlər arasında təkcə ruhani təbəqənin nümayəndələri yer almırdı, həmçinin universitet müəllimləri də müxalif tərəfdə yer alırdılar. Çünki bu universitet müəllimləri də Aristotelin modelinin haqq olduğuna inanırdılar.[333] İstənilən halda Hitchens'in dediyi kimi kilsə *nəinki teleskopla müşahidələri* qadağan *etməmiş,* əksinə bu dövrdən sonra astronomiyanın inkişafına əvəzsiz dəstək *vermişdir və* bu dövrdən sonrakı astronomik *kəşflərin* bir çoxu kilsənin nəzdində fəaliyyət göstərən astronomların sayəsində mümkün olub. Misal üçün Yezuit *təhsili görmüş Giovanni* Domenico Cassini (1625-1712) Saturn planetinin sputniklərini, halqasını təsbit edən katolik astronomdur. O, yezuit müəllimləri Giovanni Battista Riccioli və Francesco Maria Grimaldi'nin dəstəyi ilə orbitin formasını sınamaq məqsədi ilə *Bologna* şəhərindəki San Petronio kilsəsində *bir heliometer inşa edilməsi* üçün kilsənin razılığını aldı.[334] Bu heliometrin sayəsində ilin fərqli vaxtlarında Yerin Günəşdən nə qədər uzaqlaşıb, nə qədər yaxınlaşdığını hesablaya bildi. Bununla da orbitlərin Keplerin göstərdiyi kimi elips formasında olduğu təsdiqini tapdı. Kopernikin və Galilei'nin müdafiə etdikləri dairəvi orbitlər xətalı çıxdı. Ümumiyyətlə bilmək lazımdır ki, o dövrdə yarışma sadəcə iki model arasında getmirdi. Tycho Brahe, Nicholas Reymers B□r, William Gilbert tərəfindən təqdim olunan modellər də var idi. Tycho'nun modeli semi-heliosentrik idi və orada

---

[332] Maurice A. Finocchiaro, "The Essential Galileo", səh: 147; Hackett Publishing Company, Cambridge, 2008
[333] John C. Lennox, "God's Undertaker: Has Science Buried God?", səh: 26; Lion Hudson, Oxford, 2009
[334] Roberto Casati, "Shadows: Unlocking Their Secrets, from Plato to Our Time", səh: 107-108, Vintage Books, New York, 2004.

Aydan və Yerdən başqa bütün səma cisimləri Günəşin ətrafında fırlanır, Günəş isə Yerin ətrafında fırlanırdı. Keplerin modeli Kopernikin modelindən daha mükəmməl idi, çünki orbitlərin elips formasında olduğunu göstərirdi. Lakin bu modellərin heç biri müasir zamanımızda əldə etdiyimiz məlumatlar işığında doğru deyildi, hər birinin xətası var idi. Cassini kimi yezuit təhsili görmüş digər alimlər də getdikcə heliosentrizmi qəbul etdilər. Ren Descartes (1596-1650), Pierre Gassendi (1592-1655), Ismael Boulliau (1605-1694) kimi fransız astronomları kilsə ilə çox sıx bağlı alimlər idilər və onlar Keplerin modelini müdafiə edənlər sırasına daxildirlər. Əgər İtaliyada kilsə bir qədər konservativ mövqe tutmuşdusa, digər ölkələrdə kilsənin mövqeyi liberal idi, hətta bu araşdırmalara himayədarlıq edirdi. Həqiqi tarixi araşdırma onu göstərir ki, kilsənin qadağasının astronomiyanın inkişafına təsiri çox zəif idi,[335] çünki kilsənin öz daxilindəki astronomlar belə eyni araşdırmaları, eyni metodları istifadə edirdilər və gec-tez nəticələr ortaya çıxmalı idi. John Lewis Heilbron təbiət elmləri sahəsində tarixi araşdırmalar aparmış amerikalı tarixçidir və ən çox fizika və astronomiya sahələrində yazdığı tarixi kitabları ilə tanınır. California, Berkeley universitetində həm tarix professoru kimi çalışan, həm də vitse rektor olan Heilbron bununla yanaşı Oxford, Yale kimi universitetlərdə qonaq professor kimi fəaliyyət göstərir. Onun "The Sun in The Church: Cathedrals as Solar Observatories" adındakı kitabını Harvard universitetinin nəşriyyatı çap edib. Kitabını Heilbron bu sözləri ilə başlayır: "Roman Katolik Kilsəsi ... altı əsr ərzində astronomiya elmlərinin öyrənilməsinə başqa hər hansı bir institutdan, hətta bəlkə də bütün digər institutların hamısından daha çox maliyyə və ictimai dəstək vermişdir."[336] Təbii ki, kilsə bu qədər maliyyə dəstəyini təbiət elmlərinə olan sevgisinə görə etmirdi, lakin bu təbiət elmlərindəki nəaliyyətlərdə dini ayinlər və rituallar üçün praktiki olaraq böyük bir əhəmiyyət görürdü. Professor Heilbron doxsanıncı illərdə Bologna şəhərindəki San Petronio basilikasından başlayaraq Avropanın digər şəhərlərindəki kilsələri ciddi bir şəkildə incələmiş, öyrənmiş və orada kilsənin himayəsi ilə dövrünün ən böyük günəş observatoriyalarına şahid olmuşdur.

[335] William J. Broad, "How the Church Aided "Heretical" Astronomy", New York Times, oct 19, 1999;

[336] John.L. Heilbron, "The Sun in the Church: Cathedrals as Solar Observatories", səh: 3; Harvard University Press, Cambridge, London, 2001

## HITCHENS TEOLOQ KİMİ

"*Ateist üçün ən dözülməz an, onun həqiqətən də şükr etmək istədiyi və şükr etmək üçün heç kimsəsinin olmadığı andır.*"

Dante Gabriel Rossetti

London Illustrated News qəzetinin 1905-ci il, dekabr ayının 5-ində nəşr edilmiş sayında "Təhsil və Nağıllar" başlıqlı bir məqalə dərc edilmişdi. Məqalənin müəllifi ingilis yazıçı filosof Gilbert Chesterton dövrünün təhsil anlayışını tənqid edirdi. Ona görə təhsil, elmin və biliyin obyekti deyil, sadəcə olaraq biliyin növbəti nəsilə necə keçdiyini ifadə edir. Bu məqalənin tətiyini çəkməyə onu vadar edən isə Somerset hersoginyasının məktəbləri ziyarət edərək yaydığı bir fikir idi : uşaqlara nağıl öyrətmək "ağılsızlıqdır", onlara "Julius Caesar" və "digər görkəmli şəxsiyyətlər" haqqında öyrətmək lazımdır. Chesterton'un bu boş, amma çox populyar təklifə qarşı etiraz etməməsi çətin alınacaq bir iş idi. "Mədəniyyətlər dəyişir," o yazırdı, "amma nağıllar heç bir zaman dəyişmir." O öz fəlsəfəsini növbəti sətrlərdə ifadə edirdi: "Somerset hersoginyasının yaşadığı fiksiya, müasir fantaziya və bütün o yabanı dünya yalnız bir ibarə ilə təsvir oluna bilər. Onların fəlsəfəsi fövqəladə insanların baxışı ilə görünən *adi şeylərdir*. Nağıllar isə adi insanların baxışı ilə görünən *fövqəladi şeylərdir*." Ona görə nağılların öyrətdiyi həqiqətlər heç də tarixi şəxsiyyətlərin həyatından götürə biləcəyimiz həqiqətlərdən geri qalmırdı.[337] Çünki "nağıllar uşaqlara əjdahaların mövcud olduğunu öyrətmir. Uşaqlar onsuz da əvvəldən əjdahaların olduğunu bilirlər. Nağıllar uşaqlara əjdahaların da öldürülə biləcəyini öyrədir."[338] Hersoginya öz dövrünün təhsilini görmüş bir qadın idi və cəmiyyətdəki təsəvvürləri dəyişməyə səy göstərirdi. Həqiqət budur ki, hər bir cəmiyyətin ən yüksək təhsilini almış insanlar işin təməlində yenə də insan kimi qəbul edilməlidirlər. Onların bir çoxunun rəylərini formalaşdıran təkcə təhsil deyil, həmçinin şəxsi həyat təcrübələridir.

[337] James V. Schall, "Schall on Chesterton: Timely Essays on Timless Paradoxes", səh: 8-10; The Catholic University of America Press, Washington, 2000

[338] Heather Haupt, "Knights in Training: Ten Principles for Raising Honorable, Courageous and Compassionate Boys", səh: 48; Penguin Random House LLC, New York, 2017

Doğru təhsilin önəmi də məhz burada özünü göstərir. Chesterton'a görə "təhsil olmazsa təhsilli insanları ciddiyə almaq kimi dəhşətli və ölümcül bir təhlükə ilə üzləşərik."[339] Çünki bir ziyalının rəyinin keyfiyyətli bir təhsildən *yoxsa* şəxsi subyektiv həyat təcrübələrindən qaynaqlandlığını ayıra bilmək üçün özünün də təhsil sahibi olmağın lazımdır. Bir çox hallarda ziyalı rəyi olaraq təqdim olunan fikirlər qərəzli fikirlərdən *başqa bir şey deyildir. Bizim Hitchens'in ateistik* qənaətləri də tamamilə dinə qarşı hiss etdiyi duyğular üzərində qurulub və heç bir həqiqi akademik bir dəyər daşımır. Bir çox yerdə on doqquzuncu əsrin pozitivistlərinin tüpürdüklərini təzədən ağzına atıb çeynəməyə çalışır.

Musa peyğəmbərə *verilmiş on* sərəncamı müzakirəyə çıxardıqdan sonra Hitchens maraqlı şərhlərə yer verir. Bu on sərəncamdan biri olan "sən qətl etməyəcəksən" qadağası barəsində deyir: "Bir kimsə yəhudi ənənəsinə nə qədər az dəyər versə də Musanın xalqının o vaxta qədər qətl, zina, oğurluq və yalandan *şahidliyin icazə*li olduğuna inanaraq gəldiklərini təsəvvür etmə*k şübhə*siz ki, onlara qarşı təhqiramizdir."[340] Eyni məntiqi İsa peyğəmbər üçün də *işlə*dir. İngilis jurnalistlərinin ziyalılarından olan Hitchens bu qadağaların üzərinə belə primitiv bir etiraz gə*tirib. Düşünün! Belə* bir etirazın burada ümumiyyətlə yeri varmı? İslam dini də özünü Adəm peyğəmbərdən başlamış vəhyin davamı, daha dəqiq desək vəhy zəncirinin sonuncu halqası kimi görür. İslam dini də qətl etməni qadağan edir, bununla belə əvvəlki vəhylərdə də ölümün qadağan edildiyini vurğulayır. Qadağanın gəlməsi heç də hə*r zaman bir şeyin daha* əvvəldən icazəli olmasını tələb etməz. Yəhudilər Musadan da əvvəl öldürmənin qadağan olduğunu bilirdilər və yəhudilikdə qadağalar sadəcə bu on sərəncamın içindəkilər ilə məhdud deyildir və məhdud olması da nəzərdə tutulmayıb. Lakin daş lövhələrdə *Musaya verilmiş* bu on sərəncam – Bibliyaya görə - Rəbbin ən əzəmətli göstə*riş*ləridir. Beləliklə də bir peyğəmbərə nazil edilən vəhy əvvəlki qadağanı təkrarlaya bilər və bunda bir qəribəlik görən ağıllara təəccüblənməmək olmur. "Nəhay*ət şə*r əməlləri qınamaq yerinə" – Hitchens əlavə edir – "burada pak olmayan fikirlərin də məzəmməti qəribə bir ifadə ilə yer alır. Bunun da iddia olunan yerin və zamanın insanları tərəfindən uydurulduğunu demək olar, çünki qadını da *qonşunun* heyvanı, köləsi və maddi əşyaları ilə eyni sıraya daxil edir."[341] Burada nəyi qəsd etdiyini anlamaq çətin deyildir. Tövratdakı əhkamın heç birinin ilahi qaynağının olmadığını sübut etmə*k üçün bu* şəkildə onları olduğundan fərqli bir mənada çatdırmağa çalışır. Qadını da necə heyvanlarla, kölələrlə bir sırada saymaq olar?! Bununla on sərəncamdan sonuncusunu qəsd edir: "Qonş*unun evinə* tamah salmayacaqsan! Qonşunun arvadına, quluna, qarabaşına, öküzün*ə, eş*şəyinə - *heç bir şeyinə* tamah

[339] "Collected Works of G.K. Chesterton", səh: 71; Ignatius Press, 1986
[340] GIG, səh: 99;
[341] Səh: 100

salmayacaqsan!" (Çıxış, 20:17) Təsəvvür edin ki, Azərbaycan kimi partiarxal bir cəmiyyətdə din xadimləri kişilərə müraciət edərək deyir: "Qardaşlarınızın arvadlarına, mallarına, mülklərinə göz dikməyin, tamah salmayın!" İngilislər də qəzetlərində bu din xadimlərindən sitat gətirərək "*azərbaycanlılar qadınlarını maddi əşyalarla, ev inventarları ilə eyni sıraya qoyurlar*" başlığı altında məqalə dərc edirlər. Sizcə cəmiyyətimizi tanıyan insanlar bu iddiaya necə cavab verəcəklər? Həqiqətən də bu cür cümlələrdən qadınlarla əşyaların eyniləşməsi mənasını çıxarmaq olarmı? Bir ingilis beyni üçün mümkündür, çünki o, bu cümlələrdən əlavə məna başa düşdüyü üçün belə bir nəticə çıxarmır, əksinə cümləni məzmunundan kənara çıxardığı üçün bu cür absurd şərhlər yazır. Halbuki hamımız bilirik ki, qadınlarımız bizim üçün namusumuz, şərəfimizdir. Heç bir şəkildə qadınlarımızı maddi dəyərlərimizlə eyni səviyyəyə gətirmərik. Kaş ki, iş burada bitsəydi! Hitchens'in şərhləri daha da qəribələşir. Ona görə başqasının arvadına, mülkünə tamah salmağı qadağan etmək nəinki "mənasızdır", hətta ona görə başqasının arvadına, mülkünə tamah salmaq yaxşı bir şeydir. O bu fikrini belə ifadə edir: "Bir kimsəni şərir əməllərdən məcburi şəkildə uzaq tutmaq və ya onları etməsinin qarşısını almaq mümkündür, amma insanlara bu barədə düşünməyi qadağan etmək isə işin ağını çıxarmaqdır. Xüsusilə də başqalarının mülkünə və uğurlarına həsəd aparmağın qarşısını almağa ümid etmək absurddur; ən azından ona görə ki, həsəd ruhu rəqabətə və ambisiyaya gətirib çıxara və nəticədə müsbət nəticələr verə bilər." Burada nə deyəcəyimə bir qədər tərəddüd edirəm. Bir anlıq bunun ciddiyyətlə yazılmış bir fikir ola biləcəyinə özümü inandırmağım çətin gəlir. Ancaq bir təəssüf hissi ilə bu müəllifin qələm sadizmi ilə barışmalı oluram. Amma onun Bibliyadakı sözlərdəki mənadan bu qədər uzaq düşməsinin səbəbini ədəbiyyatdan, üslublardan cahil olmasında görmürəm, çünki adam publisistdir, yazıçıdır, ingilis dilinin ədəbiyyatını yaxşı bilir. Görə bildiyim yeganə izah bunun dini antaqonizm ilə bağlı olmasıdır. Normal bir dərrakə sahibi bir insan üçün bu sözlərdəki məna oxuyan kimi zehnində problemsiz şəkildə oturuşacaq. Dini kitablarda keçən bu cür qadağalardan belə şişirdilmiş, təhrif edilmiş mənalar çıxarmaq üçün Hitchens olmaq şərtdir. Rəbbin tələb etdiyi başqasının malına göz dikməmək və həsəd aparmamaqdır, yoxsa qibtə etmək qadağan edilmir. İstədiyin qədər xəyal qurub başqasındakı maddi imkanların və sevgi münasibətlərinin eynisini əldə etməyin yolunu planlaşdıra bilərsən. Bu minvalla o amala çatmaq üçün rəqabətə girə bilərsən. Bu tamamilə fərqli bir haldır. Tövratda keçən o sətrləri məqsədli şəkildə təhrif etmək istəsəydin yalnız bu qədər uğurlu ola bilərdin.

Tövrat əleyhində qurduğu arqumentlərin bir çoxu bu cür mənasız etirazlarla dolu olsa da ümumilikdə bir çoxu haqlıdır. Bart Ehrman'ın qələmə aldığı "*Misquoting Jesus*" kitabını oxuyan hər bir kəs – təəssübkeş xristian olmadığı

müddətdə - bu arqumentlər ilə razılaşmağa özünü məcbur hiss edəcək. Hitchens uzun cümlələr ilə bu gün əlimizdəki "Tövrat" kitabının, o cümlədən İncilin necə təhrif edildiyini izah edir və ağla batan misallar verir. Müasir tariximizi istisna etdikdən sonra deyə bilərik ki, yəhudilər əsrlər boyunca Tövratı hərfi mənada ilahi kitab hesab ediblər; yəni onun hər bir ayəsinin ilahi vəhy olduğunu qəbul ediblər. Görkəmli yəhudi filosofu Musa bin Məymun (Maimonides) miladi təqvimlə 1190-cı ildə yazdığı "Dələlətul-Həirin" kitabında yəhudiliyin təməl iman əsaslarını sayarkən Tövratın tam şəkildə Musaya vəhy yolu ilə verilməsini də qeyd edir. Əsrl*ər boyunca bu yanaşma y*əhudilikdə ortodoks mövqe olaraq qəbul edilib. Bu gün bu mövqeni d*əyişmiş y*əhudilər bunun tarixi köklərini axtararkən yəhudi filosofu və tövrat alimi İbrahim ibn *Əzra'dan (1089*-1167) uzağa gedə bilmirlər.[342] İbn *Əzra*'nın isə öz növbəsində bu fikirləri müsəlman müəlliflərin kitablarından təsirlənərək yazdığı deyilir.[343] İbn *Əzra (Abenezra)* Bibliyadan bəzi yerləri müzakirə edərkən onların Musa tərəfindən yazıla bilməyəcəyinə *işarə* edir. On dördüncü əsrin ikinci yarısında yaşamış bir başqa yəhudi alimi Joseph Ben Eliezer Bonfils böyük bir təfsir kitabı yazaraq İbn *Əzra'n*ın sözlərini bu m*ənada şərh etmişdir*. Baruch Spinoza (1632-1677) öz fəls*əfi düşüncə*lərini müdafiə edərkən Tanax kitabının[344] vəhy olmadığını və Musa peyğəmbər tərəfindən yazılmadığını isbat etmək üçün İbn *Əzra'n*ın əsərlərindən istifadə edirdi.[345] Spinoza fikirlərinə görə *Hollandiyada yaşayan por*tuqaliyalı yəhudi icması tərəfindən ekskommunikasiya *edilmişdi; ondan f*ərqli olaraq İbn *Əzra tövrat*ın avtoritetini sorğulamırdı. Lakin istənilən halda Tanaxın bəzi hissələrinin iddia olunan peyğəmbərlər tərəfindən yazılmamış olması ideyası yəhudi yazıçıların kitablarında belə öz təsdiqini tapırdı. David Kimhi (1160-1235) bu barədə ən geniş materialı hazırlamış qədim yəhudi alimlərindən biridir. Əksər tarixçilər bu misalları kritik Bibliya araşdırması kimi dəyərləndirmirlər; onların nəzərində kritik Bibliya araşdırmaları Maarifçilik dövrünə və ya erkən İntibah dövrünə *düşür. Menahem Haran qeyd edir ki,* "Avropa İntibahının oyanış ərəfəsində ortaya çıxmış kritik Bibliya araşdırması yeni bir təzahürdür və bunun ilk qığılcımları üçün talmudik və ya orta əsr müdriklərin sözlərini axtarmaq *əbəs iş olacaq."*[346] Lakin Hitchens tövratın müəllifliyi

---

[342] Roger Brooks & John J. Collins, "Hebrew Bible or Old Tastement? Studying The Bible in Judaism and Christianity", səh: 119; University of Notre Dame Press, Notre Dame, Indiana, 1990

[343] Hava Lazarus-Yafeh, "Intertwined Worlds: Medieval Islam and Bible Criticism", səh: 73-74; Princeton University Press, New Jersey, 1992; Bu kitabda müəllif çox məharətlə *nümayiş etdirir* ki, Bibliya m*ətnini ilk kritik* şəkildə analiz edən müəllif müsəlman alim İbn Həzm olub. Müəllifə görə İbn Həzm və onun kitablarından faydalanmış Səməv'al əl-Məğribi öz yazdıqları vasitəsi ilə İbrahim ibn *Əzra'ya t*əsir edə biliblər.

[344] Tanax, yəhudilərdə Bibliyanın adıdır.

[345] Yitzhak Y. Melamed & Michael A. Rosenthal, "Spinoza's Theological-Political Treatise: A Critical Guide", səh: 47-49; Cambridge University Press, New York, 2010

[346] Sara Japhet, "Studies in Bible", səh: 31; Magnes Press, Qüds, 1986

mövzusunda bu adları sitat gətirməyə ehtiyac görmür, onun öz qəhrəmanı var: Thomas Paine. Hitchens'in Paine kimi bir şəxsiyyətə olan hörməti onun inqilabçı fikirlərindən çox bəlkə də ona özünü qismən xatırlatmasına görədir. Hitchens də onun kimi Amerikaya köçmüş ingilis mütəfəkkir, siyasi aktivist idi. Amma ondan fərqli olaraq Paine bir deist idi, yaradıcı Tanrıya inanırdı. On səkkizinci əsrin törəməsi olan Paine'in xristianlığı, xristianlığın müqəddəs mətnlərini tənqid etməsində qeyri-adi heç bir şey yoxdur. Onun zamanında artıq belə bir mətn tənqidi mövcud idi, ingilis dilində bir çox tərcümələr var idi və din əleyhdarı sentimentlər dövrün intellektualları nəzdində vüsat tapmışdı. İstər Davim Kimhi'nin, istər Thomas Paine'ın yazdıqlarına əsaslansan, hər bir halda varacağın nəticə bu olacaq ki, Bibliyanın bir çox kitabına iddia olunan müəlliflərdən sonra yaşamış insanlar tərəfindən əlavələr edilmiş və onların Allahın qatından olduğu iddia edilmişdi. Bunun üzərində bir az fikirləşməyə və daha sonra növbəti sətrləri oxumağa dəyər: "**Vay o kəslərin halına ki, Kitabı öz əlləri ilə yazıb sonra bir az pul almaqdan ötrü: "Bu, Allah tərəfindəndir!" – deyirlər. Öz əlləri ilə yazdıqlarına görə vay onların halına! Qazandıqları hər şey üçün vay onların halına!**" (2:79) Qurandan bu ayələri oxuduğunuzda ağlınızdan nə keçdiyini bilmirəm. Quranın Allahın yox, Muhəmmədin sözü olduğuna inanırsızsa o zaman qəbul etməlisiz ki, oxumaq-yazmaq bilməyən, ibrani və arami dillərində danışmayan yeddinci əsrin insanı, bir başqa dinin müqəddəs mətnlərini çox doğru bir şəkildə tənqid edib. Yalnız üstündən əsrlər keçdikdən sonra mütəxəssislər bu həqiqəti təsdiqləyə biliblər. Bart Ehrman kimi bibliya alimlərinin bunu görməsi üçün illər boyunca Bibliya tədqiqatı ilə məşğul olması, linqvistik analizlər etməsi, bibliya tarixini incələməsi lazım gəldi. Bəs on dörd əsr bundan əvvəl yaşamış İslam peyğəmbəri hansı imkanlarla dini bir kitabın təhrif edildiyini iddia edə bilmişdi?! Həqiqət budur ki, bütün bunlarda bizi düşündürəcək ibrətlər vardır, amma təəssüf ki, Hitchens ucuz mal axtarışındadır, ona görə də bir çox şey gözünün qarşısında olduğu halda görə bilmir. Ona görə də dinləri tənqid edərkən bu təəccüblü fakta heç bir diqqət çəkmir, bu barədə heç bir söz etmir və buna izahat gətirməyə çalışmır.

Bu gün "tövrat" adı ilə bizə təqdim olunan kitabı tənqid etdik. Onun mətnində dəyişikliklərin baş verdiyini qəbul etdik. Hitchens orada durmur, iştahası onu daha da irəliyə götürür. O, ümumiyyətlə bütün bu dini məntlərin əfsanə olduğunu, tarixi bir həqiqətinin olmadığını deyir. "(Misirdən) Çıxışda təsvir edilmiş qorxunc və qarışıq hadisələrin heç birinin baş vermədiyi aşkardır. İsrailli arxeoloqlar dünyanın ən professionalları arasında yer alırlar... Yer qazanlar və alimlərdən ibarət qruplardan heç biri Sinayın və Kənanın qumlarını ələkdən keçirmiş israillilər qədər zəhmət ilə və ya onlar qədər böyük gözləntilər ilə çalışmayıb... Lakin onların

gəldikləri nəticə... (budur ki,) Misirdən heç bir qaçış olmayıb, s*əhrada yürüyüş* olmayıb..."[347] Qısacası arxeoloqlar qazıntılar ilə belə bir köçün, yəni Misirdən Kənan ərazisinə *köçün baş verdiyini sübut etməy*iblər. Buradan çıxış edərək *Hitchens bunun baş verm*ədiyini deyir, bunun bir əfsanə olması qənaətinə gəlir. Ədalət üçün etiraf edək ki, Hitchens bu iddiasında tək deyildir. Tamamilə müxtəlif cərəyanları təmsil edən insanlar bu iddiaların eynisini söyləyiblər. Kitabı oxuyanlar bu cür iddialar ilə qarşılaşdıqlarında ortaya qoyulan nəticənin sadəcə Hitchens'in qənaəti olmadığını, əksinə arxeoloqların elmi qənaəti olduğuna aldanırlar. Amma əslində bir tarixi hadisənin arxeologiyada hələ də təsdiqini tapmaması onun baş verməməsi anlamına gəlməz. Bu, çox sadə bir məntiqdir. Həm Bibliya, həm də Quran yəhudil*ərin qrup* şəklində Misirdən köçərək Kənan ərazilərinə yerləş*diyini* xəbər verir. Lakin Qurandan fərqli olaraq Bibliya bu köç edən qrupun sayında çox mübaliğə edir; həmin köçdə altı yüz min döyüşçü ərin olduğunu deyir. Bu rəqəmə əsasən qadınlarla və *uşaqlarla birlikdə* köçün ən azından iki milyon insandan ibarət olduğunu söyləməli olublar. Bu, inanılmaz dərəcədə böyük bir rəqəmdir və bəlkə də o dövrün Misirindəki əhalinin yarısını təş*kil edir. Ona görə* də arxeoloqlar bunu təsdiqləməyiblər deyildikdə, iki-üç milyonluq insan kütləsinə dəlalət edəcək tapıntıların olmadığı qəsd edilir. Çünki iki-üç milyonluq bir köç, səhrada hərəkət etdikdə mütləq özlərindən sonra ciddi izlər qoymalıdırlar, heyvanlarının, ərzaqlarının saxlamaq üçün ciddi tədbirləri olmalı idi. Üstəlik bu qədər insan birdən birə bir ölkəni tərk edərsə bunun tarixi qeydlərdə sözü keçmədən *baş verm*əsi – adətən - mümkün deyildir. Ona görə də bəzi bibliya alimləri köçdə altı yüz min döyüşçünün deyil, altı min döyüşçünün iştirak etdiyini, beləliklə də bütün köçün təxminən iyirmi min nəfərdən ibarət olduğunu deyiblər.

Bibliya alimləri arasından xüsusilə ateist olanlar Musanın tarixi şəxsiyyət olduğunu inkar edirlər. Bibliya kitabındakı bu cür xətalara əsasən h*ər bir şeyi inkar* etmək elmdən uzaq bir metoddur. Biz kitabın özündə Musanın tarixi bir şəxs olduğunu göstərəcək kifayət qədər dəlil görə bilirik. Misal üçün Musa adı əslən bir misirli adıdır, yəhudi adı deyildir. Bibliyada bu belə ifad*ə edilir: "Uşaq böyüdü və* qadın onu firon qızının yanına apardı. Fironun qızı uşağı oğulluğa götürdü. O, uşağın adını Musa qoyub dedi: "Oğlanı sudan çıxartdığım üçün ona bu adı qoydum." (Çıxış, 2:10) Bibliyadakı iddiaya görə Musanın adı "sudan çıxarılmış" mənasını verir. Lakin bu gün bu adı yəhudi dili ilə izah etmək bir çox problemlərlə üzləş*ib. Dil aliml*əri ibrani dilindəki "Moşeh" (Musa) adının qrammatik olaraq "sudan çıxarılmış" mənasında anlaşıla bilməyəcəyini deyirlər, daha doğru məna "suda çıxaran" olmalıdır. Sigmund Freud "Moses and Monotheism" kitabında bu məqama toxunaraq haqlı olaraq deyir: "İbrani etimologiyası ilə bağlı bilgiləri Misir

[347] Səh: 102;

*şahzadə*sinin adına yazmaq mənasızdır."[348] Kişi haqlıdır. Misir şahzadəsi uşağa nə üçün ibrani dilində bir ad qoysun ki?! Növbəti səhifədə Musa adının qədim misir dilində *"uşaq" mə*nasını verdiyini inandırıcı arqumentlər ilə *nümayiş etdirir.* "Amenmose", "Ptahmose" kimi misir adlarındakı "mose" birlə*şməsini "uşaq"* mənası ilə izah edir. O zaman belə bir sual üzərində *düşünməyə* dəyər. Tövratı "uyduran" müəllif nə üçün ona misirli adı verib sonra ibranicə izah etmək cəhdi ilə özünü əziyyətə, hətta ziddiyyətə salmış olsun?! Aşkar görünən budur ki, misirli adın sahibi və fironun sarayında böyümüş Musa, kölə halına düşmüş yəhudiləri Misir torpaqlarından qurtardığı üçün bir qəhrəmana, bir lider*ə çevrilmişdir. T*əbii ki, tövrata *əlavələr etmiş müə*lliflər Musanın həyatında bəzi məqamlara izah gətirməyə ehtiyac duyublar və onun misirli adını ibranilə*şdirməyə* çalışıblar. Bu, Musanın uydurulmuş bir şəxsiyyət olduğunu yox, real *tarixi bir ş*əxsiyyət olduğunu göstərir. Köç hadisəsinin də *baş verdiyini başqa yollarla sübut etmə*k mümkündür. Yəhudilərin Misirdə olduğuna dair kifayət qədər tarixi dəlillər mövcuddur. Xüsusilə də yəhudilərdən levilər qəbiləsi Misiri tərk edənlər olublar, çünki tövratda levilərin arasında misirli adların olması diqqətə layiqdir. Musa özü də levili olaraq təsvir olunur. Digər misirli adlar arasında İlyanın iki oğlu Finhəs və Hofni də keçir. Ümumiyyətlə Bibliyada təsvir olunan Misir, miladdan əvvəl 15-ci və 13-cü əsrin Misirini maraqlı bir şəkildə vəsf edir və qeyd edilən bəzi detallar bu tövrat mətnlərinin qədim mənbəyə dayandığını göst*ərir. Başqa sözlə* desək Misiri vəsf edənin bunu bu qədər gözəl bacarmasını şahidlərdən başqaları ilə izah etmək çətindir.

Arxeoloji qazıntılara gəldikdə isə elə bu sətrləri yazdığım ərəfədə İordan çayının şərqində yerləşən Xirbət əl-Məstəra adlı yerdə bununla bağlı çox önəmli yeniliklərin xəbəri yayılır. Ariel universitetind*ən David Ben Şlomo və* Averett universitetindən Ralph Hawkins'in apardığı bu arxeoloji tədqiqatlar potensial bir sübut kimi təqdim olunur.[349] Daşlarla qurulmuş divarlar divar sayılmayacaq qədər alçaq görünürlər,bu səbəblə onların hasar olduğunu deyirlər. Çox ehtimal ki, heyvanları bir yerə toplamaq üçün nəzərdə tutulub. Buna görə də saxsı qablar o daş hasarın içərisində yox, çölündə tapılıb. Görünür ki, nə Sinayın, nə də Kənanın qumları hələ tam ələkdən keçirilməyib. *Əslində* qazılacaq, araşdırılacaq yerlər qat-qat çoxdur və bu gündən sonra nələrin üzə çıxacağı hələ də məlum deyildir. Hitchens də bir çox ateistlər kimi nəticə çıxarmağa tələsir və əsaslandırılmamış nəticələr çıxarırlar.

[348] Sigmund Freud, "Moses and Monotheism", səh: 12; The Hogarth Press and The Institute of Psycho-Analysis, 1939, The Garden City Press, Letchworth, Hertfordshire
[349] https://www.express.co.uk/news/world/1022585/exodus-bible-proof-israelite-jordan-ruins-sinai-egypt

Hitchens'in köhnə əhdə münasibəti yeni əhdə münasibətində də *eyni şiddə*t ilə özünü büruzə verir. Tövratın təhrif olunduğunu, onun iddia olunan əsrdən sonra *başqa mü*əlliflər tərəfindən yazıldığını vurğuladığı kimi İncil haqqında da eyni *şeylə*ri söyləyir. Burada da biz Hitchens'i haqlı hesab etdiyimizi deyəcəyik. Təhrif olunmuş Tövratı ələ alarkən Thomas Paine'in dilindən danışırdı, burada isə Henry Mencken'i (1880-1956) danışdırır. Hitchens'in təqdimatında Mencken bir qəhrəmandır, sağlam düşüncənin təmsilçisidir, insanlığın çox saylı xilaskarlarından biridir, çünki dinin "zülmünə" qarşı mübarizə aparmış insanlardandır. Mencken'i "daha yaxşı yazıçı", "səmimi əmək" sahibi adlandıqdan sonra Hitchens eyni səhifədə *bir hollivud aktyorunu dişlə*rinin arasına alır. Mel Gibson'u "faşist", "bacarıqsız aktyor", "anti-semit" adlandırır. *Əlbə*ttə ki, Hitchens bunu "qərəzsiz" niyyət ilə *edir, başqa cür necə düşünmə*k olar?! Biz bilirik ki, Gibson dindar xristiandır, xristian inancına əsasən İsa peyğəmbərin məruz qaldığı işgəncələr barəsində çox həssas bir film çəkib. Mencken isə nə qədər yaxşı ədəbiyyat kritiki olsa da onun rasist, antisemit olduğu sənədlə*şdirib və* Hitchens'in bundan xəbəri olduğundan əminəm. *Mencken'in antisemitizmini, irqçiliyini ifşa edə*n kitabı nə*şr* edən yayın evi elə Mencken'in öz kitablarını nə*şr edə*n və bir zamanlar direktoru çalışmış Knopf nəşriyyatı oldu. *Onun* şəxsi gündəliklərini kitab formasında 1989-cu ildə çapa hazırlamış Charles Fecher daha əvvəllər onu antisemitizm ittihamına qarşı müdafiə edənlərdən idi; 1978-ci ildə yazdığı "Mencken: A Study of His Thought" kitabında ona bəraət qazandırır. Amma onun şəxsi gündəliyi ilə tanış olduqdan sonra tərəddüd etmədən elan edir: "Qoy bir dəfəlik, aydın və şəkk *buraxmayacaq* şəkildə bilinsin ki, Mencken antisemit idi."[350] Mencken də ən az onun qədər dindarlara və dinə qarşı içində hiqd bəsləyən biri idi. İkinci Dünya müharibəsi ərəfəsində Knopf nə*şriyy*atının satış meneceri Bernard Smith dualar kitabı çap etməyi təklif edir. Mencken belə bir zərərsiz təşəbbüsə çox qəzəblənir və gündəliyində yazır ki, bu cür bir kitabı nə*şr etmə*k nəşriyyatın keyfiyyətini aşağı salır.[351] Sözün düzü Mencken'in antisemit və ya irqçi olması məni bir müsəlman kimi maraqlandırmır, oxucu üçün də bunun bir əhəmiyyət kəsb etdiyinə inanmıram. Sadəcə olaraq Hitchens kitabı boyunca dindar olan şəxsiyyətləri qaralamaqla, özü kimi antiteist olmaqla tanınmış kəsləri isə qəhrəman elan etməklə məşğuldur. Biz bu səmimiyyətsizliyə və ziddiyyətə diqqət çəkmək istəyirik. Yeni əhdi tənqid etmək, daha doğrusu alçaltmaq istəyən iradə bunun üçün Gibsonun antisemitizmini, aktyor bacarıqsızlığını vurğulamağı münasib görürsə nə *üçün Mencken kimi din dü*şməninin irqçiliyini, antidemokratlığını görməməzlikdən gəlir?! Hitchens'in tərif*lədiyi* şəxsiyyətin gizli ehtiraslarından xəbərsiz olmadığını

---

[350] Charles A. Fecher, "The Diary of H. L. Mencken", səh: xix; Alfred A. Knopf, New York, 1989
[351] Sheldon L. Richman, "*Journalism: Mr. Mencken and The Jews*", The American Scholar, cild: 59, say: 3, səh: 407-406; 1990-cı il

elə öz kitabından anlaya bilirik; bu müzakirədən təxminən 100 səhifə sonra onun bir Hitler simpatizatörü olduğunu etiraf. Lakin öz məqamında deyilməyən söz haqqını itirmiş bir sözdür. Üstəlik Hitlerlə siyasi danışıqlara girmiş katolik kilsəsinə qarşı "inkvizisiya" elan etdiyi halda Mencken'ə qarşı yönəltdiyi tənqid ciddiyyətdən tamamilə yoxsuldur.

Mencken'in yeni əhdə qarşı kritik yazılarından heç bir şey oxumamışam və nə qədər keyfiyyətli olduğunu deyə bilmərəm. Amma Hitchens'in bəzi tənqidlərindən onun primitiv biliklərdən o tərəfə keçmədiyi anlaşılır. İncillə bağlı biliklərini dəqiqləş*dirmə*diyini görmək olur: "Dörd (incil)in hamısının möhtəmələn əsaslandığı və alimlər yanında fərziyyə olaraq "Q" adı ilə tanınan kitab, əbədi *olaraq itirilmişdir…"*[352] Hitchens deyir. Bu sözləri ilə yeni əhd araşdırmalarında tanınan və "Q İncil" adını qazanmış proto mənbə haqqında məlumat verməyə çalışır; bəli, bu sadəcə olaraq bir fərziyyədir. German dilində mənbə mənasını verən "quelle" sözündə*n götürülmüş bu Q, mövcud incill*ərdəki bənzərliklər üzərində *qurulmuş bir f*ərziyyədir. Lakin yeni əhd alimləri dörd kitabın dördünü də o qaynağa bağlamayıblar. Kiçik bir araşdırma onu göstərir ki, Q incili Markın incilinə paralel bir mənbədir, yəni Markın incili Matta və Luka incilləri üçün qaynaq olduğu kimi bu Q incili də hər ikisi üçün qaynaq rolunu oynayıb. Bir sözlə Q incili Hitchens'in bildiyi kimi dörd incilin dördünün də əsasını tə*şkil etmir, sadə*cə olaraq fərz olunduğuna əsasən Matta və Luka'nın incilləri üçün qaynaq rolunu oynayıb və Mark'ın incilinə qaynaq hesab edilmir.[353] *Amma bir şeydə* haqlıdır ki, həmin o Q incili bizim zamanımızda mövcud deyildir. Bəlkə də nə zamansa tapılacaq, bəlkə də belə bir incil heç zaman mövcud olmayıb. Hitchens bunu qeyd edərək bu cür kitabların vəhy ola bilməsini inkar edir. Biz müsəlmanlar olaraq əlimizdəki dörd incilin vəhy olmadığına inanırıq. Lakin razılaşmadığımız nöqtə budur ki, bir kitabın tarixdə itməsi onun vəhy olmadığını sübut etməz. Ümumiyyətlə bu, müqəddimə ilə nəticə arasındakı məntiqi bağı göstərmədən edilmiş bir iddiadır. Bəli, bunlar xristianlığın universal bir missiya olduğunu iddia edənlərə qarşı tutarlı hesab edilə bilər, lakin İsa peyğəmbərin risaləsinin sadəcə lokal xarakter daşıdığına inanan müsəlmanlara qarşı ciddi bir arqument ola bilməz. Müsəlmanların dinində peyğəmbərlərin bir-birilərindən fərqli olduqları bildirilir, onların missiyaları hər bir *şeydə* eyni qəbul edilmir. Peyğəmbərlərin əksəriyyəti yalnız öz qövmünü, öz tayfasını, öz xalqını Allaha ibadət etməyə çağırmaq üçün göndərilib. Yenə müsəlmanların dini mətnlərində g*əlmiş m*əlumatlara əsasən peyğəmbərlərin bir hissə*si öldürülmüş,* digər hissəsi öldükdən sonra kitabları tə*hrif edilmiş,* d*əyişdirilmiş, insan* əlinin zülmünə məruz qalmışdır. *Hitchens başqa yerdə* Nag

[352] GIG, səh: 112
[353] David E. Aune, "The Blackwell Companion to The New Testament", səh: 312; Wiley-Blackwell, Malden, 2010

Hammadi kəndində tapılmış qnostik incillərin məşhur dörd incil ilə eyni zamanda yazıldığını iddia edir. Bu iddia da onun yeni əhd araşdırmaları barəsindəki qüsurlu təsəvvürünü göstərir.

## HITCHENS VƏ QURAN

"*Dərənin dibindən gördüklərinin nə qədər əzəmətli olduğunu görə bilirsən; təpədən baxdığında isə hər şey kiçik görünür.*"

Gilbert K. Chesterton

Xristianlığı tənqid edərkən Hitchens'in Bibliya araşdırmalarında bəzi bəsit xətalar etdiyini gördüyümdə ümumiyyətlə İslam, xüsusilə Quran haqqında nə dediklərini maraqla oxudum. Kitabının bir çox yerində etdiyi kimi mövzunun özəyini intellektual arqumentlər ilə müzakirə etmək əvəzinə bir sıra dağınıq, ziddiyyətli, təsdiqini tapmamış məlumatları oxucunun qarşısına atır. Əldə etmək istədiyi nəticə aydındır; yerə yıxmağa gücü çatmasa da palçığa bulaşdırmaqla ürəyini soyudur. İslamın ilk əvvəldən iki yerə bölündüyünü deyir, yəni siyasi parçalanma olaraq şiələrə və sünnilərə bölünməsini qeyd edərkən də eyni üslubdan istifadə edir. Bu kitabımızda sünni və şiə ayırımına aydınlıq gətirməyə ehtiyac görmürük, çünki insan faktorundan başqa bir şey deyildir və İslamın ana qaynağında sünni və şiə ayırımı yoxdur; xristianlarda katoliklərin müqəddəs kitabları protestantlarınkından fərqləndiyi halda İslamda sünnilər və şiələr daxil olmaqla bütün qrupların tək bir müqəddəs kitabı vardır və o da Qurandır.

Hitchens Quranın müsəlmanlar üçün əhəmiyyətini anladığı üçün onu hədəf alır. "Bəzi müsəlman alimlər tərəfindən deyilib ki" deyərək mövzuya giriş edən Hitchens nəql edəcəyi təsəvvürün yalnız müsəlmanlara aid olduğunu aşılamağa çalışır. Görək həmin müsəlman alimlər nə deyiblər: "… Muhəmmədin vəfatından dərhal sonra, ilk xəlifə Əbu Bəkrin zamanında onun şifahi nəql olunmuş sözləri unudula bilərdi. Döyüş meydanlarında o qədər müsəlman əsgərlər ölmüşdü ki, Quranı əzbərdən bilənlərin sayı təhlükəli dərəcədə azalmışdı. Ona görə də üzərində hikmətli sözlərin yazılmış olduğu "kağız parçaları, daşlar, xurma ağacının yarpaqarı, kürək sümükləri, qabırğalar və dəri parçaları" ilə birlikdə hər bir şahidi toplamaq və etibarlı bir müqayisə üçün onları peyğəmbərin keçmiş katiblərindən biri olmuş Zeyd bin Sabitə vermək qərarı alındı. Bu edildikdə möminlər

təsdiqlə*nmiş bir versiyaya sahib oldular.* Ə*g*ər doğrudursa bu, Quranın Muhəmmədin öz həyatına xeyli yaxın bir zamana təyin edəcək. Lakin biz dərhal öyrənirik ki, bu hekayənin doğruluğu barəsində bir razılıq və ya bir əminlik yoxdur. Bəziləri deyirlər ki, bu fikrin sahibi birinci yox, dördüncü xəlifə*, şi*əliyin banisi Ə*li* idi. Xeyli sayda başqaları isə - sünni əksəriyyət – bu son qərarı 644 ilə 656-cı illər arasında hakimiyyətdə *olmuş x*əlifə Osmanın verdiyini iddia edirlər. Generallarından birinin ona verdiyi xəbərə görə müxtəlif əyalətlərdən olan əsgərlər Quranın fərqli versiyalarına görə *vuruşurlar, Osman Zeyd bin Sabit*ə həmin müxtəlif mətnləri bir arada toplamağı, onları birlə*şdirm*əyi və onları bir nüsxəyə köçürməyi əmr etdi. Bu tapşırıq tamamlandıqda Osman əsas nüsxəni Mədinədə saxlamaqla standart nüxsələrin Kufəyə, Basraya, Dəmə*şq*ə və *başqa yerl*ərə göndərilməsini əmr etdi. Beləliklə də xristian bibliyasının standartlaşdırılmasında, təmizlənməsində və senzuradan keçməsində İrenaeus və İskəndəriyyənin *baş keşişi Athanasius* tərəfindən həyata keçirilmiş kanonlaşdırma rolunu (burada) Osman oynamış oldu. Səsə *qoyulmuşdu* və bəzi mətnlər müqəddəs və *qorunulmuş* elan olundu, digərləri isə "apokrif" hesab olundu. Osman hətta Athanasius'u da keçərək sabiq və müxalif versiyaların məhv edilməsini əmr etdi."[354] Hitchens'in təqdimatını olduğu kimi oxuculara çatdırmağa çalışdıq. Sözün düzü belə bir səthi "analizdəki" xətaların harasından başlayacağımızdan da əmin deyilik. Bu təqdimata inanmalı olsaq əlimizdəki Quranın vəziyyəti Bibliyadan da ağır olmalıdır. Hitchens eyhamlar və *işar*ələr ilə oxucuya çatdırmaq istəyir ki, Quran peyğəmbərin zamanında yazılı şəkildə mövcud deyildi və öldükdən sonra kimin tərəfindən ilk dəfə yazılı şəkildə toplandığı bilinmir. H*ər şeyd*ən əvvəl bilmək lazımdır ki, Quranın xurma yarpaqları, dəri parçaları, kürək sümüklə*ri, daşlar* üzərində peyğəmbərin zamanında yazılı olması, eləcə də vəfatından sonra Əbu Bəkrin xilafəti zamanında vahid bir kitab kimi toplanaraq yazılması müsəlman alimlər arasında ixtilaflı bir mövzu deyildir. Nə *şi*ələr, nə də sünnilər bu nöqtədə *münaqiş*ə etmirlər. Hitchens'in sözlərini oxuyanlarda elə bir təsəvvür formalaşır *ki, sanki şi*ələr – sünnilərdən fərqli olaraq – Quranın xeyli sonra, yəni dördüncü xəlifə *Əli bin Əbi Talib hakimiyy*ətə gəldikdə toplandığını deyirlər. Nə *keçmişd*ə, nə də müasir tariximizdə *heç bir şi*ə alimi belə bir iddia etməyib. B*əli, şi*ələrin arasında bəzilərinin Quranla bağlı absurd iddiaları var, amma onlar da ümumiyyətlə bu gün əlimizdə olan Quranın ilk dəfə xəlifə *Əbu B*əkr'in zamanında toplandığını qəbul edirlər.

Peyğəmbərin vəfatından sonra elə həmin il bəzi ərəb qəbilələri İslam dövlətinin idarəsindən çıxmaq istədiklərində tarixə "riddət müharibəsi" adı ilə *düşmüş* hadisələr başladı. Yəmə*m*ə *döyüşünd*ə Quranı əzbər bilən çox sayda qari

[354] God is not Great", səh: 131-132;

*öldürüldü. Hitchens'in iddia etdiyi kimi bu döyüşdə*n sonra qarilərin sayı təhlükəli dərəcədə azalmamışdı, çünki Quranı əzbərdən bilən səhabələrin sayı bir döyüşdə azalacaq qədər az deyildi. Hitchens'in iddiaları tarixi qaynaqlar tərəfindən dəstəklənmir. Sadəcə olaraq Ömər bin əl-*Xattab bu döyüşdə*n bir nəticə çıxardı və bu cür gələcək müharibələri də nəzərə alaraq Quranın bir kitab şəklində yığılmasının əhəmiyy*ətini başa düşdü. Xəlifə Əbu Bəkri bu işi hə*yata keçirməyə iqna etməyi bacardı. Bu vəzifəni həyata keçirmək Zeyd bin Sabit'ə tapşırıldı. Zeyd bu barədə deyir: "Beləliklə də mən Quranı xurma, kağız və ya dəri parçalarından, *nazik daşlardan,* xurma ağacının yarpaqlarından və insanların qəlblərindən topladım və mən "tövbə" surəsinin sonuncu ayəsini *Əbu Xuzeymə* əl-*Ənsari'nin* yanında tapdım. Ondan başqasının yanında tapa bilmədim… Quranın toplandığı mushaf ölənə qədər *Əbu B*əkrin yanında qaldı, sonra ölənə qədər Ömərin yanında qaldı, sonra isə Ömərin qızı Hafsa'da qaldı."[355] Daha sonra xəlifə Osmanın zamanında yenidən Quran bir neçə nüsxədə yazılarkən Hafsa'dan həmin mushaf tələb edildi. Hitchens bu tarixi hadisələri elə çatdırmağa çalışır ki, sanki Quranın ilk dəfə *Əbu B*əkrin zamanında yoxsa Osmanın zamanında yoxsa sonuncu xəlifə Əlinin zamanında yazılması barəsində fikir ayrılığı var. Halbuki İslam dünyasında hə*m şiə*lər, həm də sünnilər qəbul edirlər ki, Quran ilk dəfə xəlifə *Əbu B*əkrin zamanında, yəni peyğəmbərin vəfatının üstündən heç bir il keçmə*miş iki cild* arasında kitab formasında toplandı. Daha sonra Osmanın zamanında eyni vəzifə təkrarlandı. Quran yazılı şəkildə hələ peyğəmbərin sağlığında mövcud idi. Tarixi qaynaqlarda Ömərin necə müsəlman dinini qəbul etdiyini oxuduğumuzda öyrənmiş oluruq ki, bacısı Fatimə'nin müsəlman olduğunu eşidir və onun evinə basqın edir. Ömərin gəldiyini xəbər tutan bacısı qardaşının qəzəbindən qorxaraq oxuduqları, Taha surəsinin yazılı olduğu, səhifəni budunun altında gizlədir.[356] Hətta müsəlman tarixçilərin ittifaqını bir kənara qoysaq və Qərbin tənqidi yanaşmasına baxsaq yenə də Quranın erkən bir zamanda toplanmış olduğu öz təsdiqini tapır. Şotlandiyalı orientalist Sir William Muir (1827-1905) deyir: "Vəhy zamanında və ya ondan qısa müddət sonra hər bir (Quran) parça(sı) Muhəmməd tərəfindən onun hüzurunda olan dostlarının və davamçılarının qarşısında oxunardı və ümumən onlardan biri tərəfindən elə həmin vaxtda və ya bir az sonra ələ keçən xurma yarpaqları, d*əri, daşlar və* bunun kimi kobud materiallar üzərində yazıya köçürülərdi… Lakin (Quranın) tərkibi peyğəmbərin sağlığında tam şəkildə sistematik olaraq tərtib olunmamışdı və bir arada toplanmamışdı. Orijinal yazıların necə qorunulması barədə bizim məlumatlarımız yoxdur… Amma Quranın tamamını və ya tamamına yaxın bir hissəsini əhatə edən fraqmentar nüxsələrin peyğəmbərin sağlığında onun səhabələri tərətindən yazılmasına inanmaq üçün

---

[355] "Sahih əl-Buxari", 4679
[356] Bax: Əhməd bin Hənbəl, "Fədailus-Sahabə", 371;

kifayət qədər yaxşı səbəblər vardır." Muir ərəblərin arasında oxuyub yazanların çox olduğunu, Quranın da surələrinin yazılı olduğunu əqli analiz ilə oxucusuna təqdim edir. *Ərəblər əgər ən məşhur şerlərini* yazıb bölüşürdülərsə Allahın sözü olduğuna inandıqları Quranı niyə yazmayacaqdılar ki?! Üstəlik hər dəfə uzaq bir qəbilədən nümayəndə gəldikdə Muhəmməd onlara öyrətmək üçün Quran müəllimi və ya Quran nüsxəsi göndərərdi. Daha sonra deyir: "Yalnız Müseylimə devrildikdən sonra, Yəməmə'də müsəlmanlar arasında böyük q*ətliam baş* verdikdən və Quranın ən yaxşı qarilərindən xeyli sayda insan öldürüldükdən sonra Ömərin ağlında bütün hafizlərin ölməsi halında mətn ilə bağlı yaşanacaq əminsizlik barəsində bir tərəddüd ortaya çıxdı. Xəlifə *Əbu B*əkrə xitab edərək - "qorxuram *ki, başqa döyüşlər*də də qətliam, hafizlərin arasında qızğın atəş kimi yayılsın və *bununla da çox şey itsin!"* - dedi." Beləliklə də Muir də ənənəvi tarixi xəbərləri təsdiqləyir, *Əbu B*əkrin zamanında Quranı toplamaq işinin Zeydə tapşırıldığını qeyd edir və sonra deyir: "Bu misalda göstərildiyi kimi Zeydin topladığı Quran xəlifə Ömərin zamanında da standard və mötəbər tekst olmağa davam etdi."[357] Nəzərə alın ki, Muir və qarşıda adlarını qeyd edəcəyim qərbli, qeyri-müsəlman alimlər İslam dünyasına və müsəlmanların müqəddəs mətninə tənqidi gözlə yanaşırlar. Bu o deməkdir ki, əgər Quranı və onun s*əhihliyini şübhə* altına almaq üçün tutarlı bir səbəb görsələr bunu əldən verməyəcəklə*r. Bir başqa q*ərbli alim Theodore Nöldeke (1836-1930) 1860-cı ildə n*əşr etdiyi "Geschichte des Qorans"* kitabında Quranın peyğəmbərin sağlığında ayrı-ayrı parçalarda yazılı olduğunu inkar etmir. Bununla yanaşı *Əlinin belə* bir Quranı müst*əqil* şəkildə toplaması ilə bağlı xəbərlərə gəldikdə isə "bu xəbərlərin tərkib cəhətdən tarixin bütün sağlam faktları ilə ziddiyyət t*əşkil*" etdiyini deyir. Ona görə "Əli nə xəlifə olduğu zamanda, nə də ondan əvvəl özünün topladığı Quranı heç bir yerdə qeyd etmir."[358] Quranın Osmandan öncə *tam* şəkildə yazıya köçüldüyünü də qəbul edir, lakin bunun Əbu Bəkr'in yoxsa Ömərin xəlifəliyi dövründə *baş verm*əsində tərəddüd edir. Bunun üçün bir neçə səbəb göstərir. Qeyd edir ki, *Əbu B*əkrin xəlifəliyi dövrü qısa idi, Yəməmə *döyüşündə*n təxminən 15 ay sonra v*əfat etmişdi.* Yəməmə *döyüşündə* çox sayda hafizin ölm*əsini şübhə* altına alaraq "(döyüşdə) xəsarət alanlar haqqında mənim əldə edə bildiyim xəbərlərdə Quran haqqında bilikləri təsdiqlənmiş yalnız iki nəfər, Abdullah bin Hafs bin Ğanim və *Əbu Huzeyf*ə'nin mövlası Səlim bin Maqil mövcuddur" deyir. Bu arqumenti italyalı islamşünas Leone Caetani'yə (1869-1935) nisbət edir. L. Caetani'yə görə "az qala onların hamısı İslamı yeni q*əbul etmiş müs*əlmanlar idilər." Bu nəticəni hardan çıxardığı çox müəmmalıdır, çünki tarixi qaynaqlar tamamilə bu iddianın əksini göstərir. Doğrudur ki,

[357] William Muir, "The Life of Mohammad", səh: xiv – xxi; John Grant, Edinburgh, 1923
[358] T. Nöldeke, F. Schwally, G. Bergsträßer, O. Pretzl, "The History of the Quran", səh: 219-220; Brill, Leiden-Boston, 2013; Wolfgang Behn tərəfindən ingilis dilinə tərcümə olunub

müsəlman ordularına İslamı yeni q*əbul etmiş Xalid bin* əl-Valid başçılıq edirdi, *amma döyüşdə şəhid düş*ən o olmadı. Müsəlman ordusunun əsas hissəsini mühacirlər və ənsarlar tə*şkil edirdi və* bir hissəsi yeni müsəlmanlardan ibarət idi. Mühacirlərin bayrağını daşıyan Abdullah bin Hafs bin Ğanim, Səlim Məvla *Əbi* Huzeyfə, *Əbu Huzeyfə* özü və Ömərin qardaşı Zeyd bin əl-Xattab idi. Onların hamısı erkən müs*əlman olmuş mühacirlə*r idilər və hamısı döyüşdə *şəhid düşüb.* Xüsusilə Səlim mühacirlər arasında Quranı ən yaxşı bilənlərdən biri kimi tanınırdı. Ənsarların bayrağını daşıyan isə S*əbit bin Qeys bin Ş*əmməs idi; peyğəmbərin carçısı və vəhy katiblərindən biri olub, yəni Quranı yazanlardan idi.[359] O da həmin *döyüşdə* ölənlərdən idi. Nöldeke özü bu arqumentin *zəifliyini başa düşür, lakin* əlavə edir: "Hətta Caetani tərəfindən göst*ərilmiş ziddiyyə*tlər yoxa çıxsaydı Quranın bir kitabda toplanmasının bu h*ərbi yürüşlə* ənənəvi olaraq ələqaləndirilməsini qəbul etmək yenə mümkün olmayacaqdı, çünki əlavə xəbərlər gizli dildə Quranın istisnasız yalnız yazılı materiallar üzərində toplandığını deyir. Bu məsələdə *şübhə* ola bilməz, çünki vəhyin yazı ilə qeydə *düşmə*sini Muhəmmədin özünün tə*şkil etdiyini* bilirik. Belə bir halda *döyüşdə* qeyri-adi sayda Quran hafizinin ölməsi peyğəmbərin vəhyini risk altına sala bilməzdi."[360] Beləliklə də görürük ki, Nöldeke burada Quranın peyğəmbərin zamanında yazıya köçürüldüyünü qəbul edir. Ona görə əgər Quran peyğəmbərin zamanında yazılı halda mövcud idisə *Əbu B*əkr üçün, Ömər üçün narahat olmağa bir səbəb yox idi. Nöldeke'yə görə məhz bu səbəbdən Quranın toplanması hansısa döyüşdə hafizlərin həlak olması ilə əlaqələndirilə bilməz. Fəqət bu arqument həddindən artıq *zəif bir arqumentdir, çünki tarixi şahidliklə*rə əsasən Quran yazılı şəkildə mövcud olsa da bir kitab halında mövcud deyildi, onları bir kitab halına salmaq üçün, kənar ünsürlərin ora daxil olmasına mane olmaq üçün ciddi bir iş*in* görülməsi tələb olunurdu. Zeyd bin Sabit'in etdiyi də m*əhz bu iş oldu.* Bundan əvvəl iki cild arasında toplanmış bir kitab kimi mövcud olmadığı üçün Ömərin narahat olmasına real səbəb var idi. Ona görə də *bu arqument heç bir* şəkildə Yəmamə *döyüşünün Öm*əri narahat edən səbəb olmasını inkar edə bilməz. *Nöldeke daha sonra bir başqa arqument g*ətirir. Ona görə toplanmış bu Quranın Ömərin qızı Hafsa tərəfindən saxlanılması iki şeyi sübut edir. Birincisi bu Quran dövlətin ictimaiyyət üçün hazırladığı rəsmi bir versiya olmadığını, xəlifənin özü üçün hazırladığı şəxsi versiya olduğunu göstərir. İkincisi isə Ömərdən qızı Hafsaya keçməsi onu göstərir ki, Quran Ömərin zamanında toplanmışdı və *onun* şəxsi mülkü kimi qızına keçib. Bu arqumentlər də *heç bir* şəkildə Quranın *Əbu B*əkrin zamanında toplanmasını imkansız etmir. *Əvvə*la Nöldeke dövlətin rəsmi versiyası

[359] əl-İraqi, "*Əlfiyyə*tus-Siratin-Nəbəviyyə", səh: 123; Darul-Minhəc, Beyrut. 2005
[360] T. Nöldeke, F. Schwally, G. Bergsträßer, O. Pretzl, "The History of the Quran", səh: 230; Brill, Leiden-Boston, 2013; Wolfgang Behn tərəfindən ingilis dilinə tərcümə olunub

dedikdə müasir dövlətləri təsəvvür etməsi xətalıdır. Üstəlik biz razıyıq ki, Əbu Bəkr Quranı toplamaq işini Zeydə tapşırarkən məqsədi ictimaiyyətin xidmətinə veriləcək bir kitab hazırlamaq deyildi. Məqsədi Öməri narahat edən səbəblərin aradan qalxmasını təmin etmək idi, çünki Ömər gələcək döyüşlərdə hafizlərin ölüb getməsindən narahat idi; əgər hafizlər qalmazsa və bir kitab içində toplanmış Quran yoxdursa o zaman insanlar nəyə müraciət edəcəklər?! Əbu Bəkr bu ehtiyacı qarşılamaq üçün və bu rahatsızlığı aradan qaldırmaq üçün bu işi başlatmışdı. Burada daha bir məqamı anlamaq lazımdır; Ömər hələ Əbu Bəkr sağ ikən onun vəliəhdi elan olunmuşdu və Əbu Bəkrin vəfatı ilə xəlifə oldu. Arada heç bir fasilə yox idi, ona görə də bu keçidlə yanaşı Ömər öz təşəbbüsü ilə hazırlanmış kitabın qorunulmasına bir-başa özü nəzarət etmək istəmişdi, çünki həmin Quran kitabı Əbu Bəkrin şəxsi mülkü deyildi. Ömər xəlifəliyinin sonunda ölüm ayağında ikən özündən sonra bir vəliəhd təyin etməmişdi və saxladığı Quran kitabını qızına miras kimi yox, əmanət kimi tapşırmışdı.

William Muir'ə bir daha qayıdaq və onun başqa sözləri ilə də tanış olaq. O, deyir: "Osmanın nəzərdən keçirdiyi Quran bizim zamanımıza dəyişikliyə məruz qalmadan gəlib çatıb. Kitab şübhəsiz ki, o qədər qayğı ilə qorunub ki, İslam imperiyasının geniş sərhədləri arasında səpələnmiş saysız miqdarda nüsxələr arasında önəmli fərqlər yoxdur, hətta az qala heç bir fərqin olmadığını deyə bilərik." Bu nöqtəni yadda saxlamaq çox önəmlidir, çünki Hitchens savadsız bir şəkildə Quranın fərqli qiraətlərini Quran əleyhinə arqument kimi istifadə etməyə çalışacaq. Muir davamında buyurur: "O zaman Osmanın komissiyasından keçmiş Quranın dəyişdirilməmiş mətninə sahib olduğumuzu qəbul etsək geriyə bir şeyi soruşmaq qalır; həmin tekst – önəmsiz fərqləri uzlaşdırmaq əməliyyatından əlavə - Zeydin (Əbu Bəkrin zamanında) topladığı Quranın dürüst reproduksiyasıdırmı? Bunun belə olduğuna inanmaq üçün çox güclü əsaslar vardır. Osmanın öz iddialarını dəstəkləmək üçün Quranı təhrif etdiyinə dair şübhə oyadacaq heç bir erkən və ya etibarlı bir tarixi şahidlik yoxdur. Sonrakı dövrlərin şiələri, əlbəttə ki, Osmanın bəzi surələri və ya Əlinin xeyrinə olan ayələri çıxardığını hesab edirlər. Amma bu inandırıcı deyildir."[361] Beləliklə də Muir, bu sözləri ilə təsdiq edir ki, həm Əbu Bəkr'in zamanında toplanmış Quran, həm də Osmanın zamanında yenidən toplanmış Quran, İslam peyğəmbərinin zamanında mövcud olan orijinalı layiqliklə təmsil edib. Daha bir qərbli alim John Burton da eyni nəticəyə gəlir. O, mövzuya tamamilə fərqli düşüncədən yanaşır; o, vurğulayır ki, peyğəmbərin ölümündən sonra elə ilk çağlardan teoloji münaqişələr mövcud olub, ayrı-ayrı qruplar siyasi və ya sosial maraqlar üçün münaqişələrə giriblər, daha sonralar isə məzhəb fəqihləri öz aralarında hiddətli müzakirələr aparıblar; Quranı öz etiqadına uyğun şəkildə

[361] William Muir, "The Life of Mohammad", səh: xxii-xxiii; John Grant, Edinburgh, 1923

təhrif etməyə çalışmış qruplar çox olublar və əgər ilk əvvəldən vahid, kanonik bir Quran mövcud olmasaydı o zaman bu gün tamamilə fərqli bir mənzərə ilə qarşılaşardıq, bu gün bizim əlimizdə - Bibliyada olduğu kimi – ən azından dörd və ya beş variant olardı. Burton deyir: "Bu və ya digər səhabənin iddia olunan kodeksi istismar olunmaqla təhrifə eyham etmək cəhdlərinə baxmayaraq mətn kimliyini davamlı qoruyaraq, əsrlər boyunca təfsirçilərin və üsulçuların hücumlarına uğurlu şəkildə tab gə*tirmiş v*ahid canlı Quran mətni məhz vəhylərdən ibarət nadir mətndir… elə bir mətn ki, Peyğəmbərin təsdiq etdiyi və tərtib etdiyi formada bizə qədər gəlib çatıb." Bu sözləri dedikdən sonra kitabının axırını bu cümlə ilə qurtarır: "Bu gün əlimizdə olan elə Muhəmmədin özünün mushafıdır."[362] Daha bir oriyentalist alim Aloys Sprenger buyurur: "Burada bunu demək kifayətdir ki, təhrifdən tam azad olmaması ehtimalının olmasına baxmayaraq, (Quranın) səhihliyinə *şübhə* etmək üçün heç bir səbəb yoxdur."[363] Diqqət edək ki, Sprenger, Quranın təhrif olunduğuna dair bir dəlil göstə*rmir, lakin skeptik yanaşma* sərgiləməsi akademik neytrallığın gərəyi olduğu üçün ehtimala yer verir, amma bununla belə Quranın səhihliyinə *şübhə* etmək üçün bir səbəb görmür.

Erkən Quranın əlimizdəkindən fərqli olduğunu göstərməyə çalışan Hitchens *bunun üçün Qüds* şəhərindəki Qubbət əs-Saxra məscidinin üstündəki yazıları misal verir: "Qüdsdəki Qubbət əs-Saxranın xaricində yazılmış ərəb dilindəki sözlər Quranda olan hər bir versiyadan tamamilə fərqlidir."[364] Bu iddiada ingilis jurnalistin cahilliyi ondan ibarətdir ki, o, Qubbət əs-Saxra'da yazılan yazıların hamısının Quranı təmsil etdiyini güman edir. *Əksinə* o binanın üzərindəki yazılar ümumilikdə dua və zikr sayılır və bu zikrlərin arasında Quran ayələri də yer alıb və axırda bu binanı tikdirən xəlifənin adı qeyd edilir. Zikrlərin arasında keçən ayələr *tam bir* şəkildə bu gün əlimizdə olan Quranın mətninə müvafiqdir, Hitchens'in iddia etdiyi kimi zidd deyildir. Buna görə də Estelle Whelan bu yazıları Quranın kitab olaraq erkən bir zamanda mövcud olduğuna dəlil gətirir.[365] Hitchens'in əlində Quranın səhihliyinə qarşı ağıllı bir arqument yoxdur. Gətirdiyi misallar və arqumentlər ilkin analizdən çürük çıxır. *Əsas g*ətirdiyi "akademik araşdırmalar" isə Qurana yönlə*ndirilmiş t*ənqidin tutarlığını yox, özünün çar*əsizliyini nümayiş etdirir.*

Hitchens iddia edir ki, Quranın əlyazmaları üzərində ciddi araşdırmalar aparılmayıb və bunun səbəbini müsəlmanların aqressiv reaksiyası ilə izah etməyə çalışır. "(Quranın) fərqli nə*şrlə*ri və əlyazmaları arasındakı uyğunsuzluqları

---

[362] John Burton, "The Collection of the Quran", səh: 239; Cambridge University Press, New York, 1977;
[363] Aloys Sprenger, "The Life of Mohammad: From Original Sources", səh: 63; Presbyterian Mission Press, 1851
[364] "GİG", səh: 131
[365] Estelle Whelan, "Forgotten Witness: Evidence for the Early Codification of The Quran", Journal of The American Oriental Society, 1998, cild: 118, səh: 1-14

kataloqlaşdırmaq üçün" – Hitchens deyir: "heç bir ciddi cəhd edilməyib və hətta *bunun üçün edilmiş* ən ibtidai səylər belə az qala inkvizisiya qəzəbi ilə qarşılanıb."[366] Sözünü etdiyi bu hala misal vermək üçün Christoph Luxenburg və onun "The Syriac-Aramaic Version of the Koran" adlı kitabını misal gətirir. Sözündən və seçdiyi məzmundan belə anlaşılır ki, Luxenberg[367] ciddi bir araşdırma edib, Quranın n*əşrlər*i və əlyazmaları arasındakı uyğunsuzluqları göstərib və buna görə də müsəlmanların "inkvizisiyasına" məruz qalıb. Bir kimsə vəziyyəti faciələ*şdirməyə* çalışsaydı bundan yaxşı bacarmazdı. Bəs həqiqət nədir? Görəsən Hitchens'in Quran araşdırmaları sahəsindəki bilikləri hara qədər gedir? Maraqlıdır ki, Luxenberg sadəcə olaraq bir ləqəbdir, psevdonimdir və onun həqiqi kimliyi barəsində dəqiq məlumatlar yoxdur. Christoph əgər kütləvi informasiya vasitələrində iddia edildiyi kimi bir alman professordursa öz həqiqi kimliyini gizlətməyə nə ehtiyac var ki? Onsuz da Qərb coğrafiyasında İslam və Quran haqqında onun iddiasından da daha absurd fikirləri səsləndirənlər az deyildir, lakin onların heç biri müsəlmanların qəzəbindən qorxaraq öz kimliklərini gizlətməyiblər. Həqiqi kimliyini gizlətməyinin daha ağlabatan izahı budur ki, Luxenberg möhtəmələn bir müsəlman ölkəsindən çıxmış və *Almaniyada yaşayan* ərəbdir. *Şərqşünas alim François de Blois* və Leyden universitetinin professoru Hans Jansen, onun liviyalı xristian ərəb olduğunu təxmin etməkdə bəlkə də haqlıdırlar. Fikrimcə onun kitabına ən dəqiq qiyməti də məhz de Blois verib. "Onun kitabı elmi bir əsər deyildir, sadəcə diletantizmin əsəridir" de Blois deyir və araşdırmasında həvəskar səviyyəsində ərəb dili xətalarının olduğuna diqqət çəkir. Suryani dilindəki biliklərinin isə müasir lüğətlərdən o tərəfə keçmədiyini iddia edir.[368] Luxenberg'in iddiasına gəldikdə isə saçmalıqdan başqa bir şey deyildir. Onun kitabında müdafiə etdiyi fikrin xülasəsi budur ki, Quran ilk dəfə ərəb dilində yazılmayıb, lakin suryani-arami dili ilə ərəb dilinin sintezində yazılmış xristian mətnlərdən ibarət olub. Onun iddiasına əsasən altıncı və yeddinci əsrlərdə Ərəbistanda ərəb dili yazılı dil kimi formalaşmamışdı və guya yazılı dil suryani-arami dillərindən ibarət idi. Buna görə də sonradan gələn müsəlmanlar Quranı öz orijinal dilində oxuya bilmədikləri üçün onu ərəblə*şdiriblə*r və orijinal formasından də*yişə*rək islamilə*şdirib*lər. Luxenberg'in yazdığı kitab – qısacası - Quranın orijinal formada müsəlmanların mətni olmadığını, lakin müsəlmanlar tərəfindən təhrif *edilmiş və* suryani xristian cərəyanlarına aid olan bir mətn olduğunu iddia edir. Buna nail olmaq üçün müəllif Quranda keçən bəzi sözlərdəki hərflərlə oynayır və

---

[366] GIG, səh: 137

[367] Hitchens'in kitabında bu psevdonim Luxenburg olaraq keçir, bunun çap xətası yoxsa Hitchens'in səhlənkarlığından qaynaqlandığını bilmirəm. Bart Ehrman'ın adını da həmçinin Barton olaraq yazmışdı.

[368] F. de Blois, "Review of Die Syro-Aramäische Lesart des Koran: Ein Beitrag zur Entschlüsselung *der Koransprache", Journal of Quranic Studies, beşinci cild, say 1,* səh: 97, 2003

o sözləri öz ərəbcə əslindən çıxararaq suryani-arami dilinə uyğunlaşdırmağa çalışır. Bu misallar içərisində xüsusilə bir misal Hitchens'i və Qərbin digər ateistlərini xeyli məmnun edib və əyləndirib. "Onun ən məşhur misalı şəhidlərin Cənnətdəki mükafatı ilə bağlıdır: yenidən tərcümə və redaktə edildikdə, səmavi mükafat heç də bakirə qızlar yox, şirin ağ kişmişlər olur" – Hitchens kinayə ilə deyir. Əslində kinayə şəhidlər üçün vəd edilmiş mükafata deyil, Luxenberg'in yazdığı saçmalıqlara ünvanlanmalıdır. Federico Corriente haqlıdır ki, Luxenberg'in girişdiyi iş asan deyildir, təkcə "huru in" sözünü suryani dilində "şirin ağ kişmiş" olaraq tərcümə etmək kifayət etmir, həmçinin məzmunda keçən digər sözlərə də münasib mənalar tapmaq lazımdır.[369] "Biz onları hurilərlə evləndirəcəyik."[52:20] Təbii ki, ağ kişmişlər ilə evlənə bilmədiyi üçün mütləq buradakı "zəvvacnəhum" (evləndirəcəyik) sözünü də təhrif etməyə məcbursan. "Çadırlarda gözlərini dikmiş hurilər vardır" [55:72] ayəsində çadırların ümumiyyətlə kişmişlərlə nə əlaqəsi ola bilər?! Bu və digər aşkar xətalara görə François de Blois, Angelika Neuwirth, Simon Hopkins, Robert Hoyland, Federico Corriente və başqaları Luxenberg'in kitabını tənqid ediblər. Robert Hoyland qeyd edir ki, müsəlmanların ilkin tarixini öyrənmək üçün əlimizdə xeyli material, "xüsusilə qeyri-müsəlman mənbələr, papirus, qayalar üzərində yazılar və arxeoloji qazıntılar" mövcuddur ki, bunların zənginliyi hələ təzə-təzə öyrənilməyə başlanıb. Üstəlik "müsəlman icmanın tarixi yaddaşı iddia olunandan da sağlamdır." Hətta İslamdan əvvəlki dövrlərə aid ilahlar, krallar və qəbilələr haqqında müsəlman tarixçilərin verdikləri məlumatlar epiqrafik qeydlərdə də öz əksini tapır və bu, onu göstərir ki, müsəlmanların tarixi yaddaşı möhkəmdir və sağlamdır və bunu sual altına almağa heç bir əsas yoxdur; "müsəlmanların yaddaşında tam bir davamsızlığın, qopuqluğun olmasını tələb edəcək tarixi ssenariyaların, misal üçün Muhəmmədin mövcud olmaması, Quranın ilk dəfə ərəbcə yazılmaması, Məkkənin əslində əvvəllər başqa bir yerdə olması və buna bənzər iddiaların necə əsaslandırıla biləcəyini görmək çətindir."[370] Luxenberg'in əsas iddiası, yəni 6-cı və 7-ci əsrlərdə ərəb dilinin yazılı olaraq mövcud olmaması tezisi tarixi dəlillər, material dəlillər qarşısında dərhal çökür. Nabia Abbott kimi papirus materiallar üzərində araşdırma aparmış tarixçilər o dövrdə ərəb dilinin yazılı şəkildə istifadə edildiyini asanlıqla isbat edə bilirlər. İşin ironiyalı tərəfi budur ki, Luxenberg'in çap edilmiş kitabının qapağındakı şəkildə hicri birinci əsrə aid olan və tamamilə ərəb dilində olan Quran mushafı əks olunur; əgər Luxenberg'in əlində iddiasını cüzi də olsa təsdiqləyəcək bir material olsaydı onun şəklini yerləşdirərdi. Hitchens'in istinad etdiyi araşdırmaların bir çoxu bu

[369] F. Corriente, "On A Proposal for A "Syro-Aramaic" Reading of The Quran", Collectanea Christiana Orientalia, 2003, birinci cild: səh: 309

[370] R. Hoyland, "New Documentary Texts and The Early Islamic State", Bulletin of The School of Oriental and African Studies, 2006, 69-cu cild, say 3, səh: 410-411

şəkildə keyfiyyətsiz və ucuz cəhdlərdir. O, bəlkə də gözəl bilirdi ki, oxucuların əksəriyyəti bu kimi mövzular haqqında məlumatsızdır və çürük meyvələri sağlamlarından ayıra bilməyəcəklər. Bəlkə də özü də o çürük meyvələrdəki çürüklüyü görə bilmirdi.

İslam haqqında ağlasığmaz, çılğın iddialar edənlər təkcə Luxenberg ilə məhdud deyildir. Sovet dövrünün tanınmış "islamşünasları" hətta Muhəmməd peyğəmbərin, həm də ilk dörd xəlifənin sadəcə əfsan*əvi* şəxslər olduğunu, həqiqi *tarixi* şəxsiyyətlər olmadıqlarını iddia edirdilər. Bunların başında N. A. Morozov, S. P. Tolstov, İ. N. Vinnikov kimi sovet alimləri gəlirdi.[371] Morozov'un məntiqi çox sadədir: "*Ər*əb yarımadası hansısa dini ortaya çıxarmaqdan acizdir – çünki bu coğrafiya normal mədəniyyət bölgələrindən xeyli uzaqdır." *Əgə*r Morozov bu *müşahidə*sində haqlıdırsa bu, heç də Muhəmmədin bir əfsan*əvi* şəxsiyyət olduğunu göstərmir, əksinə - müsəlmanların inandığı kimi – möcüz*əvi bir* şəxsiyyət olduğunu sübut edir. Hətta bəziləri Quranda gəmiçilik və dənizçilik haqqında məlumatları göstərərək kitabın ən azından sonrakı əsrlərdə də*yişdirdildiyini iddia edib; bu* iddianı irəli sürən kəsə görə Muhəmməd dənizçilik və gəmiçilik barəsində təcrübəsiz olub və buna görə də Qurandakı həmin ayələr daha sonrakı əsrlərdə Aralıq dənizinə açılmış müsəlmanlar tərəfindən əlavə edilmiş olmalıdır.[372] Bu cür sübutlar ilə Muhəmmədi tarixdən silməyə və Quranı həqiqi müəllifindən qoparmağa çalışanlar bəzi dairələrdə *şöhrə*t qazansalar da ciddi akademik dairələr yanında etibar qazanmayıblar. Burada John Wansbrough və tələbəsi Patricia Crone *da yada düşür*. Wansbrough 1970-ci illərdə təzə bir tezis ortaya atdı; onun iddiasına görə Quran ümumiyyətlə vahid bir kitab kimi yeddinci əsrin əvvəllərində Hicazda yox, səkkizinci əsrin sonlarında və doqquzuncu əsrin əvvəllərində Mesopotamiyada formalaşıb.[373] Ona görə Quranın tək bir müəllifi olmayıb, lakin mövcud dini tekstlər tədricən bir-araya gətirilərək formalaşıb. Tələbəsi Patricia Crone ən azından müəllimi qədər skandallı bir iddia ortaya atmaq üçün bir-iki kitab yazdı; kitabının birini Michael Cook ilə birlikdə yazan Crone orada ilk müsəlmanların əslində yəhudilərdən ayrılmış bir firqə olduğunu iddia edir, İslam dinini də müstəqil bir din kimi yox, lakin yəhudiliyin bir qolu kimi dəyərləndirir. Bu iddiasının tərkib hissəsi olaraq müsəlmanların müqəddəs şəhərinin əslində indiki Məkkə olmadığını, *Ər*əbistanın şimalında bir yerdə olduğunu deyir. İngilis islamşünas alim Robert Bertram Serjeant haqlı olaraq qeyd edir ki, Crone "qəribə nəzəriyyələrin köməyi ilə islamistl*əri şok etmə*k yolu ilə publikanı qazanmağa

[371] Erich W. Bethmann, "The Fate of Muslims Under Soviet Rule", səh: 20; American Friends of The Middle East Inc, New York, 1958
[372] Aaron W. Hughes, "Muslim Identities: An Introduction to Islam", səh: 74; Columbia University Press, New York, 2013
[373] J. Wansbrough, "Quranic Studies; Sources and Methods of Scriptural Interpretation", səh: 49-50; Prometheus Books, New York, 2004

çalışır". Bu nəzəriyyələrini isə "mənbələri yalnış anlamaq, hətta bəzən ərəbcədən xətalı tərcümə etmək" üzərində qurur.[374] Bir daha xatırlatmaq olar ki, bu cür radikal, cürətli, skandallı iddialar edən qərbli yazıçıların heç biri müsəlmanların qəzəbindən qorxaraq adlarını gizlətməyiblər; çünki onlar çox gözəl bilirlər ki, akademik mühitdə yazılmış nəzəriyyələr və iddialar təhdidlər və təqiblər ilə qarşılanmır. Luxenberg'in psevdonim götürmək ehtiyacı tamamilə əsassızdır və şou xarakteri daşıyır.

Bir sözlə Wansbrough, Crone, Luxenberg kimi revisionistləri istisna etməklə ənənəvi və müasir araşdırmalar Quran haqqında müsəlmanların tarixi iddialarını təsdiqləyir. Berlin-Brandenburg Elmlər Akademiyasının apardığı Corpus Coranicum layihəsi Quranın əlyazmaları üzərindən kritik bir mətnini hazırlamaq məqsədini güdür və bu layihəyə rəhbərlik edən alman professor Angelika Neuwirth bir məqaləsində bunları deyir: "Üstəlik ən son tapılmış Quran mətn fraqmentləri, Quranın (bu gün) əlimizdə olan surələrdən ibarət erkən və sabit bir mətn olması haqqındakı ənənəvi təsəvvürü şübhə altına almır, əksinə o təsəvvürü təsdiqləyir."[375] Neuwirth bu məqaləsində xüsusilə Günter Lüling, Christoph Luxenberg, Patricia Crone, Michael Cook, John Wansbrough'un adını çəkərək onların gətirdikləri "linqvistik arqumentlərin" uğursuz olduğunu da deməyi unutmur. Əgər həqiqətən də Wansbrough, Crone, Luxenberg kimilərin dedikləri doğrudursa, yəni müsəlmanların Quranın tarixi haqqında yazdıqları yalandırsa burada Joseph Lumbard çox yerində bir sual verir; məgər müsəlmanlar daha yaxşı bir yalan uydura bilməzdilərmi?! Nə üçün sadəcə olaraq Quranın elə Muhəmməd peyğəmbərin zamanında bir kitaba toplandığını demirdilər?! Sualın cavabı çətin deyildir və müsəlmanların kitablarında qeyd edilmiş ənənəvi tarixi hekayət, şübhəsiz ki, həqiqətləri təmsil edir. Həmçinin əlimizdəki Qurandan fərqlənən əlyazmaları axtaranlar bu günə qədər müsəlmanların dediklərindən fərqlənən heç bir şey tapa bilməyiblər. İlk xilafəti idarə edən dövlət aparatı müasir günümüzdəki communist Çinin imkanların sahib deyildi ki, insanların əlindəki Quran nüsxələrinə o dərəcədə nəzarət edə bilsin. Əgər həqiqətən də peyğəmbərdən sonra fərqli versiyalar mövcud olsaydı onlardan biri mütləq bizim zamanımıza gəlib çatardı. Bir sözlə Quranın mətninin səhihliyi ilə bağlı Hitchens'in əlində ciddi heç bir arqument yoxdur.

Quranın digər kitablardan fərqli tərəfləri çoxdur və onlardan biri xüsusilə maraqlıdır. Bu ilahi kitab özündən maksimum dərəcədə agah bir kitabdır;

---

[374] R.B. Serjeant, "Review: Meccan Trade and The Rise of Islam: Misconceptions and Flawed Polemics", Journal of The American Oriental Society, cild 110, say: 3, səh: 472, iyul-sentyabr, 1990

[375] Jane Dammen McAuliffe, "The Cambridge Companion To The Quran", səh: 100; Cambridge University Press, New York, 2006

oxucularda hansı reaksiyalara səbəb olacağını özü dilə gətirir. Quran agahdır ki, onun mətnində keçən bəzi məsəllər qəlbində küfr və nifaq olanlar üçün qəribə gələcək və bu qəribəlik onların küfrünü, tərəddüdünü, inkarını daha da artıracaq. "Həqiqətən, Allah ağcaqanadı və ondan da üstün olanı məsəl çəkməkdən utanmaz" – deyən Quran buna reaksiyasında insanları iki yerə ayırır: "İman gətirənlər bilirlər ki, bu, onların Rəbbindən (gələn) haqdır. Küfr edənlər isə deyirlər: "Bu məsəllə Allah nə (demək) istədi?" Halbuki O bununla bir çoxlarını azdırır və bir çoxlarını da haqq yoluna yönəldir. Lakin O, bununla yalnız fasiqləri yoldan çıxarır."[2:26] Beləliklə də Quran özündə belə bir əks təsirin də olduğuna diqqət çəkir. Bir başqa yerdə deyir: "Kitabı sənə nazil edən Odur. O Kitabın bir qismi mənası aydın ayələrdir ki, bunlar da Kitabın anasıdır. Digərləri isə mənası aydın olmayan ayələrdir. Qəlblərində əyrilik olanlar fitnə fəsad törətmək və istədikləri kimi yozmaq məqsədilə mənası aydın olmayanın ardınca düşərlər. Onun yozumunu isə Allahdan başqa heç kəs bilməz."[3:7] Quran elə həyatın özüdür; həyatı sən Arthur Schopenhauer'ə verib: "onu bizim üçün dəyərləndir" – desən sənə ömrünün ən qaranlıq, ən pessimist bir mənzərəsini canlandıracaq. Sören Kierkegaard'a versən içini rənglərlə, işıqlarla dolduracaq bir şer söyləyəcək. Bəli, Quran sadəcə bir cizgi izləyən kitab deyildir, onun bir surəsi digərindən fərqlənir, hətta ayələr arasında belə həm üslub cəhətdən, həm də məna cəhətdən çox fərqliliklərlə qarşılaşırsan. Quran bizə həyatda hər bir şeyin sınaq üçün mövcud olduğunu öyrədir. Bu, həyatı və həyatda qarşılaşdığımız ən ağır fəlsəfi problemləri ziddiyyətsiz şəkildə birləşdirməyə kömək edən bir təlimdir. "Biz sizi bir az qorxu, bir az aclıq, bir az da mal-dövlət, insan və məhsul itkisi ilə sınayarıq. Səbr edənlərə müjdə ver!"[2:155] Bir başqa yerdə eyni həqiqəti başqa sözlərlə ifadə edir: "Biz şübhəsiz ki, içinizdən mübarizə aparanları və səbr edənləri ayırd edib görmək üçün sizi mütləq sınayacaq və barənizdəki xəbərləri də yoxlayacağıq."[47:31] Bu məna kitab boyunca öz təsdiqini tapır: "Əməl baxımından hansınızın daha yaxşı olduğunuzu sınamaq üçün ölümü və həyatı yaradan Odur."[67:2] O zaman Quran özü də bu prosesin bir hissəsi olmalıdır, Quran özü də sınağın bir hissəsi olmalıdır. Ona görə də Quran özü haqqında: "Bu, içində şübhə olmayan, Allahdan qorxanlara doğru yol göstərən Kitabdır"[2:2] – deyir. Bu kitabın həyatda rəhbər edici olması üçün insanın Allaha inanması, Allahı axtarması lazımdır və məhz onlar üçün Quran hidayət rəhbəridir.

Heç təəccüblü deyildir ki, Quranı açıb içində qüsur, uyğunsuzluq, qəribəliklər tapmaq istəyənlər axtardıqlarını tapacaqlar və Quran özü bunun misalını verib. Allaha inanmayan, yalnız maddəyə inanan kəslər Quranı oxumadan əvvəl onun haqqında hazır fikirə sahibdirlər; heç bir kitab Allahdan ola bilməz, çünki Allah yoxdur və Quran da digər kitablar kimi bir insan məhsuludur. Məhz bu təsəvvürdən

yanaşdıqları üçün onların çoxu İslam peyğəmbərinin – tarixi xəbərlərdə gəldiyi kimi – oxumağı və yazmağı bacarmayan bir insan olduğunu qəbul edə bilmədi. Axı necə ola bilər ki, oxuya bilməyən, yazı yaza bilməyən bir nəfər milyonlarla insanı vəcdə gətirən, onları ilhamlandıran və ən yüksək ədəbi xüsusiyyətlərə sahib bir kitab yazsın?! *Əksinə* Muhəmmədin nəinki oxumaq və yazmağı bacardığını, hətta öz dövrünün mövcud ədəbiyyatını oxumuş biri olduğunu iddia etdilər; yəni iddiaya görə Bibliyanı oxumuşdu və bəzi apokrifik ədəbiyyata vaqif idi. Halbuki Gerhard Böwering təsdiqləyir ki, "bizim ən yaxşı biliklərimizə əsasən Bibliya Muhəmmədin zamanında nə *tam* şəkildə, nə də ayrı-ayrı kitablar formasında ərəb dilinə tərcümə edilmə*mişdi."*[376] Bunu yoxlamaq da çətin deyildir; misal üçün əl-Ğazəli kimi bir islam alimi xristianlara qarşı yazılarında istifadə etmək üçün ərəb dilində Bibliya tapa bilmirdi, halbuki o, peyğəmbərdə*n beş* əsr sonra yaşayıb. Xristianlara qarşı kitabını yazmaq üçün qibtilərin bibliyasından istifadə etməli olur.[377] Nəinki Bibliyanın ərəbcə tərcüməsi, heç xristianlıq özü Hicaz bölgəsində oturuşmamışdı. Richard Bell qeyd edir ki, "Hicazda və ya Məkkənin qonşuluğunda, nə də Mədinənin yaxınlığında xristianlığın oturuşmuş yerlərinə dair qənaətbəxş heç bir sübut yoxdur."[378] Quranın xristian və yəhudi qaynaqlarından istifadə etdiyini ilk iddia edən də Hitchens deyildir. Hitchens bunun üçün kitabında ayrıca bir fəsil açır. Keçən əsrin əvvəlində ərəb xristianlarından olan Louis Cheikho Quranın necə xristianlıqdan təsirləndiyini, xristian təlimlərindən qaynaqlandığını göstərmək üçün İslamdan əvvəlki cahiliyyə *şerlə*rini araşdırmağa başlayır. O, cahiliyyə *şerlə*rində xristian elementlərin olduğunu göstərməklə h*əmin şairlə*rin xristian olduqlarını və beləliklə də Muhəmmədin də yaşadığı şəhərdə xristianlardan öyrəndiyini sübut etməyə çalışacaqdı. Onun qarşısına qoyduğu məqsədi bu idi. Cheikho'nun araşdırması tam əks nəticəyə gətirib çıxardı, çünki onun dəlil olaraq istifadə *etdiyi şerlə*rdən yalnız birinin xristian olduğu göstərilə bildi.[379] Spencer Trimingham də cahiliyyə *şairlə*ri arasında belə bir sübutun olmadığını deyir.[380] Quranın qaynaqları haqqında bir çox müəllif kitab yazıb və Qurandakı ayrı-ayrı hekayələrin hansı apokrifik materiallardan götürüldüyünü göstərməyə çalışıb. Bunların içində ən mə*şhuru yə*hudi əssli alman Abraham Geiger'in yazdığı "Was Hat Mohammed aus dem Judenthume Aufgenommen" adlı kitabdır. Xristian yazıçı və şərqşünas William Clair Tisdall mövzu haqqında yazdığı kitabında yəhudi

---

[376] Gabriel Said Reynolds, "The Quran in Its Historical Context", səh: 70; Routledge, New York, 2008

[377] Malek Bennabi, "The Quranic Phenomenon", səh: 243; American Trust Publications, Indiana, 1983

[378] R. Bell, "The Origin of Islam in Its Christian Environment: The Gunning Lectures", səh: 42; Frank Cass & Co. Ltd, New York, 1968

[379] Hechame Camille, "Louis Cheiko et Son Livre le Christianisme et la Littrature Chretienne en Arabie avant l'Islam: Etude Critique", səh: 183; Dar əl-Mə*şriq, Beyrut, 1967*

[380] J. S. Trimingham, "Christianity Among the Arabs in Pre-İslamic Times", səh: 247; Longman Publishers, New York, 1979

qaynaqlarını müəyyən etmək üçün Geiger'in araşdırmasına əsaslanır. Misal üçün Adəmin iki oğlundan birinin digərini öldürməsi haqqında keçən xəbərin haradan götürüldüyünü dəqiqləşdirmək istədikdə "Jonathan'ın Targum'unu" və həmçinin "Qüds Targum'unu" iki ayrı qaynaq kimi göstərir.[381] "Onlara Adəmin iki oğlunun gerçək əhvalatını oxu. O zaman ikisi də qurban vermiş, onların birindən qəbul *edilmiş, dig*ərindən isə qəbul edilməmişdi. (Qurbanı qəbul olmayan oğlu öz qardaşına) demişdi: "Səni hökmən öldürəcəyəm!" (Qardaşı da ona belə*) demişdi:* "Allah ancaq müttəqilərdən (qurban) qəbul edər! Sən məni öldürmək üçün mənə əl qaldırsan da, mən səni öldürmək üçün sənə əl qaldıran deyiləm. Həqiqətən, mən aləmlərin Rəbbi Allahdan qorxuram. Mən istəyirəm ki, sən, həm mənim günahımı, həm də öz günahını üzərinə götürəsən və Od sakinlərindən olasan. Zalımlara veriləcək cəza budur."[5:27-29] Bu hissəni Tisdall həmin iki yəhudi qaynağına aid edir, lakin Quranda keçən xəbər ilə yəhudi mətni arasındakı bənzərliyin "nəzərə çarpan" olmadığını etiraf edir.[382] Geiger hətta qeyd edir ki, iki qardaş arasında keçən söhbət qaynaqlarda "o qədər fərqlidir ki", iki mətni müqayisə etməyə dəyməz.[383] Tisdall'ın etdiyi xəta budur ki, o, Jonathan'ın Targum'unu" və "Qüds Targum'unu" iki ayrı kitab hesab edir, halbuki hər ikisi də eyni kitabın iki fərqli adıdır. Üstəlik müasir elmi araşdırmalar təsdiq edirlər ki, bu "targum" müsəlmanlar Yaxın Şərqi ələ keçirdikdən bir neçə əsr sonra qələmə alınıb. Targum'un ingilis dilinə tərcüməsinin müqəddiməsində tərcüməçi professor *Michael Maher "bu gün geniş şəkildə qəbul edilmiş rəyə*" yer verir və deyir: "Müasir müəlliflərin çoxu qeyd edir ki, bu Targum ərəblərin Yaxın Şərqi istila etməsindən sonra yazılıb. M. Splansky inanır ki, bu kitab doqquzuncu və ya onuncu əsrə aiddir…"[384] Beləliklə də burada Quranın hansısa "targum" kitabından borc alması söhbəti edilə bilməz, əksinə yəhudilərin Qurandan borc aldıqlarını iddia etmək daha doğru səslənir.

Xristian rahib Tisdall, həmçinin yəhudi ravvin Geiger xəbərin Quranda keçən ikinci hissəsinə də diqqət çəkərək onun da yəhudi qaynaqlarından gəldiyini sübut etməyə çalışırlar. "Nəfsi onu qardaşını qətlə yetirməyə vadar etdi və o da nəfsinə tabe olaraq onu öldürdü və ziyana uğrayanlardan oldu. Allah, yeri eşələyən bir qarğa göndərdi ki, ona qardaşının cəsədini necə basdırmağı göstərsin. O dedi: "Vay halıma! Doğrudanmı mən, qardaşımın cəsədini basdırmaqda bu qarğa kimi

---

[381] "Targum" deyildikdə əsasən Bibliya kitabının arami dilində *edilmiş t*ərcümələri qəsd olunur. "Targum" sözünün ərəbcədəki "tərcümə" sözü ilə identik olması da təsadüf deyildir.
[382] W. C. T. Tisdall, "The Original Sources of The Quran", səh: 62-63; Society For Promoting Christian Knowledge, London, 1911
[383] R. A. Geiger, "Judaism and Islam: A Prize Essay", səh: 80; M.D.C.S.P.C.K. Press, Madras, 1898
[384] Michael Maher, "Targum Pseudo-Jonathan Genesis", The Aramaic Bible, cild: 1B, səh: 11; A Michael Glazier Book, The Liturgical Press, Minnesota, 1992

olmaqdan da acizəm?" Beləliklə o, peşmançılıq çəkənlərdən oldu."[5:30-31] Tisdall və Geiger bu hissənin "Pirkei De-Rabbi Eliezer kitabından götürüldüyünü iddia edirlər.[385] Bu gün biz bilirik ki, belə bir iddia yalnışdır, çünki qəsd olunan ədəbiyyat post-islami dövrə aiddir. Norman Stillman bir dəyərləndirməsində deyir: "Bu gün bizim ravvin ədəbiyyatının xronologiyası haqqında biliklərimiz Geiger'in zamanındakından daha yaxşıdır və o zamandan bəri daha çox mətn – müsəlman, yəhudi və xristian mətnləri – dərc olunub. Bunun işığında biz indi bilirik ki, bəzi misallarda İslami mətnlərə t*əsir etdiyi düşünülə*n yəhudi "haqqadik" təsir əslində əksinə mümkündür. Misal üçün Pirqe de Rabbi Eli'ezer görünür ki, İslamın g*əlişind*ən sonra yazılıb."[386] Bu misal da həmçinin bizə göstərir ki, Quran yəhudi mətnindən təsirlənm*əmiş,* əksinə - möhtəmələn - yəhudi mətni Qurandan təsirl*ənmişdir.* Quranın qaynaqları mövzusunda aparılmış araşdırmalarda bu cür misallar çoxdur. Bunun bəlkə də ən ibrətamiz nümunəsi Musa ilə Xıdır arasındakı *görüşmə* ilə bağlıdır. Louis Ginzberg, İsrael Friedländer, Julian Obermann, Jan Wensinck və başqaları iddia ediblər ki, Qurandakı bu xəbər əslində yəhudi qaynaqlarından götürülüb və bunun üçün dəlil olaraq Ravvin Y*əşva* bin Levi ilə İliya arasında keçən hekayəti misal göstərirlər və həqiqətən də bu hekayə ilə Qurandakı Musa-Xıdır hekayəsi arasında çox yaxın bənzərlik vardır. Lakin problem budur ki, Y*əşva ilə* İliya arasında keçən söhbətin qaynağını bu araşdırmacılar Qayra*van şə*hərində on birinci əsrdə yaşamış yəhudi ravvin Nissim *bin Şahin'ə* və onun "Hibbur Yafeh Me-Ha-Yeshua" kitabına aid edirlər.[387] Daha sonra bu kitabın ərəb dilindəki orijinalı tapıldıqda aydın oldu ki, yəhudi dilində keçən bütün materiallar öz əslini bu ərəb dilindəki qaynaqdan götürür və on birinci əsrdən əvvəlki heç bir yəhudi qaynağında belə bir xəbərə rast gəlinmir.[388] Bütün bu dəlillərə baxmayaraq Wensinck, Obermann və digərləri Qurandakı bu hekayənin yəhudi materiallarından borc götürüldüyünü iddia etməyə davam etdilər. Çünki – Obermann'ın dili ilə ifadə etsək – Quranda keçən xəbərlərin "qaynaqları bir qayda olaraq post-bibliya dövrünə aid folklora qədər izlənə bilər."[389] Obermann demək istəyir ki, yəhudilərin bu yazılı qaynağı Qurandan ən az dörd əsr sonrakı dövrə aid olsa da onun Qurandan götürdüyünü demək doğru

---

[385] W. C. T. Tisdall, "The Original Sources of The Quran", səh: 63; Society For Promoting Christian Knowledge, London, 1911; R. A. Geiger, "Judaism and Islam: A Prize Essay", səh: 80-81; M.D.C.S.P.C.K. Press, Madras, 1898

[386] "Journal of Semitic Studies", cild: 19, say: 2, səh: 231; "The Story of Cain and Abel in The Quran and The Muslim Commentators: Some Observations", Manchester University Press, 1974

[387] I. Friedländer, "Die Chadhirlegende und Der Alexanderroman", səh: 257; B.G. Teubner, Leipzig, 1913

[388] Brannon M. Wheeler,"The Jewish Origins of Quran 18:65-82? Reexamining Arent Jan Wensinck's Theory", Journal of The American Oriental Studies, cild:118, say:2, səh: 155-156; American Oriental Society, Aprel-İyun, 1998

[389] J. Obermann, "Two Elijah Stories in Judeo-Arabic Transmission", Hebrew Union College Annual, cild:23, say:1, səh: 400; Hebrew Union College Seventy-fifth Anniversary Publication, 1950-1951

deyildir, mütləq ki, o özü daha qədim yəhudi folklorundan bəhrələnib və Quran da həmçinin ondan təsirlənmiş olmalıdır. Çünki Q*ərbin yetişdirdiyi bu* "islamşünasların" qəbul etdiyi qaydaya əsasən Quran bütün hekayələri özündən əvvəlki yəhudi və xristian qaynaqlarından alıb. Halbuki ravvin Nissim'in yaşadığı çağ və mühit, onun Qurandan təsirləndiyini daha inandırıcı edir. Brannon Wheeler bu nəticəyə gəlir və qeyd edir ki, yəhudi mətni möhtəmələn Qurandan və təfsirlərdən bəhrələnib.[390] Quranın özündən əvvəlki mətnlərdən istifadə etməsi iddiası hər dəfə süquta uğrayır, çünki Qurana paralel olaraq misal verilən yəhudi və xristian qaynaqlarının çoxunun Qurandan sonra qələmə alındığı sübut olunur, digər bəzi qaynaqların isə nə zaman yazıldığı dəqiq bilinmir və yerdə qalanların isə tamamlanma tarixi Qurandan sonrakı dövrə *düşür.* Bu misalların hər birinə ayrılıqda toxunmaq və onları ələ almaq ayrılıqda bir kitab ortaya çıxaracaq. Burada *bölüşdüklə*rimiz sadəcə olaraq ortaya qoyulan iddiaların nə qədər zəif zəmin üzərində qurulduğunu sərgiləmək üçün idi. Hitchens'in İslam dini haqqında: "o, özünün primitiv yəhudi və xristian sələfləri üzərində qurulub" - deməsi də[391] təəccüblü gəlməməlidir. Quran onun kimi qəlbi küfrlə dolu olanların reaksiyalarından da tam şəkildə agahdır. "Hətta sənin yanına gəldikdə səninlə mübahisə edirlə*r. Kafir olanlar: "Bu, keçmişdə*kilərin əfsanələrind*ən başqa bir şey* deyildir" – deyərlər."(6:25)

Neo-ateistlərin kitablarını oxuyanlar diqqət edərlərsə onların bütün dini mətnləri sadələ*şdirməyə*, ucuzlaşdırmağa çalışdıqlarını görəcəklər. Hitchens'in kitabı boyunca müqəddəs kitablara münasibəti bununla yadda qalır. Bir yerdə çox dayaz bir müqayisə apararaq deyir: "Shakespeare'in Talmuddan və ya Qurandan... daha çox mənəvi qabarıqlığı vardır."[392] Bu sözü deyən insanda nə dini mətnlər haqqında, nə də ümumiyyətlə Shakespeare haqqında doğru bir təsəvvür ola bilməz. Shakespeare əlbəttə ki, anidən kitab arxasında peyda olmuş bir yazıçı olmayıb, onun şəxsiyyətini – digər dahi qələm ustaları kimi – dövrünün cəmiyyəti və o cəmiyyətdəki mənəvi dəyərlər formalaşdırıb. Bu dəyərlər isə Avropada – xüsusilə də Hamlet'in müəllifinin dövründə - yəhudi və xristian ənənəsindən öz başlanğıcını götürür. Qərbdə bir çox ateist özünü "xristian ateist" olaraq tanıtdırır və bu, onların xristianlıqda mənəvi dəyərlərin əhəmiyyətini dərk etməklərindən irəli gəlir. Müqayisənin absurdluğu həm də real həyatda insanların həyatında özünü göstərir; əsrlər boyunca milyonlarla insanın mənəviyyatını formalaşdırmış kitablar ilə, ingilis səhnəsi üçün hazırlanmış əsərləri necə müqayisə etmək olar?!

[390] Brannon M. Wheeler,"The Jewish Origins of Quran 18:65-82? Reexamining Arent Jan Wensinck's Theory", Journal of The American Oriental Studies, cild:118, say:2, səh: 170-171; American Oriental Society, Aprel-İyun, 1998
[391] "GIG", səh: 123
[392] "GİG", səh: 151

İstər mənəvi təlimlər baxımından, istərsə də ədəbi üslub baxımından heç bir kitab Quranla yarışa bilməz. Belə bir nəticəyə gəlmək üçün əlbəttə ki, qəlbində iman toxumları olmalıdır ki, Quran onsuz da bunun üzərinə bir neçə yerdə vurğu edir. “İnsanın intellektual bacarıqlarını müəyyən etmək” – Fritz Schumacher deyir – “buna görə də real deyildir, sanki eyni növdən olan heyvanlar kimi bəşər övladlarının da hamısı eyni olmalı idi. Beethoven’in musiqi bacarığı – kar olsa belə - mənimkindən müqayisə olunmayacaq dərəcədə daha güclü idi və bu fərq, *eşitmə* qabiliyyətindən qaynaqlanmır; bu, şüurda olan bir şeydir. Bəzi insanlar onlara verilən musiqi parçasını anlayıb dəyərləndirməyə qadir deyillər və bu, onların kar olmaqlarına görə yox, sadəcə olaraq onların şüurunda “*adaequatio*” olmadığına görədir. Musiqi intellektual qabiliyyət sayəsində dərk edilə bilir və bəzi insanlarda bu qabiliyyət o dərəcədədir ki, bütöv bir simfoniyanı bir dəfə *eşitmək*lə onu dərk edib əzbərində saxlaya bilir; bəzilərində isə bu istedad o qədər zəifdir ki, nə qədər çox və nə qədər diqqətlə dinləməyindən asılı olmayaraq onu dərk edə bilmir. Simfoniya öz bəstəkarı üçün nə qədər real idisə birinci növdən olan insanlar üçün də o qədər real ola bilir, ikincilər üçün isə simfoniya deyil*ən bir şey mövcud* deyildir; onların təsəvvüründə *eşitdiklə*ri sadəcə olaraq bir-birini izləyən, az-çox *xoşa gələ*n, lakin ümumilikdə mənasız səslər toplusudur. Bir*incinin şüuru* simfoniya üçün adekvatdır, o birinin şüuru isə qeyri adekvatdır və beləliklə də simfoniyanın mövcudluğunu etiraf etməyə qadir deyildir.”[393] Schumacher bunun bütün “bəşəri təcrübələr” üçün keçərli olduğunu deyir. Onun istifadə etdiyi “*adaequatio*” sözü orta əsrlərin sxolastikasında bilinən bir prinsip idi: *veritas est adaequatio rei et intellectus*. “Həqiqət, mövcud olanın intellektə müvafiqliyidir” mənasında səslənən bu prinsipə görə istənilən mövcud olan bir şeyi olduğu kimi dərk etməyimiz üçün ona uyğun intellektual alətə sahib olmağımız lazımdır.[394] İslam etiqadına görə hər bir kəsin bu haqqı və gözəlliyi görmək istedadı vardır, lakin “küfr” bu istedadı örtür və küfr sözü də ərəb dilində örtmək, gizlətmək, basdırmaq mənasını verir. İngilis filosof John Smith yazırdı: “Allahla bağlı işləri doğru bilməyə və anlamağa imkan verən *şey, içimizdə yaşayan müqə*ddəslik parçası olmalıdır.”[395] Quranın gözəlliyi ilə Shakespeare arasında müqayisə aparmağa gəldikdə Shakespeare h*ər şeyd*ən əvvəl insan övladının içindəki qaranlıqları bizə işıqlandırdığı halda Quran insanlığa Yaradıcını, mövcudiyyətin ən əzəmətli varlığını tanıtdırır. Təbii ki, Yaradana inanmayan biri üçün, buna əfsanə gözü ilə baxan biri üçün bundan daha mənasız bir şey ola bilməz. Bu, Kitabın ən əsas hissəsidir, lakin bununla yanaşı Quran insanlara keçmişdəkilərin aqibətini

---

393 E. F. Schumacher, “A Guide for The Perplexed”, səh: 40-41; Harper Colophon Books, New York, 1977
394 Salem Azzam, “Islam and Contemporary Society”, səh: 40-41; Longman, London, 1982
395 H. G. Williams, ”Select Discourses by John Smith”, səh: 3; Cambridge University Press, Cambridge, 1859

xatırladır, onların həyatından ibrətli nümunələr verir və müsəlmanlara öz həyatlarını yaşamaq üçün əhkam öyrədir. Allahın tək və yeganə haqq məbud olduğunu ən güclü, ən təmtəraqlı şəkildə təlqin edən, Ona yönəlmənin, Ona ibadət etmənin həyatın ən əsas qayəsi olduğunu, bunu sevmənin dəyərini öyrədən bir kitabdan danışırıq. Quranın həyat fəlsəfəsi, insanın içini sıxan bir çox suallara uzlaşdırıcı bir effektlə cavab verir; həyatın bizə bir test, bir sınaq olduğunu xatırladır və üzləş*diyimiz facia*lər, üzüntülər, kədərlərin hamısı yalnız bu sınaq məzmununda bir məna kəsb edə bilir. Həyatdan bu mənanı alıb götürdüyümüzdə insan övladı ölməkdə olan kosmosun iztirablarını öz üzərində hiss edən və bunun qurtulmaz, uzunsürən əzab olduğunu dərk edən yeganə varlığa çevrilir. Quran bəşəriyyətə bu psixoloji sarsıntıdan qurtulmağın yolunu göstərir. Quran xristianlıqdakı ziddiyyətli ünsürlərdən də azaddır; insanların günahını satın almaq üçün Öz günahsız oğlunu qurban verən Allahı bizə təbliğ etmir. Həmçinin yəhudilikdəki etnosentrizmi də ləğv edir; hansısa bir xalqın gözünə, qaşına vurulmuş, onları başqalarına qısqanan, onların qəmzəsi və *işvə*si ilə oynayan bir Allah inancından, bir kimsənin etdiyi günaha görə növbəti nəsilləri lənətləyən Allah inancından azad edir. İnsanı da unutmur; ona bu həyatda təsəlli olmaq üçün var olduğunu göstərir. Onu ən ideal mənəvi zirvələrə yönəldir; "Məgər O, səni yetim çağında qoruyub sığınacaq vermədimi? Səni çaşqın olduğun halda doğru yola yönəltmədimi? Kasıb olduğun zaman səni varlandırmadınmı? Elə isə yetimə xor baxma! Səndən (kömək) diləyəni qovma! Və Rəbbinin nemətindən danış!"[93:6-*11] Xeyir işlərə təşviq etmə*k üçün ən sadə düsturları öyrədir: "Həqiqətən, yaxşı işlər pis əməlləri silib aparır."[11:114] Ədaləti ən ali dəyərlərdən biri kimi insana aşılayır. "Ey iman gətirənlə*r! (Şahidliyiniz) özünüzün və* ya valideynlərin, ya da yaxın qohumların əleyhinə olsa belə*, Allah şahidl*əri kimi ədaləti qoruyun. (*Əleyhinə şahidli*k edəcə*yiniz ş*əxslərin) varlı və ya kasıb olmasından asılı olmayaraq Allah onların hər ikisinə də yaxındır. Hissiyyata qapılıb haqdan uzaqlaşmayın! Əgər siz (haqsız) danışsanız və ya (haqqı deməkdən) boyun qaçırsanız, bilin ki, Allah nə etdiklərinizdən xəbərdardır."[4:135] Zülmə zülmlə cavab verməyi təqdir etmir. Sol yanağına vurana sağ yanağını da çevirməyi *əmr etmir, daha ülvi bir yanaşma* göstərir: "Sən pisliyi yaxşılıqla dəf et. Biz onların aid etdikləri sifətləri daha yaxşı bilirik."[23:96] Etnoslar, xalqlar və mədəniyyətlər arasındakı fərqliliyi də müsbət bir surətdə görməyi öyrədir: "Sonra bir-birinizi tanıyasınız deyə, sizi xalqlara və qəbilələrə ayırdıq. *Şübhə*siz ki, Allahın yanında ən hörmətli olanınız ən təqvalı olanınızdır."[49:13] İnsana onu dünyaya gətirmiş, böyüdüb başa çatdırmış valideynləri ilə də yaxşı rəftar etməyi öyrədir: "Rəbbin yalnız Ona ibadət etməyi və ata-ana ilə yaxşı davranmağı buyurmuşdur. Əgər onların biri və ya hər ikisi sənin yanında qocalıq yaşına dolarsa, onlara "Uf!" belə demə, üstlərinə qışqırma və *onlara xoş söz söylə*! Onların hər ikisinə rəhm edərək təvazökarlıq qanadının

altına al və "Ey Rəbbim! Onlar məni körpəliyimdən tərbiyə edib böyütdükləri kimi, Sən də onlara rəmt et!" – de!"[17:23-24] Məhz bu ayədən sonra Hitchens'in kitabında oxucuya sırımağa çalışdığı bir iddiasına yer vermək istəyirəm. "Müsəlman dünyasında gənc oğlanlara…" – Hitchens deyir: "nəticə etibarı ilə öz analarına və bacılarına həqarətlə baxmaq öyrədilir…"[396] Bu bizi daha əvvəl qeyd etdiyimiz nöqtəyə gətirib çıxarır ki, bir insan Quranda tapmaq istədiyini axtararsa tapacaq; əslində tapdığı Quranda deyildir, onun öz içindəki çürüklükdədir.

Gətirdiyimiz ayələr Qurandakı mənəvi qabarıqlığın misalları olaraq tarix boyunca milyonlarla insanlara həyat rəhbəri olublar və bunların üzərində mütəfəkkirlər əxlaq kitablarını bina ediblər. Quran insan təbiətindən tam bir şəkildə xəbərdar kitab olaraq bu təlimləri onlara gözəl bir üslubda, poetik bir biçimdə, bəlağətli, fəsahətli sözlərlə çatdırır və insanların sinələrinə həkk edir. *Dünyada başqa heç bir kitab belə* bir statusa aid edilə bilməz. Quran öz poetik gözəlliyi ilə, bəlağətinin gücü ilə n*əinki* şərq insanını, hətta Q*ərbin bir çox şair* ruhunu fəth edə bilib. 1824-cü ildə m*əşhur alman şairi Heinrich Heine dostu* Moser'ə *Hanover* şəhərindən bir məktub yazır. Fars şairlərinə vurğunluğunu gizlətməyən Heine dostuna – "sən yaxşı bilirsən ki, mən, alman deyiləm, ax o barbarlar!" – yazırdı: "(Yer üzündə) yalnız üç mədəni millət vardır: fransızlar, çinlilər və farslar. Mən isə fars olmağımla fəxr edirəm…" Heine əslində fars deyildi, amma özünü mənəvi olaraq farslara nisbət edir. Vəziyyəti daha da dramatikləş*dir*ərək yazır: "Ax, mən nə qədər də İsfahanı özləyirəm! Çox təəssüf! Mən yazıq onun gözəl minarələrindən və mis qoxulu bağlarından uzağam! Ax, bir *fars şairi üçün,* sizin bu dəyərsiz və kobud alman dilində özünü tükətməsi, sizin bu təhərsiz post faytonlarınız, sizin bu pis havanız, sizin axmaq tütün simalarınız, sizin roma qanunlarınız, sizin fəlsəfi hədyanlarınız və qalan maymaq üslublarınız üzündən həlak olması nə qədər də dəh*ş*ətli bir taledir! Ey Firdovsi! Ey Cami! Ey Sadi! Sizin qardaşınız nə qədər də miskindir! Şirazin qızılgülləri üçün nə qədər də darıxıram! Almaniyanın xeyli yaxşı tərəfli ola bilər; bunu yamanlamayacam. Onun *da böyük şairlər*i var: Karl Müchler, Claurens, Gubitz, Michel Beer, Auffenbach, Theodor Hell, Laun, Gehe, Houwald, Rückert, Müller, Immermann, Uhland, Goethe. Amma Hafiz və Nizami ilə müqayisədə onların əzəmətindən nə qalır ki?!" *Heine Ş*ərq ədəbiyyatının vurğunu idi, qəzəlləri oxumağı sevərdi və şərqin üslubuna bələd olan biri kimi bu etirafı etməli olur: "Fars olmağıma baxmayaraq, etiraf edirəm ki, peyğəmbərlərin ən möhtəşəmi sizsiniz, ey Məkkənin əzəmətli peyğəmbəri! Həmçinin sizin Quranınız – onunla yalnız keyfiyyətsiz tərcüməsi ilə

[396] "GIG", səh: 227

tanış olmağıma baxmayaraq – asan-asan ağlımdan çıxmaz!"[397] Almanların ən məşhur ədibi Goethe isə Quranın ecazkarlığı, üslubunun gözəlliyi haqqında yazır: "Quranın stili, onun tərkibi və məqsədinə uyğun olaraq, ciddidir, əzəmətlidir, dəhşətlidir və bəzi yerlərdə həqiqətən də möhtəşəmdir; bunların biri digərini hərəkətə gətirir və Kitabın bu cür effektivliyinə heç kim təəccüblənməməlidir."[398] Bir başqa yerdə deyir: "Nə qədər sıx-sıx ona yaxınlaşsaq ilk baxışda özünü xoşagəlməz göstərəcək; amma tədricən cəzb etməyə başlayır, heyrətləndirir və ən sonunda pərəstiş etməyə məcbur edir!"[399] Goethe ilə təxminən eyni dövrdə yaşamış və İngiltərənin romantizm dövrünün ikonik şairlərindən olan Lord Byron isə (1788-1824) deyir: "…Quranın tərkibinə, Avropanın şeriyyətini çox geridə qoyan ən möhtəşəm poetik hissələr daxildir."[400] Bu gözəlliyi, üslub üstünlüyünü şübhəsiz ki, Quranı öz original dilində oxuya bilən insanlar daha tez görürlər. Şotland orientalist Sir Hamilton Gibb (1895-1971) buyurur: "Ədəbi dəyər məsələsi a priori əsaslar üzərində yox, lakin ərəb dilinin dahiliyinə görə mühakimə olunmalıdır; və min beş yüz il ərzində heç kim Muhəmməd kimi bu ağır-səsli aləti bu qədər güc, bu qədər cəsurluq və duyğusal təsirin bu qədər genişliyi ilə işlədə bilməmişdir."[401] Quranı ingilis dilinə tərcümə etmiş George Sale (1697-1736) yazır: "Quranın stili ümumilikdə gözəl və axıcıdır… Yığcamdır, mənası bir çox yerdə qapalıdır, şərq zövqünə uyğun şəkildə cəsur təsvirlərlə bəzədilmiş, gözəl və ibrətli ifadələrlə canlandırılmışdır və çox yerdə, xüsusilə də Allahın əzəməti və xüsusiyyətləri vəsf edilən yerlərdə, möhtəşəm və füsunkardır."[402] Quranın bəlağətini və fəsahətini ən gözəl şəkildə nümayiş etdirən tərəf budur ki, onu öz ana dillərinə tərcümə etməyə çalışmış tərcüməçilərdən bir çoxu öz dillərindəki ən güclü bədii təsvirə, ədəbi üsluba baş vurublar. 1772-ci ildə David Megerlin Quranı birbaşa ərəb dilindən alman dilinə tərcümə etdikdə ona "Die Türkische Bibel" (Türk Bibliyası) adını vermişdi. Onun tərcüməsini oxuyan Goethe təəssüflənir və tərcümə üçün "elend" (mənfur, səfil) deyərək onu bir sözlə vəsf edib, çünki Quranın stilistik gözəlliyindən əsər-əlamət görə bilmirdi.[403] Avstriyalı şərqşünas Joseph von Hammer-Purgstall on doqquzuncu əsrin əvvəllərində Quranın poetik

---

[397] Adolf Strodtmann, "H. Heine's Leben und Werke", birinci cild, səh: 366-367; Verlag von Franz Duncker, Berlin, 1873

[398] J. W. Goethe, "Goethe's Werke", altıncı cild, "Noten und Ubhandlung zu Besserem Verständnis des West-Östlichen Divans", səh: 35; J. G. Cotta, Stuttgart, 1828

[399] Emanuel Deutsch, "Literary Remains of The Late Emanuel Deutsch", səh: 121; John Murray, London, 1874

[400] L. Byron, "The Complete Miscellaneous Prose", səh: 1; Clarendon Press, Oxford University Press, New York, 1991

[401] H. A. R. Gibb, "Mohammedanism; An Historical Survey", səh: 25; Oxford University Press, New York, 1970

[402] G. Sale, "The Koran Commonly Called The Alcoran of Mohammed", səh: 44; J. B. Lippincott & Co, Philadelphia, 1860

[403] Mustafa Shah & Muhammad Abdel Haleem, "The Oxford Handbook of Qur'anic Studies", səh: 544; Oxford University Press, New York, 2020

stilistikası ilə bağlı bir məqalə dərc etdi; alman dilinə edilən tərcümələrdə Quranın gözəlliyinin ötürülmədiyini dərk etdiyi üçün buna nail olmaqdan ötrü bir ölçü hazırlamağa çalışır. "Quran sadəcə İslamın qanun kitabı deyildir, o, həm də ərəblərin *şer sənətində bir şah əsərdir*" deyən Hammer-Purgstall vurğulayır ki, "Abdullahın oğlu öz sözlərini yalnız dilin ovsunu ilə oxuyanlara və *eşidənlərə* Allahın Öz sözü kimi qəbul etdirə *bilmişdi."*[404] Təbii ki, Joseph müsəlman dininə, o cümlədən müsəlmanların müqəddəs kitabına inanmadığı üçün onun ilahi kitab olduğunu qəbul etmirdi. Buna baxmayaraq Kitabın ədəbi gözəlliyini etiraf edirdi. Hammer-Purgstall'ın Quranın son qırx surəsi üçün poetik alman dilində hazırladığı tərcüməsi 1809-cu ildə "Fundgruben des Orients" jurnalında dərc olundu. Friedrich Rückert də bu ənənəni davam etdirərək Quranı alman dilinin ən gözəl üslubunda tərcümə etməyə çalışdı, lakin bu tərcüməsini tamamlaya bilmədi.[405] Quranın gözəlliyini tərcüməsində qoruyub saxlamağa çalışan daha bir *şərqşünas* Friedrich Eberhard Boysen (1720-1800) olub. Tərcüməsində tərəddüd edən Boysen Quranın dilindəki gözəlliyin haqqını verə bilməməkdən narahat idi. Almanların maarifçilik dövrünün şairlərindən olan Johann Ludwig Gleim'a 1765-ci ildə yazdığı məktublarının birində Boysen deyir: "Muhəmmədin möcüzəsindəki təmtəraqın, ahəngindəki cəsarətin və təsvirlərindəki çoxluğun, çeşidliliyin – özünüz də bildiyiniz kimi – haqqını verə bilmə*mişəm*."[406] Gleim'a iyirmi il əvvəl yazdığı məktubunda isə deyir: "Mən əgər Quranı tərcümə etmək istəsəydim gərək sizin *ruhunuza sahib olum; bu şerdə* o qədər atəş *və əzəmət* var ki!"[407] Boysen'in tərcüməsi axır ki, 1773-cü ildə işıq üzü gördükdə bu çalışması ilə Avropada İslam haqqında yayğın olan bəzi xətalı təsəvvürləri düzəltməyə ümidli olduğunu qeyd edirdi.[408] Quranı öz dillərinə tərcümə etməyə çalışanların qarşısında hər zaman bu çətinlik durub. İsveçlilərdə ədəbi özəlliklərə diqqət ayırmağa çalışan ilk Quran tərcüməsi Karl Vilhelm Zettersteen'ə aiddir. Onun tərcüməsini əlinə alan isveçli dərhal sezir ki, Qurandakı emosional vurğunu, mətninin axıcılığını, ifadənin güclülüyünü oxucuya çatdırmaq üçün Zettersteen arxaik və poetik bir isveç dili *seçmişdir.* Məlumdur ki, Aleksandr Puşkin, İvan Bunin kimi rus şairləri də Qurandan ilham alırdılar və bir *çox şerlə*rini Quranın motivləri üzərində yazıblar. Ümumiyyətlə rusların pre-*romantik şairlə*ri Qurana valeh idilər.[409] Burada onu da əlavə etməyimiz lazımdır ki, Quran şer deyildir, o, nadir bir üslubdur, nə *şerdir, nə*

---

[404] Christoph Martin Wieland, "Der Neue Teutsche Merkur", səh: 77; Verlage Landes-Industrie-Comptoirs, Weimar, 1807
[405] Mustafa Shah & Muhammad Abdel Haleem, "The Oxford Handbook of Qur'anic Studies", səh: 544-545; Oxford University Press, New York, 2020
[406] "Briefe vom Herrn Boysen an Herrn Gleim", səh: 171; Frankfurt und Leipzig, 1772
[407] "Briefe vom Herrn Boysen an Herrn Gleim", səh: 38; Frankfurt und Leipzig, 1772
[408] Jan Loop, "Divine Poetry? Early Modern European Orientalists on The Beauty of The Koran", Church History and Religious Culture, cild: 89, say: 4, səh: 482, Brill, Leiden, 2009
[409] William Mills Todd, "The Familiar Letter as A Literary Genre in The Age of Pushkin", səh: 137; Northwestern University Press, Illinois, 1999

də nəsrdir. Quran metrik dilin hər hansısa bilinən bir janrına müvafiq deyildir, bununla belə - William Graham və Navid Kermani deyir - "fövqəladə *bir* şəkildə, h*ətta izah olunmayacaq* şəkildə, cazibədardır."[410] Ərəblər özləri də Quranı hansısa bilinən kateqoriyaya salmaqda çətinlik çəkirdilər və onun təsirini "ovsun" və "sehrə" bənzədirdilər. Tarix bu misallarla doludur. Tufeyl bin Amr əd-Dəvsi öz qəbiləsinin, yəni Dəvs qəbiləsinin başçısı idi. Məkkəyə gəldiyində Məkkənin böyükləri onun Muhəmmədin dəvətinə qulaq asmağından narahat olduqları üçün onu xəbərdar edirlər. "Muhəmmədin oxuduqlarına qulaq asma!" dedilər. Tufeyl sadəcə bir rəhbər deyildi, o, həm də zəkalı bir şair idi. Özündən əmin olan Tufeyl fikirləş*ir: "M*ən insan sözündə gözəl olan ilə çirkin olanı ayıra biləcək qədər ağıllı *bir şair, yet*kin bir insan deyil*əmmi?!" Bu cür düşünə*n Tufeyl İslam peyğəmbəri ilə *görüşməyə* qərar verir və *görüşün nə*ticəsi tarixə məlumdur; Tufeyl Quranın valehedici gözəlliyinə vurularaq və İslamın sadə, ağlabatan mesajını qəbul edərək müsəlman olur.[411]

Shakespeare'i Quran ilə müqayisə etməyi bir kənara qoyaq, ümumiyyətlə Quran olmasaydı Shakespeare'in olmayacağını deyə bilərik. Nəinki Shakespeare, ümumiyyətlə müasir Avropa ədəbiyyatı müsəlmanlara, dolayısıyla da Qurana borcludur və borclu qalacaq. Hələ zamanında Avropa ədəbiyyatı tarixində araşdırmalar etmiş alimlər etiraf edirdilər ki, xüsusilə romans janrı Avropada müsəlmanların g*əlişi ilə* inkişaf edib. Thomas Warton'un zamanında yayğın olan fikir bu idi ki, "ərəb təxəyyülünün məhsulu Qərb dünyasına s*əlib yürüşlə*ri vasitəsi ilə keçib." Warton əlavə edir ki, bu təsir daha erkən zamandan başlayıb. "Sarasenlər və ya ərəblər" – Warton deyir – "…səkkizinci əsrdə İspaniyaya daxil oldular və .. dinlərini, dillərini və adətlərini yerli əhaliyə qəbul etdirərək paytaxt şəhər Kordoba'da kraliyyət qərargahı qurdular." Avropada yunan elmlərini də məhz müsəlmanların ihya etdiklərini dey*ən bu ingilis tarixçi şair qeyd edir ki, "eyni* zamanda onların romantik və yaradıcı dəhalarına xas olan o ekstravaqant icadlarını da yaydılar. Du Cange tərəfindən sitat gətirilən bir əlyazma bizə öyrədir ki, sarasenlərin g*əlişində*n qısa müddət sonra latın dilini öyrənməyi t*ərk etmiş* bu qəriblərin idxal etdikl*əri* ş*ə*rq kitabları ilə m*əftun olmuş ispanlar*, birdən birə qeyri adi təmtəraqlı üslub və ibarəli ülvi danışıq tərzi istifadə etməyə başladılar." Bu ədəbi üslubun daha sonra Toulon və Marseilles limanları vasitəsi ilə Fransaya və İtaliyaya keçdiyini qeyd edir.[412] Henry Wadsworth Longfellow 1830-cu ildə verdiyi mühazirələrdə "Fransa dramasının və Cəngavərlikdəki romansın m*ənşəyini* şərqin

[410] Jane Dammen McAuliffe, "The Cambridge Companion to The Quran", səh: 127; Cambridge University Press, New York, 2006
[411] Muhammad Husayn Haykal, "The Life of Muhammad", səh: 114-115; American Trust Publications, Indiana, 2014
[412] T. Warton, "The History of English Poetry", birinci cild, səh: i-iii; Thomas Tegg, 73, Cheapside, London, 1824

duyğularında tapır və italyan ədəbiyyatına aid çoban nəğmələrinin və sevgi balladalarının trubadurlardan və *ərəb şeriyy*atından təsirləndiyini göstərir."[413] Müsəlmanların Avropa ədəbiyyatının inkişafındakı təsiri, on doqquzuncu əsrin əvvəllərində artıq bir fakt kimi qəbul edilirdi. 1829-cu ildə də*rc edilmiş* "Encyclopedia Americana" bu barədə yazır: "Bağdad Asiya üçün nə rol oynayırdısa Kordobanın ali məktəbi də Avropa üçün eyni rolu oynayırdı, orada xüsusilə onuncu əsrdə ədəbiyyatın əsas sütunlarını ərəblər tə*şkil edirdilə*r…Xalqın cürətli və macərasevər ruhunun məhsulu olan balladalar da onlar tərəfindən icad *edilib. Heç bir şübhə* yoxdur ki, onlar bu vasitələr ilə müasir Avropa şeriyyatına güclü təsir göstəriblər… Macərasevər cəngavər ruhu, pərilərin və kahinlərin hekayələri və bəlkə də, qafiyə belə ərəblərdən bizim Qərb şeriyyatına keçib."[414] Aquitaine əyal*ətinin hersoqu doqquzuncu William, saray şairliyi hesab edə* biləcəyimiz trubadur ənənəsinin banisi hesab edilir. Maria Rosa Menocal məharət və ustalıqla William'ın həm əndəlüs, həm də fələstin mədəniyyətindən ciddi bir şəkildə təsirləndiyini göstərir. Onun "ənənəvi xristian cəmiyyətindən sıxıldığını" qeyd edən Menocal xatırladır ki, kilsə bu səbəblə onu iki dəfə ekskommunikasiya *etmişdi.*[415] Trubadur ədəbiyyatından danışan heç bir tarixçi William amilindən qurtula bilmir, lakin onların bir çoxu müsəlman mirasını etiraf etməkdən rahatsızlıq hiss etdiyi üçün Aquitaine hersoqunu müsəlman İspaniyasının və Fələstinin təsirindən qurtarmağa çalışırlar. Bu təsirlərə, bu qərəzlərə baxmayaraq ədəbiyyat tarixində özünə*layiq bir yer tutmuş bir h*əqiqət hələ də yaşamaqdadır: "*Ərəb şer* ənənəsindən d*ərin bir* şəkildə təsirlənən trubadur şeriyyatı on ikinci əsrdə Fransanın cənubunda ortaya çıxıb və sürətlə Avropanın digər hissələrinə yayılıb."[416] Avropa poeziyasının tarixini möhtəmələn ilk dəfə araşdırmış şəxs olaraq Giammaria Barbieri "Dell' Origine Della Poesia Rimata" *əsərində şerdə* qafiyənin istifadəsini bir yenilik kimi dəyərləndirir və *şeriyy*atın bu yeni xüsusiyyətlərinin mə*nşə*yini *Əndə*lüsə qədər izləyir.[417] Menocal kitabında geniş bir şəkildə Avropaçılıq fikrinin keçmişi təhrif etdiyini və tarixi araşdırmalardakı qərəzə gətirib çıxardığını göstərir və bir çox avropalı tarixçinin müasir Avropa ədəbiyyatının radikal şəkildə müsəlmanlardan təsirləndiyini inkar etməsini bu "avropaçılıq" ideologiyası ilə əlaqələndirir. Bununla belə xeyli sayda tarixçinin bu həqiqəti etiraf etdiyini də sənədləşdirir. Menocal kitabının əvvəlində "trubadur"

---

[413] Luther S. Luedtke, "Nathaniel Hawthorne and The Romance of The Orient", səh: 146; İndiana University Press, Indianapolis, 1989

[414] Francis Lieber, "Encyclopedia Americana", birinci cild, səh: 318-320; Carey & Lea, Philadelphia, 1830

[415] M. R. Menocal, "The Arabic Role in Medieval Literary History", səh: 32; University of Pennsylvania Press, Philadelphia, 2004

[416] Jason Glenn, "The Middle Ages in Texts and Texture: Reflections on Medieval Sources", səh: 292; University of Toronto Press, Toronto, 2011

[417] M. R. Menocal, "The Arabic Role in Medieval Literary History", səh: 79-80; University of Pennsylvania Press, Philadelphia, 2004

sözünün ərəb mənşəli olduğundan danışır və *bunun qaneedici* şəkildə isbat edildiyini yazır. Bundan əlavə trubadur mədəniyyətinin müsəlmanlardan qaynaqlandığını göstərə*n bir başqa d*əlil isə budur ki, istifadə olunan çalğı alətləri də müsəlmanlardan götürülüb. Roger Boase bu mövzuda yazdığı tarixi araşdırmasında deyir: "Avropanın ərəb musiqisinə borclu olması fikri hələ də mübahisəlidir, lakin "lute", "rebec", "guitar" və "naker" kimi sözlərin ərəbcədəki "ud", "rabab", "qithara" və "naqqara" sözlərindən əmələ gəldiyi kifayət qədər isbat olunub və göstərir ki, (müsəlmanların) təsiri nəzərə çarpacaq dərəcədə olub."[418] Rebec adı həm də rebelle və rubebe adları ilə də tanınırdı, yalnız on *beşinci* əsrdə "rebec" adı tək bir ad olaraq müəyyən edildi. Skripka alətinin erkən modeli hesab edilən rebec tarixçilərin də etiraf etdikləri kimi müs*əlman Şə*rqdən gəlir.[419] Lute isə Şərqin məş*hur "ud" alə*tidir və möhtəmələn fransız dilindəki "l'oud" formasından ortaya çıxıb. Avropanın ilk sevgi şerləri, şeriyyatdakı qafiyə və *ritm, bu şerləri mü*şaiyət edən çalğı alətləri müsəlmanlardan öyrənilibsə, hətta trubadur sözü belə ərəb dilində "musiqi oxumaq" mənasına gələn "tarabə" felindən qaynaqlanırsa o zaman Avropa ədəbiyyatının müsəlmanlara borclu olduğunu necə inkar etmək olar?! Roger Boase ilə yanaşı Bernard O'Donnoghue, Peter Dronke, Alois Richard Nykl, Alexander Joseph Denomy, Lois Anita Giffen kimi ədəbiyyat tarixçiləri də bu ədəbi janrın müsəlmanlardan gəldiyini etiraf edirlər.[420] Bir sözlə İslam dini və müsəlmanlar olmasaydı Avropa indiki ədəbiyyatına sahib olmayacaqdı, heç Shakespeare ilə tanış olmayacaqdılar. Çünki Avropa ədəbiyyatı ümumilikdə öz kimliyini müsəlmanlara, müsəlmanlar isə Qurana borcludurlar. Çünki şeriyyatı və ədəbiyyatı müsəlmanlardan öyrə*nmiş provensial şairlə*rə - Nietsche demiş*kən – "Avropa çox şeyini, hə*tta hə*r şeyini* borcludur."[421]

---

[418] R. Boase, "The Origin and Meaning of Courtly Love: A Critical Study of European Scholarship", səh: 125; Manchester University Press, Manchester, 1977
[419] Alberto Bachmann, "An Encyclopedia of The Violin", səh: 1-2; Dover Publication, New York, 2008
[420] Abdulla al-Dabbagh, "Literary Orientalism, Postcolonialism and Universalism", səh: 42-43; Peter Lang Publishing, New York, 2010
[421] Friedrich Nietzsche, "Beyond Good and Evil", səh: 204; Carlton House, New York, 1930

# MÖCÜZƏ

*"Əgər sizdən birinizin başı anidən aslan başı olsa və nərildəsə, şübhəsiz ki, bu, fövqəladə bir hal olacaq. İlkin təəccübümüzdən ayılan kimi təklifimiz bu olacaq ki, həkim çağıraq və məsələni elmi yöndən araşdıraq... O zaman möcüzə hara getdi? Çünki aydın məsələdir ki, məsələyə bu cür yanaşdıqda möcüzəvi hər bir şey yoxa çıxır... Bu onu göstərir ki, "elm, möcüzələrin olmadığını sübut edib" demək absurddur. Doğru olan isə budur ki, bir fakta elmi yöndən baxmaq ona möcüzə olaraq baxmaqdan fərqlidir."*

Ludwig Wittgenstein

John Locke bizə holland səfir ilə Siam ölkəsinin kralı arasında keçən bir söhbəti nəql edir. "Hollandiyalı səfirin Hollandiyanın xüsusiyyətləri barəsində danışıb Siam kralını" əyləndirdiyini deyən Locke söhbətin təfərrüatını qeyd etmir. Lakin bir misalı xüsusilə qeyd edir. Səfir "ona dedi ki, ölkəsində su, bəzən soyuq havalarda o qədər sərtləş*irdi ki, insanlar onun üzə*rində yeriyə bilirdilər və hətta orada bir fil olsa idi onu belə daşıyardı. Buna kralın cavabı belə oldu: "Bura qədər mənə danışdığın qəribə *şeylə*rə inanırdım, çünki səni ağıllı və dürüst biri kimi görürdüm, amma indi isə sənin yalan danışdığından əminəm."[422] Siam kralı öz ölkəsindəki isti iqlimdə suyun donduğunu görm*əmişdi,* bəlkə də səfir ilə *görüşünə* qədər bunun xəbərini belə *eşitməmişdi. O, suyun nə* olduğunu bilirdi, onu gündəlik həyatında müşahidə edirdi və onun üçün suyun bir filin ağırlığını daşıyacaq qədər sərtləş*mə*sini qəbul etmək imkansız idi. Naturalistlər və materialistlər də dünyaya Siam kralının baxdığı gözlə baxırlar. Onların aləmində təbiətdən ötədə bir şey yoxdur, ilahi varlıq mövcud ola bilməz, ona görə də təbiətin ad*ətini pozacaq* şəkildə ilahi bir müdaxilənin olması imkansızdır. Siam kralı görmədiyi üçün, xəbəri olmadığı üçün inkar edirdi, bunlar da təbiətdən, materiyadan ötədə bir şeyin varlığını görmədikləri üçün, bilmədikləri üçün inkar edirlər. Hitchens'in möcüzələrə münasibəti də digər ateist yoldaşları kimi çox bəsitdir: ona görə möcüzələr imkansızdır, ola bilməz. "Möcüzənin təbii nizamda *əlverişli bir də*yişiklik olduğunu ehtimal etsək" – Hitchens deyir – "mövzunun son sözünü şotland filosof David Hume yazıb; o, bu məsələdə bizə azad iradə bəxş

---

[422] J. Locke, "An Essay Concerning Human Understanding", səh: 476; J. F. Dove, London, 1828

edib."[423] Əgər Hitchens "azad iradə" ilə mövzu haqqında ağlına gələni yaza biləcəyini qəsd edirsə onunla razılaşırıq, həqiqətən də bu baxımdan o özünü çox sərbəst hiss edib. Amma mövzunun son sözü nə uzaqdan, nə də yaxından David Hume'a aid deyildir və heç zaman aid olmayıb. Əgər filosof John Earman'dan soruşsanız o, Hume'un mərkəzi arqumentini "əsasən qeyri-orijinal" adlandırır və əlavə edir ki, "orijinal olan yerlərdə isə az qala heç bir dəyəri yoxdur." *Bir başqa* yerdə deyir: "Hume'un Enquiry Concerning Human Understanding" kitabındakı onuncu (Möcüzələr Haqqında) fəsil bir iflasdır."[424] Xeyr, Earman xristian deyil, heç Allaha da inanmır, sadəcə olaraq bir filosof kimi David Hume'a xəta olaraq çempion titulunun verilməsi ilə razı deyildir, yarışda iştirak edən digər iştirakçılara qarşı haqsızlıq hesab edir. Hume'un arqumentlərinin orijinal olmadığını daha əvvəlki yazıçılardan – misal üçün Thomas Woolston, Peter Annet – misallar gətirərək göstərir. David Hume'un arqumenti bir neçə hissədən ibarətdir; bir yerdə o, möcüzə məsələ*sini şahidlərin şahidliklə*ri ilə ümumi bilinən faktlar arasında ziddiyyətə gətirib çıxarır. Möcüzələrə inanmaq – Hume'a görə - təbiətdə *müşahidə* etdiyimiz nizam, adət, qanun haqqında yəqinliklə bildiyimiz faktları tərk edib *şahidlə*rin – nə qədər etibarlı və say baxımdan çox olsalar da – dediklərinə inanmağı tələb edir. Təbiət haqqında bildiklərimiz də*yişməz*, sabit, hə*mişə* doğru olan təcrübə*dir, şahidlərin şahidliklə*ri isə eyni dərəcədə sabit, də*yişmə*z bir bilik deyildir, ona görə də *şahidliklə*rin nə qədər güclü olmasından asılı olmayaraq onlara inanmaq haqqımız yoxdur. Hume'un rəyinin xülasəsini ən azından ingilis *filosof Charlie D. Broad bu* şəkildə təqdim edir.[425] Buradan anlaşılır ki, şahidlər nə qədər etibarlı, nə qədər dürüst olsalar da onların şahidlikləri möcüzələrə inanmaq üçün kifayət etmir. John Earman belə bir xülasə ilə razılaşmır, lakin "etiraf" edir "ki, mətn, (Richard) Price və Broad'ın (Hume'un sözlərindən) anladıqları mənanı çıxara biləcək qədər ikibaşlıdır."[426] John Earman arqumentin xülasə*sini başqa cür* verir: "Hume'un möcüzələrə qarşı ilk arqumenti qısaca belədir: Bir möcüzə, fərz edilən bir təbiət qanunun pozulmasıdır. Hume'un dəqiq induktiv qaydasına əsasən təcrübənin fərz edilən qanuna verdiyi ehtimal dərəcəsi 1-ə bərabərdir. Beləliklə də möcüzənin ehtimalı birbaşa 0-a bərabərdir. Bu qədər sadədir."[427] Earman arqumentin "ehtimal" dərəcəsinə əsaslandığını izah etdikdən sonra Hume'un müasirlərindən iki alimin ona verdikləri cavaba toxunur və burada Richard Price

[423] "GIG", səh: 141
[424] J. Earman, "Hume's Abject Failure; The Argument Against Miracles", səh: I və 3; Oxford University Press, New York, 2000
[425] "Proceedings of The Aristotelian Society; Containing The Papers Read Before The Society During The Thirty-Eight Session, 1916-1917", cild 17, səh: 80; Williams and Norgate, London, 1917
[426] J. Earman, "Hume's Abject Failure; The Argument Against Miracles", səh: 22; Oxford University Press, New York, 2000
[427] Eyni mənbə: səh: 23

ilə Thomas Bayes'in çalışmalarına yer verir. Price ilə Hume qarşılıqlı məktublaşırdılar və bu məktublaşmadan biz öyrənirik ki, Hume öz arqumentinə qarşı Price'in gətirdiyi tənqidi ciddiyə alırdı. Price – Bayes'un ehtimal nəzəriyyəsinə əsaslanaraq – göstərirdi ki, induktiv qayda heç bir şəkildə yəqinlik ifadə etməz, yalnız möhtəməllik, mümkünlük ifadə edə bilər. Beləliklə də təbiət qanununa verilən ehtimal dərəcəsi 1-ə bərabər ola bilməz, dolayısıyla da möcüzəyə verilən ehtimal 0-a bərabər olmaz. Fəlsəfədə "induksiya problemi" ilə əlaqəli olan bu mövzu əslində daha çox Hume'un adı ilə bağlıdır, lakin bu məqamda Price bunu – başqa bir nöqtədən – Hume'un özünə qarşı istifadə edir. Möcüzə sualına gəldikdə Hume induksiya metodunu istifadə edərək ehtimalı sıfıra endirir, lakin təbiət qanunlarındakı ehtimalı birə qaldırır. Earman bunun müasir elmi ənənəyə çox zərərli olduğunu deyir və nümayiş etdirmək üçün bir misal verir. Zərrə fiziklərinin müşahidə etdikləri zilyonlarla protonların arasında heç birinin parçalandığı görülməyib, buna baxmayaraq həmin fiziklər müşahidə edəcəkləri növbəti protonun parçalanmayacağı ehtimalını 1-ə bərabər hesab etmirlər və onlar ümumiyyətlə protonların parçalanmaması fikrilə bağlı güclü bir gümana belə sahib deyillər. Əks təqdirdə onların proton parçalanmasını müşahidə etmək üçün sərf etdikləri vaxt və pulu heç bir məntiqi qərar ilə izah etmək doğru olmazdı. Əgər Hume'un möcüzələr haqqında dediklərini bura aid etsək belə bir nəticə çıxacaq; indiyə qədər müşahid edilmiş zilyonlarla protondan heç biri parçalanmayıbsa bundan sonra hansısa birinin parçalanacağını gözləmək məntiqsizdir, çünki parçalanması ehtimalı sıfıra bərabərdir. Price və Bayes'in nəzəriyyəsinə görə isə protonun parçalanması mümkün olaraq qalır.

Locke'nin Siam kralı Hume arqumenti üçün hər zaman ciddi bir problem olub, ona görə də onun Enquiry kitabı ilk dəfə nəşr olunduqda Hume bu misala ümumiyyətlə toxunmur. Lakin irland filosof Philip Skelton 1749-cu ildə nəşr etdiyi "Ophiomaches" kitabında bu misalın Hume'un arqumenti üçün problem olduğunu və buna görə Hume'un bu barədə susduğunu vurğuladıqdan sonra Enquiry kitabının 1750-ci ildəki nəşrində bu misalın müzakirəsi də yer alır. Maraqlıdır ki, Hume'un bu misala verdiyi cavabların heç biri ciddi fəlsəfi izahlar olaraq yadda qalmır. Hume qeyd edir ki, təkcə Siam kralının təcrübəsi və bilikləri bir şeyin təbiət qanunu olması üçün kifayət etmir; bir şeyin təbiət qanunu kimi qəbul edilməsi üçün bütün bəşəriyyətin keçmiş təcrübəsi ittifaq halında olmalıdır; möcüzə isə təbiət qanunlarının pozulmasıdır. Lakin bu əslində cavab deyildir, çünki buradakı problem "təbiət qanunu versus möcüzə" ilə bağlı deyildir, problem möcüzəyə inanmaqdakı rasionallıqdır. Əgər David Hume möcüzəyə qarşı qoyduğu arqumentdə haqlıdırsa o zaman Siam kralı holland səfirini yalançı adlandırmaqla rasional davranıb və haqlı idi; çünki holland səfirinin şahidliyi qarşısında Siam

kralının təbiətdən *müşahidə* edərək öyrəndiyi və - onun təcrübəsində - heç zaman dəyişməyən "bir adət" var idi; bu, suyun heç bir zaman sərt olmadığını "sübut edirdi". Əslində Siam kralı misalından da əvvəl Hume'un özünün təsdiqlədiyi "induksiyanın yetərsizliyi" problem olaraq durur və bu, bəzilərinə görə Hume'un möcüzələr haqqında gətirdiyi ilk arqumentə cavab olaraq kifayət edir. Beləki Hume özü deyir: "*Mümkün olan bir şeyin* xəta olduğu heç bir zaman isbat edilə bilməz; və təbiətin məcrasının dəyişməsi mümkündür, çünki biz belə bir *dəyişikliyi* təsəvvür edə bilirik."[428] P. Skelton bunun fərqinə varmışdı və "Ophiomaches" əsərində bir dialoqda Shephard'ın adı ilə buna belə cavab verirdi: "Təcrübənə və *keçmiş müşahidə*lərinə əsasən sən əminsən ki, Günəş sabah çıxacaq. Lakin heç bir təcrübə səni bundan əmin edə bilməz, çünki günəşin çıxmayacağını demək heç *bir* şəkildə ziddiyyət təş*kil etmir."*[429] Burada "çünki günəşin çıxmayacağını demək *heç bir* şəkildə ziddiyyət təş*kil etmi*r" sözü David Hume'un kitabındakı "çünki təbiətin məcrasının də*yişməsinin mümkünlüyü heç bir* şəkildə ziddiyyət təş*kil* etmir"[430] sözlərinin parafrazasıdır. *Bir başqa yerdə* Hume deyir: "Günəş*in sabah* çıxmayacağı" fikri "onun sabah çıxacağını" təsdiqləməkdən daha az anlayış *nümayiş etdir*ən və nə də daha çox ziddiyyət ifadə edən bir fikir deyildir."[431] Hume'un fəlsəfi irsi üzərində ekspert sayıla biləcək ingilis filosof Antony Flew qeyd edir ki, "ilk İnquiry kitabında möcüzə barəsində yazdığı məş*hur f*əsildə" səbəb və nəticə barəsində müdafiə etdiyi skeptik mövqedən "heç bir əsər-əlamət yoxdur."[432]

David Hume'un arqumentinin birinci hissəsi möcüzələ*rin baş verm*əsi ehtimalı ilə bağlı idisə, ikinci hissəsi möcüzələr haqqında şahidlik edənlərin etibarlılığı ilə bağlıdır. Onun nəzərində hətta möcüzələr mümkün olsa belə *"heç bir şahidlik elə* bir növdən ola bilməz ki, onu yalanlamaq, onun isbat etməyə çalışdığı faktdan daha möcüzəvi olsun"[433]. Bununla demək istədiyi əslində budur ki, möcüz*ənin baş* verdiyini sübut ed*ən şahidli*k elə bir şahidlik olmalıdır ki, onun yalan olması möcüzənin özündən də daha inanılmaz olsun. Bu arqumentin daha yüngül forması müasir neo-ateistlərin dilində sevimli mantraya çevrilib: "Fövqəladə iddialar fövqəladə dəlillər tələb edir." Bunu bir aforizm kimi populyarlaşdıran Carl Sagan

[428] D. Hume, "On Human Nature and The Understanding", səh: 294; Collier Books, New York, 1962
[429] "The Works of The Rev. Philip Skelton", birinci cild: səh: 319; William Watson, Dublin, 1770
[430] D. Hume, "On Human Nature and The Understanding", səh: 55; Collier Books, New York, 1962
[431] D. Hume, "An Enquiry Concerning Human Understanding", səh: 15; Hackett Publishing Company, Indianapolis, 1993
[432] A. Flew, "Philosophy: An Introduction", səh: 120; Promotheus Books, New York, 1980
[433] J. Earman, "Hume's Abject Failure; The Argument Against Miracles", səh: 38; Oxford University Press, New York, 2000

oldu.[434] Bir çoxları əks tərəfin arqumentini rədd etmək üçün bunu bir düstur kimi istifadə edir və ilk dəfədən belə bir qayda insana təbii səslənir. Amma işin həqiqəti budur ki, bu iddianın özünün isbata və ya ən azından izaha ehtiyacı vardır. Çünki bir şeyin fövqəladə olması özü də nisbidir, ona görə də həm isbat edilməsi tələb olunan hadisənin fövqəladə olması, həm də istifadə edilən dəlillərin fövqəladə olması fərddən fərdə, məzmundan məzmuna dəyişə bilər. Siam kralı üçün əlbəttə ki, suyun sərtləşməsi fövqəladə bir hal idi, lakin hollandlar üçün bu, sıradan bir hal idi. Nə qədər fövqəladə görünsə də kralın qarşısında bunu isbat etmək çətin deyildi, soyuq iqlimdən böyük bir buz parçasını gətirməklə krala suyun necə sərtləşdiyini və buzun necə əridiyini nümayiş etdirmək mümkün idi. Bizim zamanımızdakı bir çox elmi kəşfləri fövqəladəlik ilə vəsf edə bilərik. Einstein 1915-ci ildə ümumi nisbilik nəzəriyyəsində "fəza-zamanın" (spacetime) büküldüyünü irəli sürdüyündə bəşəriyyət üçün bu, fövqəladə səslənirdi. Çünki maddə və enerjinin bizim ətrafımızdakı fəzanı əyməsi, bükməsi sağlam düşüncəyə tamamilə zidd gələn bir iddia idi, lakin belə bir iddianın isbatı üçün adi bir proqnoz və müşahidə kifayət etdi. 1919-cu ildə günəş tutulması zamanı günəşə yaxın görünən uzaq ulduzların işığının – Einstein'in xəbər verdiyi kimi – yer dəyişdirdiyi müşahidə edildi. Bu sadə bir müşahidə məşhur fizikin iddiası üçün ilk və əsaslı bir dəlil idi, lakin biz bunu fövqəladə dəlil adlandıra bilərikmi? 2011-ci ildə nobel mükafatını qazandıran kəşfi, yəni Kainatın daim sürətlənən tempdə genişlənməsi, fövqəladə bir kəşfdirmi? Əgər bunu fövqəladə adlandıra biliriksə bunun dəlilini o qədər də föqvəladə adlandırmaq olmaz. Kvantum fizikasındakı bir çox yeniliklər də bu kateqoriyaya daxil olur; məşhur qoşa-yarıq eksperimenti mahiyyət baxımından çox adi bir eksperimentdir, amma dəlalət etdiyi nəticələr həddindən ziyadə fövqəladədir. Məşhur insanların dedikləri hər "prinsipin", hər "qaydanın" doğru olması zəruri deyildir. "Dünyəvi insanlar… hamılıqla haqdan payı olmayan bir-neçə abırsız prinsipə əsaslanırlar" deyən Chesterton bəlkə də hardasa haqlıdır.[435] Hume da istisna deyildir. Onun möcüzələrə qarşı gətirdiyi ikinci arqumenti bu baxımdan da qənaətbəxş görünmür. Həqiqət budur ki, bu mövzuda Hume'un müasirləri tənqidlərində daha uğurlu idilər, xüsusilə Richard Price cavablarında əsaslı və intellektual cizgi izləyirdi. David Hume'un Richard Price'ın evini bir neçə dəfə ziyarət etdiyini bilirik və bu ziyarətlərindən birində Hume "səmimiyyətlə etiraf edib ki, Cənab Price bir nöqtədə onun arqumentlərinin əsaslı olmadığına onu inandıra bilib."[436] Çox təəssüf ki, əlimizdə həmin söhbətlərin tarixi qeydləri yoxdur və biz

[434] C. Sagan, "Broca's Brain: Reflections on The Romance of Science", səh: 73; Presidio Press, New York, 1979; C. Sagan, "Billions & Billions: Thoughts on Life and Death at The Brink of The Millennium", səh: 85; The Random House Publishing Group, New York, 1997

[435] Gilbert K. Chesterton, "Orthodoxy", səh: 20; John Lane, The Bodley Head, London, 1915

[436] Roland Thomas, "Richard Price, Philosopher and Apostle of Liberty", səh: 30; Oxford University Press, H. Milford, London, 1924

Hume'un qəsd etdiyi həmin nöqtənin də nə olduğunu bilmirik. Lakin bura qədər qeyd etdiklərimiz bu mövzuda son sözün Hume tərəfindən deyilmədiyini göstərmək üçün kifayət etməlidir.

Mövcud olan xətalı təsəvvürlərdən biri də budur ki, əvvəlki insanlarda təbiət qanunları haqqında doğru anlayış olmadığı üçün möcüzələrə inanırdılar və müasir zamanımızda elm inkişaf etdiyi üçün möcüzələrə inanmaqda heç kimin "üzrü" qalmayıb. Keçmişin insanlarını bu dərəcədə primitivləş*dirmə*yi müasir insanların təkəbbürlüyünə bağlaya bilərik. Richard Dawkins – dostu Hitchens kimi - adətinə uyğun olaraq dini etiqad sahibləri ilə istehza edir və deyir: "T*əhsilli bir ş*əxsin möcüzələrə - misal üçün "bakirə doğuşa" - inandığını utanmadan etiraf edə biləcəyi ən son vaxt on doqquzuncu əsr idi."[437] Bu təkəbbürlük, bu özündən razılıq fərdlərdən daha çox, ideologiyadan qaynaqlanır. Lakin reallıq Dawkins'in və dostlarının yanıldığını dəfələrlə sübut edib. 1997-ci ildə fizika üzrə nobel mükafatı laureatı William Phillips, Cambridge universitetində kvantum fizikası üzrə professor kimi çalışan John Polkinghorne və İnsan Genom Layihəsi'nin (Human Genome Project) sabiq sədri və Milli Səhiyyə İnstitutunun hazırki sədri Francis Collins kimi intellektual alimlər utanmadan, çəkinmədən möcüzələrə inandıqlarını deyirlər.[438] Əgər utanma halı varsa bu, heç də - Dawkins'in iddia etdiyi kimi - insan rasionallığından qaynaqlanmır, ateistlər tərəfindən akademik dairələrdə formalaşdırılmış qeyri-sağlam mühitdən qaynaqlanır.

Keçmişin insanlarına gəldikdə isə rasionallıq onlardan – iddia olunduğu qədər – *uzaq deyildi; keçmişdə* də təbiət qanunları qəbul edilirdi və insanlar bundan cahil deyildilər. Möcüzə sözünün tərifi belə bu iddianı yalanlamaq üçün kifayət edir, çünki möcüzə dedikdə insanlar normal olan haldan yayınma başa düşürlər. Belə bir anlayış yalnız və yalnız normal hal haqqında bir təsəvvür mövcud olduqda mümkündür. İnsanlar bunu q*ədim zamandan müşahidə* ediblər və bu, onların gündəlik təsəvvürlərinin ayrılmaz parçası idi. Ona görə də möcüzələrə bəzən "xariqüladə" deyilir və ərəb dilində bu söz "adəti, qanunu pozan" deməkdir. Deməli əminliklə deyə bilərik ki, insanlar bu baxımdan təbiətdə mövcud olan qanunlara, adətlərə inanırdılar və bu möcüzələri həmin qanunların pozulması kimi görürdülər. Quran bizə xəbər verir: "Elçilərimiz İbrahimə (İshaqın doğulacağı barədə) müjdə gətirdilər və "Salam!" – dedilər. O da: "Salam!" – dedi və dərhal (gedib) qızardılmış bir buzov gətirdi. (İbrahim mələklərin) yeməyə əl vurmadıqlarını gördükdə *onlar onun xoşuna g*əlmədi və onların yanında canına qorxu düşdü. Onlar dedilər: "Qorxma! Həqiqətən biz Lut qövmünə göndərilmişik." Onun arvadı

---

[437] R. Dawkins, "The God Delusion", səh: 187; Black Swan Edition, London, 2016
[438] John Lennox, "Gunning For God: Why The New Atheists Are Missing The Target", səh: 170; Lion Hudson, Oxford, 2011

(pərdə arxasında) durmuşdu və o, güldü. Biz onu İshaqla, İshaqın ardından da Yaqubla müjdələdik. O dedi: “Vay halıma! Mən bir qoca qarı, bu ərim də bir qoca kişi olduğu halda doğa bilərəmmi? Doğrusu, bu, *təəccüblü bir şeydir.*” [11:69-72] İbrahimin arvadı bütün səmavi dinlərdə ehtiramla yad edilən Saradır və məhz o, qonaqların onun ərinə *uşaqla müjdə* verməyinə gülürdü. Çünki Sara dövrünün digər insanları kimi çox gözəl bilirdi ki, ixtiyarlıq dövründə qadınların uşaqları olmur, təbiətin qanunu belədir. Bununla belə möcüzələri qəbul edirdilər və Allahın hər şeyin Yaradıcı olaraq istədiyini etməyə qadir olduğuna inanırdılar. Bu ikisi arasında onların aləmində heç bir ziddiyyət yox idi. C. S. Lewis deyir: ”Elmi proqresin hansısa yolla bu məsələni d*əyişdirm*əsi fikri, “qədim zamanlarda” insanlar “təbiətin qanunlarını bilmədikləri üçün” möcüzələrə inanırdılar fikri ilə yaxından əlaqəlidir. Ona görə də sən insanları belə deyərk*ən eşid*əcəksən: “İlk xristianlar İsanın bakirə bir qızın oğlu olduğuna inanırdılar, lakin biz bilirik ki, elmdə bu imkansızdır.” Bu cür dey*ən insanlar düşünürl*ər ki, möcüzələrə inanmaq elə bir zamanda ortaya çıxmışdı ki, təbiət prosesi haqqında insanların cahilliyi o dərəcədə idi ki, möcüzələrin bu təbii prosesə zidd olduğunu dərk edə bilmirdilər. Bir anlıq təfəkkür bu fikrin tamamilə cəfəngiyat olduğunu göstərir: Bakirə qızın doğuşu hekayəsi xüsusilə diqqətəlayiq bir misaldır. Müqəddəs Yusuf öz nişanlısının hamilə olduğunu öyrəndikdə təbii olaraq ondan üz döndərməyə qərar verdi. Nə üçün? Çünki o da istənilən müasir ginekoloq bilirdi ki, təbiətin adətinə görə qadınlar *kişilərlə yatmadan uşaq sahibi ola bilm*əzlər. *Şübh*əsiz ki, müasir ginekoloq doğuş və atalıq haqqında Müqəddəs Yusufun bilmədiyi bir çox *şeyi bilir. Lakin h*əmin *şeyl*ər (müzakirədəki) əsas mövzu ilə - bakirə qızın doğuşunun təbiət adətinə əks olması ilə - əlaqəli deyildir. Müqəddəs Yusuf da bunu bilir. Bu gün “bu hal elmdə imkansızdır” deməyin doğru olduğu bütün mənalarda o da eynisini deyəcəkdi; çünki bu hal hər zaman imkansız olub və bunun imkansız olduğu da hər zaman bilinib, lakin təbiətin sıravi prosesinin xüsusilə bu halda təbiətdən ötədə bir varlıq tərəfindən ləğv edilməsi və ya əlavələrə məruz qalması halı istisnadır.”[439] Deməli möcüzələrə inanan keçmişin insanları eyni zamanda təbiətin adətinə, nizamlı cərəyanına da inanırdılar və bu ikisi arasında bir uyğunsuzluq görmürdülər. Çünki təbiəti, təbiətin qanunlarını yaradan bir fövqəltəbii varlığın olduğuna inanırdılar. Ona görə də müasir elmin inkişafının möcüzələrə olan inancın zəifləməsi ilə bir əlaqəsi olmamalıdır. Möcüzələrə inamın zəifləməsi Allaha imanın zəifləməsi ilə bağlıdır. Bu günün insanları da keçmişin insanları kimi təbiətin qanunlarını qəbul edirlər və bu baxımdan cövhəri bir d*əyişiklik yoxdur; t*əbiət qanunlarının necə çalışdığını daha yaxşı anlamağımız təməl prinsipdə bir d*əyişiklik etmir, çünki h*əm *keçmişin, h*əm də günümüzün insanları üçün təbiət qanunları bir qanun olaraq

---

[439] C. S. Lewis, ”Miracles: A Preliminary Study”, səh: 56-57; Geoffrey Bles – The Centenary Press, London, 1947

qalır. İşin dəyişən tərəfi təbiət qanunlarına, təbiətin adətinə inancla bağlı deyildir, lakin təbiətdən kənarda ilahi bir qüvvənin varlığı ilə bağlıdır. Beləki, müasir postmodernist insan ilahi varlığı etiraf etmədiyi üçün möcüzələri qəbul etmək istəmir. Yəni müasir ateistlərin Allaha inanmamaqlarının səbəbi möcüzələri görməməkləri və ya ümumiyyətlə möcüzələrin olmaması deyildir, onlar əksinə tam *başqa s*əbəblərə görə Allaha inanmırlar və Allaha inanmadıqları üçün, təbiətdən ötədə bir qüvvənin, varlığın mövcudluğunu inkar etdikləri üçün möcüzələrə inanmırlar. Bu həqiqəti John Stuart Mill belə ifadə edir: "Əgər biz artıq fövqəltəbii amillərə inanmırıqsa heç bir möcüzə bizə onların mövcudluğunu sübut edə bilməz. Möcüzə özü, sadəcə olaraq fövqəladə bir fakt hesab edildikdə, bizim duyğu orqanlarımız tərəfindən və *ya şahidliklə*r vasitəsi ilə qənaətbəxş *d*ərəcədə təsdiqini tapa bilə*r, lakin heç bir şey bunun möcüzə* olduğunu sübut edə bilməz; (çünki) *ortada daha başqa bir f*ərziyyə vardır ki, bu (möcüzə), bizə məlum olmayan hansısa təbii səbəbin nəticəsi ola bilər…"[440] J. S. Mill qısacası bunu demək istəyir ki, biz ateist olaraq təbiətdə*n başqa heç bir şeyə* inanmırıq, hətta gözümüzün qarşısında – dindarların möcüzə adlandırdıqları – fövqəladə *bir hal baş verə*rsə biz bunun mütləq təbii bir izahının olduğuna inanacağıq.

Üstəlik onu da əlavə etmək olar ki, Qərbdə on yeddinci əsrdə*n başlayaraq* qızğın bir şəkildə davam edən bu müzakirədə möcüzələri inkar edən tərəf öz dövrünün elmi icması deyildi. Möcüzələri müdafiə edənlər arasında ənənəvi dini dairələr olduğu kimi, liberal teologiya tərəfdarı sayılacaq böyük alimlər də var idi və məhz həmin alimlər öz zamanının elmi inkişafının avanqardını tə*şkil edirdilə*r.[441] Robert Burns bu nöqtəni isbat etmək üçün kitabında Boyle, Sprat, Wilkins, Glanvill, Newton kimi təbiət elmlərini təmsil edən böyük alimlərin nəzər nöqtəsini təqdim edir. Möcüzələri inkar edənlər o dövrün elmi tərəqqisini təmsil etmirdilər, onlar əsasən deistlərdən ibarət idilər və ənənəvi dinlərə qarşı etiraz etdikləri üçün möcüzələri də o cümlədən imkansız görürdülər. Təbiət elmlərini təmsil edən alimlər isə möcüzələri qəbul edirdilər. Onların bir hissəsi qəbul etməklə yanaşı onların bir hissəsini təbiət qanunlarının özü ilə izah edirdilər. Misal üçün Isaac Newton və onun William Whiston, Samuel Clarke kimi tələbələri əksər möcüzələri təbiət qanunları ilə izah edirdilər; Musanın əli ilə Misirin başına gələn fəlakətlərin hamısının təbii izahlarının olduğuna inanırdırlar, lakin bununla belə bəzi möcüzələri ənənəvi mənada, təbiət qanunlarının pozulması kimi görürdülər.[442] İnsanların təbiət haqqında biliklərinin artması ilə, təbiət elmlərində dərinləş*mə*si ilə

---

[440] J. S. Mill, "A System of Logic, Ratiocinative and Inductive", səh: 440; Harper & Brothers, New York, 1882

[441] Robert M. Burns, "The Great Debate on Miracles: From Joseph Granvill to David Hume", səh: 12-14; Associated University Presses, New Jersey, 1981

[442] Peter Harrison, "Newtonian Science, Miracles and The Laws of Nature", Journal of The History of Ideas, 56-cı cild, say: 4, səh: 537-546; University of Pennsylvania Press, Okt. 1995

möcüzələrə inancının zəiflədiyini iddia edənlər üçün bu göstərdiklərimiz aşkar ziddiyyət təşkil edir, çünki onların iddia etdiklərinin əksinə olaraq, möcüzələri inkar edən deistlərə qarşı müxalifət göstərənlər dövrünün ən görkəmli elm adamları olublar. Təbiət qanunlarına inanmaqla möcüzələr inanmağın arasında bir ziddiyətin olmadığını C. S. Lewis maraqlı bir şəkildə izah edir: "Əgər mən bazar ertəsi günü siyirməyə altı qəpik və çərşənbə axşamı daha altı qəpik qoyuramsa, qanunlar mənə onu deyir ki, - əgər qalan hər şey öz yerindədirsə - çərşənbə günü mən orda on iki qəpik tapmalıyam. Amma əgər siyirməyə oğrunun əli müdaxilə edibsə mən orda tapdığım təkcə iki qəpik də ola bilər. Nəsə bir şey mütləq pozulmuş olmalıdır (ya siyirmənin qıfılı, ya da İngiltərənin qanunları), lakin riyaziyyatın qanunları pozulmuş olmayacaq. Oğru tərəfindən yaradılmış yeni vəziyyət orijinal vəziyyətdə olduğu kimi yenə də riyaziyyat qanunlarını nümayiş etdirəcək."[443] Lewis'in demək istədiyi çox sadədir; möcüzələrin olması Allahın müdaxiləsidir, yəni Allahın öz yaratdığı təbiətə müdaxiləsidir və oğrunun misalında riyaziyyatın qanunları pozulmadığını gördük, sadəcə olaraq araya əlavə bir faktor daxil oldu. Möcüzə də bunun kimidir, təbiət qanunları pozulmamış, lakin əlavə bir amil daxil olmuşdur. Çünki teistlərin bir hissəsinə görə - müsəlmanlar da bura aiddir – təbiət qanunu adlandırdığımız nizam ilahi feldən kənar bir şey deyildir, mövcudiyyətdə baş verən hər bir şey Allahın feli sayılır; bu fellərin bəziləri vasitəsiz, bir başa olduğu kimi, bəziləri vasitəli fellər olur. Bizim qanun dediyimiz bir şeyin özlüyündə heç bir təsiri yoxdur, qanunlar fikizi dünyanı idarə etmir. Riyaziyyatda öyrəndiyimiz qanunların heç biri fiziki dünyada bir şeyin ortaya çıxmağına, dəyişməsinə təsir edə bilməz. Qanun sadəcə olaraq fiziki dünyada baş verən hadisələrin həmişə izlədiyi cizgilərin ifadəsidir; başqa sözlə desək fiziki dünyada baş verən hadisələr qanunu müəyyən edir, qanunlar fiziki hadisələri müəyyən etmir. Müasir insan təbiət qanunlarına haqq etdiyindən daha çox rol və məna yükləyirlər. Ludwig Wittgenstein bunu məşhur traktatında bu sözləri ilə ifadə edir: "Dünya haqqındakı müasir təsəvvürün tamamının təməlində bir illüziya yatır: (guya) təbiət qanunları adlanan şey təbiət fenomeninin izahıdır."[444] Alman filosof Robert Spaemann onun bu sözlərini nəql etdikdən sonra əlavə edir ki, "təbiət qanunları sadəcə olaraq təbiətdəki nizam-intizamı təsvir edir, lakin onların hardan gəldiyini izah edə bilmir."[445] Bunu daha gözəl bir şəkidə C. S. Lewis misal verərək izah edir. Beləki o, vurğulayır ki, "hərəkət qanunları bilyard toplarını hərəkətə gətirmir: sadəcə olaraq başqa bir şey (buna əlində kiy tutan adam və ya gəminin

---

[443] C. S. Lewis, "Miracles: A Preliminary Study", səh: 70; Geoffrey Bles – The Centenary Press, London, 1947

[444] L. Wittgenstein, "Tractatus Logico-Philosophicus", səh: 180; Routledge & Kegan Paul LTD, London, 1960

[445] Peter Nickl & Georgios Terizakis, "Die Seele: Metapher oder Wirklichkeit?", səh: 47; Transcript Verlag, Bielefeld, 2010

ani tərpənişi və ya bəlkə də fövqəltəbii qüvvə deyə bilərsən) hərəkətə gətirdikdən sonra qanunlar onların hərəkətini analiz edir. Onlar heç bir hadisə törətmirlər…”[446] Əgər bilyard topunu vuran adamdırsa və həmin adamın azad iradəyə sahib olduğuna inanırıqsa, o zaman topu hərəkətə gətirən işin əvvəlində sadəcə əqli bir amil oldu, fiziki heç bir qanun o topu hərəkətə gətirmədi. Gəminin ani tərpənişi də bir gəmiçinin onu hərəkətə gətirməsi ilə baş verir. “Təbiət qanunlarının” - John Lennox deyir – “bizim Allaha inanmağımızı və ya Onun kainata müdaxilə etməsini imkansız etməyinin mübahisəsini aparmaq tamamilə xətalıdır. Bu, sanki mühərrikdəki daxili yanma qanunlarını başa düşməyin, bir maşın mühərriki dizayn edənin və ya onun mexaniklərindən birinin müdaxilə edərək mühərrikdəki silindr başlığını qaldıra biləcəyinə inanmağı imkansız etdiyini iddia etməyə bənzəyir. Üstəlik belə bir müdaxilə həmin qanunları pozmuş olmur. Mühərrikin silindr qapağı ilə necə çalışdığını izah edən həmin qanunlar indi də silindr başlığı götürüldükdən sonra nə üçün işləmədiyini izah edə bilir.”[447]

Quranın möcüzələrə baxışı diqqətəlayiqdir, çünki Allaha inanmaq üçün möcüzələrə ehtiyac olmadığını öyrədir. “Bilməyənlər dedilər: “Bəs nə üçün Allah bizi danışdırmır, yaxud bizə bir ayə gəlmir?” Onlardan əvvəlkilər də elə onlar kimi demişdilər, qəlbləri bir-birinə oxşayır. Biz, yəqinliklə inanan bir qövmə ayələrimizi bəyan etmişik.” [2:118] Allahdan bu cür ayələr, dəlillər və möcüzələr gözləyənlər üçün buyurur: “Həqiqətən də, göylərin və yerin yaradılmasında, gecə ilə gündüzün bir-birilə əvəz olunmasında, insanlara fayda verən şeylərlə (yüklənmiş halda) dənizdə üzən gəmilərdə, Allahın göydən endirdiyi, onunla da ölmüş torpağı diriltdiyi suda, (Onun) bütün heyvanatı (yer üzünə) yaymasında, küləklərin (istiqamətinin) dəyişdirilməsində və göylə yer arasında ram edilmiş buludlarda başa düşən insanlar üçün ayələr vardır.” [2:164] İslam peyğəmbərinin Allaha dəvəti də bu prinsip üzərində olub və insanlığa möcüzəsinin Quran olması üzərində həmişə vurğu edib. Bu məqamda Hitchens’in kitabında qeyd etdiyi bir müşahidəyə yer vermək münasibdir. Bəzi şəxslərin tarixdə insanları təbiət fenomenləri ilə aldatdığına, onların itaətindən sui-istifadə etdiyinə diqqət çəkərək buyurur ki, “… öncə günəş tutulmasını qabaqcadan xəbər verməyi öyrənən və sonra öz auditoriyasını heyrətləndirmək və onları sağmaq üçün bu planetar hadisədən istifadə edən şəxsin ağıllı biri olması aşkar məsələdir.”[448] Hitchens’ə görə Kambocanın qədim kralları Mekong və Bassak çaylarının hansı gün daşaraq qarışacağını və suyun təzyiqi altında geriyə axırmış təəssüratını oyadacağını

[446] C. S. Lewis, ”Miracles: A Preliminary Study”, səh: 71; Geoffrey Bles – The Centenary Press, London, 1947
[447] John Lennox, ”Gunning For God: Why The New Atheists Are Missing The Target”, səh: 175-176; Lion Hudson, Oxford, 2011
[448] “GIG”, səh: 140;

*bilirmişlə*r və bundan sui-istifadə edərək həmin liderlər suyu normal axarına qaytarmaq mərasimi qururlar. Bu misalları gətirən ateist müəllif oxucularını inandırmağa çalışır ki, möcüzələr sadəcə olaraq saxtakarların əlində yaxşı bir alət olub. *Əslində* onun qoyduğu bu ölçü çox gözəl bir ölçüdür. İslam peyğəmbərinə - Hitchens'in sözünü etdiyi - bu ölçünü tətbiq etdiyimizdə çox maraqlı bir nəticə ortaya çıxır. Hədis kitablarında keçən bir hədisdə oxuya bilirik ki, peyğəmbərin oğlu İbrahim öldüyü ərəfədə günəş tutulması baş verir və insanlar bu barədə danışaraq bunun peyğəmbərin oğlunun ölümünə görə *baş verdiyini deyirlə*r. Allahın elçisi bu zaman minbərə çıxır və insanlara xitab edərək deyir: "Günəş *və* ya sadəcə olaraq Allahın ayələrindən iki ayədir, hansısa bir insanın ölümünə görə tutulmurlar..."[449] İnsanları öz böyüklüyünə, öz peyğəmbərliyinə bir daha inandırmaq üçün bundan göz*əl şans nə* ola bilərdi? İnsanlar onsuz da könüllü surətdə buna inanmağa hazır idilər, Muhəmməd bir söz deməməsi, sadəcə susması belə onları inandırmaq üçün kifayət edəcəkdi. Amma buradan yalnız bir nəticə çıxara bilirik: Muhəmməd həqiqətən də öz missiyasına inanırdı, həqiqətən də insanları tək Allaha ibadət etməyə çağırırdı. Fransız ş*ərqşünas və* yazıçı Emile Dermenghem də bu həqiqəti çox dəqiqliklə sezir və bu barədə deyir: "(Məryəm) onun üçün oğlan uşağı, İbrahimi, dünyaya gətirdi, amma o, çox yaşamadı. Erkək varisinin ölməsi Muhammməd üçün çox böyük bir kədər oldu; ağlayaraq onun kiçik cəsədini öz əlləri ilə torpağa tapşırdı. Elə həmin gün günəş tutulması baş verdi və insanlar bunun matəm əlaməti olduğunu dedilər, lakin Muhammməd bu mövhumatı inkar etmək üçün kifayət qədər açıq fikirli birisi idi. O, yalançı birinin deməyəcəyi sözləri dedi: "Səmavi cisimlər insanların ölümü səbəbi ilə tutulmur."[450] Fransızın diqqət çəkdiyi bu nöqtənin üzərində *düşünmə*klə yanaşı Quranın ümumiyyətlə möcüzələrə yanaşmasını xatırlatmaqda da xeyir vardır. Quran açıq sözlərlə qeyd edir ki, insanların Allaha və Onun elçilərinə inanması möcüzə səbəbi ilə deyildir. "Onlar dedilər: "(Bunlar) qarmaqarışıq yuxulardır! Xeyr, o bunu özündən *uydurmuşdur! Xeyr, o, bir şairdir! Qoy o,* əvvəlki elçilərə göndərilən (möcüzələr) kimi bizə də bir möcüzə gətirsin." Onlardan əvvəl məhv etdiyimiz məmləkətlərdən heç biri iman gətirməmişdi. İndi bunlarmı iman gətirəcəklər?" [21:5-6] "(Kafirlər) Allahın adı ilə möhkəm and içdilər ki, əgər onlara bir ayə gəlsə, mütləq ona inanacaqlar. De: "Ayələr ancaq Allahın yanındadır. Siz haradan biləsiniz ki, o (ayələr) gəldikdə onlar yenə də iman gətirməyəcəklər?" [6:109] Deməli insanlarda iman gətirmək səbəbi heç də möcüzələrin olmağı deyildir, möcüzə sadəcə ikinci dərəcəli əhəmiyyət kəsb edir. "Biz möcüzələri yalnız qorxutmaq üçün göndəririk." [17:59] İslam peyğəmbəri bəşəriyyətin küfr və inad içərisində olmağına üzülürdü

---

[449] "Sahih İbn Xuzeymə", 2/314 (1379)

[450] E. Dermenghem, "The Life of Mahomet", səh: 285; George Routledge & Sons, LTD, London, 1930

və həyatını onları Allaha iman etməyə çağırmaq üçün s*ərf etmişdi. Bunun üçün* əlbəttə ki, insanlara möcüzələr göstərməyi, beləliklə də onlara Allahın qüdrətini sübut etməyi çox istəyirdi. Lakin Allahın, peyğəmbərinə cavabı belə idi: "*Əgər* onların (haqdan) üz döndərməsi sənə ağır gəlirsə, onda bacarırsansa yerin içinə (enə biləcəyin) bir lağım və görə (çıxa biləcəyin) bir nərdivan tap ki, onlara bir möcüzə gətirəsən. Əgər Allah istəsəydi onları toplayıb doğru yola yönəldərdi. Elə isə cahillərdən olma!" [6:35] Yəni ki, ey Muhəmməd, əgər tək məqsədimiz insanların hamısını Özümüzə kölə etmək, abid etmək olsaydı bunu istədiyimiz zaman edə bilərik. Lakin insan azad iradəyə, ağla sahib olaraq yaradıldı və doğuşdan ölümə qədər getdiyi yolunun üzərində iman etmək üçün kifayət qədər dəlillər və *işar*ələr vardır, əgər iman etmək istəmirlərsə möcüzələr belə onlara heç bir kömək etməyəcək. "Bir möcüzə gördükdə isə ona istehza edir və deyirlər: "Bu ancaq açıq-*aşkar bir sehrdir."[37:14*-15] Yəni bir ovsundur, bir illüziyadır, həqiqi bir fenomen deyildir. Karamazovun üçüncü oğlu Alyoşa haqqında danışan Dostoyevski "imansız realist" tipini vəsf edərək deyir: "Realisti imana gətirən, möcüzələr deyildir. Həqiqi realist - əgər o, imansızdırsa – möcüzələrə inanmamaq üçün hər zaman özündə güc və bacarıq tapacaq və hətta əgər bir möcüzə ilə danılmaz fakt olaraq üzləşərsə həmin faktı qəbul etməkdənsə öz duyğularını yalanlayacaq. Hətta əgər qəbul edərsə, onu – o zamana qədər ona məlum olmayan səbəblərdən ortaya çıxmış - təbii bir hadisə/fakt kimi qəbul edəcək. Bir realist üçün iman möcüzələrdən əmələ gəlmir, lakin möcüzələr imandan əmələ gəlir."[451] Mən belə birini realist yox, naturalist adlandırardım. İstənilən halda Dostoyevskinin burada vəsf etdikləri bizim izah etməyə çalışdığımız nöqtədir. Onun sözünü etdiyi imansız realistə daha *əvvəl John Stuart Mill'in ş*əxsində misal verdik.

Hitchens möcüzə mövzusunu elə bir yerə gətirir ki, sanki dünyanın hər bir bucağına yayılmış dinlərin nümayəndələri möcüzələrə kor-koranə inanan axmaqlardan ibarətdir. Sanki dinə inananlar rasional bir zəmində inanmır, möcüzələr qarşısında cahil bir heyrətdən və təbiət fəlakətlərində gördükləri ilahı qəzəbdən təsirlənərək inanır*lar. Bunu misallarla nümayiş etdirməyə* çalışan Hitchens bir yerdə indoneziyalı müsəlmanlar haqqında yazır: "On doqquzuncu əsrin sonlarında Krakatoa'dakı nəhəng vulkanik partlayış, İndoneziyanın qorxu içində olan əhalisi arasında İslama doğru son dərəcə böy*ük bir dönüşə* səbəb oldu."[452] Görünür ki, Hitchens öz həmkarı Simon Winchester'in kitabını oxuyub. Simon ümumiyyətlə Krakatoa vulkanı haqqında 400 səhifəlik bir kitab yazıb və doqquzuncu fəslini vulkan partlayışından sonrakı dövrdə yerli xalqın başlatdığı

[451] F. M. Dostoyevski, "Bratya Karamazovi", səh: 28; İzdatelstvo AST, Moskva, 2017
[452] "GIG", səh: 148

üsyana həsr edib. Kitabı boyunca açıq şəkildə Hitchens'in iddia etdiyini qeyd etməsə də məzmundan elə bir məna çıxarmaq mümkündür. Bir yerdə bunu bu şəkildə ifadə edir: "Banten adasının əhalisini 1888-ci ildə bu qədər amansızca vuruşmağa sövq etmiş İslam dini, vaxt keçdikcə qarşıdan gələcək inqilabın daha çox təşkilat strukturuna çevrildi, inqilabçıların, altında vuruşa biləcəkləri bir sancaq rolunu isə daha az ifa etdi. Lakin 1949-cu ildə doğulmuş İndoneziya bir müsəlman dövləti oldu və bu günə qədər də belə qalmaqdadır; Yava və Sumatra adlarında İslam, uzun bir keçmişə nisbətən bu gün daha aqressiv bir formada yaşayır."[453] Kitabın bu fəslini oxuduğumuzda müəllifin İslam dinini əsas cani olaraq gördüyünü hiss etmək olur. Simon'un sözünü etdiyi hadisələr əslində indoneziyalıların müstəqillik uğrunda apardıqları mübarizədən bəzi epizodlardır. Bəlkə də xatırlatmağımız yersiz görünə bilər, amma bildiyimiz kimi - əksər ölkələrdə olduğu kimi – İndoneziyada da din bu işdə əhəmiyyətli bir rol oynayıb. Başqa necə təsəvvür etmək olardı ki?! Biz Simon kimi qeyri-müsəlmanın – o cümlədən Hitchens'in - bu nöqtəni anlayacağını gözləmirik, amma İslam dininin mahiyyətindən ayrılmaz bir xüsusiyyət vardır; "İslam h*əmişə* üstündür, ona heç bir *şey üstün ola bilməz.*"[454] Bu prinsipə əsasən müsəlman bir cəmiyyət əsarətdə yaşamağı qəbul edə bilməzdi. O baxımdan ümumiyyətlə qürur və şərəf sahibi heç bir millət başqalarının mülkü olaraq varlığını sürdürməyə razı olmaz. Öz qələmi belə hollandların müstəmləkə siyasətindəki acımasızlığı, qəddarlığı etiraf etsə də Simon sanki yenədə yerli xalqın avropalı "ağalarına" qarşı üsyan etməklərini doğru qarşılamır. Bir yerdə yazır: "(Vulkan fəlakətindən sonra) xilas etmə və b*ərpa işlə*rini sürətləndirdikləri üçün yerli xaqın kolonistlərə minnətdar olması üçün kifayət qədər səbəb var idi. Fəlak*ətin baş verm*əsi heç də hollandların günahı deyildi: buna *baxmayaraq şikay*ət edib deyinmədən hollandlar ən çox *zərər görmüş xalq* kütlələrinə bol-bol kömək edirdilər."[455] Yəni qısacası fəlakətdən sonra yerli xalq hollandlara təşəkkür etmək əvəzinə onlara qarşı üsyan başlatdılar və onları öldürməyi halal gördülər. Eyni zamanda müəllif etiraf edir ki, hollandların indoneziyalılara maddi yardım etməsinin əsas səbəbi öz müstəmləkə biznesini bərpa etmək idi. Buna baxmayaraq yenə də nəticə etibarı ilə yerli xalq müstəmləkəçilərin biznes maraqlarından faydalanırdılar, buna görə də təkcə bu səbəblə onların öz havadarlarına mütəşəkkir olmaqları lazım idi. Simon belə düşünür, indoneziyalılar isə *o zaman Simon kimi düşünmürdü.* Reallıq budur ki, 1888-ci ildə *baş vermis üsyan* əslində məzlum xalqın müstəmləkəçilərə qarşı

[453] Simon Winchester, "Krakatoa: The Day The World Exploaded: August 27, 1883", səh: 337; Harper Collins Publishers, New York, 2003
[454] əd-Dəraqutni, "əs-Sunən", (3620); əl-Beyhəqi, "əs-Sunən əl-Kubra", 6/338; ət-*Tahavi, "*Şərh Məanil-Əsər", 3/257; ər-Ruyəni, "Musnəd ər-Ruyəni", (783);
[455] Simon Winchester, "Krakatoa: The Day The World Exploaded: August 27, 1883", səh: 318; Harper Collins Publishers, New York, 2003

mübarizəsinin bir hissəsidir. Həmin dövrdə dini sentimentlərin güclənməsinin vulkan partlayışı ilə bir əlaqəsi yox idi, əslində dini dirçəliş 1850-ci illərdən başlayır və hər şeydən əvvəl qlobal bir dirçəliş idi. Sartono Kartodirdjo üsyan haqqında yazdığı kitabının beşinci fəslini o dövrün dini dirçəlişinə həsr edib; fəslin heç bir yerində vulkan partlayışı ilə bağlı tək bir cümlə belə yoxdur.[456] İndoneziyalı araşdırmacı Sartono əksinə dini dirçəlişi hər şeydən əvvəl həcc səfərləri ilə və dəvət işləri ilə əlaqələndirir. Simon Winchester'i oxuyan bir çox kəs onun dediklərindən Hitchens'in anladığı mənanı çıxarıblar. Antropoloq Kenneth George yazır: "Richard Ellis New York Times qəzetinə 2003-cü ilin aprel ayının 20-sində Simon Winchester'in "Krakatoa-The Day The World Exploded: August 27, 1883" adlı kitabına yazdığı dəyərləndirməsində deyir: "İslami militanlar" (və bu, sitatdır) Krakatoan vulkanından sonrakı mənəvi panikadan sui-istifadə edərək Yava adasını islamlaşdırdılar. Burada biz Ellis'in müstəmləkə erasından tanış olan qərəzli baxışları təkrarladığını görürük: yəni yerli xalq mövhumatçılar olub və müsəlmanlar silahlı və təhlükəli yadellilər imiş. O, bunu Krakatoa vulkanı ilə "kütləvi qırğın silahı" arasında bənzətməyə yer verdiyi eyni cümlədə gətirir. Şok və qorxu dolu İraq müharibəsi hələ bir ay əvvəl başlamışdı və Ellis'in dəyərləndirməsi mənim nəzərimdə, İndoneziya (və onun vulkanologiyası) haqqındakı populyar təsəvvürdə İslama qarşı müharibənin bir cəbhəsini açmaq üçün göstərilmiş bir cəhd kimi görünür."[457] Bəli, eyni cəhd elə Simon Winchester'in yazısında da özünü hiss etdirir. Kitabda bir neçə yerdə günümüzün islamçı militanları ilə o dövrün üsyankarları arasında bir parallel qurur və bununla da hər iki müqavimət hərəkatının eyni legitimliyə sahib olduğuna eyham edir.

Kommunizm vaxtında senator MaCarthy üçün kommunizm nə idisə, Simon və ya Hitchens kimilər üçün də İslam dini eyni rolu oynayıb. Cinayət səhnəsindəki hər daşı qaldırdıqda altında İslamı və müsəlmanları görürlər. Dəliliyin həddi varmı görəsən? Hitchens'də ən azından o həddə çatıb ki, Səddam Hüseyn'in kürdləri qətl etməsini də Quranın və dinin adına yazır. *Ənfal surəsindən* danışarkən yazır: "İki əsr sonra Kürdistan xalqını kütləvi qətl etməyə və onları (torpaqlarından) məhrum etməyə haqq qazandırmaq üçün Səddam Hüseyn məhz bu surəni istifadə edəcəkdi."[458] Buna nə ad verəcəyimi bilmirəm, bu cür bir iddianın qarşısında adam tərəddüd edir. Fəlsəfədə, tarixdə, teologiyada yarıtmayan biri heç olmasa jurnalistikada fərasət göstərməli idi, amma İslam dininə qarşı qərəz və nifrət onu da öldürüb. Bəli, Səddam Hüseyn kürdlərə qarşı apardığı əməliyyatlara əl-*Ənfal*

---

[456] Sartono Kartodirdjo, "The Peasant's Revolt of Banten in 1888: Its Conditions, Course and Sequel", səh: 140-175; Springer Science, Amsterdam, 1966

[457] Eric Tagliacozzo, "Producing Indonesia: The State of The Field of Indonesian Studies", səh: 36-37; Southeast Asia Program Publications, New York, 2014

[458] GIG, səh: 181

surəsinin adını vermişdi. Axı bu necə dinin özünə qarşı istifadə edilə bilər? Səddam Hüseyn özü dinsiz bir adam ikən, kürdlər isə müsəlmanlar olduğu halda bunu necə anlamaq doğru olar? Kürd yazıçı Dana Halabjayi özü də bu təəccübünü gizlədə bilmir: "Bu, bir kod ad üçün çox qəribə bir seçim idi, çünki kürdlər də iraqlı ərəblər kimi müsəlmandırlar."[459] *Keçmişdə* və bu gün tamamilə məsum meaningfikirlər adına edilmiş cinayətlər ilə doludur. Yaxın-Şərqdə başladılmış müharibələrdə *ABŞ* hər zaman demokratiyanı əlində bayraq tutub. Görəsən Hitchens'in nəzərində bu müharibələrdə günahkar demokratiyadır?! İyirminci əsrin əvvəllərində irq üzərində *edilmiş q*ətliamların, cinayətlərin motivləri öyrənildikdə onların darvinizm, eugenics kimi fikirlərlə sıx bağlı olduğunu görə bilirik. Hitchens heç zaman bu cür misalları verib darvinizmi tənqid etməyib. Onun kitabında bu cür hiperbolik ifadələrlə çox rastlaşırıq.

[459] Paul R. Bartrop, "Encountering Genocide: Personal Accounts from Victims, Perpetrators and Witnesses", səh: 190; ABC-CLIO, California, 2014

## SEKS VƏ MƏDƏNİYYƏT

"*Sekslə bağlı uzaq-görənlikdən məhrum olmuş bizim liberalizmdə görə bilmədiyimiz şey bu oldu ki, bir fərdi götürüb azad seçimin məhdudiyyətsiz və içi boş dənizinə atdıqda bu, özlüyündə ona azadlıq vermir, əksinə onun daxili konfliktini gücləndirməyə yarayır.*"

Dr. Rollo May

Erotik yazıları ilə tanınan yazıçı Anais Nin belə yazılarının birində Millard adlı heykəltəraşın danışdığı əhvalata yer verir. Əhvalatın içində Millard deyir: "Bir nəfər mənə bir əhl-səlibin çox maraqlı hekayəsini danışdı; bu səlibçi öz arvadına "ismət kəməri" geyindirib kəməri qıfıllayır və öldüyü təqdirdə arvadını kəmərdən azad etməsi üçün açarını ən yaxın dostuna tapşırır. O atına minib bir neçə fərsəx uzaqlaşmamışdı ki, dostunun ona tər*əf qeyzli* ş*ə*kildə at çapdığını görür və ucadan belə qışqırırdı: "Sən mənə səhv açarı vermisən!"[460] Seksin bu dərəcədə komikləş*dirildiyi bu hekay*ədəki "ismət kəməri" çox zaman dindar orta əsrlərin mühafizəkarlığı üçün bir simvol kimi istifadə edilir. Belə bir kəmərin ümumiyyətlə insanlar tərəfindən istifadə edilməməsi, sadəcə olaraq orta əsrlər haqqındakı v*əhşi* fantaziyanın bir uydurması olması başqa bir mövzudur. Bu cür komik hekayələrə nə qədər gülsək də bir o qədər seksin ciddiyə alınmasının vacib olduğunu görə bilirik. *Heç bir şübhə* ola bilməz ki, seks insanların həyatında əvəzsiz rol oyanyır və tarix boyu qəhrəmanlıqların, dastanların mövzusu olduğu kimi böyük fəlakətlərin, müharibələrin də altından imzasını atıb. Qoca Homer də *bu iş* ucbatından iki dövlətin, iki xalqın bir-birini öldürməyə hazır olduğunu hələ o zamandan bizə öyrədirdi. G. Chesterton deyir: "Sağlam oğlan ilə qızın seks haqqında hiss etdikləri ilk iki fakt bunlardır: birincisi onun gözəl olduğunu hiss edirlər və ikinci isə onun təhlükəli olmasıdır." Deyilənə görə Chesterton öz oğluna məsləhət verərkən xatırladarmış ki, cinsi əlaqədən aldığın həzz "çox qısadır", amma onun potensial aqibəti "tamamilə ömürlükdür."[461]

[460] A. Nin, "Delta of Venus: Erotica", səh: 34; Harcourt Brace Jovanovich, New York, 1977
[461] R. Murray Thomas, "Sex and The American Teenager: Seeing Through The Myths and Confronting The Issues", səh: 52; Rowman & Littlefield Education, Lanham, 2009

Hitchens'in kitabında xüsusilə üzərində durduğu məqamlardan biri də dinlər ilə cinsəllik arasındakı münasibətdir. Dinlərin cinsəl fəaliyyətlərə məhdudiyyətlər qoyması onun nəzərində absurd görünür. Axı seks bütün müxtəlifklikləri ilə necə qadağan edilə bilər? "Aydındır ki, insan növü seks ilə təcrübə keçirmək üçün dizayn olunub."[462] Sözün düzü Hitchens'in bu dizayn iddiası düşündürücüdür. Əslində *bir az düşünsə*k dizaynın bizə nə *dediyini başa düşə* bilərik; misal üçün anus keçidi bədənimizdəki ifrazatların çölə çıxarılması üçün dizayn edilib, ağzımız yemək yemək üçün, danışmaq üçün dizayn edilib; görəsən dizaynın harası bizə anal və oral seksi "normal" göstərir?! Bu məqamda o bizə misallar vermir, amma kitabının başqa yerində masturbasiyadan danışarkən dizaynı arqument kimi gətirmə*yi unutmur. "Lakin şübhə* ola bilməz ki, insan övladı istər ayaq üstə durduqda, istərsə də uzandıqda əlinin övrət yerinin tam yaxınlığında dayandığını görür."[463] Deməli əlimiz əgər övrət yerimizə yaxın düşürsə bu hardasa – Hitchens'ə görə - masturbasiyanın təbii olduğunu sübut etməlidir! Yazının məzmunundan onun bunu ciddi bir arqument kimi gətirdiyini, yoxsa kinayə ilə məzəli görünmək üçün gətirdiyini bilmək olmur. Hər bir halda bu "arqumentin" nə hümorist, nə də rasional qüvvəsi yoxdur. Eyni əl həm də arxa keçidə də yaxındır. Məgər o əlin övrət yerini təmizləyə bilməsi üçün ora yaxın olması daha məntiqli deyildirmi?! Hitchens əslində bununla razılaşır, amma onun məntiqində bir ziddiyyət ortaya çıxır; əgər hansısa bir səbəbə görə övrətə toxunmaq əmr olunursa, nə üçün digər səbəblərə görə toxunmaq olmaz?!" Bütün dinlərin masturbasiyanı qadağan etməsi onun üçün bir müəmma olaraq qalır.[464] Onun izlədiyi xətt, əslində təbiətdə təbii olaraq edilə biləcək h*ər şeyə* sərbəstlik vermək yönündədir. Bu xətti, məntiqi nəticəsinə gətirib çıxarmalı olsaq çox maraqlı hallar ortaya çıxır: darvinizmi insanların cinsəl həyatına tətbiq etməli oluruq. Niyə də olmasın?! Axı Darwinin öz təklifi də bu yöndə *deyildimi?! "Bütün kişilə*r üçün açıq yarışma olmalıdır; onların arasından ən bacarıqlı olanların ən yaxşı nailiyyət əldə etməsinə və özündən sonra ən çox sayda törəmə buraxmasına qanun və örf mane olmamalıdır."[465] Bu gün örfün və qanunun qoyduğu hər bir məhdudiyyət qaldırılarsa ortaya çıxacaq "seksual utopiya" görəsən Hitchens'in görmək istədiyi cəmiyyət olacaq? Buna inanmıram, amma onun kimi ateistlər fikir eksperimentlərində bir qədər ehtiyatlı davranmalıdırlar.

Onu da qeyd edək ki, Hitchens'in müdafiə etdiyi seksual liberallıq təkcə dinlər tərəfindən qeyri-normal qarşılanmır. Dinlərə tənqidi yanaşmış, ateist olaraq

[462] "GİG", səh: 54;
[463] "GİG", səh: 214;
[464] "GİG", səh: 215
[465] C. Darwin, "On The Origin of Species by Means of Natural Selection", səh: 560; Broadview Texts, Toronto, 2003

tanınmış filosoflar da cinsəlliyin bəzi formalarını anormal hesab ediblər. Alman filosof Immanuel Kant (1724-1804) "masturbasiya və homoseksuallığın qeyri-moral olduğunu yazırdı, çünki onlar təbiətə zidd cismani cinayətlərdir."[466] Kant'ın və onun dövrünün insanlarının bu kimi "qeyri-təbii" cinsəl fəaliyyətlərə baxışları mənəvi təsəvvürdən qaynaqlanırdı; bu nöqtədə dinlərin baxışı ilə onların baxışı üst-üstə düşür. İnsanın hər cinsəl istəyinə tabe olması onun dəyərini azaldır, onu bir növ heyvanlaşdırır, çünki heyvandan fərqli olaraq insan özünü kontrol edə bilən bir varlıqdır. İstər yemək iştahası olsun, istərsə də cinsəl şəhvət olsun, insan olmaq üçün bütün hallarda öz nəfsini cilovlamağı bacarmalısan. Kant da bu təsəvvürdən çıxış edirdi. Masturbasiyanı digər təsəvvürlərdən də tənqid edənlər var. Amerikalı filosof Robert Solomon cinsəl münasibətlərə dil kommunikasiyası kimi baxır. Bu baxımdan masturbasiyanın əxlaqsız olduğunu deməsə də, onun "bir sapıqlıq" olduğunu qeyd edir.[467] Məşhur ateist filosof Thomas Nagel da seksi buna yaxın mənada dəyərləndirir; seksual pozğunluqlar haqqında yazdığı çalışmasında qeyd edir ki, seks "həm də iki tərəf arasındakı münasibət olaraq bir mahiyyətə malikdir və yalnız bu əlaqəni analiz edərək seksual pozğunluq hallarını başa düşə bilərik."[468] Nagel bu *yanaşmaya* əsaslanaraq bütün natamam cinsi münasibətləri – bura masturbasiya da daxildir – cinsəl pozğunluqlara aid edir. İstənilən cinsəl məşğuliyyət ehtiras və şəhvət ilə başlayır; heteroseksual biri, xoşuna gələn qadını görməklə və ya onu beynində canlandırmaqla ehtiraslanır və əgər o qadınla fizika kontaktda olmağa qadir deyilsə bunu masturbasiya yolu ilə həyata keçirir. Təbii ki, insanlar öz cinsəl potensialını maksimum həddə çatdırmağa çalışır, əgər seksual həzzi artırması mümkündürsə - adətən - bunu edəcək. Ən bəsit halda ehtiras obyektini istədiyi şəkildə beynində canlandıraracaq; onu soyundura bilər, müxtəlif seksual formalarda canlandıra bilər, onunla oral və ya anal sekslə məşğul ola bilər. Bu, sadəcə beyindəki xəyali formalarda qaldığı müddətdə liberallar buna "məsum məşğuliyyət" adını verirlər. Beynində canlandırdığı qadınların gündəlik həyatda qarşılaşdığı qadınlar olmasında – onlara görə - qınanılacaq bir tərəf yoxdur. Onun beynindəki qadın qonşusunun arvadı da ola bilər, qızı da ola bilər. Bunun bir pillə yuxarısı pornoqrafik səhnələrə baxmaqla masturbasiya etməkdir və bu, pornoqrafiya aludəçiliyinin ən əsas səbəblərindən biridir. Bu gün pornoqrafiya asılılığı yeniyetmələrdə, gənclərdə, hətta ailə *sahibi kişilərdə* sosioloji problem kimi qəbul olunur və bir əl əlcəyin içində necə oturursa masturbasiya da seksual asılılıqda elə bir rol oynayır. İnsan fantaziyası özünü reallaşdırmağa daima meyl

---

[466] Alan Soble, "Sex From Plato to Paglia: A Philosophical Encyclopedia", 2-ci cild, səh: 676; Greenwood Press, Connecticut, 2006

[467] Robert C. Solomon, "From Hegel to Existentialism", səh: 133; Oxford University Press, New York, 1987

[468] Thomas Nagel, "Sexual Perversion", The Journal of Philosophy, cild 66, nr: 1, səh: 8, (16 yanvar, 1969)

edir, əgər seksual ehtiyaclarımızı həyata keçirməyə imkan varsa liberal biri üçün bunu etməkdə hər hansı bir problem olmayacaq. Cəmiyyətin örfü, adəti, ədliyyə institutları bunu məhdudlaşdırmasa bu xəyalların həyata keçməsinə *başqa bir* maneə olmayacaq. Roger Scruton da masturbasiyanı "cinsəl pozğunluqlar" kateqoriyasına daxil edir və bunun səbəb ola biləcəyi ən radikal aqibətə toxunaraq deyir: "Daha əvvəl də göstərməyə çalışdığımız kimi, fantaziya, reallıq ilə rahat bir surətdə mövcud ola bilmir. O, özünü reallaşdırmaq üçün, dünyanı öz xəyalına uyğun şəkildə də*yişmə*k üçün təbii tendensiyaya sahibdir. Video cihazın köməyi ilə masturbasiya edən zə*rərsiz bir ş*əxs hər an əlində *silah tutmuş çarə*siz təcavüzkara çevrilə bilər."[469] Scruton'un bu sözləri mübaliğə kimi görünə bilər, amma unutmayaq ki, bu cür yırtıcılar, fantaziyalarını masturbasiya ilə təmin edə bilməyən canilərdir.[470] Ümumiyyətlə masturbasiya ilə mübt*əla olmuş ş*əxs psixoloji problemlərdən qurtula bilməz. C. S. Lewis bunu dostuna yazdığı bir məktubunda gözəl bir üslubda izah edir. Cinsi ehtiyacın qanuni yollarla ödənməsini "öz şəxsiyyətini başqasında tamamlamaq" kimi dəyərləndirən Lewis qeyd edir ki, qeyri-təbii yollarla edilən cinsəl fəaliyyətlər, insanı "əksinə (özünə) qaytarır, insanı *öz ş*əxsinin həbsxanasına göndərir, öz xəyali qadınlarından ibarət hərəm saxlamağı ona öyrədir... və bu hərəm, ora daxil olduqdan sonra, bir daha onun oradan çıxaraq real qadınla münasibət qurmasının əleyhinə çalışır. Çünki bu hərəm, hər zaman əlinin altındadır, hər zaman qulluğundadır, heç bir fədakarlıq və tabeçilik tələb etmir və heç bir real qadının rəqabət apara bilməyəcəyi dərəcədə erotik və psixoloji cazibələrlə təmin edilə bilər..."[471] Hitchens üçün bütün bunların heç bir əhəmiyyəti yoxdur. Marquis de Sade'nin çağdaş oğulları və qızları üçün bir qayda mövcuddur; cismani həzzlər ilə qorxu arasındakı səddi dağıtmaq lazımdır. Yeni maarifçiliyə ehtiyac olduğunu deyən Hitchens "seksual həyat ilə qorxu arasında, seksual həyat ilə xəstəlik arasında və seksual həyat ilə tiraniya arasında ayrılmaya" nail olmağa çağırır və bunun üçün yeganə şərt olaraq dinin təsirini bu mövzuda tamamilə qadağan etməyi təklif edir.[472] Belə *bir yanaşmada ziddiyyə*tdən qurtulmaq istəyirsə mütləq insest, sado-mazoxizm kimi münasibətlərə də azadlıq verməsi lazımdır. Hitchens – çox təəssüf ki - bu barədə kitabında öz rəyini oxucuları ilə *bölüşmür. Halbuki mövzunu bir çox tə*rəfdən ələ alması daha münasib olacaqdı. Bu baxımdan de Sade daha səmimi idi və fəlsəfəsində daha az ziddiyyət var idi; o, seksual həzzin bütün növlərini icazəli görürdü, təbiətin bütün

---

[469] Roger Scruton, "Sexual Desire; A Philosophical Investigation", səh: 346; Phoenix Press, London, 1986

[470] Graham Heth, "The Illusory Freedom: The Intellectual Origins and Social Consequences of The Sexual Revolution", səh: 39; William Heinemann Medical Books, London, 1978

[471] Clive Staples Lewis, "Collected Letters: Narnia, Cambridge and Joy 1950-1963", 3-cü cild, səh: 758; Harper Collins, New York, 2000

[472] "GİG", səh: 283;

çağırışlarına cavab verməyi normal hesab edirdi, sodomiya, insest, mazoxizm artıq tabu olmamalı idi.[473] Şübhəsiz ki, seks Adəm oğulları üçün önəmlidir, lakin həyatımızın əsas mövzusu deyildir və mənəvi dəyərlərimizdən heç bir şəkildə daha üstün bir yer tuta bilməz. Müasir ateist liberalların, seksi bu baxımdan həyatın qayələrindən birinə çevirməklərini anlamaq da bir dərddir. Məşhur filosof Arthur Schopenhauer'in həyata və seksə verdiyi pessimist qiymətlə razılaşmasaq da bir məqamda onun sözlərindəki həqiqəti təsdiqləməliyik: "Illica post coitum cachinnus auditur Diaboli."[474] Filosof bu sözlərini açıqlayarkən qeyd edir ki, seks "sözlə ifadə edilə bilməyəcək qədər, sonsuz və həddindən artıq çox şey vəd edir, amma daha sonra həqircəsinə az bir şey yerinə yetirir."[475] Cismanı həzlərin arasında xüsusilə cinsəl şəhvətin belə məyus edici bir özəlliyi vardır. Gözləntilər hər dəfəsində inanılmaz dərəcədə möhtəşəm olur, amma nəticə heç bir zaman özünü doğrulda bilmir. Kişilərin triumf anı anidən alışıb sönən qığılcım misalıdır.

Bu gün seksin zəncirlərini qırıb azadlığa buraxmağa çağırış edənlər fahişəlik, atasız uşaqlar, pornoqrafiya asılılığı, seksual təcavüz kimi halların artmasından şikayətlənirlər. Azadlıqlar ilə seks də digər həyati məsələlər kimi ticariləşir və adiləşir. Almaniya, Hollandiya, Yunanıstan, İsveçrə, Avstriya kimi ölkələrdə seks işçiləri dövlətin vergi ödəyən vətəndaşlarına çevriliblər, artıq öz alın tərləri ilə çörək pulu qazanan işçi adına iddia edə bilərlər. Modern azadlıqlar və imkanlar dünyası, yeməklərimizi "fast-food" adlandırdığımız qəlyanaltılarla əvəz edəndən bəri sağlamlıqdan şikayət edirik, insanların əcaib formalar alması nə qədər xoşumuza gəlməsə də bu zəhrimarın dadına doya bilmirik. Yeməklərimizi şişmanlıq bombalarına çevirən nədirsə seksi də pornoqrafiyaya çevirən odur; gənclərimiz ayaq üstə pizza yeyib kola içdikləri kimi porno imkanların da dadını çıxarmağın yolları ilə maraqlanırlar. Romantika, ülvi sevgi artıq keçmişin qalıqlarına çevrilməyə başlayıb. Yaşma altından gülüşə, hicab altından baxışa vurulmağı bacaran Zeydlərin dövrü çoxdan qurtarıb. İndi artıq afişalardakı, jurnallardakı modellərə bənzər qız tapmadıqca "igidləri" razı sala bilmirsən, qızların da öz dərdləri var. İngilis şair, romançı və yaçızı Philip Larkin bunu belə ifadə edir: "Vaxtıykən insanlar – fillərdə olduğu kimi – tədrici bir sürətlə cütləşirdilər; xüsusi bir şəkildə xitablar, iltifatlar olmalı idi, yerə düşən əlcəklər qaldırılıb sahibinə verilməli idi, rəqsə dəvət edilməli idi… İndi isə heç bir şey gözləmədən, dərhal ekstaz anını yaşamaq istəyindən başqa heç bir şey yoxdur… bütün mərasimlər kənara atılıb…Doğuş kontrolu, seks artıq uşaqlar, ailələr, yaşayış, birlikdə

---

473 Alister McGrath, "The Twilight of Atheism: The Rise and Fall of Disbelief in The Modern World", səh: 34-35; Doubleday, New York, 2004

474 "Cinsi əlaqədən dərhal sonra şeytanın gülüşü eşidilir."

475 A. Schopenhauer, "Parerga and Paralipomena: Short Philosophical Essays", ikinci cild, səh: 316; Clarendon Press – Oxford University Press, New York, 2000

*yaşlanma, hə*yatların daha çox zənginliklə bir-birinə bağlanmasını ifadə etmir. Seks (bu aralar) heç bi*r şey ifadə* etmir – yalnız bir neçə dəqiqədə alışıb sönən ekstaz anını ifadə edir."[476]

Seksual liberalizmin izah etməkdə çətinlik çəkdiyi daha bir problemi vardır. O da budur ki, tarixən mədəniyyətlərin yüksə*lişi seksual t*ənzimləmələr ilə *müşaiy*ət olunub. *Ən* primitiv qəbilələr ümumilikdə seksual adətlər baxımından daha liberal olublar, əksinə *ən inkişaf etmiş c*əmiyyətlərdə isə t*ərsi müşahidə olunub; kişi ilə* qadın arasındakı seksual münasibətlərdə tənzimləmələrin və məhdudiyyətlərin olması mədəniyyətin göstəricisi idi. İngilis etnoloq və antropoloq Joseph Unwin (1895-1936) 1930-cu illərdə öz dövrünün analitik psixoloqlarının tezisi üzərindən çıxış edərək seks ilə mədəniyyət arasındakı münasibəti araşdırır. Araşdırmasının nəticələrini 1934-cü ildə bir kitabında n*əşr ed*ən Unwin qeyd edir ki, cinsi məhdudiyyətlər və kontrol nə qədər çox olarsa mədəni səviyyə o qədər yüksək olar və cinsi məhdudiyyətlər nə qədər azdırsa mədəniyyətin səviyyəsi də bir o qədər az olar. "*Əgə*r ictimai tənzimləmələr, seksual impulslardan *bir başa həz*z almağı qadağan edirsə duyğusal konflikt başqa formada özünü ifadə edəcək və bizim "sivilizasiya" adlandırdığımız şey h*əmişə* fitri istəkləri tətmin etməkdə icbari fədakarlıqlar tərəfindən qurulub."[477] Unwin bu nəticəyə 80 primitiv qəbilənin *araş*dırılmasından və 6 ən böyük mədəniyy*ətin beş min illik tarixinin* öyrənilməsindən sonra gəlib. Ondan əvvəlki sosioloqlar da bu həqiqəti təsdiqləyiblər. Émile Durkheim (1858-1917) da cinsəl tənzimləmələri yüksək mədəniyyətin əlaməti olaraq görürdü. O, yazır ki, insan mədəniyyəti, sivilizasiyası *inkişaf etdikcə* cinsi münasibətlər "çoxsaylı aestetik və mənəvi duyğular vasitəsilə getdikcə daha kompleksləş*mişdir və* bu gün" cinsi münasibətlərin fiziki tərəfi "bu kompleks prosesin tamamının yalnız ən kiçik bir hissəsini t*əşkil edir." Durkheim* əlavə edir: "Bu intellektual ünsürlərin təsiri altında" kişi ilə qadın arasındakı əlaqələr "özünün fiziki təbiətindən qism*ən azad olmuş və* intellektual bir xarakter qazanmışdır. Fiziki ehtiyaclar kimi mənəvi səbəblər də sevgiyə təhrik edir. Bu səbəbdən də heyvanlarda olduğu kimi (insanlarda) müntəzəm, avtomatik vaxtaşırılıq ilə olmur. Psixoloji impuls istənilən vaxt onu oyada bilər; bu, sezonla deyildir. Bu müxtəlif meyilliklər… orqanik zəruriyyətlərdən bir başa asılı olmadığı üçün ictimai tənzimləmələr zəruri olur. Orqanizmin özünün tənzimləmə imkanları olmadığı üçün cəmiyyət tərəfindən tənzim olunmalıdır. Evliliyin funksiyası da budur."[478] Bu sözlərin məğzi budur ki, evlilik institutu yüksək mədəniyyətin

---

[476] Maeve Brennan, "The Philip Larkin I Knew", səh: 73; Manchester University Press, Manchester, 2002
[477] J. D. Unwin, "Sex And Culture", səh: vii; Oxford University Press, London, 1934
[478] Émile Durkheim, "Suicide: A Study in Sociology", səh: 233; Routledge Classics, London & New York, 2005

məhsuludur və cinsi münasibətlərin tənzimlənməsi cəmiyyətin təkamülünü göstərir. Sosioloq və iqtisadiyyatçı alim Werner Stark (1909-1985) eyni mənanı təsdiqləyərək yazır: "Biz, cinsəl özbaşınalığa icazə *vermiş heç bir yüksə*k mədəniyyət görməmişik; primitiv insanlar arasında çox zaman müxtəlif normalar dönüb dolaşır, lakin hətta onların arasında belə tam nizamsızlığın olduğu görülməyib."[479] Hətta seksual həyatda azadlığa, sərhədl*ərin genişlə*dilməsinə çağıran Sigmund Freud belə bunu inkar etməzdi. "Sivilizasiya ilə seksuallıq arasında antitezis" olduğunu deyən Freud etiraf edir: "Biz, sivilizasiyanı bu yöndə getməyə məcbur edən və onun seksuallığa qarşı ədavətinə səbəb olan zərurətin nə olduğunu bilmirik. Burada, bizim hələ kə*şf etmə*diyimiz rahatsız edici bir faktorun olması lazımdır." Freud bununla kifayətlənmir və bu faktor üçün möhtəməl namizədlər axtarır. O, belə bir namizədi fərdlərin aqressiv xarakterində tapır. "Sivilizasiya insanın aqressiv instinktlərinə məhdudiyyət qoymaq üçün və bu instinktlərin təzahürlərini kontrolda saxlamaq üçün əlindən gələni etməlidir... seksual həyat üzərinə *qoyulmuş m*əhdudiyyətlər də buradan qaynaqlanır..."[480] Mədəniyyət ilə seksuallıq arasında "antitezis" və "antaqonizm" olduğunu demək bu ikisinin bir-birinə tərs mütənasib olduğunu deməkdir. *Bir başqa* kitabında bununla bağlı yazır: "Qədim mədəniyyətlərin tənəzzülü ərəfəsində olduğu kimi, cinsəl həzzlərə qarşı heç bir maneənin olmadığı zamanlarda məhəbbət dəyərsizlə*şmişdi, h*əyat mənasızlaşmışdı və sevginin həmin əvəzedilməz mənəvi dəyərinin yenidən bərpası üçün güclü reaksiya-birliklərinə ehtiyac var idi. Bu məzmunda deyilə bilər ki, xristianlığın asketik təmayülü, sevginin psixoloji dəyərini qaldırmaqda elə bir təsirə sahib idi ki, qədim dövrün bütpərəst mədəniyyətləri buna nail ola bilmə*mişdi."*[481] Bu, Joseph Unwin'in öz araşdırmasında gəldiyi nəticəni tam mənada təsdiqləyir. Fərdlər arasındakı seksuallıq nə qədər tənzimlənərsə və kontrol altında olarsa mədəniyyət də o qədər yüksək göstəricilər ilə tarixə *düş*ər. Bütün bu deyilənlərin işığında Hitchens'in "iman ilə mədəniyyət arasındakı konfrontasiyadan"[482] danışması absurd səslənir.

Onu da əlavə edək ki, seksual inqilab heç də qadınların axtardığı seksual razılığı təmin edə bilməyib. *Əksinə* araşdırmalar onu göstərir ki, ənənəvi ailə münasibətl*əri kişi və* qadına cinsəl toxluq verməkdə ən optimal münasibətdir. Seksuallıq barəsində geniş bir araşdırma aparmış müəlliflər qeyd edirlər ki, "evli insanların həm duyğusal olaraq, həm də fiziki olaraq öz seksual həyatlarından

---

[479] W. Stark, "Safeguards of The Social Bond: Custom and Law", səh: 116; Fordham University Press, New York, 1980
[480] Sigmund Freud, "Civilization and Its Discontents", səh: 55-59; W.W. Norton & Company, New York, 1962
[481] Sigmund Freud, "Sexuality and The Psychology of Love", səh: 57; Touchstone Book, New York, 1997
[482] "GİG", səh: 280

məmnun olmaqları ehtimalı daha böyükdür."[483] Yəni ki, subay yaşamağa üstünlük verənlər, xüsusilə də qadınlar arasında seksual həyatından narazı olanların sayı evli olanlara nisbətdə xeyli çoxdur. Ailə münasibətlərində yaşayan qadınlar isə müntəzəm cinsi münasibətdə olduqları üçün daha məmnundurlar. Bu isə *ən aşkar* şəkildə Hitchens və onun həmrəylərinin üzünə duran inadkar bir faktdır. Heç gözlənilmədiyi halda təkrar-təkrar mühafizəkar ailə *quruluşu h*əm qadınlar üçün, həm də *kişilə*r üçün ən uğurlu cins*əl yaşam t*ərzi olaraq isbatını tapır. Bu gün seks azadlığına, sərhədləri çeynəməyə, hər bir metodun dadına baxmağa çağıran qruplar qadınlara ən böyük pisliyi edirlər. Onların sayəsində tə*k yaşayan və* kazual əlaqə axtaran çarəsiz qadınlar, cinsəllik cəhətdən ən narazı qruplara aid edilirlər.

Çox maraqlıdır ki, mühafizəkar dəyərlər üzərində *qurulmuş ailə* münasibətləri insanları günümüzün cinsəl xəstəliklərindən də qoruyur. Bunun əksi isə, yəni seksual azadlıqlar insanların arasında bu cür xəstəliklərin yayılmasına gətirib çıxarır. Seksual inqilabdan əvvəlki dövrdə cinsəl xəstəliklər əsasən siflis və süzənək (gonorrhea) xəstəliklərindən ibadət idi, digər xəstəliklər isə yalnız fahişələr aləmində tanınırdı. Amma bu gün bu xəstəliklərin sayı otuza çatıb və statistikaya görə hər gün 1 milyon insan cinsi keçici xəstəliklərə yoluxurlar.[484] Bütün bunlardan sonra Hitchens kimilər utanmadan katolik kilsəsini kontraseptiv vasitələrə qarşı olmaqla ittiham edirlər və guya kilsənin Afrikada apardığı bu siyasəti nəticəsində çox sayda insan QİÇS səbəbi ilə ölür. Kilsənin kondomlara qarşı olmasını tənqid etmək olar, amma yayılan bu xəstəliklərdə kilsəni misal gətirib "seksual liberallığa" göz yummaq *ən yumşaq dildə* desək, Hitchens'in ikiüzlülündən qaynaqlanır.

Bütün bunların üzərindən bir də "ailə planlamasına" toxunan ingilis jurnalist, burada yenə də mühafizəkarları qınamağı unutmur. Beləliklə də seksual sərhədlərin aşılmasını təbliğ edən Hitchens bundan sonra arzu olunmaz uşaqların dünyaya gəlməsinin qarşısını almaq üçün "ailə planlamasına" yer verməyə ehtiyac görür. Burada da qəhrəmanlar özü kimi ateist "aydınlardır", zülm edənlər isə yenə də mövhumatçı dindarlardır. Ona görə ailə planlaşdırılmasının bu qədər önəmli olmasına baxmayaraq ilk əvvəldən onu təbliğ edənlər mühafizəkarlar tərəfindən təqib olunublar və həbs ediliblər. Bu arada John Stuart Mill'i misal çəkir.[485] Sözün düzü burada da Hitchens səmimi deyildir. Unutmayaq ki, "ailə planlaması" olaraq cəmiyyətlərdə dəstəklənən fəaliyyətlə*rin çoxu işin* əslində hamilə qadınları abort

---

[483] Edward O. Laumann, John H. Gagnon, Robert T. Michael & Stuart Michaels, "The Social Organization of Sexuality: Sexual Practices in The United States", səh: 546; The University of Chicago Press, Chicago, 1994

[484] https://www.who.int/news-room/detail/06-06-2019-more-than-1-million-new-curable-sexually-transmitted-infections-every-day

[485] "GİG", səh: 222

seçimi ilə tanış etdirməkdir. John Stuart Mill'ə gəldikdə isə onun həbs olunması hələ 17 yaşına təsadüf edir; bu dövrdə Robert Malthus'un fikirlərindən təsirlənən Mill, əhalinin artımından narahat idi və məhz bu məqsədlə kasıbların yaşadığı rayonlarda doğuş kontrolu ilə bağlı broşürlər paylayırdı. Həbs edilməsinin səbəbi də bu olub.[486] Lakin Hitchens burada da hədəfdən iki baxımdan yayınır. Hər *şeyd*ən əvvəl Robert Malthus anqlikan kilsəsinin rahibi idi və belə çıxır ki, "ailə planlaması" fikrini ateist Mill'dən əvvəl kilsə xadimi təbliğ edirdi və bu fikir üzərində heç bir tərəf monopoliya iddia edə bilməz. Katolik kilsəsinin kontraseptiv vasitələrə qarşı neqativ münasibəti məlumdur, amma bunu ümumən dinlərə *xarakteristik bir yanaşma kimi t*əqdim etmək aldadıcıdır. İslam dini – misal üçün – bunu qadağan etmir, əksinə icazə verir. Professor John Marion Riddle mövzu haqqında yazdığı kitabında İslamdakı hüquqi məktəblərin abort barəsində fikir ayrılığında olduğunu qeyd etdikdən sonra əlavə edir: "Onların hamısı bir nöqtədə razılaşa bilirdilər: kontraseptiv vasitələr məqbul idi və Allahın qanunu ilə qadağan edilmə*mişdi."*[487] Bu baxımdan İslam dininin münasibəti əksinə çox müsbət olub. Onu da qeyd etməliyik ki, həm Robert Malthus, həm də J. S. Mill bu məsələdə sırf iqtisadi təsəvvürdən fikir yürüdürdülər. Mill hələ həbs olunduğu ildə "Black Dwarf" qəzetinə yazdığı məqaləsində bu fikri belə ifadə edirdi: "İşçilərdə onların sayını *iş v*əsaitindən bir qədər aşağı saxlamaq məsləhətlidir." Bunun səbəbini isə bir neçə sətr sonra belə izah edir: "Onların qarnı tam tox olmazsa, onlara doğru təlim keçmək olmaz: və onlara doğru təlim keçilməyənə qədər, onlar özlərini rahibliyin və əlçatmazlara pərəstişin qoşa xaltasından qurtara bilməzlər."[488] Beləliklə də Mill üçün əsas motiv iqtisadi xarakter daşıyırdı; önəmli olan cəmiyyətd*əki iş*çilərin sayını resursların imkan verdiyi həddən bir qədər aşağıda saxlamaqdır. Onun "ailə planlaması" qadınların hüquqlarını nəzərdə tutmurdu və o hüquqlardan çıxış etmirdi.[489] Hitchens'in hədəfdən yayındığı birinci nöqtə budur. İkinci nöqtəyə gəldikdə isə onun burada misal verdiyi qəhrəman – daha dəqiq desək John Stuart Mill – ailə planlaması və seksual münasibətlər haqqında fikrində Hitchens'dən fərqlənir. O, "cinsəl münasibətləri, cəmiyyətin xeyri üçün məhdudlaşdırılması gərəkən həzz/əyləncə hesab edirdi."[490] Əgər belədirsə o zaman Mill ilə Hitchens tamamilə iki fərqli qütbdə dururlar; Hitchens seksual

[486] Gregory Claeys, "Mill and Paternalism", səh: 23; Cambridge University Press, Cambridge, 2013

[487] John M. Riddle, "Contraception and Abortion from The Ancient World to The Renaissance", səh: 127; Harvard University Press, Cambridge, 1992

[488] J. S. Mill, "Newspaper Writings; December 1822-1831", The Collected Works of John Stuart Mill", cild 22, səh: 81-82; Routledge and Kegan Paul, London, 1986

[489] Burada J. S. Mill'in qadın hüquqlarını müdafiə etmədiyi qəsd edilmir; onun əksinə qadın hüquqlarını müdafiə edən ilk ingilis mütəfəkkirlərdən olduğu bilinir və bu barədə müstəqil kitab yazıb.

[490] Timothy Larsen, "John Stuart Mill: A Secular Life", səh: 106; Oxford University Press, New York, 2018

liberallığı insan mədəniyyətinin məntiqi nəticəsi kimi görür, J. S. Mill isə bunu əksinə vəhşilik, mədəniyyətsizlik kimi dəyərləndirir. O, yazır: "Cəmiyyətin mövcud olması, məhz insan övladı vəhşi olmadığı üçün mümkündür. Mədəniyyət, hər bir aspektində, heyvani instinktlərə qarşı mübarizədən ibarətdir."[491] Belə çıxır ki, bu dəyərləndirməyə əsasən Hitchens'in təbliğ etdiyi seksual azadlıqlar, mədəniyyətdən uzaqlaşmaq və heyvanların səviyyəsinə enməkdir. Daha da maraqlı olan budur ki, Hitchens dinləri seksuallığı məhdudlaşdırmaqda ittiham etdiyi halda J. S. Mill onları seksuallığı təbliğ etməkdə günahlandırırdı.[492] Mill, xristian ailələrdə çox uşağın doğulmasını kilsənin ailə daxilindəki cinsəl münasibətlərə məhdudiyyət qoymamasında görürdü və din xadimlərini buna görə tənqid edirdi. Çox qəribədir ki, Hitchens mədəniyyət ilə seksual liberalizm arasındakı tərs mütənasibliyi kitabında bir cümləsində etiraf edir, bununla belə praktikada bu tarixi həqiqətdən uzaqlaşır.

Mill'in bu cür maltusçu ideyaları təbliğ etdiyi üçün həbs edilməsinə gəldikdə isə bu problem sadəcə dini cəmiyyətlərin problemi deyildir. Bu gün transgender və homoseksual azadlıqları tənqid edənlərə qarşı başladılan təqib kampaniyası əslində liberal dünyamızın müasir inkvizisiyası hesab edilə bilər. Bir çox universitet professoru bu cür fikirlərinə görə universitetlərdən kənarlaşdırılıblar və ya fəaliyyətlərinə məhdudiyyətlər qoyulub. Kanadalı yazıçı və jurnalist Meghan Murphy bir feminist olaraq müasir trans azadlıqlarını tənqid etdiyi üçün belə bir təqibə məruz qalıb; Kişilərin özlərini trans elan edərək qadınların qapalı və xas zonalarına daxil olmaq imkanı əldə etməklərinə etiraz edən Meghan universitetlər, LGBT təşkilatları, hətta Toronto şəhərinin meri tərəfindən tənqid olunub, fəaliyyətlərinə qarşı məhdudiyyətlər tətbiq edilib və bu, son iki ilin içində baş verən hadisələrdir. Yaxud da ingilis filosof və sosial-teorist Heather Brunskell-Evans nəşr etdiyi məqalələrdə yeni transgender siyasətini tənqid etdiyi üçün akademik təqibə məruz qalıb. O, yaydığı bir məqalədə deyir: "Bir akademik həmkarım mənə xəbərdarlıq etdi: "transgenderliyi analiz etmə - yoxsa elə bir girdaba düşəcəksən ki, oradan heç zaman qurtula bilməyəcəksən."[493] Əlbəttə ki, burada haqlı olaraq demək olar ki, bu misallar keçmişin zülmlərinə haqq qazandırmır. Doğrudur və bu, heç də bizim qəsdimiz deyildir. Bunlar sadəcə olaraq problemlərin əslində insan faktorundan qaynaqlandığını göstərmək üçündür. Hətta ən liberal bir cəmiyyətdə, azadlıqların tam təmin olunması üçün çalışan insanların arasında bu cür təqib və zülm misalları çoxdur. Bu misalları göstərərək cəmiyyətin mənəvi dəyərlərini

[491] John Stuart Mill, "Principles of Political Economy", 1-ci cild, səh: 447; John W. Parker and Son, London, 1857

[492] Timothy Larsen, "John Stuart Mill: A Secular Life", səh: 107; Oxford University Press, New York, 2018

[493] "A Woman's Place is Standing Her Ground", səh: 4; http://www.heather-brunskell-evans.co.uk/wp-content/uploads/2018/06/WPUK.pdf

qaralamaq doğru deyildir. Bu, tibbi məsləhətlərə riayət etməyib vəziyyəti ağırlaşdıqda həkimi günahlandıran nanəciblərin əxlaqıdır.

# HITCHENS KİLSƏDƏ

"*Doğrusu budur ki, tarixdə tək bir xristian olub və o da çarmıxa çəkilərək ölüb.*"
Friedrich Nietzsche

Campo dei Fiori, *Roma* şəhərində Giordano Bruno'nun kilsə tərəfindən yandırıldığı meydanın adıdır. Məhz onun ölümü kilsə tarixinin elmə münasibətini göstərmək üçün "qara piar" olaraq istifadə edilib. Bu meydan həm də kitab dükanları ilə tanınıb. 1915-ci ilin gözəl günlərindən birində oxumaq həvəskarı olan on dörd yaşlı zəki bir italiyalı oğlan kitab almaq üçün bu meydanı ziyarət edir; seçəcəyi çox kitablar var idi, onların hamısını bir-bir incələyir və içindən maraqlı bir kitab tapıb seçmək istəyir. Sonunda ələ aldığı kitablarin arasından o, yezuit rahib Andrea Caraffa'nın 1840-cı ildə yazdığı "Elementorum Physicae Mathematicae" kitabını seçir. Müəllifin zamanına qədər bilinən fiziki nəzəriyyələri özündə ehtiva edən bu kitabı bu azyaşlı oğlan elə maraqla, elə həvəslə oxuyurdu ki, kitabın onda doğurduğu marağı başqalarına da çatdırmaq istəyirdi. Öz bacısına bir dəfəsində kitabı belə vəsf edir: "Möhtəşəmdir! Planetlərin hərəkətini izah edir!" Bacısı Mariya isə nəzakətli bir qız olduğu üçün özünü elə aparırdı ki, sanki ona da maraqlı idi. Amma çətin idi, qızı nə fizika, nə də riyaziyyat maraqlandırmırdı. Kitabı acgözlüklə oxuyan qardaşı isə bir dəfə bacısına deyir: "Heç bilirdin ki, kitab latınca yazılıb – mən heç fikir verməmişdim." Marağın gücündən kitabın dilinə belə fikir verməmiş bu istedadlı oğlan uşağı İtaliyanın müasir tarixdəki ən tanınmış fiziki və astrofiziki Enrico Fermi idi.[494] Məhz bu kitabın onda oyatdığı şövq ilə fizika yoluna qədəm qoyan və nəticədə nobel mükafatı qazanan Fermi həm də ilk nüvə reaktorunu dizayn edən alim kimi tanınır.[495] Kilsə xadiminin fizika sahəsində yazdığı bir kitab dünyaya müasir elmin qəhrəmanlarından birini qazandırdı.

---

[494] Amir D. Aczel, "Uranium Wars: The Scientific Rivalry That Created The Nuclear Age", səh: 74-75; Palgrave Macmillan, New York, 2009
[495] C. Bernardini & L. Bonolis, "Enrico Fermi: His Work and Legacy", səh: 34; Springer Verlag, Heidelberg, 2001

Orta əsrlər tarixi və kilsə tarixi sadə bir qiraət deyildir. Kilsənin tarixi ilə mirası barəsində çox danışmaq mümkündür və əlbəttə ki, insanların reaksiyası da rəngbərəng olacaq. Hitchens'in münasibətini də təxmin etmək çətin olmamalıdır. Kitabında bir yerdə anidən belə bir şərhə yer verir: "*Hollandiyadan tutmuş* Toskana'ya qədər orta əsr Avropasına həsr edilmiş muzeylər elə alətlər və cihazlar ilə doludur ki, bir kimsəni (işgəncə ilə) qovurarkən hansı müddətə qədər sağ saxlamağın mümkün olduğunu görmək üçün müqəddəs adamlar o alətlərin üzərində səmimi qəlbdən çalışırdılar."[496] Şübhəsiz ki, burada orta əsrlərin inkvizisiyasını, kilsə məhkəmələrini və həmin inkvizisiyanın dəhşətlərini görmək üçün bu gün fərqli şəhərlərdə ictimaiyyətə açıq olan "işgəncə muzeylərini" qəsd edir. Burada "qovurmaq" sözü ilə əslində məcazi olaraq işgəncəni qəsd etdiyini təxmin edirəm, çünki bildiyim qədər ilə bu muzeylərdə fiziki olaraq kimisə qovurmaq üçün istifadə olunan bir işgəncə aləti yoxdur. İstənilən halda çatdırılan xəbər çox aydındır və Hitchens üçün bunu çatdırmaq üçün uzun tarixi ədəbiyyatı vərəqləməyə ehtiyac yoxdur. Artıq populyar mədəniyyətdə "orta əsrlər" sözü işgəncə, xurafat və çirkinlik ilə assosiasiya olunur. Bu gün ingilis dilindəki "medieval" sözü hətta aşırı qəddarlıq, zorakılıq mənalarında istifadə edilir.

Burada mütləq bəzi mübaliğələr haqqında danışmalıyıq. Əlbəttə ki, orta əsrlərin işgəncə metodları zəngin fantaziyadan yararlanırdı, lakin bu fantaziya qara propaqandaçıların – Hitchens də onlardan biridir – fantaziyası yanında çox miskindir. Həqiqət budur ki, bu gün muzeylərdəki "işgəncə sərgilərində" göstərilən işgəncə alətlərinin, cihazlarının ən məşhurları müasir dövrün bəzi avantüristləri tərəfindən icad edilib. Bu o deməkdir ki, bu cihazların bir çoxu orta əsrlərdə mövcud olmayıb və ya tamamilə başqa məqsədlər üçün nəzərdə tutulmuşdu. Bu işgəncə cihazları içərisində bəlkə də ən məşhuru, "Dəmir Bakirə" (Iron Maiden) adındakı qurğudur və bunun çox maraqlı bir tarixçəsi vardır. 1800-cü illərin ortalarında Nuremberg şəhəri turist mərkəzinə çevrilməyə başlayırdı, dünyanın bir çox məşhur yazıçısı tarixdən ilham almaq üçün bu şəhəri ziyarət edirdi. Yerli antikvaryan Georg Friedrich Geuder şəhərin həbsxana qalasında "işgəncə otağı" qurur və oranı turistlər üçün açıq elan edir. Geuder'in həmin otaqda topladığı işgəncə alətləri kolleksiyasına məşhur "Dəmir Bakirə" də (Iron Maiden) daxil idi. İç tərəfindən dəmir tikanlarla təchiz edilmiş bu qorxunc dəmir sarkofaq o gündən bəridir ki, populyar mədəniyyətin təxəyyülünü işğal etməkdədir. Tarixçi Joel F. Harrington bu epizodu bizə çatdırarkən vurğulayır ki, "həm dəmir bakirə, həm də "gizli məhkəmə" tamamilə uydurma idi, çox ehtimal ki, qədim mətnlərin təhrifi üzərində qurulmuşdu. Lakin sərgi, Maarifçilikdən əvvəlki dövrün "ədalət" anlayışı və bu ədalətin alçaq icraçıları haqqındakı qotik təsəvvürü məşhurlaşdırmaqda

[496] "GİG", səh: 218-219

effektiv oldu. Başına kapüşon keçirmiş bir cəlladın – ki, on doqquzuncu əsrin daha bir uydurmasıdır – tərəfindən idarə olunan "orta əsr qəddarlıqları" haqqındakı romantikanın tamamı, turistlər və novelistlər üçün qarşıqoyulmaz həddə cazibədar olduğunu göstərdi."[497] Harrington açıq sözlərlə orta əsrlərə qarşı qara propaqandanın tarixi təhriflər etdiyini deyir. Alman tarixçi yazar Robert Zagolla *da Nürnberg* şəhərində qurulan bu sərgidəki cihazların, xüsusilə də "Dəmir Bakirənin" müasir dövrün ixtirası olduğunu təsdiqləyir və qeyd edir ki, həmin cihazın nüsxəsi 1944-cü ildə müharibədə yanıb. O, əslində bu qurğunun orta əsrlərdəki kökünün "utanc əbası" (Schandmantel) olduğunu deyir. Taxta çəlləkdən ibarət olan və cinayətkarı ictimaiyyət qarşısında utandırmaq üçün əyninə keçirilən bu vasitə daha sonradan bəzi ədəbiyyatlarda əlavə *ştrixlər*lə təmin edilib və tədricən "dəmir bakirə" ortaya çıxıb.[498] Jakob Tanner qeyd edir ki, bu alətin saxta olduğu, orta əsrlərə aid olmadığı tarixçilər tərəfindən iyirminci əsrin əvvəllərindən bəri bilinir. "Bu fiqur xəyali bir fantomdur və *uydurulmuş bir* ənənədir" – deyir. "Bu, yeni bir kəşf deyildir" vurğusunu edən Tanner bunun üçün 1920-ci illərə aid olan və naməlum bir müəllif tərəfindən yazılmış "die Geschichte der Folter im Kriminalverfahren aller Völker und Zeiten" kitabını misal gətirir.[499] Orta əsrlərin adına yazılmış bu cür alətlər təkcə "dəmir bakirə" ilə məhdudlaşmır. Bura "əzab armudu", "tunc öküz", "Yəhudanın kürsüsü", "iffət kəməri" kimi digər alətləri də aid edə bilərik və bu gün bir çox muzeydə bu alətlər orta əsrlərin "dahi" *işgəncə* və zülm alətləri arasında qeyd edilir. "*Əzab armudu" da maraql*ı bir misaldır. Qapalı şəkildə armud formasında olan bu alət, içindəki metal yayın köməyi ilə açılır və dörd qaşıq formasında hissələrə ayrılır. İddiaya görə bu aləti ağıza, vaginaya və *ya anus deşiyinə* daxil edən kəs onu açaraq əlinin altındakı insana *işgəncə* verərdi. Avstraliyalı tarixçi Chris Bishop bu alətlə bağlı araşdırmasında göst*ərir ki, bunun işgəncə* aləti olaraq istifadə edilmiş olması imkansızdır, çünki içindəki metal yay çənəni və ya anus əzələlərini aralayacaq qədər güclü deyildir. Üstəlik muzeylərdə saxlanılan bu nümunələrdən bir çoxu estetik bəzəklər ilə təchiz edilib. Bishop mövcud ədəbiyyata dalaraq bu alətin əvvəlki əsrlərdə bəzi oğrular tərəfdən istifadə edildiyini müəyyənləşdirir; oğrular bu alətin vasitəsi ilə imkanlı insanları ələ keçirər, onların ağzına "armudu" daxil edər və sonra onu içəridə açardılar. Mexanizmi yığmaq üçün xüsusi bir açara ehtiyac olardı və bu açarı oğrulardan əldə etmək üçün h*əmin ş*əxs onlara istədikləri məbləği ödəməyə məcbur olurdu. *Bishop qeyd edir ki, başqa işgəncə* alətləri haqqında tarixi

---

[497] Joel F. Harrington, "The Faithful Executioner: Life and Death, Honor and Shame in the Turbulen Sixteenth Century", səh: 233; Farrar, Straus and Giroux, New York, 2013

[498] Robert Zagolla, "Im Namen der Wahrheit: Folter in Deutschland vom Mittelalter bis Heute", səh: 118-119; Bebra Verlag, Berlin, 2006

[499] Barbara Naumann, Thomas Strässle, Caroline Torra-Mattenklott, "Stoffe: Zur Geschichte der Materialität in Künsten und Wissenschaften", səh: 102; VDF Hochschulverlag, Zürich, 2006

qeydlərdə oxumaq mümkündür, “lakin biz heç bir yerdə armud haqqında bir şey oxuya bilmirik.”[500] *Eyni şeylə*ri “iffət kəməri” barəsində də demək olar. Bu haqda Albrecht Classen’in yazdığı “The Medieval Chastity Belt” kitabı bizə bu əfsanənin necə formalaşdığını və müasir insanların təxəyyülündə həkk olunduğunu izah edir. Orta əsrlərə nisbət edilən bu cür kəmərlər vaxtında muzeylərdə sərgiləndiyi halda bu gün bir çox muzeydən yığışdırılır. Linda Migl Keyser belə bir məlumat verir: “Faktiki olaraq 1846-cı ildən bə*ri Londan ş*əhərində Britaniya Muzeyində *tamaşa* edilmə*si üçün qoyulmuş* və orta əsrlərə aid olduğu iddia olunan iffət kəməri 1996-cı ildə sərgidən götürüldü. Muzeyin sözçüsü qeyd etdi ki, “mövcud nümunələrin əksəriyyəti maraqlananlar üçün ya da sadəcə *olaraq şit bir zarafat kimi on* doqquzuncu əsrdə düzəldilib.”[501] Alman tarixçi Franz Helbing bu alətlərin bir çoxunun əsasən sərgi məqsədi ilə düzəldildiyini deyir, tədricən ortaya çıxmış və muzeylərə *qoyulmuş bu cihazlar* əslində *heç bir zaman işg*əncə üçün istifadə edilməyib. O, *bu* şəkildə düzə*ldilmiş işg*əncə alətlərinin müasir dövrdə saxtalaşdırılmasını “o dövr haqqındakı romantika və kilsəyə/dinə qarşı nifrət” ilə əlaqələndirir.[502] Ümumiyyətlə orta əsrlər haqqında, o dövrün ədalət anlayışı haqqında çox danışmaq olar. Bildiyimiz budur ki, işgəncə metodları o dövrün ədalət institutlarının inteqral bir hissəsi idi. Müasir tariximiz kilsəyə qarşı mübarizə, orta əsrləri romantikləş*dirmə* ilə tanındığı üçün, keçmiş haqqında sağlam təsəvvürlərlə yanaşı tə*hrif edilmiş sur*ətlər də ortaya çıxmışdır. B*əzi işg*əncə alətləri – dəmir bakirə kimi – tamamilə təxəyyül məhsulu olduğu kimi digərləri də*yişdirilmiş, daha da q*əddarlaşdırılmışdı. Bu alətlərin bəziləri həqiqətən də istifadə edilsə də, onların replikaları sonradan çoxaldılmış, bəzi kolleksionerlərə və muzeylərə satılmışdır. Üstə*lik bu işg*əncə metodları təkcə dini institutlara xas deyildi, dünyəvi hakimiyyətlər bu metodu daha çox istifadə edirdi. Hətta daha da irəli gedərək deyə bilərik ki, dini dairələrin istifadə *etdiyi işg*əncə, təbiət etibarı ilə dünyəvi dairələrə nisbətdə daha məhdud və daha intizamlı idi. İnkvizisiya tarixini geniş araşdırmış tarixçilərdən Edward Peters bununla bağlı bəzi müqayisələr edir. Peters qeyd edir ki, kils*ənin işg*əncə metodları istifadə edərkən məqsədi yalnız müttəhimin etirafını əldə etmək idi, “dünyəvi hakimiyyətin hüquq məmurları” isə bununla yanaşı işgəncə ilə həm də “cəzalandırmağı məqsəd güdürdülər.”[503] Qeyd etmək lazımdır ki, işgəncə altında əldə *edilmiş etiraflar kilsə* məhkəmələri tərəfindən etibarlı hesab edilmirdi, etirafın etibarlı olması üçün müttəhimin özünün

---

[500] Chris Bishop, “The Pear of Anguish: Truth, torture and Dark Medievalism”, səh: 593; International Journal of Cultural Studies, 17, 2014

[501] Stephen J. Harris & Bryon L. Grigsby, ”Misconceptions About The Middle Ages”, səh: 254; Routledge, New York, 2008

[502] Franz Helbing, “Die Tortur. Geschichte der Folter im Kriminalverfahren aller Völker und Zeiten”, 1-ci bölüm, səh: 243-245, Dr. P. Langenscheidt Verlag, Berlin, 1910

[503] Edward Peters, ”Inquisition”, səh: 65; The Free Press, A Division of Macmillan, New York, 1988

bunu könüllü olaraq etiraf etməsi lazım idi. İspaniya inkvizisiyasının tarixini yazmış Henry Kamen deyir: "İnkvizisiyanın düşmənləri tərəfindən ortaya atılmış sadizmin qorxunc səhnələri yalnız və yalnız əfsanələrdə mövcuddur."[504] *Mövzunun bir başqa* avtoriteti Henry Charles Lea (1825-1909) antikatolikliyinə, ispaniya əleyhdarlığına görə tənqid olunsa da bu mövzuda əvvəlki iki müəllif ilə razılaşır və deyir: "İnkvizisiya işgəncə otaqlarının qəddarlıqla istisna bir ustalıqdan, əzab verməkdə xüsusilə ixtiraçı metodlardan və etirafların zorla çıxarmaqda özünəməxsus əzmkarlıqdan ibarət olması haqqında yayğın olan təəssürat, sensasiya axtaran yazıçıların (insanlardakı) sədalövhlükdən sui-istifadə etməsi nəticəsində ortaya çıxmış bir xətadır." Lea əlavə edir ki, "bir qayda olaraq (kilsə məhkəmələri) praktikada dünyəvi məhkəmələrdən daha az qəddar idi."[505] Mövzunun ən öndər mütəxəssisləri inkvizisiya və kilsə məhkəmələri haqqında protestantlar, maarifçilər, pozitivistlər tərəfindən boyanmış portretlərin həddindən artıq şişirtmə və əfsanə olduğunu deyirlər. Bunu anlamaq çətin olmamalıdır. Reformasiyadan sonra protestentlar katoliklərə qarşı qara propaqandanı intensivlə*şdirdil*ər və katolikləri qəddar, qaniçən canilər olaraq göstərənlər ilkin protestant yazıçılar oldu. Bu ənənəni daha sonra ümumilikdə dinin əleyhinə olan pozitivist və ateist yazıçılar davam etdirdilər. Orta əsrlər haqqında nə desək də, bir *şey* bizə çox aydındır: *o dövr işg*əncəni anti-etik bir norma elan edərək özünü daha üstün bir mədəni və mənəvi statusa aid etmirdi. Əksinə *işg*əncə normal bir prosedura hesab olunurdu. Bəs müasir dövrün dünyəvi dövlətləri haqqında eyni *şeyi deyə* bilərikmi?!

Müasir tariximizin "mədənilə*şmiş"* dövlətləri *işg*əncəni mədəniyyətə zidd bir metod olaraq görürlər. Bu dövlətlər mənəvi bir üstünlüyə iddialıdırlar, xüsusilə də Hitchens'in İraq müharibəsinə dəstək verərək yanında durduğu Amerika Birlə*şmiş* Ştatları bu iddiada özünəməxsus bir yer tutur. Belə bir məzmunda *Əbu* Ğureyb dustaqlarına qarşı edilmiş zülmlər və *işg*əncələr yad edilməyə bilməz. Məhbusların başına torba keçirilirsə, nazik qutular üzərinə çıxarılırsa, hər iki əlinin barmaqlarına elektrik naqilləri bağlanaraq saatlarla o vəziyyətdə saxlanılırsa buna biz işgəncə deyirik. Üstəlik orta əsrlə*rin işg*əncələrindən fərqli olaraq müasir "demokratların" etdiklə*ri işgəncələr daha çox* şəxsiyyəti alçaltmaqla, insanın kimliyini məhv etməklə seçilir; bunun üçün məhbusları oral seksə məcbur edirlə*r, anus deşikl*ərinə lampalar və müxtəlif əşyalar salırlar, üzlərinə, bədənlərinə digər məhbusların ifrazatlarını yaxırlar. Bütün bunları Hitchens'in "mədəni" adlandırdığı cəmiyyətin nümayəndələri icra ediblər. Arada daha önəmli bir fərq var. Xristian kilsəsi bu *işgəncələri, işg*əncənin bütün dünya tərəfindən ədalət institutlarında legitim vasitə

---

[504] Henry Kamen, "The Spanish Inquisition", səh: 174; New American Library, New York, 1966
[505] Henry Charles Lea, "A History of The Inquisition of Spain", üçüncü cild, səh: 2; (dörd cildlik nə*şr) The Macmillan Company, New York, 1907*

olaraq istifadə edildiyi bir zamanda edirdi, amma müasir zamanın cəlladları isə bunu, bütün dünyanın işgəncəni qadağan etdiyi və qınadığı bir zamanda edirlər. Bu, çox önəmli bir fərqdir. Sam Harris orta əsrlərin işgəncələrinin dini inanclardan doğduğunu iddia etdiyi kitabında Xalid Şeyx Muhəmməd haqqında bu sözləri yazır: "Hətta əgər işgəncə altında bizə deyəcəyi şeyin əl-Qaidə'ni bir az da dağıtmağa imkan verəcəyinə milyonda bir şans varsa, görünür ki, onu danışdırmaq üçün əlimizdə olan hər vasitəni istifadə etməyimiz lazımdır."[506] Dini, imanı alçaltmaq üçün orta əsrlərdə istifadə edilmiş işgəncəni misal gətirmək olar, amma məsələ öz dövlətinin təhlükəsizliyinə gəldikdə bir müsəlmanı hər cür işgəncəyə məruz qoymaqda Sam Harris kimi bir ateist heç bir problem görmür. Əksinə gördüyümüz kimi buna bəraət qazandırmağa çalışır. Johnstone haqlı olaraq qeyd edir ki, "orta əsrlərdəki hüquq işgəncəni ilk tədbir kimi görmürdü və bunun belə olması üçün ciddi kriteriyalar qoymuşdu. Harris isə əksinə bir kriminal kateqoriyanın tamamını bir əsas üzərində müəyyən edir; bu əsas, onların bir qayda olaraq işgəncə edilə bilməkləridir. Onun kifayət edəcək günah üçün qoyduğu kriteriya o qədər genişdir ki, əvəzində müsəlman şübhəlini "su işgəncəsindən" qurtaran kriteriyanın nə olduğunu soruşmaq daha mənalıdır."[507] Su işgəncəsinin (waterboarding) işgəncə olmağının mübahisəli olduğunu düşünənlərə isə Hitchens'in cavabı vardır: "İnanın mənə, waterboarding bir işgəncədir." Bunun bir işgəncə olub olmadığını anlamaq üçün öz üzərində tətbiq edilməsinə razı olan Hitchens belə deyir: "Əgər waterboarding işgəncə sayılmayacaqsa o zaman işgəncə deyilən bir şey yoxdur."[508]

Orta əsrlər haqqındakı qara əfsanələr burda bitmir, onların haqqında tarixçilərin hər gün yeni araşdırmaları nəşr olunur. Bu əfsanələrin ən məşhuru bəlkə də orta əsrlərdə təbiət elmlərinə, elmi araşdırmalara olan münasibət barəsindəndir. "Atomizm əsrlər boyunca xristian Avropada amansızca təqib olundu..."[509] - Hitchens deyir. Bununla da oxucuda belə bir təəssürat oyatmağa çalışır ki, orta əsrlərin kilsəsi bütün elmi yeniliklərə qarşı mübarizə aparıb. Hitchens və onun qələmdaşlarının istifadə etdikləri "ritorika" həqiqətən də çox ucuzdur; günümüzün ən sonuncu elmi kəşflərini istifadə edərək keçmiş fəlsəfi nəzəriyyələri dəyərsizləşdirməyə çalışmaq ən yumşaq dildə desək insafsızlıqdır. Çünki yunan fəlsəfəsində müzakirə edilmiş atomizmi müasir atomizm ilə eyniləşdirmək çox böyük bir xətadır. Atomizmin proponentləri sırf fəlsəfi düşüncədən çıxış edərək

[506] S. Harris, "The End of Faith: Religion, Terror, and The Future of Reason", səh: 198; W.W.Norton & Company, New York, 2005
[507] N. Johnstone, "The New Atheism, Myth and History: The Black Legends of Contemporary Anti-Religion", səh: 229; Palgrave Macmillan, 2018
[508] Nicholas Epley, "Mindwise: Why We Misunderstand What Others Think, Believe, Feel and Want", səh: 213-214; Alfred A. Knopf, New York, 2014
[509] GİG, səh: 259

fiziki dünyanın kiçik və bölünməz tərkib hissəciklərindən formalaşdıqlarını *demişdilə*r və təbiət hadisələrinin o hissəciklərin hərəkətindən qaynaqlandığını iddia edirdilər. Lakin iddia etdikləri o hərəkətlər dövrünün hərəkət nəzəriyyələrindən heç birinə uyğun gəlmirdi. Democritus (Demokrit) kimi atomizm tərəfdarlarının, hərəkət haqqında öz müasirlərindən daha sağlam biliklərə sahib olduqlarına dair əlimizdə heç bir dəlil yoxdur.[510] Əksinə hərəkətlər haqqında mövcud olan v*ə öz dövrünün* şərtlərinə görə legitim olan təcrübi elm, atomizmdəki hərəkət nəzəriyyəsi üçün bir problem idi. Buna görə də atomizmi "dini fanatiklər" yox, məhz Aristotel kimi yunan filosofları tənqid edirdilər və onun imkansız olduğuna dair riyazi, həndəsi və fiziki dəlillər gətirirdilər. Atomizmi inkar etmək *heç bir* şəkildə insanların elmə və proqresə ədavətini sübut etməz. Əgər yunan və xristian filosofların əksəriyyəti empirik elmin inkiş*af etmə*diyi bir dövrdə atomların mövcudluğunu inkar edirdilərsə Ernst Mach kimi ateist fizik – hələ iyirminci əsrin əvvəllərində - bütün dünya fiziklərinin rəyinə müxalif olaraq atomların mövcudluğunu inkar edirdi. Bu barədə öz həmkarı Boltzmann ilə aras*ında baş vermiş polemika belə* bir inkarın da materialist fəlsəfə üzərində durduğunu bizə göstərir.[511] Mach ilə yanaşı atomları və molekulları inkar edən digər böyük alim Friedrich Ostwald idi.[512] Hər iki alimin atomizmə qarşı müqaviməti onların elmi fəlsəfələrindən qaynaqlanırdı; onlar hiss orqanları ilə sübut edilməy*ən heç bir şeyi* qəbul etməyi doğru hesab etmirdilər.[513] *Şotland botanist Robert Brown'un suyun* səthi üzərində *müşahidə* etdiyi toz dənəciklərinin rəqsini, Albert Einstein'in 1905-ci ildə atomlarla izah edə bilməsi, hətta bu hərəkətlərin xüsusiyyəti haqqında verdiyi proqnozların sonradan eksperimentlərlə təsdiqini tapması, bir çox skeptikin – Ostwald da onlardan biri idi - atomizmi qəbul etməsinə səbəb oldu, lakin bu, Mach'ı atomların mövcudluğuna inandıra bilmədi.[514] Sonralar 1913-cü ildə *Vyana ş*əhərində keçən alman alimlərinin konqresində *iştirak ed*ən Einstein həmin münasibətdən istifadə edərək Mach'ı ziyarət edir. Aralarında keçən söhbətdə Einstein onu atomların mövcudluğuna inandırmağa çalışır, lakin Mach nəzəriyyəni sadəcə olaraq "əlverişli" adlandırır, lakin onları real fiziki hissəciklər kimi qəbul etdiyini demir.[515] Einstein, öz gənclik dövrünün qəhrəmanından belə

---

[510] Andrew Pyle, "Atomism and Its Critics: From Democritus to Newton", səh: 61; Thoemmes Press, Bristol, 1997

[511] John T. Blackmore, "Ernst Mach: His Work, Life and Influence", səh: 206; University of California Press, London, 1972

[512] Milthon A. Rothman, "The Science Gap: Dispelling the Myths and Understanding the Reality of Science", səh: 104; Prometheus Books, 1992

[513] Steve Adams, "Frontiers: Twentieth-Century Physics", səh: 417; Taylor & Francis, New York, 2000

[514] Jeremy Bernstein, "Cranks, Quarks and The Cosmos", səh: 35; Basic Books, New York, 1993

[515] Jagdish Mehra, "Einstein, Physics and Reality", səh: 113-114; World Scientific Publishing, Singapore, 1999

bir cavab almaqla məyus olmuşdu. Bu görüşdən üç il sonra Ernst Mach bu dünyaya vəda edir. Mach'ın atomizmə müqaviməti heç cür yunan və xristian filosoflarının müqaviməti ilə müqayisə edilə bilməz, çünki birincisi mövcud dəlillər qarşısında pozitivist fəlsəfəyə görə atomizmi inkar etdiyi halda, ikincisi isə heç bir dəlil olmadığı halda əksər alimlərin rəyinə müvafiq olaraq atomizmi inkar etməkdir. Əlbəttə ki, birinci halın tənqid olunması daha məntiqlidir.

Yunanların dövründə mövcud olan elmi təsəvvürə görə əşyaların hərəkəti ya təbii, ya da məcburi hərəkətdən ibarət idi. Əgər xarici amil tərəfindən hərəkətə gətirilməyibsə əşyalarda sadəcə təbii hərəkət ola bilərdi; o dövrdə bu təbii hərəkətlər ağır əşyalar üçün aşağıya doğru, yüngül əşyalar üçün isə yuxarıya doğru təsəvvür edilirdi. O zaman atomların hərəkəti mövcud təbii nəzəriyyə ilə izah edilə bilmirdi, hətta ziddiyyət təşkil edirdi. Demokrit'in atomizminə həyat qatan Epikür belə bu nöqtəyə qənaətbəxş çözüm gətirə bilməmişdi və opponentlərin etirazlarına tutarlı bir cavab tapa bilmədi; "bu etirazlara cavab olaraq Epikür çox maraqlı və özünəməxsus bir nəzəriyyə formalaşdırdı. Təbii hərəkət nəzəriyyəsindən qurtulmaq əvəzinə o, öz atomlarına təbii – aşağıya doğru – hərəkət nisbət etməli oldu. Öz ağırlıqları sayəsində - Epikür deyir – bütün atomlar təbii olaraq sonsuz boşluqda aşağı düşürlər."[516] Aşağıya doğru hərəkət edən bütün atomların necə bir-biriləri ilə toqquşması, bir-biriləri ilə interaksiya etməsi mistikasını isə bizim təsəvvür qabiliyyətimizə buraxmışdı. Beləliklə də erkən atomistlərin atom haqqında təsəvvürləri də tamamilə metafizik bir təsəvvür idi. Demokrit'ə görə bütün canlıların bədənindən atomlar çıxır, onun nəzərində bu atomlar ruh atomlarıdır. Ona görə insan öldükdə bir heç olmur, əksinə hiss etməyə davam edir; insanın ölməsi ruh atomlarının xeyli bir hissəsinin bədəni tərk etməsi ilə baş verir, lakin geridə qalan ruh atomları bədənin hissiyyatını saxlamasını sağlayır. O, bəzi insanların öldükdən sonra dirilməsini və ya öldükdən sonra da dırnaqlarının uzanmasını izah etmək üçün bu nəzəriyyəsini irəli sürmüşdü. Epikür və onun mənəvi həvarisi Lukretius isə bu növqədə Demokrit ilə razılaşmayıblar.[517] Güman edirəm ki, atomizmin bu həddini heç Hitchens belə təqdir etməzdi.

Hitchens iddia edir ki, kilsə atomizmi "anlaşılan bir səbəbə görə, təbii aləmi dindən daha yaxşı izah etdiyi üçün"[518] təqib etmişdir. Bu cür güclü iddialar edən bir yazıçının növbəti sətrlərdə iddiasını əsaslı şəkildə sübut edəcəyini gözləmək olar, lakin hər dəfə olduğu kimi bu dəfə də oxucunu məyus edir. Bu barədə heç

---

[516] Andrew Pyle, "Atomism and Its Critics: From Democritus to Newton", səh: 70; Thoemmes Press, Bristol, 1997

[517] Aldo Brancacci & Pierre-Marie Morel, "Democritus: Science, The Arts and The Care of The Soul", səh: 77-80; Brill, Leiden, 2007 (Cristopher C. W. Taylor, "Democritus and Lucretius on Death and Dying")

[518] GİG, səh: 259

bir tarixi araşdırmaya yer vermir, tək bir tarixçi müəllifə belə *işarə* yoxdur. Lakin onun fransız həmkarı, bir başqa neo-ateist Michel Onfray isə bunu misallarla izah etməyə çalışır. "Materializmin eyhamının göründüyü hər bir yerə kilsə hücum çəkir" deyən Onfray bunun üçün Bruno və Galileo'nu misal gətirir. Bruno'nu ateizmə görə yox, materializminə görə yandırdıqlarını deyir. Galileo'nun isə eyni aqibətdən qurtulmasını atomizmi etiraf etməməsi, kopernik bidətini isə qəbul etməsi ilə izah edir. O zaman "heliosentrizm ömürlük ev həbsi ilə cəzalandırılırdı" – Onfray deyir- "digər tərəfdən isə atomizmi müdafiə etməyə görə is tonqalda yandırırdılar."[519] Tarixçilərin Bruno'nun məhkəməsi, onun yandırılması səbəbləri haqqında yazdıqlarını nəzərdən keçirməyimə baxmayaraq onlardan heç birinin atomizmə bu səbəblər arasında rol verdiklərini görə bilmədim. Frances Yates – misal üçün – qeyd edir ki, "Brunonun fəlsəfi bir mütəfəkkir kimi təqib olunması, çoxlu dünyalar və ya Yerin hərəkət etməsi kimi cürətli fikirlərinə görə yandırılması əfsanəsi artıq müdafiə edilə bilməz."[520] Yates'in rəyi budur ki, Bruno hermetist olduğu üçün və sehrlə məşğul olduğu üçün məhkum olunaraq öldürülüb.[521] Alberto Martinez isə bu fikrin tam tərsini müdafiə edir. "Giordano Bruno" – Martinez deyir – "həqiqətən də kainat haqqındakı fikirlərinə görə yandırılıb." Bunu qeyd etdikdən sonra isə əlavə edir: "Bruno iddia edirdi ki, Yerin ruhu vardır və çox dünyalar mövcuddur."[522] Maurice Finacchario heç biri ilə razılaşmır və orta yolun daha doğru olduğunu müdafiə edir. Ona görə Bruno nə elmi iddialara görə, nə də dini bidətlərə və inanclara görə öldürülüb, lakin fəlsəfi fikirlərinə görə ölüm hökmünü qazanıb.[523] Finacchario – italyan tarixçi Angelo Mercati'nin rəyi ilə razılaşaraq - göstərir ki, Bruno'nun Yerin hərəkəti haqqındakı fikirləri elmi-astronomik fikirlər deyildi, lakin fəlsəfi fikirlər idi. *Əlavə* edir ki, onun ölüm hökmündə rol oynayan fikirlər, kainatın *əzəli* olması, məkan baxımından sonsuz olması və *başqa* planetlərdə həyat olması, həmçinin ruhun mahiyyəti, onun ölümsüzlüyü və maddə ilə əlaqəsi ilə bağlı idi.[524] Hətta Martinez belə razılaşır ki, Brunonun nəzərində Yerin hərəkəti "sadəcə astronomik bir hərəkət deyildi. *Əksinə* Yerin də ruhunun olması, beləliklə də digər canlılar kimi onun da hərəkət edən bir canlı olması kimi özünəməxsus dini bir konseptin bir parçası idi."[525] ***Bütün bunlardan sonra başa***

---

519 M. Onfray, "In Defense of Atheism: The Case Against Christianity, Judaism and Islam", səh: 84-85; Arcade Publishing, London, 2007
520 F. A. Yates, "Giordano Bruno and The Hermetic Tradition", səh: 355; Taylor & Francis, New York, 1999
521 Eyni mənbə, səh: 542
522 A. A. Martinez, "Burned Alive: Giordani Bruna, Galileo and The Inquisition", səh: 7-8; Reaktion Books, London, 2018
523 Hilary Gatti, "Giordano Bruna, Philosopher of The Renaissance", səh: 54; Taylor & Francis, New York, 2016
524 Hilary Gatti, "Giordano Bruna, Philosopher of The Renaissance", səh: 80-81; Taylor & Francis, New York, 2016
525 A. A. Martinez, "Burned Alive: Giordani Bruna, Galileo and The Inquisition", səh: 239; Reaktion Books, London, 2018

*düşmək* olar ki, Onfray'in Bruno'nu bir materialist kimi vəsf etməsi və materializminə görə öldürüldüyünü deməsi absurddur.

Galileo haqqında dediklərinə gəldikdə isə Nathan Johnstone yazdığı dəyərli bir kitabında bu iddianın necə doğru olmadığını göstərir. H*ər şeyd*ən əvvəl Johnstone göstərir ki, Onfray bu məlumatları italiyalı tarixçi Pietro Redondi'nin 80-ci illərin əvvəlində yazdığı bir kitabından çıxarıb. Bununla bağlı iki önəmli etiraz edir. İlk etiraz budur ki, Redondi'nin kitabı sonrakı tarixçilər tərəfindən etibarsızlaşdırılıb.[526] Jules Speller öz araşdırmasında Redondi'nin bu iddiasını müzakirə edir və onun əsassız olduğunu qeyd edir.[527] Dom Paschal Scotti deyir ki, "...atomizmin katoliklərin transsubstansiasiya[528] doktrinasını sarsıtmaq yönündə möhtəməl təsirlərinin olması baxımından bəzi t*ələşlar olsa* da bu, dramanın aktyorlarının qayğıları arasında o qədər də ciddi yer tutmurdu."[529] Scotti daha sonra Redondi'nin araşdırmasını sərt sözlərlə tənqid edir.[530] İyirminci əsrin elmi fəlsəfəsi sahəsində yazıları ilə tanınmış Paul Feyerabend belə bu nəzəriyyədən qane olmadığını qeyd edir: "Galileo'nun "Assayer" əsərində atomizm haqqında dedikləri "transsubstansiasiya" inancı ilə konfliktə girməyəcək qədər qısa və qeyri-müəyyəndir."[531] Hətta Redondi'nin haqlı olduğunu fərz etsək belə bu, Onfray'i daha çətin vəziyyətə salır; çünki Onfray'in dedikləri ilə Redondi'nin dedikləri eyni deyildir. Çünki Redondi'nin iddiası budur ki, Galileo'ya qarşı başladılmış məhkəmə əslində onu ağır bir ittihamdan, atomizm ittihamından qurtarmaq üçün tə*şkil edilmişdi. Onun t*əqdim etdiyi tarixi hesabata görə kilsənin daxilində iki güclü tərəf var idi; bir tərəf ənənəvi fəlsəfənin statusunu müdafiə etməyə çalışdığı halda digər tərəf Galileo'nun müdafiə etdiyi "yeni fəlsəfəyə" meyl edirdi. Məhz bu ikinci tərəf Galileo'nu daha ağır ittihamlardan xilas etməkdən ötrü onu daha kiçik ittihamla, yəni heliosentrizm ittihamı ilə üzlə*şdirirlə*r. Redondi atomizm üzərində gedən *münaqiş*əni Elm ilə Kilsə arasında ged*ən münaqişə* kimi göstərmir, əksinə bunu Kilsənin öz daxilində gedən mübarizə kimi təqdim edir. Köhnə fəlsəfə Aristotelin fəlsəfəsi idi, yeni fəlsəfə isə Aristotelin sistemini rədd edirdi. "Redondi'nin kitabında üzdə ged*ən siyasi münaqiş*ələrin altında - Onfray'in anlaya bilməyəcəyi

---

526 N. Johnstone, "The New Atheism, Myth and History: The Black Legends of Contemporary Anti-Religion", səh: 151; Palgrave Macmillan, 2018

527 J. Speller, "Galileo's Inquisition Trial Revisited", səh: 150-151; Peter Lang GmbH, Europäischer Verlad der Wissenschaften, Frankfurt am Main, 2008

528 Bu, katoliklərdə çörəyin maddəsinin İsanın bədəninə, şərab maddəsinin isə İsanın qanına çevrilməsi inancıdır.

529 D. P. Scotti, "Galileo Revisited: The Galileo Affair in Context", səh: 230; Ignatius Press, San Francisco, 2017

530 Tarixçilər bu məsələ ilə bağlı Vincenzo Ferrone və Massimo Firpo'nun yazdıqları dəyərləndirməyə istinad edirlər. Onlar Redondi'nin kitabını yazdıqları məqalədə nəzərdən keçirirlər və xətalarını göstərirlər. V. Ferrone & M. Firpo, "From Inquisitors to Microhistorians: A Critique of Pietro Redondi Galileo Eretico", Journal of Modern History 58 (1986): səh: 485-524

531 Paul Feyerabend, "Against Method", səh: 115; Verso, London, 1993

- belə açıq bir fikir yer alır ki, Galileo'nun atomizminin bidət olmadığına dair Kilsənin daxilindən nüfuzlu, teoloji bir qərar çıxarmaq mümkün idi."[532] *Başqa sözlə* desək neo-ateistdən fərqli olaraq tarixçi Redondi göstərməyə çalışır ki, Kilsənin öz daxilində məsələ haqqında fikir ayrılığı olub və atomizm real, legitim bir fikir kimi qəbul edilmək ərəfəsində idi. Burada nəzərdən qaçırılan nöqtə budur ki, yunan atomizminin müasir dünyada qəbul edilməsi üçün bəzi d*əyişikl*ərdən keçməsi və müasir standartlara cavab verməsi lazım idi. Eyni şey əslində orta əsrlərdə də *baş* verdi və *atomizm teistik* şərtlərə uyğunlaşdırılaraq kilsə tərəfindən qəbul edildi. Dinin yunan atomizmindən təmizlədiyi bəzi fikirlər əslində müasir elm tərəfindən təsdiqini tapıb; misal üçün ilk atomistlər atomların qədim olduğuna, yaradılmamış olduğuna, hər zaman mövcud olduğuna inanırdılar. Kilsə təbii ki, belə bir inancı rədd edəcəkdi və ona düz*əliş etm*əyi tələb edəcəkdi. Günümüzün elmi k*əşfl*əri bir daha bu fikri dəstəkləyir ki, atomlar da Big Bang ilə yaranıb, əzəli olmayıb. Onu da əlavə edək ki, orta əsrlərdə bəzi atomist filosoflar yaşayıblar və fəaliyyət göstəriblər. Onların arasında İngiltərədən Henry of Harclay, Walter Chatton, William Crathorn, John Wyclif kimilərini, Kontinentdən isə Gerard of Odo, Nicholas Bonetus, John Gedo, Marcus Trevisano və Nicholas Autrecourt'un adlarını çəkmək olar.[533] Hitchens'in iddia etdiyi kimi atomizm tam yox olmamışdı. Həm də İslam dünyasında *əşaril*ər, mötəzililər, maturidilər və bir çox digər qruplar atomizmi təbiət təsəvvürünün təməlində qəbul edirdilər.

Lukretius da atomizmi müdafiə etmiş bir romalı yazıçı idi. Onun "De Rerum Natura" kitabı barəsində danışan Hitchens belə bir iddiaya yer verir: "Bu əsər az qala xristian fanatlar tərəfindən orta əsrlərdə m*əhv edilmişdi..."*[534] Bu sözlər oxucunun ağlında bir dünya canlandırır; bütün proqressiv kitablar dindar fanatlar tərəfindən tapılaraq m*əhv edilirmiş. Sanki 1933*-cü ilin may ayında Berlində nazi tələbələr tərəfindən təşkil edilmiş kitab yandırma mənzərəsini gözümüzün önünə gətirdi. Bu iddia tarixçi olmayan Hitchens'in iddiasıdır. William Ellery Leonard isə tamamilə *başqa şeyl*ər yazır. O, "De Rerum Natura" əsərindən hər hansısa bir əlyazmanın bizim zamanımıza çatmasını xristian rahiblərə borclu bilir. "Çünki bütpərəstin dinsiz beytlərini xilas edən məhz rahiblərin mömin qələmləri oldu." Daha sonra bunun səbəbi üzərinə təfəkkür edən Leonard bunu kilsədə *formalaşan* bir ənənə ilə izah edir. Özündən əminlik əldə edən Kilsə, klassik mədəniyyətin nailiyyətlərini qorumağa başlamışdı. *Əlyazmaları* köçürənlər hər dəfəsində yalnız bir nüsxə köçürürdülər və əlyazmaların sayının az olması bununla bağlı idi.

[532] N. Johnstone, "The New Atheism, Myth and History: The Black Legends of Contemporary Anti-Religion", səh: 152; Palgrave Macmillan, 2018
[533] Christophe Grellard & Aurelien Robert, "Atomism in Late Medieval Philosophy and Theology", səh: 16; Brill, Leiden, 2009
[534] GİG, səh: 259

*“Monastrlar heç bir* şəkildə Lukretius’un təbliğatçıları deyildilər,” – Leonard deyir – ”bəs o zaman onların nə üçün Lukretius’un kitabını götürüb bir dəfəlik yandırmamaqları ciddi bir problemdir.”[535] William Leonard burada Hitchens’dən fərqli olaraq qeyd edir ki, Lukretius’un kitabını məhv etmək istəsəydilər Kilsə üçün bunu etmək çətin deyildi, lakin Kilsə bunu etməyib. Deməli Hitchens’in iddiasının əksinə burada elmi əsərlərə qarşı diqqət və qayğı olduğunu görürük. Ümumiyyətlə kitabın nüsxələrinin azlığı Kilsə tərəfindən məhv edildiyi üçün yox, sadəcə olaraq oxucular arasında geniş bir oxucu kütləsi qazanmaması ilə izah olunur. David Butterfield qeyd edir ki, xristian dünyasında Lukretius oxucu cəlb etməkdə problem yaşayırdı, buna baxmayaraq beşinci əsrə qədər Cənubi Avropada və Şimali Afrikada kitabın oxunduğuna dair dəlillər mövcuddur. Üstəlik J. Philippe özünün pioner araşdırmasında göstərir ki, Lukretius’un poeması orta əsrlər boyunca, heç bir kəsinti olmadan, Kilsə atalarından başlayaraq on ikinci əsrə qədər müzakirə olunurdu.[536] “Lakin Roma İmperiyasının çökməsi” – Butterfield deyir – “digər klassik müəlliflərdə olduğu kimi Lukretius’a da öldürücü zərbəyə yaxın bir zərbə vurdu.”[537] Bu tarixçinin də təsdiqlədiyi budur ki, əlyazmaların azalması sadəcə olaraq roma mədəniyyətinin tədricən çökməsi ilə bağlı idi; Kilsənin bu kitabı yandırdığına dair heç bir dəlil yoxdur, sadəcə olaraq klassik ədəbiyyata maraq azalmışdı və yenə də xristianlığın daxilində səkkizinci və doqquzuncu əsrlərdə klassik ədəbiyyata maraq oyandı, Butterfield bunu Charlemagne’ın (742-814) islahatları və başlatdığı kiçik intibah ilə əlaqələndirir. Ümumiyyətlə antik dövrün əsərlərinin qorunulmasını biz xristian monastırlarına borcluyuq. İtaliyali hüquq tarixçisi Antonio Padoa-Schioppa bunu belə ifadə edir: “Antik dövrün faktiki olaraq bütün yazılı əsərlərinin bizə gəlib çatmasını biz monastırlara borcluyuq: qədim Yunanıstanın və Romanın ədəbi, fəlsəfi, tarixi və elmi mətnləri az qala istisnasız erkən və yuxarı orta əsrlərin rahibləri və *keşişlə*ri tərəfindən köçürülüb və sonra əsrl*ər boyunca Ş*ərqin və Qərbin kilsələrinin və monastırlarının kitabxanalarında qorunulub saxlanılmışdır.”[538]

Hitchens “erkən xristian əsrlərdə din tərəfindən elmə və alimlərə qarşı tətbiq edilmiş terrordan” danışarkən Hippolu Augustine’in Yerin altı min ildən də cavan olmasına inandığını misal gətirir.[539] Daha doğrusu Augustine Yerin yox, sadəcə olaraq bəşəriyyətin yaşını altı min il olaraq təxmin edir. Yerin yaşına gəldikdə isə

---

[535] William Ellery Leonard & Stanley Barney Smith, “De Rerum Natura: The Latin Text of Lucretius”, səh: 81-82; The University of Wisconsin Press, Wisconsin, 1970
[536] Christophe Grellard & Aurelien Robert, “Atomism in Late Medieval Philosophy and Theology”, səh: 3; Brill, Leiden, 2009
[537] Stephen Harrison & Christopher Stray, ”Expurgating The Classics: Editing Out in Greek and Latin”, səh: 96; Bristol Classical Press, London, 2012
[538] Antonio Padoa-Schioppa, “A History of Law in Europe: From The Early Middle Ages to The Twentieth Century”, səh: 20; Cambridge University Press, Cambridge, 2017
[539] GIG, səh: 260

onun xeyli qədim olduğunu təsdiqləyir. Hətta bir yerdə deyir: "Etiraf edirəm ki, bəşər irqi yaradılmadan əvvəl nə qədər müddət keçdiyini bilmirəm."[540] Bəşəriyyətin yaşı ilə Yerin yaşı bir deyildir. Ümumiyyətlə Augustine'in və ya qeyrisinin bu barədə xətalı bir təsəvvürə sahib olması nəyi sübut edir ki?! Məgər o dövrdə *bundan başqa bir rəyi* qəbul etmək üçün səbəb var idimi?! Gələcəyin təbiət alimləri bəlkə də bizim bəzi təsəvvürlərimizi öyrənib təəccüb edəcəklər, lakin biz, öz dövrümüzün biliklərinə əsasən dünya görüşü formalaşdırırıq, keçmişin insanları da öz zamanlarında mövcud olan biliklərə əsaslanaraq fikir yürüdürdülər. Təbiət elmlərinin öyrənilməsi prosesi hər zaman belə olub. Hitchens də deyəsən, dünyada elmi proqresin Newton'un başına düşən alma tərəfindən başladıldığına inanan kəslərdən olub. Biz bunun belə olmadığını bu gün yaxşı anlayırıq. Burada anlaşılması əhəmiyyətli olan nöqtə budur ki, tarix ideologiyaların mübarizəsi və toqquşması arasında yazılıb. Protestantlar katolikliyi qaralamaq üçün çox yalanlar uydurublar, onların işini davam etdirənlər Voltaire kimi fransız maarifçilər oldular. Daha sonra Thomas Huxley, John William Draper, Andrew Dickson White kimi pozitivist fikir sahibləri estafeti aldılar. Bu səfər bu ənənənin qurbanları təkcə katoliklər yox, ümumilikdə xristian dini oldu. Tarixi bu gözlə dəyərləndirənlər on doqquzuncu əsrin ikinci yarısından başlayaraq çoxalıblar. Bu ənənəyə qarşı ilk müqavimət göstərənlərdən biri fransız fizik Pierre Duhem (1861-1916) oldu. Tamamilə əlaqəsi olmayan bir məsələni araşdırarkən Duhem toz içində basdırılmış əlyazmalar xəzinəsi ilə qarşılaşır. O, 1904-cü ildə "Les Origines de La Statique" kitabını yazarkən on altıncı əsrə aid bir kitabda daha əvvəl tanınmayan bir mütəfəkkirlə, Jordanus de Nemore'yə *edilmiş bir referens ilə* rastlaşır. Onun bu referensi izləməsi "elm tarixi" sahəsində yeni bir təsəvvürün formalaşmasına gətirib çıxardı.[541] *Kəşf edilən* əlyazmalar orta əsrlərin heç də təqdim edildiyi kimi bəsit bir təsəvvürə malik olmadığını, əksinə kifayət qədər *inkişaf etmiş düşüncələrin* müzakirə edildiyi bir dövr olması qənaətini doğurur. Çünki Da Vinci və Galileo kimi italyan alimlər öz kitablarında "Paris doktorları" adlandırdıqları orta əsr alimlərinə istinadlar edirdilər. Qeyd edək ki, Duhem bu ideyaları *nəşr edərkən* dövrünün akademikləri tərəfindən etirazla qarşılandı. Bu respublikaçı akademiklər orta əsrlərin qaranlıq dövr olması və elmlə heç bir əlaqəsinin olmaması fikrinin yıxılması ilə razı deyildilər.[542] Onun bu işini daha sonra amerikalı Lynn Thorndike (1882-1965) davam etdirdi. Günümüzdə bu işin çempionları Edward Grant və David Lindberg kimi tarixçilərdir. Kilsəni və xristianlığı elmin düşməni kimi qələmə

---

[540] Gavin Ortlund, "Retrieving Augustine's Doctrine of Creation: Ancient Wisdom for Current Controversy", səh: 121; Inter Varsity Press, Illinois, 2020

[541] Roger Ariew & Peter Barker, "Duhem and Continuity in The History of Science", *Revue Internationale de Philosophie*, cild:46, say: 182 (3), 1992-ci il, səh: 325;

[542] Stanley J. Laki, "Uneasy Genius: The Life and The Work of Pierre Duhem", səh: 412; Martinus Nijhoff Publishers, Dordrecht, 1987

vermək müasir tarixin doğurduğu qara əfsanələrdən biridir. Kilsənin elmə maneə olacaq epizodları olduğu kimi onun elmi proqressi sürətləndirəcək xidmətləri də olub. Profesor John Heilbron kitablarının birini bu sözləri ilə başlayır: "Roma katolik kilsəsi altı əsr ərzində - qədim təlimlərin bərpasından başlayaraq Son Orta Əsrlər boyunca İntibah dövrübə qədər - astronomiya elminin öyrənilməsinə istənilən digər institutdan, bəlkə də digər institutların hamısından daha çox maddi və sosial dəstək göstə*rmişdir."*[543] Heilbron bunu Avropadakı kilsələrin günəş rəsədxanaları kimi istifadə edilməsinin tarixini incələdiyi kitabında qeyd edir. David Lindberg və Ronald Numbers onunla razılaşaraq qeyd edirlər ki, "Hellbron'un hökmü … sağlam tarixi dəlillərə dayanır."[544] 1200-ci illərdə*n başlayaraq Bologna,* Paris və *Oxford kimi ş*əhərlərdə açılan universitetlər kilsələrin nəzdində fəaliyyət göstərirdilər və 1500-cü ilə qədər Avropanın müxtəlif yerlərində altmışa yaxın universitet xidmət göstərirdi və Michael Shank'a inanmalı olsaq, onların tədris proqramının otuz faizi təbiət elmlərini öyrənən materiallardan ibarət idi.[545] Kilsənin elmi proqresdə nə qədə*r geniş ş*əkildə *iştirak etdiyini görm*ək üçün təkcə *Yezuit ordeninin yetişdirdiyi aliml*ərlə maraqlanmaq kifayət etməlidir. Galileo kilsə tərəfindən araşdırıldıqda onun kosmos barəsində etdiyi iddiaların doğruluğunu yoxlamaq üçün Kardinal Bellarmino məhz yezuit astronomlarına müraciə*t etmişdi.* Maraqlıdır ki, yezuit astronomlar – bəzi kiçik məsələləri istisna etməklə - *Galileo'nun müşahid*ələrini təsdiqlədilər.[546] *Başqa sözl*ə desək teleskop ilə səmanı *müşahidə e*dənlər təkcə Galileo deyildi, kilsənin öz rəsmi astronomları da eyni alətlərdən istifadə edirdilər. Hitchens'in kitabında "teleskopdan baxmaq və nəticələr üzərində spekulyasiya etmək haqqı kilsə tərəfindən məhdudlaşdırılırdı"[547] deməsi qərəzli və xətalı təsəvvürdə*n başqa bir şey deyildir.* On yeddinci əsrdə üç böyük yezuit astronom, Giovanni Battista Riccioli (1598-1671), Melchior Cornaeus (1598-1665) və George de Rhodes (1597-1661) artıq Aristotelin kosmologiyasını şübhəyə alan astronomlar arasında yer alırdılar.[548]

Avropada universitetlər kilsə və kilsə adamları tərəfindən təsis olunduğu kimi Amerika Birləşmiş Ştatlarındakı universitetlər də eyni tarixi yaşayıblar. Harvard, Yales və Princeton universitetləri xristian qruplar tərəfindən açılmışdı. 1692-ci ildə

---

[543] J. L. Heilbron, "The Sun in The Church: Cathedrals as Solar Observatories", səh: 3; Harvard University Press, Cambridge, 1999
[544] D. C. Lindberg & R. L. Numbers, "When Science & Christianity Meet", səh: 2; The University of Chicago Press, Chicago, 2003
[545] Ronald L. Numbers, "Galileo Goes to Jail and Other Myths about Science and Religion", səh: 21; Harvard University Press, Cambridge, 2009
[546] Agustin Udias, "Jesuit Contribution to Science: A History", səh: 17-18; Springer, Cham, 2015
[547] GIG, səh: 70;
[548] Sabetai Unguru, "Physics, Cosmology and Astronomy, 1300-1700: Tension and Accomodation", səh: 115; Springer Science + Business Media, Dordrecht, 1991

Harvard universitetinin *şüari yenilə*ndikdə onun gerbi üzərində “Veritas Christo et Ecclesiae” (Haqq Məsih və Kilsədədir və ya Məsih və Kilsə xatirinə Haqq) sözlərini h*əkk etmişdil*ər. Bu gün biz bu sözləri hələ də Widener kitabxanasında, Memorial kilsəsində görə bilirik. Üstəlik bu təhsil ocağının əsası 1636-cı ildə qurulduqda gerbin üzərində üç kitab əks olunurdu; bunlardan yuxarıda duran iki kitab açıq, aşağıdakı kitab isə üzü aşağı idi. “Belə bir forma insan məntiqinin məhdud olduğunu və Allahın vəhyinə ehtiyac olduğunu simvollaşdırırdı.”[549] Daha sonralar üzü aşağı yatan kitabı çevirərək universitetin öz dini köklərindən qoparıldığını, tamamilə sekulyarlaşdırıldığını ifadə etdilər. Yeni simvol insan əqlinin həqiqətləri k*əşf etm*əkdə məhdud olmadığını göstərməli idi.[550] Alman idealistlər Humboldt, Schleiermacher və Fichte’nin təhsil modellərini ingilis-*şotland fikirl*əri ilə qarışdırıb Amerikaya gətirən və onların əsasında müasir amerikan universitetini quran Henry Tappan da dindar xristian idi; Michigan universitetini müasirlə*şdirmiş* Tappan inanırdı ki, Prussiya modelində olduğu kimi onun universiteti də protestant olmalı idi və tələbələrdən hər bazar kilsəyə getməyi tələb edirdi.[551] Bütün bunlar bizə göstərir ki, kilsələrin müasir dünyanın inkişafındakı rolu inkar olunmayacaq qədər böyükdür və kilsə tarixini sadəcə qaranlıqlar tarixi kimi göstərməyə çalışanlar, bununla da dinin tərəqqiyə mane olduğunu sübut etməyə çalışanlar dərindən yanılırlar.

---

[549] Michael J. Gehring, Andrew D. Kinsey, Vaughn W. Baker, “The Logic of Evangelism Revisited”, səh: 123-124; Pickwick Publications, Eugene, 2019

[550] E. H. Ecklund, “Science vs. Religion: What Scientists Really Think”, səh: 87-88; Oxford University Press, New York, 2010

[551] George M. Marsden, “The Soul of The American University: From Protestant Establishment to Established Nonbelief”, səh: 105-108; Oxford University Press, New York, 1994

## DİN, ELM VƏ FATALİZM

*"Din, xalq üçün tiryəkdir! Ağrıdan, təhqirdən, xəstəlikdən və köləlikdən əziyyət çəkənlər üçün din, ölümdən sonrakı həyatda mükafat vəd etdi. İndi isə biz bir dəyişiklik yaşayırıq. Xalq üçün həqiqi tiryək, ölümdən sonra heç bir şeyin olmaması inancıdır: xəyanətlərimizə, acgözlüyümüzə, qorxaqlığımıza, qətllərimizə görə mühakimə olunmayacağımızı düşünməklə böyük bir təskinlik tapmaqdır."*

Czeslaw Milosz

Məşhur əfsanəyə görə George Washington altı yaşında ikən təzəcə əldə etdiyi baltacıq ilə bağdakı gilas ağacını baltalayır. Atası ondan ağacı onun baltalayıb baltalamadığını soruşduqda George belə bir cavab verir: "Mən yalan danışmağı bacarmıram, ata, sən bilirsən ki, mən yalan deməyi bacarmıram. Onu öz baltacığım ilə mən kəsdim." Oğlunun dürüstlüyünə sevinən atası göz yaşlarını saxlaya bilmir və oğlunun dürüstlüyünün min gilas ağacından daha dəyərli olduğunu deyir.[552] Yazıçı Mark Twain'ə bununla bağlı belə bir söz nisbət olunur: "Mən George Washington'dan mənəvi olaraq daha üstünəm. O, yalan danışa bilmirdi. Mən isə yalan danışmağı bacarıram, lakin yalan danışmıram."[553] Yazıçının burada demək istədiyi çox sadədir və çoxumuz tərəfindən asanlıqla anlaşılır. Mənəviyyat seçim ilə gəlir, seçim olmadığı yerdə mənəviyyat ola bilməz. Ona görə də biz, robotları mənəvi varlıqlar olaraq görmürük və ya maşınlarımıza mənəvi xarakterlər yükləmirik. Bəlkə aramızda bunu edənlər var?

Böyük Britaniyanın televiziyasında canlandırılmış komik xarakter Basil Fawlty bir epizodda xarab olmuş maşınını təhdid edir, çalışmadığı üçün hədələyir və üçə qədər sayır. Sonunda maşın çalışmadığı üçün çıxaraq onu, tapıb ələ keçirə bildiyi bir ağac budağı ilə döyməyə başlayır. Bu səhnəni izləyənlər Basil'in həmin qırmızı maşını kötəkləməsinə ürəkdən gülürlər, çünki bu əməli səfeh və hikmətsiz hesab edirlər. Richard Dawkins 2006-cı ildə Edge dərgisinə verdiyi bir məqalədə insanların ümumiyyətlə etdiklərinin Basil'in etdiyi ilə eyni olduğunu deyir. "Biz nə

---

[552] "The Panoplist and Missionary Magazine United", ikinci cild, səh: 527 ; Farrand, Mallory and Co., Boston, 1810

[553] Peter Van Inwagen, "Thinking About Free Will", səh: 58; Cambridge University Press, Cambridge, 2017

*üçün eyni* şəkildə qüsurlu bir adama – bir qatilə və ya təcavüzkara – qarşı eyni reaksiya vermirik? Nə üçün Basil Fawlty'yə ürəkdən güldüyümüz kimi bir canini cəzalandıran hakimə də gülmürük?... Məgər qatil və ya təcavüzkar qüsurlu komponentə və ya qüsurlu tərbiyəyə və ya qüsurlu təhsilə və ya qüsurlu genlərə sahib olan sadə bir maşın deyilmi?"[554] *Bu mexanistik yanaşma ilə* insanı insan edəcək h*ər bir şeyd*ən məhrum etmək mümkündür; əslində Dawkins bunu gizlətmədən, ən açıq mənalı sözlərlə ifadə edir. Eyni məqalədə deyir: "Məgər insanın sinir sistemi haqqındakı həqiqi mənada elmi və mexanistik təsəvvür, məsuliyy*ət düşüncə*sini mənasız etmirmi?!" Einstein də bir materialist olaraq azad iradəyə inanmırdı və bunu belə ifadə edirdi: "Mən sanki azad iradə *mövcud imiş* kimi davranmağa məcburam, çünki əgər mədəni bir cəmiyyətdə *yaşa*maq istəyirəmsə məsuliyyətli davranmalıyam."[555] *Materialistik, ateistik dünya görüşünə* sahib olan insanların dilemması budur; bir tərəfdən həyatda heç bir seçimlərinin olmadığına, ətrafındakı insanların öz etdiklərinə görə məsuliyyət daşımadıqlarına inandıqları halda həyatlarını öz inanclarının tam əksinə yaşayırlar. *Professional iş* həyatlarında insanları Basil'in qırmızı maşınıyla eyni*ləşdirə*n materialistic fəlsəfə üzərind*ən düşünürlə*r, amma bir başqasının onlara qarşı etdiyi haqsızlıqlara gəldikdə isə həqiqi mənada qəzəblənirlər, haqqı, qarşı tərəfin cəzalandırılmasını tələb edirlər. C. S. Lewis çox d*əqiq bir* şəkildə qeyd edir ki, "naturalistlər … xeyrin və şərrin sadəcə illüziya olduğunu etiraf etdikdən saniyələr sonra, gələcək nəsillərin xeyri üçün çalışmağa, bəşər irqinin xeyri üçün təlim-tərbiyə keçməyə, inqilab etməyə, yaşamağa və ölməyə çağırır."[556]

Müasir materialist, reduksionist elmin gəldiyi nəticə budur; h*ər bir şey fiziki* zərrəciklərin təbiət qanunlarına uyğun olaraq interaksiyasından əmələ gəlir, bütün varlıqlar və onların seçimləri fiziki, kimyəvi, genetik amillərin nəticəsidir. Stephen Hawking bizim əsrin ən mə*şhur astrofiziki olaraq bu barə*də deyir: "Biz istədiyimizi seçə bildiyimizi hiss etdiyimizə baxmayaraq biologiyanın molekulyar əsasları haqqında bildiklərimiz göstərir ki, bioloji proseslər fizika və kimya qanunları ilə idarə olunur, ona görə də planetlərin orbitləri kimi qabaqcadan müəyyən ediliblər… Bizim davranışlarımız fiziki qanunlarla müəyyənlə*şirsə* azad iradənin necə çalışa biləcəyini təsəvvür etmək çətindir, ona görə də belə görünür ki, biz bioloji maşınlardan başqa bir şey deyilik və azad iradə sadəcə bir illüziyadır."[557] Hawking öz ixtisasına uyğun olaraq insanları da orbitlərdə süzən səma cisimlərinə bənzədir, onların o orbitlərdən ayrılmaq seçimi yoxdur, eləcədə biz insanlar da

---

[554] https://www.edge.org/response-detail/11416
[555] Walter Isaacson, "Einstein: His Life and Universi", səh: 392; Simon & Schuster Paperbacks, New York, 2007
[556] C. S. Lewis, "Miracles: A Preliminary Study", səh: 46; Geoffrey Bles – The Centenary Press, London, 1947
[557] S. Hawking, "The Grand Design", səh: 31-32; Bantam Press, London, 2010

etdiklərimizi edərkən etməmək imkanımız yoxdur və mən bu sözləri yazarkən yazmamaq şansım yox idi. Molekulyar bioloq və 1962-ci ilin nobel mükafatı laureatı Francis Crick də bunu təsdiqləyir: "Sən, sənin sevincin və kədərin, sənin yaddaşın və ambisiyaların, sənin öz kimlik hissin və azad iradən faktiki olaraq böyük sayda sinir hüceyrələrinin və onların bağlı olduğu molekulların davranışından artıq bir şey deyildir."[558] Beləliklə də bu materialistik ateizm hətta sənin arzularını, istəklərini, şövqünü, əzmini belə sadəcə molekullar və cansız maddələr ilə izah edir. Bu fikir materialist ateistlər arasında çox yayğındır. Daha bir nobel laureatı Steven Weinberg bu məsələyə ötəri olaraq toxunur və mövzunun fəlsəfi tərəflərini müzakirə etmir, bu barədə aydınladıcı bir izaha sahib olmadığını etiraf edir. Lakin qeyd edir ki, bizim verdiyimiz bütün qərarlar, bütün istəklər "keçmiş şərtlərin və təbiət qanunlarının qaçınızlmaz nəticələridir."[559] Ondan fərqli olaraq Sam Harris hətta bu barədə ayrıca bir kitab yazıb. Həmin kitabının əvvəllərində deyir: "Azad iradə bir illüziyadır. Bizim istəklərimiz sadəcə olaraq özümüzün törətdikləri deyildir. Fikirlər və niyyətlər bizim xəbərsiz olduğumuz və kontrol edə bilmədiyimiz arxaplan səbəblərdən qaynaqlanır. Sahib olduğumuzu düşündüyümüz azadlığa əslində sahib deyilik."[560]

Azad iradə müzakirəsinin tarixi qədimdir. Lakin azad iradəni inkar etmək, materialist filosoflar arasında yayılmadan əvvəl ciddi bir tərəfkeş tapmamışdı. Bu təsəvvürü təmsil edən ən məşhur şəxsiyyətlər haqqında düşündüyümüzdə ağlımıza bir neçə filosofun adı gəlir. Bunların arasında hedonist, materialist fəlsəfənin erkən nümayəndələrindən olan fransız Julien Offray de La Mettrie (1709-1751) və onun "L'Homme Machine" (Maşın İnsan) kitabı ağla gəlir. La Mettrie insanı heyvanla eyniləşdirirdi və hər ikisinin sadəcə mexaniki varlıqlar olduğunu yazırdı. Bu məqamda həmçinin Arthur Schopenhauer ağla gəlir. 1839-cu ildə Norveç Royal Elmlər Akademiyası azad iradə mövzusunda yarışma elan etdikdə Schopenhauer orada iştirak edir və mövzu haqqında yazdığı işlə birinci yeri qazanır. Növbəti il Danimarka Royal Elmlər Akademiyasının elan etdiyi yarışmada iştirak edən yeganə yazıçı olur, lakin Akademiya yarışmaya göndərilmiş tək fəlsəfi çalışmanı rədd edir. Schopenhauer bu məğlubiyyəti çətin həzm edir və digər filosofları günahlandırmağa başlayır. İşin ironiyalı tərəfi budur ki, Schopenhauer insanın azad iradəsini inkar edən filosoflardandır, bununla belə yarışmada məğlub olmasını kimlərinsə boynuna qoymağa çalışırdı. O, Norveçdəki yarışmanı qazanmaq üçün göndərdiyi çalışmasında bu sözləri yazırdı: "Sən istədiyini edə bilərsən, amma

---

558 F. Crick, "The Astonishing Hypothesis: The Scientific Search for the Soul", səh: 3; Touchstone, New York, 1995

559 S. Weinberg, "Lake Views: This World and The Universe", səh: 102; The Belknap Press of Harvard University Press, Cambridge, Massachusetts, 2009

560 S. Harris, "Free Will", səh: 5; Free Press, New York, 2012

həyatının istənilən anında yalnız müəyyən *bir şeyi istəyə* bilərsən və mütləq şəkildə *ondan başqa heç bir şeyi istəyə* bilməzsən."[561] *Başqa sözlə* desək "sən hər istədiyini edə bilərsən, amma hər istədiyini istəyə bilməzsən." *Onun dünya görüşü,* pessimist fəlsəfəsi Nietzsche kimi filosoflara da öz təsirini göstərəcəkdi və azad iradəni inkar etmək estafetini ondan sonra Nietzsche alır. İnsanın azad iradəsini inkar etmək ona görə də bir yenilik deyildir, ateist-materialist fəlsəfənin məntiqi nəticəsidir və ateistlərin bir çoxu bu təsəvvürün gərəkdirdiyi nəticələri qəbul etməyə hazırdır. Dawkins'in bununla bağlı fikirləri ilə artıq tanış olmuşuq.

Oxucu bəlkə də bu yerdə bütün bunları nə üçün yazdığımızı soruşur. Daha çox üzmək fikrimiz yoxdur və *mövzunu bir başa Hitchens ilə* əlaqələndirməyə ehtiyac var. Bəli, Hitchens kitabında İslam dinini məhz fatalist bir din olmaqla ittiham edir və buna görə qınayır. "Hə*r şeyin Allah t*ərəfindən qabaqcadan müəyyən edildiyinə inanan İslam fatalizmi, insan muxtariyyətini və azadlığını inkar etməkdə (totalitarizm ilə*) ortaq oxşar nöqt*ələrə sahibdir…"[562] Burada Hitchens'in iddiasına iki tərəfdən yanaşmağa ehtiyac vardır. Bunlardan biri mövzumuzun özəyi olan fatalizm məsələsidir. Daha *əvvəl bölüşdüyümüz t*əqdimatda materialist ateistlərin çoxunun azad iradəni inkar etdiyini göstərdik və mahiyyət etibarı ilə bu, fatalizm ilə eynidir, hətta demək olar ki, fatalizmin özüdür. Çünki mütləq determinizmə inanan kəslərə görə hər bir fərdin aqibəti, həyatı, seçimləri və istəkləri Big Bang hadisəsinin ilk saniyəsindən müəyyə*n edilmişdir və* bu səbəblər silsiləsində bizim *başqa seçim etm*ək imkanımız yoxdur. Ateist klubunun ən böyük və ən mə*şhur* üzvləri sözün əsl mənasında fatalist olduqları halda Hitchens'in bu nöqtədə dinləri tənqid etməsi *ən yumşaq dildə* desək ikiüzlülükdür. Hitchens özü bu məsələdə aydın bir fikir bildirmir və nədənsə suala aydın bir şəkildə cavab verməkdən çəkinir; verdiyi cavab iki başlıdır: "Azad iradəyə *sahib olmaqdan başqa seçimim yoxdur"* – Hitchens deyir. Dawkins də etiraf edir ki, son zamanlar "azad iradə" haqqında *ona verilmiş suallardan Hitchens'in sözlə*ri ilə cavab verməklə qurtulur.[563] Hitchens çox gözəl bilir ki, suala verəcəyi istənilən cavab onun müdafiə *etdiyi dünya görüşü* ilə ziddiyyət tə*şkil edir; ola bilsin ki, h*əqiqətən də həyatının son saniyələrinə qədər bu məsələdə qərarını verə bilməyib, amma dinləri və teistləri tənqid edərkən "sanki azad iradəyə inanaraq" tənqid edir. Yazdığı kitabda da azad iradənin olduğunu təsdiqləyən cümlələ*r işl*ədir. "Biz əgər hər dəfəsində ən təməl instinktlərimizə təslim olsaydıq mədəniyyət heç cür mümkün olmazdı və bu arqumenti davam etdirməyim üçün yazı yazmaq imkanı olmayacaqdı."[564] O zaman görəsən dinlərin

[561] A. Schopenhauer, "On The Freedom of The Will", səh: 24; Basil Blackwell, New York, 1985
[562] "GİG", səh: 234
[563] R. Dawkins, "Science in The Soul: Selected Writings of a Passionate Rationalist", səh: 39; Random House, New York, 2017
[564] "GİG", səh: 214;

insanlara nəfsi tərbiyə etməklə bağlı aşıladığı fikirləri niyə hər imkanda tənqid edir?! Nə üçün dinlərin bizim seksual instinktlərimizə qoyduğu məhdudiyyətlərə bu dərəcədə neqativ yanaşır?! ”Bizdə öncə bir instinkti yerləşdirən, sonra onu qadağan edən bir Yaradıcının olması fikrindən - əlbəttə ki - *daha axmaq bir şey* ola bilməz” – Hitchens deyir. Daha bir dramatikləşdirmə misalı ilə qarşı-qarşıyayıq. Hitchens özü çox gözəl bilir ki, dinlər həmin instinktləri qadağan etmirlər, nə xristian dini, nə İslam, nə yəhudilik insanlara yerləşdirilmiş ən təməl, fitri instinktləri qadağan etmir, lakin onları kontrol etməyə çağırır. Hitchens özü etiraf edir ki, belə bir kontrol olmasa bəşər mədəniyyəti mümkün olmazdı; ola bilsin ki, Hitchens burada təməl instinktlər dedikdə ”masturbasiya”, ”homoseksuallıq” kimi qeyri-normativ cinsəl istəkləri qəsd edir. İstənilən halda o, teistlərin bu suala verdikləri cavabı çox gözəl bilir: ”Kazuistlər ”azad iradə” cavabını verirlər” – deyir. Beləliklə də burada iki məsələ ortaya çıxır. Hitchens çox gözəl bilir ki, səmavi dinlərin hər üçü də ”azad iradəyə” inanır, əks təqdirdə bu cavabı verməkləri mənasız olardı. O zaman İslam dininin, insanı muxtariyyətindən və azadlığından məhrum etməsi fikrini hardan çıxarır?! İkinci məsələ isə Hitchens'in bunu kazuistika adlandırmasıdır. Sözün düzü bunun necə kazuistika olacağını görə bilmirəm; kazuistlər xüsusi bir hala aid vəziyyətdən çıxarılmış mənəvi nəticələri ümumiləşdirənlərə *verilmiş ad*dır. ”Azad İradə” isə ilk əvvəldən ümumi bir prinsipdir və səmavi dinlərin ayrılmaz bir parçasıdır. Azad iradənin şər probleminin izahı kimi göstərilməsi *heç bir* şəkildə kazuistika ola bilməz. İnstinktlər ilə bağlı verilən cavab da öz yerindədir. Çünki din fəlsəfəsinə görə bizim yaşadığımız bu həyat sınaq həyatıdır ki, orada insan, ona verilmiş azad iradəsi sayəsində təməl instinktlər ilə əqli arasında seçim etməlidir. ”Hansınızın əməl baxımından daha gözəl olduğunu sınamaq üçün ölümü və həyatı yaradan Odur.” *[67:2] Hitchens'in* şəhvani instinktləri belə bir fəlsəfəni bəyənməyə bilər, lakin insan intellektində bunun axmaq bir şey olduğunu göstərəcək *heç bir şey yoxdur.* Axmaq olan yeganə tərəf Hitchens'in əlindəki malı satması və onun hələ də özündə qalmasını eyni zamanda istəməsidir. Çünki soruşmaq lazımdır ki, Hitchens Yaradıcıdan insanı necə bir varlıq olaraq yaratmasını istərdi? Əgər instinktlərdən *tam bir* şəkildə xali olan bir varlıq olaraq görmək istəyirsə insan ilə robot arasında nə fərq olacaqdı? Məgər biz belə bir varlığa insan deyə biləcəkdikmi? Cəsarət, kədər, əfv etmə, fədakarlıq kimi xüsusiyyətlər yalnız insanın indiki halında mümkündür. Dinə qarşı polemikaya girən ateistlərin halı budur; etiraz etdiklərində öz kriteriyalarının nə olduğunu soruşmalı olursan və sualın cavabsız qalır. Allahın mövcudluğuna dair dəlilin olmadığını deyirlər və Allahın mövcudluğuna dair necə bir dəlil axtardıqlarını soruşursan cavab verə bilmirlər, çünki məsələ Allahın varlığına dəlillərin olub olmaması deyildir, məsələ Allahın olmasını istəməməkdir, Allahsız dünyada yaşamaq istəyidir. Allahın insanı bu şəkildə yaratmasına etiraz

edirlər, "necə yaratmalı idi?" soruşduğunda bir cavab ala bilmirsən. Hətta Star Trek filmində canlandırılmış Vulkan planetinin humanoid əhalisi emosiyaları kontrol edən, məntiqli varlıqlar olmalı idilər, amma ssenari müəllifləri heç bir şəkildə onları duyğulardan, instinktlərdən *tam* şəkildə məhrum etməyi bacarmamışdılar.

Qərbin oriyentalist alimləri üçün İslamın qədər inancını anlamaq asan olmayıb. İslamdakı "qədər" məfhumunun oriyentalist qərəzinin qurbanı olduğunu nəzərə alsaq bunun nə üçün bu dərəcədə mənfi mənada anlaşıldığını başa düşmək olur. Bu məqamda isveçrəli jurnalist Roger Du Pasquier'nin sözləri *yada düşür: "Qərb* – istər xristian qismi olsun, istərsə də xristianlığı *tərk etmiş qismi olsun* – heç bir zaman həqiqi mənada İslam dinini tanımayıb. Tarix səhnəsinə çıxdığını gördükləri ilk vaxtlardan bəri ona qarşı müharibə etmək üçün üzr tapmaq məqsədi ilə xristianlar həmişə onu təhqir ediblər və iftira atıblar. Bu din çox absurd təhriflərə məruz qalıb və bunların izləri hələ də Avropa şüurunda yaşamağa davam edir. Hətta bu gün belə o qədər qərbli vardır ki, onlar üçün İslam dinini kiçildib üç ideyaya məhsur etmək mümkündür: fanatizm, fatalizm və çoxevlilik..."[565] Hitchens'in kitabında İslama ünvanlandığı bütün tənqidlər də bu üç mövzuda öz əksini tapır və fatalizmi də xüsusilə qeyd etməsi qəribə deyildir. Bəs İslam fatalizm dinidirmi? Qısa cavab budur ki, İslam dinində insanı öz muxtariyyətindən və azad iradəsindən məhrum edən fatalizm anlayışı yoxdur. İslamda qədər anlayışı vardır, lakin müsəlmanların inandıqları qədər onları azad iradədən məhrum edən qədər deyildir. Müsəlmanların arasında illər boyunca qalmış professor George Braswell vurğulayır ki, İslam dinində fatalizm yoxdur. Frederick M. Denny bunu belə ifadə edir: "Fatalizm yox, məhz azad iradə, insanın halı haqqında İslam təliminin mərkəzində durur..."[566] Lenn E. Goodman bunu təfsilatlı şəkildə belə izah edir: "*Əgər* fatalizm il*ə, işl*ərin aqibətində fərdi əməllərin və seçimlərin heç bir fərq etmədiyi qəsd olunursa, (İslamda bu mənada) bir norma olaraq fatalizm yoxdur. Qədərə ən çox inanan müsəlman teoloqlar belə Qurandakı fərdi məsuliyyət fikrinə möhkəm sarılırlar; onlar bizim fellərin Allahın tərəfindən yaradıldığını dediklərində bununla Allahın bizim vasitəmizlə təsir etdiyini qəsd edirlər..."[567] Qərblilər müsə*lmanlar üçün "fatalist" sözünü işlə*tməyi xüsusilə sevirlər, lakin müsəlmanların həyata və ilahi iradəyə yanaşımı hansısa latın mənşəli sözlə dərk edilə bilməz. Müsəlmanların qədər inancını anlamaq üçün onlarla yaşamaq, onların gündəlik həyatına bulaşmaq lazımdır. Leopold Weiss öz avtobioqrafiyasında müsəlmanlarla oturub durarkən gördüyü və diqqətini çəkən bu qədərə təslimiyyəti göz*əl bir* şəkildə

[565] R. D. Pasquier, "Unveiling Islam", səh: 5-6; İslamic Texts Society, Cambridge, 2002
[566] F. M. Denny, "Islam and the Muslims Community", səh: 43; Harper & Row, New York, 1987
[567] Brian Carr & Indira Mahalingam, "Companion Encyclopedia of Asian Philosophy", səh: 910; Routledge, London, 1997

nəql edir. Sinay yarımadasının quraqlıqlarında bir kəndə gəlib çıxan gənc Leopold, kəndin əmirinin evində ağırlanır. O, əmirin evində gördüyü mənzərəni xatırlayır: "Qonaqların qəbulu üçün hazırlanmış qəhvə az idi və kasıb idi və daş sobanın qarşısında bir tək həsir var idi. Lakin bir adət olaraq ərəb qonaqpərvərliyi kasıblığa qalib gəlir: çünki həsir üzərində oturar oturmaz sobadakı xeyirxah ocaqda çöplər çırtıldamağa başladı. İçində qəhvə toxumlarının əzildiyi bürünc həvəngin cingiltisi otağa canlılıq qatdı və böyük bir qabda ağzına qədər doldurulmuş açıq-qəhvəyi xurmalar səyahətçilərin aclığını qarşıladı." Evin sahibi qonaqlarını yeməyə dəvət edərəkən bunu "Allah sizə uzun ömür versin! Bu ev sizin evinizdir, Allahın adını çəkib yeyin! Olan varımız budur!" sözləri ilə ifadə etdi. Bu sözləri deyərkən əli ilə elə bir jest göstərir ki, o sadə hərəkətdə taleyinin bütün ağırlığını hiss edə bilirsən. "… amma xurmalar pis deyil. Yeyin, ey yolçular, sizə təklif edə biləcəyimizdən yeyin!" Leopold etiraf edir ki, xurmalar həqiqətən də yediyi ən dadlı xurmalardan idi. "Küləklər, küləklər! Bax onlar bizim həyatımızı çətinləş*dirir"* – evin sahibi buyurur: "Amma bu, Allahın iradəsidir. Külək bizim tarlaları məhv edir. Biz hə*mişə* tarlaların qumla örtülmə*sinin qar*şısını almaq üçün əlləş*mə*liyik. Hə*mişə* belə olmayıb. *Əvv*əllər burada bu qədər külək yox idi və kənd böyük idi, zəngin idi. İndi balacalaşıb; gənclərimizin çoxu çıxıb gedirlər, çünki hər kəs belə bir həyata qatlana bilmir. Səhra gündən günə bizə yaxınlaşır. Yaxında xurma ağacları üçün yer qalmayacaq. Bu külə*k… Amma şikay*ət etmirik… Çünki bilirsən ki, peyğəmbər – aleyhissələm – bizə deyib: "Allah buyurub: Taleyi söyməyin, çünki tale Mənəm!" Bu qısa epizodu bizə nəql edən Leopold bu səhnənin zahirini belə vəsf edir: "…tale Mənəm!" deyərkən sözlə*rini müşaiy*ət *edən baş işar*əsində bir qürur yatırdı, həyatda öz yerini sakitcə qəbul etdiyi anlaşılırdı. Mən heç bir zaman, hətta ən *xoşb*əxt insanlarda, bu qədər sükunət və əminlik ilə (həyatın) reallığı ilə barışmış birini görmə*mişdim."*[568] *Charles Le Gai Eaton bu müşahid*əni belə şərh edir: "Təslimiyyət – Haqqa təslim olmaq olduğu müddətdə və Haqqın gözəl və mərhəmətli olduğu bilindiyi müddətdə - fatalizm və stoisizm ilə - bunların Qərb ənənəsində anlaşıldığı mənada – heç bir ortaq tərəfi yoxdur."[569]

İslamdakı əqidə məktəblərinə nəzər salsaq cəbriyyə firqəsində*n başqa heç bir* firqə insanın azad seçimini inkar etməyib; *əşaril*ər də, maturidilər də, filosoflar da, əsərilər və mötəzililər də insanın muxtariyyətini təsdiqləyirlər. Maria De Cillis bir araşdırmasında İbn Sina, əl-Ğazəli və İbn Arabi kimi fərqli məktəbləri təmsil edən mütəfəkkirin qədər və azad iradəyə baxışlarını incələyir. Araşdırmasının xülasəsində bunları yazır: "Həm ilahi qəzanın, həm də insan ixtiyarının bir arada mövcudiyyəti ilahi səxavətin nümunəvi sübutudur və dində məcburiyyətin ola

[568] Muhammad Asad, "The Road to Mecca", səh: 92-93; Simon and Schuster, New York, 1954
[569] C. L. G. Eaton, "Islam and The Destiny of Man", səh: 61; State University of New York Press, New York, 1985

bilməyəcəyinin dəlilidir. Hər iki prinsip bir-birilərini qarşılıqlı inkar etməkdən tamamilə uzaq olmaqla yanaşı faktiki olaraq bir-birilərini tamamlayır; onlar İslam etiqadının ayrılmaz bir tərkib hissəsidir…"[570] Ibn Sina filosofları, əl-Ğazəli mütəkəllimləri təmsil etdiyi halda İbn Arabi isə sufiliyin nümayəndəsidir. Eyni araşdırmanı tradisionalizmi təmsil edən İbn Teymiyyə'nin kitablarında, rasionalizmi təmsil edən əl-Qadi Abdulcabbar'ın kitablarında da aparsaydı eyni nəticəyə gələcəkdi.

Einstein'in dostlarından bəziləri onun determinist fəlsəfəsini heç cür qəbul edə bilmirdi. Max Born bir məktubunda ona yazırdı: "Etik fərdin hürriyyəti ilə tamamilə mexanistik kainatı necə bir araya gətirə bildiyini heç cür anlaya bilmirəm." Çünki Born anlayırdı ki, bir fərdin mənəvi və etik qəbul edilməsi üçün onun azad olması şərtdir. "Mənim üçün determinist dünya xeyli ikrah doğurucudur. Bəlkə də sən haqlısan və dünya sənin dediyin kimidir. Amma halhazırda fizikada və daha da çox dünyanın qalan hissəsində *(işlər)* sənin dediyin kimi olmadığı görünür." Max Born nifrət etdiyi bu determinizmdən qurtulmaq üçün kvantum fizikasına ümid bağlayırdı; ona görə kvantum fizikası determinizmi yox, ehtimallara açıq olan modeli dəstəkləyirdi. Born'un arvadı Hedwig isə hər ikisini də rədd edirdi və insanın nə determinizmlə, nə də ehtimallarla məhdud olduğunu qəbul etmirdi. Öz aralarında məktublaşan bu üç dostun arasında parlayan ulduz Einstein idi; məhz onun sözləri sonrakı nəsillərin ağlına yol tapa bildi. O isə həqiqətdə insanın azad olmadığını, etik və mənəvi fərd olmadığını deyirdi. Einstein qeyd edirdi: "Mən bilirəm ki, fəlsəfi olaraq, bir qatil öz cinayətinə görə məsuliyyət daşımır, amma onunla oturub çay içməməyi tərcih edirəm."[571]

*"Şübhə*siz ki, əgər bir gün bizim bütün istək və kaprizlərimiz üçün bir düstur k*əşf edilə*rsə - o zaman insan dərhal arzulamağı durduracaq… Axı kim qaydaya əsasən arzulamaq istər ki? Üstəlik, o, insan olmaqdan çıxıb orqan alətinin düymələrinə və ya bunun bənzərinə çevriləcək; çünki arzusuz, azad iradəsiz və seçimsiz bir insan, orqandakı düymədə*n başqa n*ədir ki?!"[572]

---

570 M. de Cillis, "Free Will and Predestination in Islamic Thought: Theoretical Compromises in The Works of Avicenna, al-Ghazali and Ibn Arabi" səh: 227; Routledge, New York, 2014

571 Walter Isaacson, "Einstein: His Life and Universi", səh: 392-393; Simon & Schuster Paperbacks, New York, 2007

572 F. Dostoyevski, "Notes From The Underground", səh: 18; Cosimo Classics, New York, 2009

## TOTALİTARİZM DİNİ

*"Yer üzünün bütün hakimlərini və zadəganlarını rahiblərin bağırsaqları ilə asmaq və boğmaq onun arzusu idi."*

Jean Meslier

Soljeniçin 1930-cu ildə Solovki'yə gətirilmiş dini bir sekta haqqında yazır. Bura g*ətirilmiş onlarla dindarlar sovet rejimini antixrist hesab edirdilə*r. Onlar "antixristdən gələn hə*r şeyi r*ədd edirdilər: pasport da daxil olmaqla hansısa dokumenti qəbul etməkdən imtina edirdilər və onlar nəyəsə imza atmaqdan və ya pulla alış-*veriş etm*əkdən imtina edirdilər." Bu qrupun başında ağsaqqallı, kor və əli çomaqlı səksən yaşlı bir qoca kişinin durduğunu deyən Soljeniçin vurğulayır: "Savadı olan hər bir kəs açıq-*aşkar görə* bilərdi ki, bu təriqətçilər heç cür sosializmə daxil edilə bilməzdilər, çünki bu, sənə*d işl*əri ilə xeyli məşğul olmağı tələb edirdi – və ona görə də onlar üçün ən yaxşısı ölmək idi." Bu səbəblə onlar Malıy Zayatski adasına göndərildi və bu ada Solovetski arxipelaqındakı ən kiçik ada idi; hər yer qumsallıq idi, ağacsız səhralıq idi. Onları ora həbs edənlər hər dəfə iki ayın rasionunu verməyə razı idilər, lakin bunu vermək üçün onların qarşısına qoyduqları yeganə şərt qəbzə imza atmaq idi. *Əlb*əttə ki, onlar bundan imtina etdilər. Bu məqamda "usanmaz Anna Skripnikova müdaxilə etdi". Onun özünü hələ dörd dəfə h*əbs etmişdilə*r, lakin o, yorulmadan zülmə qarşı mübarizə aparırdı. O, həmin təriqətçilər üçün müxtəlif ofislərə *gedib baş vurur,* hətta həbsxana lagerinin başçısı ilə görüşür. İlk əvvəl onlardan o təriqətçilərə qarşı mərhəmət uman Anna ümidini itirdikdən sonra onlarla birlikdə Zayatski adasına göndərilməyi *xahiş edir; "h*ər gün onlara yemək ayırmağı və bütün hesabat rəsmiyyətini icra etməyə, onlar üçün qəbzləri imzalamağa razı olduğunu dilə gətirir. Belə görünürdü ki, bu, həbsxana sistemi ilə *heç cür toqquşmurdu.* Buna baxmayaraq rəislər yenə də yox dedilər. "Axı onlar ruhi xəstə insanları qəbzə imza tələb etmədən yedirirlər" – etiraz edib Anna ağlayırdı. Zarin isə qəhqəhə çəkib güldü. İş təyinatı verən qadın isə belə bir cavab verdi: "Bəlkə bu, Moskvanın göstə*rişidir.. biz h*əqiqətən də bilmirik..." Soljeniçin əmindir ki, bu, Moskvadan *gəlmiş göstəriş idi, çünki başqa* heç kim belə bir məsuliyyəti üzərinə götürməzdi. "Beləliklə də onlar heç bir qida olmadan (adaya) göndərildilər. İki ay sonra (məhz iki ay sonra, çünki növbəti iki ayın qidası üçün qəbzə imza atmaq tələb olunacaqdı)

onlar Malıy Zayatski adasına üzdülər və *orada quşlar tə*rəfindən dimdiklə*nmiş* cəsədlər tapdılar. Hamısı orda idi və heç kim qaçıb qurtulmamışdı."[573]

Din və dindarları xüsusi amansızlıqla t*əqib etmiş Sovet dövlə*ti haqqında məlumatlı insan Hitchens'in kitabını oxuduqda qeyri-adi təəccübünü boğa bilmir. Kitabda bu mənzərə tamamilə qayıbdır, ateizmin ideologiya adına etdiyi cinayətlər ört-basdır edilir. Hitchens' öz kitabında tarix boyu dini dövlətlərin totalitarizmi haqqında danışmağı sevir. Tarix qara səhifələr ilə zəngindir, lakin burada əsas sual belə olmalıdır: bunlar dində xarakterik olan totalitarizmdən qaynaqlanır yoxsa dövrünün şərtlərindən? Neo-ateistlər bu suala cavabda dini ittiham edirlər. Bunun qarşılığında ateist dövlətlərin və təşkilatların törətdikləri cinayətlər göstərildikdə neo-ateistlərin cavabları fərqlənir. Misal üçün Dawkins onların ateist olduqlarını etiraf edir, amma qeyd edir ki, "ateist fərdlər cinayət törədə bilərlər, lakin onlar törətdikləri cinayətləri ateizmin adına etmirlər."[574] Bu, dairəvi məntiq ortaya çıxarır; əgər ateizm təqibə, zülmə t*əşviq edə* bilməzsə, o zaman zülm və təqib halları ilə qarşılaşdığımızda bu, onu icra edənin ateizminin zəifliyindən irəli gəlməlidir. Belə çıxır ki, ateizm tarixi, məsumluq tarixidir.[575] Dawkins heç olmasa Stalin'in, Mao'nun ateist olduğunu təsdiqləyir, onlara dini yarlıqlar tikməyə çalışmır, Hitler'in təzadlı bir şəxsiyyət olduğunu da qeyd edir. Hitchens isə bir başqadır; o, hər şeyi dinin adına çıxarmağa çalışır. Bir yerdə George Orwell'dən citat gətirir ki, "totalitar bir dövlət nəticə etibarı ilə bir teokratiyadır…"[576] Onun düzüb qoşduğu təsvir budur ki, dünyada harada totalitar rejim varsa – ateist və ya buddist və ya deist olmağından asılı olmayaraq – nəticə etibarı ilə dini bir xarakter daşıyır. Bu mənanı bir daha təsdiqləyərək yazır: "Totalitar sistemlər – zahirdə hansı formanı almaqlarından asılı olmayaraq – fundamentalistdir və bizim bu aralar dediyimiz kimi "imana əsaslanırlar".[577] Arqumenti bu cür qurduqdan sonra müzakirə ediləcək bir tərəf qalmır; bu, Hitchens'in özünün də ironiya ilə xatırlatdığı "özünü doğruldan kihanətlərlə" bənzərlik daşıyır. Zülmə, despotizmə dini don geyindirdikdən sonra bütün zalımlar, despotlar birdən birə dindar çıxmış olurlar. Burada "din" ilə ifadə edilən məna əslində ideologiyadır və bu baxımdan hətta ateizm özü də bəzi formaları ilə "din" adlana bilər. Bu cür arqumentlər mahiyyət baxımından söz ustalığından başqa bir şey deyildir; bir sözü götürüb ona ümumi istifadədən tamamilə uzaq olan bir mənanı yüklədikdən sonra onu rədd etmək də asanlaşır. Hitchens'in üslubunu istifadə etsək onun özünü də dindar çıxarmaq

[573] A. I. Soljeniçin, "The Gulag Archipelago 1918-1956: An Experiment in Literary Investigation", ikinci cild: səh: 65-66; Collins & Harvill Publishers, London, 1975
[574] R. Dawkins, "The God Delusion", səh: 315; Black Swan Edition, London, 2016
[575] N. Johnstone, "The New Atheism, Myth and History: The Black Legends of Contemporary Anti-Religion", səh: 178-179; Palgrave Macmillan, 2018
[576] GİG, səh: 232
[577] GIG, səh: 250

mümkündür. Bizim üçün müqəddəs olan Allah və peyğəmbəridirsə, onun üçün müqəddəs olan təbiət elmləri, əqlin gücü və - möhtəmələn – müxalif olmaq haqqıdır. Bu cür söz oyunu ilə kimi istəsən dindar edə bilərsən və dünyada ən çox nifrət edilən bir şəxsi dindar çıxardıqdan sonra geriyə dini tənqid etmək qalır. Absurd səslənir? Razıyam, bir şeyin Orwell tərəfindən deyilməsi ona legitimlik qazandırmır. Neo-ateizmin bir başqa nümayəndəsi Victor Stenger də eyni xətti izləyir. Əgər din olmasaydı – Stenger deyir – yəhudilər də müstəqil bir xalq kimi formalaşmayacaqdılar, İsanı öldürən xalq stiqması ilə yaşamayacaqdılar. Hitler yepiskop Berning'ə bunları deməyibmi? "Məgər Kilsə əsrlər boyunca yəhudilərə parazitlər kimi baxmayıbmı, onları gettolara həbs etməyibmi?" "Mən sadəcə olaraq kilsənin on beş əsr etdiyinin eynisini, sadəcə olaraq daha effektiv edirəm." Hitlerdən bu nəqli gətirdikdən sonra Stenger'in çıxardığı nəticə budur: "Ona görə də iyirminci əsrin ən azından altı milyonluq ölümünü dinin adına yazın!"[578] Belə çıxır ki, Hitlerin də törətdiyi qətliamlar dinin törətdiyi cinayətlər imiş. Ən azından Stenger oxucularının bu cür düşünməyini istəyir. Michael Onfray isə Hitler'in bir xristian olmasında şübhə etmir; "qaz kameraları Müqəddəs Yəhya'nın adına işlədilə bilirdi" – Onfray deyir.[579] Sam Harris də eyni havanı çalır: "Qaz kameralarını kərpicbəkərpic tikən antisemitizm ... bizə xristian teologiyası vasitəsi ilə gəlir. Bilərəkdən ya bilmədən, nazi almanlar dinin agentləri idilər."[580] Tarixə düşmüş ən böyük cinayətlərdən biri olan Holocaust neoateistlər tərəfindən böyük bir həvəslə dinin adına yazılır. Digər tərəfdən isə Hitler və onun başlatdığı hərəkat dindar yazıçılar tərəfindən ateist kimi qələmə verilir. Dindarların Hitleri ateist çıxarması doğru yanaşma deyildir, çünki "xristianlığı və kilsələri nə qədər təhqir etməyinə baxmayaraq, Hitler özünün ateist və ya aqnostik olmağına dair heç bir işarə verməyib."[581] Neoateistlərin iddiasına gəldikdə isə onlar heç hədəfə yaxın belə düşmürlər, çünki Hitler haqqında belə bir təsəvvür tarixçilərin geniş konsensusuna ziddir. Hitler'in katolikliyi onun gənc dövrlərinə aid edilməlidir. Tarixçilər qeyd edirlər ki, "siyasi karyerası boyunca" Hitler "xristianlığın bütün formalarına qarşı ardıcıl və dərin ikrah bəsləməyə davam edib."[582] Bu baxımdan Hitlerin ən səmimi etirafları dar dairədə, masa arxasında etdiyi çıxışlarında tapıla bilir. Misal üçün 1941-ci ilin dekabr ayının 13-ündə Hitler masa arxasındakı – orada Ribbentrop, Rosenberg, Goebbels, Terboven də iştirak edirdi - bir

[578] V. J. Stenger, "The New Atheism: Taking a Stand for Science and Reason", səh: 114; Prometheus Books, New York, 2009

[579] M. Onfray, "In Defense of Atheism: The Case Against Christianity, Judaism and Islam", səh: 186-187; Arcade Publishing, London, 2007

[580] S. Harris, "The End of Faith: Religion, Terror, and The Future of Reason", səh: 79; W.W.Norton & Company, New York, 2005

[581] Richard Steigmann-Gall, "The Holy Reich: Nazi Conceptions of Christianity, 1919-1945", səh: 255; Cambridge University Press, New York, 2003

[582] Derek Hastings, "Catholicism & The Roots of Nazism: Religious Identity & National Socialism", səh: 181; Oxford University Press, New York, 2010

söhbətində deyir: "Müharibə bir gün qurtaracaq. O zaman hesab edəcəm ki, həyatımın ən sonuncu tapşırığı din problemini həll etmək olacaq. Yalnız bundan sonra yerli almanın həyatı birdəfəlik və həmişəlik qarantiya altında olacaq." Görəsən Hitlerin nəzərində din problemi necə səslənirdi? Bunun cavabını eyni söhbətində özü verir: "Xristianlıq xəstə beyinlərin uydurmasıdır...Bütün bunları dedikdən sonra, italyanların və ispanların xristianlıq opiumundan azad olmaqlarını istəməyimiz üçün bir səbəb yoxdur. Gəlin bu xəstəliyə qarşı immuniteti olan yeganə xalq olaq!"[583] Frank-Lothar Kroll qeyd edir ki, nasyonal-sosializmin zəfəri və hakimliyi üçün "nasyonal-sosializmə müxalif olan və müqavimət göstərən bütün ideologiyalar aradan qaldırılmalı idi." Bunların arasında xristianlıq ən əhəmiyyətli və ən təhlükəli qüvvə idi.[584] Hitlerin və ümumilikdə nazi almanların anti klerikal mövqedən çıxış etdikləri tarixçilər tərəfindən qəbul edilən bir həqiqətdir. Bu nöqtədən baxdıqda neo-ateistlər ilə Hitler bir harmoniya içində olublar; hər iki tərəf dinin təhlükəsindən danışır və onun cəmiyyətdən təmizlənməsini arzu edirlər.

"Mən inanmıram ki," – Dawkins deyir - "yer üzündə Məkkəni – və ya Chartres, York kilsəsi, və *ya Notre Dame, Şvedaqon, Kyoto* məbədlərini və ya, əlbəttə ki, Bamiyan'ın Buddasını buldozer ilə dağıtmaq istəyən bir ateist olsun."[585] David Marshall isə deyir: "Mən Çində buddist məbədlərində *olmuşam və* artistləri çalışarkən izlə*mişə*m; onlar Çinin üç min illik ruhani xəzinəsini t*əkbaşla* (təkəlli demirəm) eybəcər hala salmış bir ateistin, sədr Mao'nun geridə buraxdıqlarını təmizləyib yığışdırırdılar."[586] Mədəni İnqilab dövründə Çinin dinlərə və dindarlara qarşı etdiyi cinayətlər çox əsaslı şəkildə sənədləş*dirilib. M*əscidlərin çoxu bağlanmış, bir hissəsi dağıdılmışdı. Quranın öyrənilməsi qadağan edilmişdi və müsəlman dini icmaların başçıları "donuz yeməyə və donuz başını yalamağa məcbur edilərək t*əhqir edilmişdilə*r."[587] Albaniya isə özünü dünyanın ilk ateist dövləti elan etdikdə *Ənvə*r Hoca dini alban cəmiyyətindən tamamilə silib aparmağı qarşısına məqsəd qoy*muşdu. Bu ə*rəfədə, yəni 1967-ci ildə Albaniyada 1050 məscid, 200 b*əktaşi t*əkkəsi, 400-ə yaxın katolik və ortodoks kilsəsi var idisə bunların çoxu tədricən dağıdıldı.[588] Özündən əvvəlki alban milliyyətçilərinin "albanların dini albançılıqdır" şüarını xüsusilə sevən ateist lider tədricən ölkəsində

---

583 Gerhard L. Weinberg, "Hitler's Table Talk, 1941-1944: His Private Conversations", səh: 110-112; Enigma Books, New York, 2008
584 F. L. Kroll, "Utopie als Ideologie. Geschichtsdenken und Politisches Handeln im Dritten Reich", səh: 399; Ferdinand Schöningh, Paderborn, 1998
585 R. Dawkins, "The God Delusion", səh: 283; Black Swan Edition, London, 2016
586 D. Marshall, "The Truth Behind The New Atheism", səh: 197; Harvest House Publishers, Oregon, 2007
587 Christopher Marsh, "Religion and The State in Russia and China: Suppression, Survival and Revival", səh: 184; The Continuum International Publishing Group, New York, 2011
588 Robert Elsie, "A Dictionary of Albanian Religion, Mythology and Folk Culture", səh: 18-19; Hurst & Company, London, 2001

bütün dinləri və dini fəaliyyətləri qadağan etdi və 1972-ci ilin konstitusiyasındakı 37-ci maddədə "dövlət heç bir dini tanımır və ateist propaqandanı dəstəkləyir" sözləri əks olundu.[589] Dini qadağan etmək, cəmiyyətdən silib təmizləmək təkcə kommunistlərin arzusu deyil, günümüzdə ad çıxarmış bir çox ateist yazıçının qələmə tökdüyü duyğulardır. "Mənim alimlərə və təfəkkür edə bilən bütün insanlara təcili müraciətim var." – Victor Stenger yazır: "Biz diqqətimizi yalnız bir məqsəd üzərində cəm etməliyik; içimizdə ən gənc olanın ömrü boyunca bu hədəfə çatmaq mümkün olmayacaq, lakin bəşəriyyətin sağ qalması üçün nə zamansa *buna nail olmaq* şərtdir: axmaq dini etiqadın planetin üzündən tamamilə silinib atılması."[590] Əgər Stenger üçün dini etiqadın yoxa qərq olması bəşəriyyətin xilası *üçün* şərtdirsə görəsən bu məqsədə nail olmaq üçün nələrə razı olardı?! Əgər siyasi gücə sahib olsaydı Ənvər Hoca'nı utandırmağı bacaracağını düşünürəm və iman sahiblərinə qarşı bu cinayətləri legitimləşdirmək üçün bu cür apokaliptik təsəvvür kifayət edir.

Bunun bir başqa isbatı neoateistlərin *uşaqlara verilən* dini tərbiyəyə münasibətlərində özünü göstərir. Onlar öz publikalarına uşaqlara verilən dini tərbiyənin "uşaq istismarı" olduğunu öyrədirlər. Anthony Grayling dinlərə qarşı polemikasında yazır: "*Əsas dinlərin* müxtəlif bəhsəbəhs saxta iddialarını kiçik *uşaqlara təlqin* etmək uşaq istismarının bir növüdür və skandaldır."[591] Daniel Dennett mövzuda maraqlı müqayisələr edir; oxucularına ritorik sual verən Dennett "evdə ev tapşırığını etməyə çalışan uşağa" pivə içizdirən valideynlərin hökmünü *soruşur. Bu halda hakimiyyət* dairələrinin müdaxilə etməyə nəinki haqqı vardır, hətta borcludurlar. Lakin "*mövzu alkohol yox, din olduqda*" iş çətinləşir. *Dennett'ə* görə alkohol məsələsinə gəldikdə "bizim siyasi hikmətimiz əhəmiyyətli dərəcədə məlumatlıdır", lakin dinə gəldikdə onun zərərləri haqqında məlumatlanmayıb.[592] Dennett qısacası deməyə çalışır ki, uşağa din öyrətmək ən azından ona məcburi alkohol içirmək qədər zərərlidir. Dawkins də eyni notları səsləndirir: "…məgər uşaqları hansısa dinə daxil etmək özlüyündə uşaq istismarı deyilmi?" sualı ilə oxucunu qarşıda gələcək təkliflərə hazırlaşdırmağa çalışır. Dawkins katolik rahiblərin uşaqlara qarşı etdikləri cinsəl istismardan danışdıqdan sonra yazır: "Bir dəfə Dublində bir mühazirədən sonra sual-cavab bölümündə mənə İrlandiyadakı katolik rahiblər tərəfindən *edilmiş və geniş* şəkildə ictimailəşdirilmiş *seksual*

---

[589] Terrence E. Cook, "Separation, Assimilation, Accomodation: Contrasting Ethnic Minority Policies", səh: 84; Praeger Publishers, Westport, 2003
[590] V. J. Stenger, "God and The Folly of Faith: The Incompatibility of Science and Religion", səh: 322; Prometheus Books, New York, 2012
[591] A. C. Grayling, "Against All Gods: Six Polemics on Religion and An Essay on Kindness", səh: 26; Oberon Books, London, 2007
[592] D. Dennett, "Breaking The Spell: Religion as A Natural Phenomenon", səh: 322-323; Penguin Books, London, 2007

istismar haqqında nə *düşündüyümü soruşdular. Mən cavab verdim ki, şübhə*siz ki, cinsəl istismar nə qədər dəhşətli olsa da onun zərəri, hər şeydən əvvəl uşağı katolik kimi böyütməklə ona vurulan uzunmüddətli psixoloji zərərdən daha xəfifdir."[593] Dennett alkoholun zərərləri ilə dinin zərərləri arasında müqayisə aparırdısa Dawkins pedofillərin cinsəl istismarı ilə din arasında müqayisə aparır. Dennett hansının daha zərərli olmasında aydın fikir bildirməsə də Dawkins heç bir tərəddüd göstərmədən dini daha zərərli elan edir.

Təbii ki, əgər dini tərbiyənin uşaq istismarı olduğunu düşünürsüzsə bunun qarşısını almaq üçün bir plan, bir məqsəd, ən azından istək olmalıdır. Bunun üçün təş*kil edilmiş banketdə* ateistlər üçün tamadalığı psixoloq Nicholas Humphrey edir və deyir: "Beləliklə də valideynlərin, uşaqları üçün öz istədikləri yolu seçib onları o yöndə tərbiyələndirmək üçün tanrı tərəfindən verilmiş haqları yoxdur; öz uşaqlarının bilik üfüqlərini məhdudlaşdırmaq, onları doqma və mövhumat mühitində böyütmək və ya öz etiqadlarının dar və düz yolu ilə getməkləri üzərində israr etmək haqları yoxdur. Qısacası, ağılların cəfəngiyat fikirlər ilə pozulmaması uşaqların haqqıdır və onları bundan qorumaq bizim, bir cəmiyyət kimi, borcumuzdur. Buna görə də valideynlərə *öz uşaqlar*ını vurub onların dişlərini tökməyə və ya onları zindanda bağlı saxlamağa izn verm*ədiyimiz kimi, eyni* şəkildə öz uşaqlarına – misal üçün – Bibliyanın hərfbəhərf həqiqət olduğuna və ya planetlərin onların həyatlarını yönəltdiyinə inanmağı öyrətməyə izn verməməliyik."[594] Dawkins və digərlərinin oxumağı məsləhət gördükləri bu sözlərdə Humphrey uşaqlara Quranı və ya Bibliyanı öyrətməyi onlara astrologiya öyrətməklə eyniləş*dirir; h*ər ikisinin də eyni dərəcədə cəfəngiyat olduğunu deyir. Üstəlik uşaqları fiziki olaraq döyməyin və ya onları zirzəmilərdə həbs etməyin qadağan olduğunu xatırladaraq eyni şəkildə valideynlərə uşaqlara dini etiqadları aşılamağı da qadağan etməyi təklif edir. Bu centlmenlərin sözlərindəki məntiqi nəticə budur ki, arzu etdikləri və görmək istədikləri dövlət aparatı dindar ailələrə müdaxilə etməli və uşaqları bu cinayətkar istismardan xilas etməlidir. Dennett də bəzi aşırı dindarları həbs etməyin tərəfdarıdır və bu aşırılıqlara misal verərkən "köləliyə", "diskriminasiyaya" bəraət qazandırmaqları yanında bir də "*uşaq* istismarını" da qeyd edir.[595] Xatırlayaq ki, Dennett də öz radikal ateist yoldaşları ilə razılaşır ki, uşaqlara Quran və Bibliya kimi kitabları hərfi həqiqət olaraq öyrətmək "uşaq istismarı" sayılır. Geriyə uşaqlarına bu cür dini tərbiyə verən

---

[593] R. Dawkins, "The God Delusion", səh: 358-362; Black Swan Edition, London, 2016
[594] N. Humphrey, "The Mind Made Flesh: Frontiers of Phychology and Evolution", səh: 291; Oxford University Press, New York, 2002
[595] D. Dennett, "Darwin's Dangerous Idea: Evolution and The Meanings of Life", səh: 516; Simon & Schuster Paperbacks, New York, 1995

valideynləri qəfəsə atmaq qalır və bunu açıq sözlərlə ifadə etməsələr də dedikləri bununla eyni mənadadır.

Əslində bu ateistlərin təklifini bu gün bir dövlət xüsusi həvəslə icra edir. The New York Times qəzetində yazan jurnalist Amy Qin qeyd edir ki, Çinin hökumət dairələri yarım milyon uşağı müsəlman uyğur ailələrdən zorla ayıraraq onları xüsusi təlim və tərbiyə məktəblərinə yerləşdiriblər. Valideynləri də məcburi konsentrasiya düşərgələrinə atılıb və onlar da xüsusi tərbiyə prosesindən keçməlidirlər. Amy Qin bunun arxasındakı məqsədi müəyyənləşdirmək istəyərkən bunu "əhalinin İslama olan bağlılığını zəiflətmək" olaraq göstərir.[596] Eyni məqalə hökumət sənədlərinə istinad edilərək yazır ki, uşaqların yerləşdirildiyi həmin məktəblər "uşaqları dinin təsirindən uzaq" bir mühitdə böyütməyi nəzərdə tutur. Əgər bu, ateizmin totalitarizminə əyani misal deyilsə nədir?! Bunun ironiyalı tərəfi budur ki, Dawkins dinin uşaq istismarı olduğunu isbat etmək üçün açdığı mövzunu tarixi bir misal ilə başlatmışdı; 1858-ci ildə Roma katolik kilsəsi tərəfindən öz yəhudi ailəsindən alınaraq qaçırılmış Edgardo Mortara bu aqibəti yaşamış yeganə *uşaq deyildi.*[597] Yəhudi ailədə çalışan katolik xidmətçi qız, qayğısına qaldığı balaca Edgardo'nun öləcəyinə inanaraq onu ölmədən əvvəl xaç suyuna salır. Sağ qalan uşağın bu hekayəsindən xəbər tutan kilsə, uşağı katolik hesab etdiyi üçün onu öz yəhudi ailəsindən zorla almağa qərar verir; çünki onların inancına görə bir katolik uşağa yəhudi ailə tərbiyə verə bilməzdi. Bunu bizə *dinin uşaqla*ra qarşı acımasız istismarı kimi göstərən Dawkins, bir neçə səhifə sonra sekulyar dövlətlərin uşaqları dini tərbiyədən xilas etmək üçün ailələrə müdaxilə etməsi fikrini müdafiə edir. Bu ikili standartı izah etmək asan deyildir. Christopher Hitchens bunu izah etməyə cəhd edir; əgər *Böyük Qardaş* sənin uşaqlarına öz ideologiyasını məcburən aşılayırsa buna münasibətin necə olacaq? Əgər mən öz şəxsi ideologiyamı sənin kiçik qızına zorla aşılamağa çalışsam bunu necə bəyənərsən? – suallarına Hitchens belə cavab verir: "(Uşağa) elm (science) öyrətmək bununla eyni deyildir, bir başqasının etiqadını öyrətməklə bağlı deyildir, uşağı düşünmək qabiliyy*ətini işlə*dərək öz etiqadına varmağı tə*şviq etmə*klə bağlıdır."[598] Belə çıxır ki, dindarların öz uşaqlarına öyrətdikləri sadəcə mövhumatdır və dindarlardan fərqli olaraq sekulyar hökumətlərin öyrətdiləri isə elmdir. Hitchens xatırlamaq istəmir ki, Sovet Rusiyasının vaxtında apardığı zorakı siyasət də elmi materializm adı ilə satılırdı. Çində hələ də bu günə qədər dindarlara qarşı aparılan siyasətin əsas "üzrü" elmdir və elmi inkişafdır. Dövlətin müəyyən sekulyar bir ideologiya üzərindən uşaqları tərbiyə etməsinə və valideynlərə heç bir seçim buraxmaması baxımından

---

[596] Amy Qin, "*In China's Crackdown on Muslims, Children Have Not Been Spared*", The New York Times, 28 dekabr, 2019
[597] R. Dawkins, "The God Delusion", səh: 350-351; Black Swan Edition, London, 2016
[598] Peter Hitchens, "The Rage Against God", səh: 210; Zondervan, Michigan, 2010

azərbaycanlı müsəlmanların xeyli xoşa gəlməz xatirələri var. Sovet dövləti *qurulduqda seçilmiş ilk tə*hsil komissar'ı Anatoliy Lunaçarski cəmiyyətdən tanrı inancını yığışdırmağı, onun yerinə proletariatı yeni tanrı elan etməyi qarşısına məqsəd *qoymuşdu. Bu dövrdə* qurulan Narkompros (Narodnıy Komissariat *Prosveşeniya) büt*ün məktəblərdə dini təhsili və dini simvolları qadağan etdi.[599] Bütün müsəlman ölkələrində də eyni təmizləmə *işlə*ri aparıldı. Özbəkistanda 1927-ci ildə kommunist partiyası islam alimlərinə dini öyrətməyi qadağan etdi.[600] Sovetlərin siyasəti Çini ilhamlandırmışdı və Çində kommunist partiyanın sədri Mao Zedong ölkədə dini təhsili qadağan etməkdə gecikmədi. Mədəni inqilabın başlaması ilə dinlər, dinlərin müqəddəsatı və təlimləri nəzarətə alındı. Müsəlmanların əksər məscidləri bağlandı, bir çoxu yerlə yeksan edildi və bu dağıtma işlərində "qızıl keşiklər" xüsusilə seçilirdilər.[601] Kambodca'dakı qırmızı xmerlər də daxili siyasətlərində Mao'nu ilham mənbə*yi etmişdilə*r və onlar da bütün dini fəaliyyətləri qadağan etdilər, buddist məbədlərini dağıtdılar və rahibləri kənd təsərrüfatında çalışmağa məcbur etdilər.[602] Dindarların və dinlərin xüsusi amansızlıqla təqib edildiyi Albaniya, Sovet Rusiyası, Çin, Şimali Koreya və Kambodca kimi ölkələrin ortaq tərəfi ateist olmaqlarıdır. Dawkins isə Kyoto məbədlərini, Bamiyan buddasını, Məkkəni, Notre Dame kilsəsini dağıtmaq istəyən hansısa bir ateistin ola biləcəyinə inanmır.

Nəinki mədəbləri dağıtmaq, hətta – Dawkins, Hitchens bunu təsdiqləmək istəməsələr də - din xadimlərini, dindar insanları kütləvi qətl etmək belə iyirminci əsrin ateist proqramlarının yadda qalan bir hissəsi olub. Rusiya Federasiyasında 1995-ci ildə prezident yanında qurulmuş komissiyanın sovet cinayətləri haqqında etdiyi araşdırmanın nəticələri tük ürpədicidir. Sovet rejimi silsilə *işgə*ncə və təqiblər ilə "iki yüz min din xadimini sistematik olaraq qətl edib. Komissiyanın hesabatını təqdim edən sədr Aleksandr Yakovlev deyir: "Sənədlər bizə din xadimlərinin, rahiblərin, rahibələrin saray darvazalarına pərçimləndiklərini, Çeka'nın zirzəmilərində güllələndiklərini, üzərilərinə qaynar su töküldüyünü, boğulduqlarını, suda batırıldıqlarını və digər v*əhşi işgə*ncələrə məruz qoyulduqlarını göstərir." Yakovlev əlavə edir ki, Vladimir Lenin'in bolşevik inqilabından sonra təxminən yarım milyon din adamı təqib olunub.[603] Yale universitetinin professoru Richard

---

[599] Sabrina Petra Ramet, "Religious Policy in The Soviet Union", səh: 127-128; Cambridge University Press, New York, 1993
[600] Michael Kemper, Raoul Motika & Stefan Reichmuth, "Islamic Education in The Soviet Union and Its Successor States", səh: 245; Routledge, London, 2010
[601] Michael Dillon, "China's Muslim Hui Community: Migration, Settlemen and Sects", səh: 163-164; Curzon Press, London, 1999
[602] Stephen J. Morris, "Why Vietnam Invaded Cambodia: Political Culture and The Causes of War", səh: 70; Stanford University Press, California, 1999
[603] Peter Hruby, "Dangerous Dreamers: The Australian Anti-Democratic Left and Czechoslovak Agents", səh: 300-301; iUniverse, Bloomington, 2010

Pipes'ın tərtib etdiyi "The Unknown Lenin" kitabında bu dokumentlər və başqaları oxucuya təqdim olunur. Kitabın müqəddiməsində kilsəyə qarşı təqiblərin qəddarlığı xüsusi qeyd edilir; kilsə mülkiyyətini müsadirə etməyi əmr edən Lenin, əmrin icrasına müqavimət göstərən rahiblərin yerindəcə güllələnməsini tələb edir: "Nə qədər çox öldürülərsə bir o qədər yaxşıdır."[604] Neoateistlər ateist dövlətlərdəki bu totalitarizmi və zülmü ateizm adı ilə əlaqələndirməyi sevmirlər. Lakin bütün ateistlər eyni dərəcədə kor deyillər. Ateist filosof Julian Baggini neoateist yoldaşlarından fərqli olaraq qatığa qatıq, ayrana ayran deməyi bacarır. Lakin o, ayırım edir; onun təsnifatında sovetlərin və Çinin ideologiyası "militant ateizmdir." Baggini deyir: "Sovet Rusiyasında baş verənlər mənim militant ateizmi sevməməyimin səbəblərindən biridir." Yaxın zamanlarda bir kəsdən - "onlar həqiqətən də inanırdılar ki, dini inanc mental xəstəliyin bir növüdür və dindarların müalicə olunacağı bir gələcəyə ümidlə baxırdılar" – sözlərini *eşid*ən Baggini deyir ki, "Mən militant ateizmin necə totalitar zalımlığa çevrilə biləcəyinin misalını görə bilirdim."[605] Çox təəssüf ki, belə "tədbirli təfəkkür" neoateizmin sıralarında əksikdir; çünki bu cərəyanın tərəfdarları imansızlığın zülmə gətirib çıxara biləcəyini etiraf etmək istəmirlər.[606] Baggini tərəfindən sərgilənən bu səmimiyyət ateistlər arasında nadir bir haldır. Buna görə də o, problemin nə ateizmin, nə də dinin özündə olmadığını gözəl anlayır, problemi insan faktorunda axtarıb tapmağı bacarır. Ateizmdəki, daha doğrusu antiteizmdəki – və neoateistlərin hamısı antiteist sayıla bilərlər - potensial totalitarizm, onların dinə olan münasibətlərində özünü büruzə verir. Bunun misalı Dawkins'in təbliğ etdiyi "meme" və "fikir virusu" ideyasıdır və ona görə din, insan ağlını pozan bir "virusdur". Gənc ikən – Dawkins deyir – bizim beyinlərimiz bütün məlumatları və mədəniyyətləri sorub özünə çəkmək qabiliyyəti ilə seçilir. Bir kompüter kimi gənc insanın beyni, qəbul etdiyi informasiyanın dəyərini və təhlükəsizliyini analiz edə bilmir, beləliklə də gənclərin beyni təhlükəli infeksiyalara açıq bir vəziyyətdədir.[607] Dawkins bu fikri ilk dəfə yaymağa başladıqda onu tənqid edənlər ona başa salmağa çalışırdılar ki, bu fikrin arxasında heç bir elmi material durmur və bu, "tibbi lüğətdən" istifadə edərək dini ləkələmək, dindarları utandırmaq cəhdində*n başqa bir şey deyildir.* Dawkins ilk əvvəllər bu fikrini ciddi müdafiə etsə də, daha sonra bu fikrin heç bir elmi dəyərinin olmadığını, sadəcə izahı asanlaşdırmaq üçün istifadə etdiyi bir müqayisə olduğunu təsdiqləyir. "Meme" fikrini Dawkins'in özündən də daha çox ciddiyə alan Dennett idi. Dostu Dawkins'in meme məsələsində bir addım geriyə çəkilməsindən

---

[604] R. Pipes, "The Unknown Lenin: From The Secret Archive", səh: 11; Yale University Press, New Haven, 1996
[605] J. Baggini, "Atheism: A Brief Insight", səh: 131-132; Sterling Publishing, New York, 2003
[606] N. Johnstone, "The New Atheism, Myth and History: The Black Legends of Contemporary Anti-Religion", səh: 263; Palgrave Macmillan, 2018
[607] R. Dawkins, "A Devil's Chaplain: Selected Essays", səh: 151-172; Phoenix, London, 2004

narazılığını gizlətməyən Dennett bunu kinayə ilə "(Dawkins) buynuzlarını bir qədər içəriyə salıb" sözləri ilə şərh eləyir.[608] Bu fikir hələ də neoateistlər arasında populyarlığını qoruyur, Ray, Craig James, Dennett, Stenger və Boghossian kimi antiteistlər tərəfindən ciddi bir fikir olaraq qəbul edilir.[609] Bu ideyanın tərəfdarlarına görə Allah inancı da ağılları yoluxdurmuş "fikir virusudur." Onların bəziləri bu cür ibarələri məcazi m*ənada işlə*tdiklərini desələr də irəli sürdükləri fikirlər "məcazilik" örtüsü ilə təhlükəsini itirmir. Dindarlara və dinlərə *qarş*ı ən ağır, ən despotik hücumları edən ateistlər hesaba çəkildiklərində adətən "məcaz" kartını istifadə edirlər. Bu cür təhlükəli fikirləri ciddiyə alan bəzi yazıçılar dinin özünü cəmiyyətin sosial sağlamlığı üçün təhlükə olaraq qiymətləndirirlər. Dinləri bu şəkildə infeksiya və ya virus sözləri ilə vəsf etmək – John Cornwell haqlı olaraq bildirir – "dilə gətirilməyən müalicələr, dərmanlar və həll yollarının olduğunu nəzərdə tutur." Beləliklə də dindarlar cəmiyyətin xəstə üzvlərinə çevrilirlər, beləliklə də onlar insaniyyətlərindən və şəxsiyyətlərindən məhrum olunurlar.[610] Beləliklə də ateistlər və dinsizlər, cəmiyyətin bu xəstə fərdləri üçün yeganə çarəyə, ekspert həkimlərə çevrilirlər. Dawkins belə bir nəticəyə inandığı üçün dinə diaqnoz qoyarkən "biz həkimlər belə bir inanca "iman" deyirik" deyir.[611] Beləliklə də Dawkins özünü həkim, dindarları isə xəstə elan edir. Bu təsəvvürlərin analoqunu biz Nazi Almaniyasında tapa bilərik; nazi ideoloqlarının alman xalqının arasında "xəstə fərdləri" görüb ayırd edə bilmək qabiliyyəti sərgiləməyə, bio-siyasətlərinə "irqi təmizlik", "irqi gigiyena" kimi fikirləri daxil etməyə *imkan vermişdi. Dawkins* çox ehtimal ki, öz nəzəriyyəsini bu qədər aşırı həddə gətirib çıxarmağın tərəfdarı deyildir və əminəm ki, Charles Darwin'dən soruşsaydılar o da nazi almanların etdiyini təqdir etməyəcəkdi; lakin tarixçilər qeyd edirlər ki, nazilər darvinizmdən ilham alırdılar.[612] Dawkins əgər Darwin qədər ideoloji gücə nail olarsa, bunun üzərinə siyasi tərəfdarlar qazana bilərsə "memetik" bir dövlətin və cəmiyyətin formalaşması sadəcə zaman məsələsi olacaq, çünki bu cür fikirlər özündə bu potensialı daşıyır. Bunun təsdiqini bəzi ateist yazıçılarda və onların fikirlərində tapa bilirik. Misal üçün Peter Boghossian yazır: "...biz, imanın ağlın virusu olduğunu yenidən konseptlə*şdirmə*liyik və iman ilə digər epidemioloji böhranlarla davrandığımız kimi davranmalıyıq; kontrola almaq və tamamilə yox etmək."[613]

---

[608] D. Dennett, "Darwin's Dangerous Idea: Evolution and The Meanings of Life", səh: 361; Simon & Schuster Paperbacks, New York, 1995

[609] N. Johnstone, "The New Atheism, Myth and History: The Black Legends of Contemporary Anti-Religion", səh: 274-275; Palgrave Macmillan, 2018

[610] J. Cornwell, "Darwin's Angel: A Seraphic Response to The God Delusion", səh: 141-142; Profile Books, London, 2007

[611] R. Dawkins, "A Devil's Chaplain: Selected Essays", səh: 162; Phoenix, London, 2004

[612] Richard Weikart, "From Darwin to Hitler: Evolutionary Ethics, Eugenics and Racism in Germany", səh: 6; Palgrave Macmillan, New York, 2004

[613] P. Boghossian, "A Manual for Creating Atheists", səh: 216; Pitchstone Publishing, Durham, 2013

Boghossian bunu təkcə öz fikri olaraq görmür, həm də getdikcə artmaqda olan tələb kimi təqdim edir. Darrel Ray və onun “The God Virus” kitabındakı fikirləri üzərindən çıxış edən Boghossian artıq məcazi üslub istifadə etmir; digərlərindən fərqli olaraq sözün ən açıq, ən həqiqi mənasında dindarları təhlükəli bir virusa *yoluxmuş x*əstələr olaraq təsnifləndirir. Buna görə də “təhsil sisteminə, ibadət evlərinə və süquta uğramış bilikləri öyrədən bütün digər institutlara geniş çaplı müdaxilələr etməyə təcili ehtiyac vardır.”[614] Boghossian qeyd edir ki, bu cür müdaxilələrə zəruri ehtiyac olsa da müasir cəmiyyətlərdəki etik və konstitusiyonal prinsiplər buna mane olur. Johnstone haqlı olaraq qeyd edir ki, bu cür yanaşma stabil deyildir; *əgər dini inanclar bu ş*əkildə təhlükəli viruslardırsa, etik və konstitusiyonal prinsiplər “xəstəliyin təhlükəsini” aradan qaldırmağa mane olmamalıdır. *Əksinə ə*gər “dini infeksiyalar” bu dərəcədə təhlükəlidirsə və ictimai sağlamlıq böhranı bu səviyyədə təcilidirsə, o zaman belə bir zərərin və təhlükənin davam etməsinə icazə vermək özü nə qədər etikdir?![615] Bununla da Johnstone *nümayiş etdirir* ki, bir başqa neoateist Boghossian’la razılaşmaya bilər, əksinə dövlətin – bütün konstitusiyonal prinsiplərə rağmən – müdaxilə etməsini zəruri hesab edə bilər. Müasir tarix bizə dəfələrlə göstərib ki, ciddi pandemiyalar qarşısında hökumətlər hüquq prinsiplərini çeynəyərək viroloji təhlükəni boğmağa çalışırlar. *Əgə*r Dawkins və onun ”memetikləri” din və imanla bağlı arzu etdikləri paradiqm d*əyişikliyinə* nail olsalar o zaman yeni növ “konsentrasiya kamplarının” və yeni növ “gigiyena siyas*ətinin” şahidlə*ri ola bilərik. “*Əvvə*lki nəsillər suçiçəyi və *uşaq iflici x*əstəliklərini yox etməyi necə əhəmiyyətli görürdülərsə gələcək nəsillər də epistemoloji yoluxmaları məhv etməyi eyni dərəcədə əhəmiyyətli hesab edəcəklər” – deyərək Boghossian gələcəyi belə xəyal edir.[616] Epistemoloji yoluxmalar ilə qəsd etdiyi dini təlimlərdir. Beləliklə də ateist filosof Baggini’nin yuxarıda verdiyi izah neo-ateistlərin perspektivinə *tam bir ş*əkildə oturur; əgər güc strukturları onların idarəsində olarsa totalitarizmin yeni bir növünə *şah*id olacağıq.

Bu totalitarizm Avropanın ilk maarifçi ateistl*ərinin dünya görüşündə* mövcud idi. Bəziləri tərəfindən “ilk ateist” medalı ilə t*əltif olunmuş Jean Meslier öz* vəsiyyətnaməsində “mədəniyyəti və təhsili” olmayan sadə bir fransızdan və onun ən böyük arzusundan bəhs edir: “Yer üzünün bütün hakimlərini və zadəganlarını rahiblərin bağırsaqları ilə asmaq və boğmaq onun arzusu idi.”[617] Meslier öz

[614] P. Boghossian, ”A Manual for Creating Atheists”, səh: 231; Pitchstone Publishing, Durham, 2013

[615] N. Johnstone, ”The New Atheism, Myth and History: The Black Legends of Contemporary Anti-Religion”, səh: 278; Palgrave Macmillan, 2018

[616] P. Boghossian, ”A Manual for Creating Atheists”, səh: 217; Pitchstone Publishing, Durham, 2013

[617] J. Meslier, “Testament: Memoir of The Thoughts and Sentiments of Jean Meslier”, səh: 37; Prometheus Books, New York, 2009

fikirlərini sadə bir fransızın dili ilə ifadə edir, həmin fransızın sadə olmasına baxmayaraq instinktlərində çox haqlı olduğunu da təsdiqləməyi unutmur. Daha *sonralar Denis Diderot bunu şerində* belə ifadə edəcəkdi: "Kralları asıb boğmaq üçün ip çatışmadıqda (bəşəriyyət) öz əlləri ilə rahiblərin bağırsaqların(dan ip) hörəcək."[618] Eyni ənənənin davamçısı olan və eyni ölkənin yetirməsi olan Emile Zola da buna q*əti* şəkildə inanaraq deyirdi: "*Ən sonuncu kils*ənin ən sonuncu daşı ən sonuncu rahibin başına düşmədən mədəniyyət öz mükəmməlliyinə nail olmayacaq."[619] Fransanın sekulyar inqilabını törətdiyi anti-ruhanilik özündən sonrakı fransız yazıçılarının qələmində *bu* şəkildə özünü hiss etdirib. Fransanın "laikliyini" digər sekulyar dövlətlərdən ayıran tərəflərdən biri də dinlərə qarşı apardığı "liberalist" təqiblərdir. Əgər Fransanın demokratik idealları olmasaydı bu gün dinə və dindarlara qarşı aşkar bir totalitarizmi görə bilərdik.

---

[618] "Oeuvres de F. B. Hoffman", cild: 8, səh: 486; Lavigne & Ducollet, Paris, 1834

[619] Joseph Wheless, "Forgery in Christianity: A Documented Record of The Christian Religions", səh: 406; Alfred A. Knopf, New York, 1930